**MEHDİ HÜSEYN**

# SEÇİLMİŞ ƏSƏRLƏRİ

**ÜÇ CİLDDƏ**

**III CİLD**

"AVRASİYA-PRESS"
BAKI-2005

*Bu kitab “**Mehdi Hüseyn.** Əsərləri. On cilddə. VIII, IX cildlər”*
(*Bakı, Yazıçı, 1978, 1979*) *nəşrləri əsasında təkrar nəşrə hazırlanmışdır*

Tərtib edəni: **Zivər Hüseynova**

**894.3613 - dc 21**
**AZE**
**Mehdi Hüseyn.**
**Seçilmiş əsərləri.** Üç cilddə. III cild. Bakı, “AVRASİYA PRESS”, 2005, 312 səh.

Bir sıra maraqlı hekayə, povest, roman, pyes, ssenari və ədibi-tənqidi məqalələrin müəllifi, tanınmış yazıçı Mehdi Hüseynin seçilmiş əsərlərinin III cildinə ədibin “Şeyx Şamil”, “Nizami”, “Cavanşir”, “Alov” pyesləri, habelə ədəbi-tənqidi məqalələrindən bir qismi daxil edilmişdir. Mehdi Hüseynin yaradıcılığında xüsusi yer tutan dram əsərləri və ədəbi-tənqidi məqalələri yığcamlığına, özünəməxsus üslubuna, zamanın ruhunu yaşatmaq məziyyətlərinə görə öz dəyərlərini bu gün də saxlamaqdadır.

**ISBN-9952-421-15-8**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir



# ŞEYX ŞAMİL

## İ Ş T İ R A K  E D Ə N L Ə R

Ş a m i l – Dağıstanın xalq qəhrəmanı
Ə m i n ə t – Onun arvadı
Ş a m i l i n  a n a s ı
Q a z ı  M ə h ə m m ə d – Şamilin oğlu
S o l t a n – Şamilin qaynı, Əminətin qardaşı
H a c ı  M u r a d – Şamilin nayibi
Q a s i d – Qazı Məhəmmədin müridi
K ə r i m ə t – Dağlı qızı
K ə r i m ə t i n  a n a s ı
A t a y – Şamilin müridi
G e n e r a l – Çar ordusunun komandanı
R a y e v s k i – Paruçik
T a m a r i n – Paruçik
M a r i y a – Generalın arvadı
B o r y a – Onun oğlu
D m i t r i
F y o d o r – Rus soldatları
İ v a n
S ə i d – Avar xanları nəslindən olan bir dağlı
D o k t o r – Çar ordusunda işləyən xirurq
Q a z ı – Ruhani
D a ğ l ı l a r,  ç a r  z a b i t l ə r i, r u s  s o l d a t l a r ı...

## BİRİNCİ ŞƏKİL

Dağıstan cəbhəsindəki çar ordusu qərargahında generalın mənzili. M a r i y a dərin bir ilhamla olduqca həzin bir sonet çalır. Hər tərəf sakitdir. Birdən top səsi eşidilir.Mariya səksənir və bir anlığa hərəkətsiz dayanıb ətrafı dinləyir. Yenə piano çalmağında davam edir. Onun arxasından yavaşca addımlarla general gəlir. Top səsi bir də təkrar olunur.

M a r i y a. Oh... yenə hər tərəfdə ölüm... hər tərəfdə qan...

G e n e r a l. Əlahəzrət imperatorun iradəsi belədir, əzizim. Nə üçün çalmayırsan?.. Mən bu top səslərini gözəl musiqinin həzin tərənnümü ilə bir zamanda dinləmək istəyirəm.

M a r i y a. Gedək, Vitya, gedək, Peterburqa... mən buralarda qalmaq istəmirəm... Eşidirsənmi? Yüzlərlə insanın qanını axıtmaqdan zövqmü alırsan?.. Yox, yox, mən dözə bilmirəm... (*Gedir*)

G e n e r a l. Dözə bilmirəm... Dağlılara atılan hər top gülləsi, mənə gələcək zəfərdən xəbər gətirir... (*Zəngi vurur*)

K a t i b (*Gəlir*). Buyurun, general...

G e n e r a l. Raportun sonunu yazın!.. "Hücum, eyni zamanda üç tərəfdən başlanmışdır. Mənim ixtiyarımda olan bütün qüvvələr düşmən üzərinə birdən yürüş etmişdir. Ordu üç korpusa bölünmüş, hər bir korpusa da təcrübəli bir komandan təyin edilmişdir. Biz dünəndən bəri Kaspi dənizi tərəfdən, ləzgi və Qafqaz xətlərindən irəliləyirik..." – yazdınmı?

K a t i b. Bəli, general, yazdım...

G e n e r a l. Davam edin: "Qafqaz – böyük və sarsılmaz bir qaladır. Bu xalqın yarısı əlində silah bizə müqavimət göstərsə də, biz bu qalanı sarsıdıb uçuracağıq. Mən əminəm ki, əlahəzrət imperatorun məhəbbətindən qüvvət alan ürəklərin atəşi bu dəmir qalanı yandırıb külə döndərəcəkdir!.." – Raportu bu gün yollayarsınız.

K a t i b. Baş üstə, general...

G e n e r a l. Onlar gəldilərmi?..

K a t i b. Bəli, çoxdan gözləyirlər, general.

G e n e r a l. Çağırın.

K a t i b. Bu saat... (*Gedir*)

G e n e r a l (*Mariya gedən qapıya sarı boylanaraq*). Aha, Mariya yatdı... Çox gözəl.

S ə i d (*Katiblə, Soltanla bərabər gəlir*). Salam, yaranal.

Görüşürlər.

G e n e r a l. Ağalar, çox təəssüf ki, sizinlə uzun söhbətə macalım yoxdur... (*Soltana*) Fikirləşdinizmi?

S o l t a n. Bəli, general.

G e n e r a l. Çox gözəl. (*Katibə işarə edir, o çıxır*) Şərtlərimiz sizə bəllidirmi!

S o l t a n. Dedilər, general... Biz razıyıq.

S ə i d. Bizim də şərtimiz var, yaranal.

G e n e r a l. Aha, buyurun...

S ə i d. Şamil bütün nəslimizi qılıncdan keçirmişdir. Mülkümüzü, var-yoxumuzu talayıb müridlərinə paylamışdır... Şamilin qabağında Qurana əl basıb and içməyim sizi şübhəyə salmasın, yaranal... Mən onun ən qəddar düşməniyəm. Qanını ovuc-ovuc içsəm belə, ürəyim soyumaz.

G e n e r a l. Öz nəslinin vəfalı oğulları belə namusla yaşamalıdırlar.

S ə i d. Siz də ondan bu hayıfı almağa kömək edin, yaranal, Böyük Rusiya padşahının mərhəmətini bizdən əsirgəməyin..

Q a z ı  M ə h ə m m ə d (*Rayevski ilə qabaqlaşaraq*). Oaçma... hara?.. Səninlə vuruşan Şamilin körpə aslanı Qazı Məhəmməddir. (*Onunla vuruşa-vuruşa uzaqlaşır*)

G e n e r a l (*Səidə*). Deməк, siz sol cinahın gizlin cığırlarını bizə göstərirsiniz. (*Soltana*) Siz də, (*Sükut edərək*) demək, bəllidir...

S o l t a n. Mənim sədaqətimə inana bilərsiniz, general...

G e n e r a l. Ehtiyatlı olun, ağalar... Şamilin qılıncı itidir... Başınızın qədrini bilin.

S o l t a n. Düz buyurursunuz... O, çox amansızdır, general...

G e n e r a l (*hər ikisinə əl verir*). Böyük Rusiya imperatoru xidmətinizi layiqilə ödəyəcəkdir... Əmin ola bilərsiniz.

S o l t a n. Hələlik... (*Səidlə bərabər gedir*)

G e n e r a l (*zəngi vurur*). Onları ötürün!..

K a t i b (*gəlir*). Buyurun!..

G e n e r a l. Yazın: “Şamilin dostu və qayını Soltan bəy razılıq vermişdir. Bu günlərdə sui-qəsd olunacaq və Şamil öldürüləcəkdir. Lakin indidən Soltan bəyin evi və yerləri haqqında rəsmi təminat verməliyik. Bu xüsusda sizin sərəncamınızı gözləyirəm...”

K a t i b. Təliqə kimin adınadır, zat aliləri?..

G e n e r a l. Qafqaz sərdarına yazın.

K a t i b. Baş üstə, general..

G e n e r a l. Çağırılan zabitlər gəlsələr, məni gözləsinlər.

K a t i b. Baş üstə, general, deyərəm...

G e n e r a l (*yazılmış raportları oxuyaraq imzalayır*). Gedin, paruçik Tamarinin dalınca da adam yollayın. (*Gedir*)

K a t i b (*bir an təzim edirmiş kimi dayanır*). Müharibə zamanı bu qədər də raport yazılarmı?.. Biz, salam əvəzinə qələm işlədirik... Oh, gözlərim nə yaman qaralır!.. (*Getmək istərkən Tamarinlə Rayevskinin gəldiyini görüb dayanır*) Ağalar, general həzrətləri bu dəqiqə qayıdır... (*Gedir*)

T a m a r i n. Mən dözə bilmirəm, dostum... Sanki ölüm addım-addım məni təqib edir. Bu həyat mənim üçün zövq və nəşədən artıq, iztirabla işgəncə mənbəyi olmuşdur...

R a y e v s k i. Bəsdir... Ölüm fəlsəfəsilə bu qədər başını yorma... İnan ki, əlahəzrət imperator razı olarsa, bu ümidsizlikdən birdəfəlik yaxan qurtulacaqdır. Şeyx Şamil hələ sağdır... Silahımızın gücünü sınamaq üçün hələ də geniş meydan vardır. Sən də özünü göstər, o zaman həmişəlik əfv olunarsan...

T a m a r i n. Yox, mən Qafqaza ölüm gətirən cəlladlardan olmaq istəmirəm... Bu xalqların böyük bir məhəbbətə ehtiyacı vardır... Amma biz nə edirik?..

R a y e v s k i. Yenə deyirəm: sən öz ayağınla uçuruma yuvarlanırsan!..

T a m a r i n. Məgər hər şey aydın deyilmi? Dünən Puşkin kimi əzəmətli bir vicdan günəşini söndürənlər, bu gün məni də öldürməyəcəklərmi?.. Rusiya imperiyası – böyük insanların vətəni deyil, zindandır... Sən bunu görmürsənmi?

R a y e v s k i. Bəsdir, bəsdir... Bu sözləri başqa yerdə danışma. Əlahəzrət imperatorun qulağına çatar, məhv olarsan... Amma Qafqaz dağları səni ölümdən qurtaracaqdır.

T a m a r i n. Bu yerlər mənim ikinci vətənimdir... Onun qəlbindəki yaralar mənim yaramdır... Eşidirsinizmi? Bu yerlərdə keçən əziz günlərimi xatırladıqca, ürəyimdən qopan sızıltılar bütün mənliyimi sarsıdır...

Görünür azadlığa həsrət qalacağam mən,
Hər acı məhbəs günü bir ilə bərbərdir...
Pəncərələr ucadır, boy çatmaz ona yerdən,
Qapılarda hər zaman gəzən keşikçi vardır.

Bax, Rusiya imperiyası budur... Bu həqiqəti inkar etmək – göydə günəşi danmaq kimidir, dostum.

R a y e v s k i (*düşüncəli və qəmgin bir səslə*). Sən şeirlə məni hər zaman məğlub edə bilərsən... Həqiqət olmasaydı, belə gözəl şeir də yaranmazdı... Lakin mən bir dost kimi deyirəm: yazıqsan...

T a m a r i n (*pəncərədən uzaqlara boylanaraq*). Gecədir, aylı-ulduzlu bahar gecəsi... Bəzən bu qərib boşluqlara baxdıqca ürəyim bir anlıq təsəlli tapır. Təbiət azad, insanlar azad, könüllər azad...

Yenə top səsi eşidilir.

Bax, bu mərmilər azadlığa atılır... Sən özün söylə: az-çox məhəbbətlə döyünən insan ürəyi buna necə dözsün?.. Bura Qafqazdır, əzizim... Bura mənim ilham yurdumdur...

Pauza

Gəncliyim şölə saçarkən necə bir nurlu çıraq,
Ey cənub dağları, düşdümsə əgər sizdən iraq,
Yenə dalsam sizə xoş xatirələr canlanacaq,
Vətənin dadlı-şirin nəğməsi tək hey qəlbən,
Sevirəm Qafqazı mən.
Bir çocuqdum o zaman, soldu, ölüb getdi anam,
Zənn edərdim ki, o düzlər mənə hər gün axşam,
Yadigar bir səsi əks etdirəcəkdir; ilham
Yurdu dağlar, qayalar tək ah, bilsən,
Sevirəm Qafqazı mən...
Sizdə xoşbəxtdim a dağlar, dərələr, şən düzlər,
Keçdi beş il yenə könlüm sizə həsrət, izlər;
İki göz gördüm o yerlərdə, ilahi gözlər,
Yada düşdükcə pıçıldar ürəyim min yerdən,
Sevirəm Qafqazı mən...

R a y e v s k i (*sarsılaraq*). Ah... əzizim... nə qədər ülvi bir xatirədir!.. Görəsən dünyada şeirdən də gözəl bir şey varmıdır?

T a m a r i n. Vardır... Azadlıq!.. Quşlar kimi azad yaşamaq, bilirsənmi nə böyük səadətdir?.. Biz uca dağlar qoynundakı azad qartalların bu yeganə sərvətini də əllərindən alırıq... Nə üçün?

R a y e v s k i. Sən inan ki, bu tarixi zərurətdir... Ağsaçlı Qafqaza, qocaman Rusiya imperiyasına lazımdır... Bu sıra dağların arasilə uzanan əyrim-üyrüm yollardan bir zaman ticarət qatarları gəlib-keçəcəkdir... "Ey, Qafqaz, qarlı başını əy, tabe ol, Yermolov gəlir". – Puşkin belə demirdimi?

T a m a r i n (*daha da qəmgin*). Köksündən odlanmış böyük dostumun sözlərini mən də xatırlayıram... Lakin o yanılırdı... Bu sözləri deyərkən, o hələ gənc idi... O, sonralar belə deməyirdi... Onun qəlbi böyük azadəlik hissilə çırpındığı zaman aulların, obaların yandırıldığını görüb inlədiyi zaman o belə deməzdi... Yox, mehriban dostum,

mən Puşkinin cəllad olduğunu iddia edib günaha batmaram... (*Əlilə generalın getdiyi səmti göstərək*) O, bunlar kimi su yerinə qan içməzdi...

G e n e r a l (*gəlir*). Aha, Tamarin, əlahəzrət imperatordan cavab aldım... Allaha dua edin. O sizə acıdı, qərarını dəyişdi... Siz hərəkət ordumuzda qalacaqsınız... (*Sükut edərək*) Məgər bu xəbərdən sevin-məyirsinizmi?

T a m a r i n. Şad xəbərdir, əlbəttə, sevinirəm...

G e n e r a l. İki-üç gün sonra atəş xəttinə göndəriləcəksiniz...

T a m a r i n. Doğrudanmı?

G e n e r a l. Bəli... Nə üçün təəccüb edirsiniz?

T a m a r i n. Hər halda qorxduğum üçün yox...Şamilə qarşı vuruşmaqla ölmək arasında heç bir fərq yoxdur, zat aliləri...

G e n e r a l. Şeir dili mənə yabançıdır. Mən soldatam. Çox təəssüf ki, biz müharibə meydanında şeri də, ilham pərilərini də unutmağa məcburuq... Onu da bilməli idiniz ki, imperiyamızın böyük ordusu heç bir cəbhədə məğlub olmamışdır.

T a m a r i n. Əfv edərsiniz, general, mən belə söz demədim.

G e n e r a l. Məntiqinizdən bu nəticə çıxır cənab şair...

T a m a r i n. Qəhrəman rus ordusu heç bir cəbhədə basılmamışdır.

G e n e r a l. Bəs komandirlər necə?..

T a m a r i n. Siz ifrata varırsınız, zat aliləri... Komandanlar çox zaman istedadsız adamlardan...

R a y e v s k i (*Tamarinin ətəyindən çəkib*). Mişel, sus!..

G e n e r a l (*bir an sükut edərək*). Məncə bir şey aydındır...

T a m a r i n. Mən atəş xəttinə gedə bilərəm... Onsuz da duyuram ki, ölüm günümə çox qalmamışdır...

G e n e r a l. Heç kim sizi öldürmək fikrində deyil... Əlahəzrət imperator rəhmdildir... Biz – onun sadiq təbəələri də sizi xilas etmək istəyirik.

T a m a r i n. Şeyx Şamillə vuruşmağa da bunun üçünmü yolla-yırsınız?

G e n e r a l. Sizcə, bu vəhşi dağlılarla vuruşmaq hər bir mədəni rusun müqəddəs borcu deyilmi?.. Nə üçün susursunuz?

T a m a r i n. Mən razıyam... Gedirəm, zat aliləri...

G e n e r a l. Unutmayın ki, qəhrəmanlıq göstərsəniz, böyük rütbə-lərə çata bilərsiniz...

T a m a r i n (*güclə hiss edilən bir istehza ilə*). Əlbəttə, əlbəttə...

G e n e r a l. Bir də, o şeirdir, nədir, buraxın getsin... Belə əhəmiyyətsiz işə qiymətli vaxtınızı sərf etməyin... Hələ eşitdiyimə görə bir dərnəyiniz də varmış...

T a m a r i n. Dərnək?

G e n e r a l. Bəli, bəli... Gizlin sui-qəsdçilər dərnəyi... Özü də yeddi nəfərdən ibarət... Bu qüvvə azdır, çox azdır, cənab paruçik... Ən adi bir çocuq marağından doğan bu dərnəklər həm yüngül, həm də mənasız və gülməlidir... Sizə məsləhət görmürəm... Senat meydanını xatırlayın!.. Dar ağacı, gərək ki, o qədər də arzu olunası bir şey deyildir.

T a m a r i n. Yoldaşlarımızın evində şadyanalıq etmək də qadağandırmı, zat aliləri?

G e n e r a l. Diqqətli olun!.. Siz də, paruçik Rayevski, bu xüsusda yoldaşlarınıza köməyi əsirgəməyin.

R a y e v s k i. Baş üstə, general.

G e n e r a l. Yenə təkrar xatırladıram. Əlahəzrət imperator rəhmdildir... O sizi on illik katorqaya göndərmək istəyirdi... Sizi ölümün pəncəsindən mən xilas etdim.

T a m a r i n. Təşəkkür edirəm... Məni katorqa əvəzinə, yenə ölümə göndərdiyiniz üçün sizə hədsiz təşəkkürlər.

R a y e v s k i (*yenə Tamarinin ətəyindən çəkir*). Mişel, ehtiyatlı ol...

T a m a r i n. Gedə bilərəmmi?

G e n e r a l. Artıq mən sizi saxlamıram...

T a m a r i n. (*təzim edərək*). Görüşənə qədər... (*Rayevski ilə bərabər gedir*)

G e n e r a l. (*Tamarinin dalınca*). Bu gənc, həqiqətən qorxuludur... Qafqaz dağlarındakı mənasız ölüm onu ağıllandırar. (*Zəngi vurur*)

K a t i b (*gəlir*). Buyurun, zat aliləri...

G e n e r a l. Paruçik Rayevskini öz yanımda adyutant vəzifəsinə təyin edirəm... Onun əmrini yazın!

K a t i b. Bu dəqiqə, zat aliləri... (*Gedir*)

G e n e r a l (*düşüncəli bir tərzdə gəzinib papiros çəkir*). Ax,Şamil, Şamil... Dağlarda qopardığın bu fırtınanın sonu hələ də görünməyir.

H a c ı  M u r a d (*birdən içəri atılır*). Axşamın xeyir, yaranal...

G e n e r a l (*tapançasını çəkərək*). Kimsən?

H a c ı  M u r a d. Əl saxla, yaranal, mən Hacı Muradam...

G e n e r a l Necə?.. Hacı Murad?.. Quş-quşluğu ilə buraya səkə bilməzdi, sən...

H a c ı  M u r a d. Bəli, bəli... Quş-quşluğu ilə səkə bilməzdi, amma Hacı Murad gələ bilər... Amma qorxmayın: adam öldürməyə gəlməmişəm.

G e n e r a l (*bağırır*). Eyyy!..

H a c ı  M u r a d (*olduqca soyuqqanlı*). Yaranal, boğazını ağrıtma... Mən Hacı Muradam... Sualıma düz cavab versən, and olsun Allaha, and olsun peyğəmbərə, sənin mübarək cəsədini, bu ayna kimi parıldayan daz kəlləni rusetin padşahına çox görmərəm.

G e n e r a l (*atmaq istəyir*). Çəkil!..

H a c ı  M u r a d (*cəld onun üstünə atılır, yumruqla vurub yerə salır*). Yenə deyirəm, yaranal... Ehtiyatlı ol: Mən Hacı Muradam... Eşitməyibsənmi? Dağıstan imamı Şeyx Şamilin nayibi igid Hacı Muradı hələ tanımayıbsanmı?.. (*Yerdən generalın tapançasını götürüb stolun üstünə qoyur*) Bax, zədələndi... Amma peşkəş eləsən, götürərəm... Zağlı tapançadır... Bax, mənimki pas atmışdır...

G e n e r a l. Vəhşi!..

H a c ı  M u r a d. Vəhşi olduğumu özüm səndən də yaxşı bilirəm... Ancaq mənim adımı eşidəndə dizlərin əsdi... Düzmü deyirəm?..

G e n e r a l. Böyük imperatorumuz bu hayıfı səndə qoymaz...

Hacı Murad. O, mənə nə eləyəcək?

General. Hamınızı məhv edər...

H a c ı  M u r a d. Düz deyirsən, yaranal, bütün insanların ölümü də onun könlündədir... Bayquş xaraba sevər...

General qapıya qarşı yönəlmək istəyir

H a c ı  M u r a d (*astaca addımlarla, azca axsaya-axsaya onun qabağını kəsir*). Hara?..

G e n e r a l. Tfu!.. Gör nə baxır, elə bil vəhşi məni yeyəcəkdir...

H a c ı  M u r a d. Mən müsəlmanam, yaranal, donuz əti yemirəm... Nə sənin yanına, nə də eşiyə adam buraxılmayacaq. Hər tərəfdən qapı kəsilmişdir... O biri otaqda xanımınız yatmışdır, onu yuxudan oyatmadım... Vəhşi olsaq da, azdan-çoxdan qanacağımız var... Biz özgələrinin istirahətini pozmuruq... Amma siz, yaranal, bütün bir ölkəni qan dənizində boğmaq istəyirsiniz... Məni buraya Şamil yolladı... Onun tapşırığına diqqətlə qulaq as...

G e n e r a l. Demək sən ultimatum verirsən?

H a c ı  M u r a d. Ultimatum-batım?.. Yox, ondan yox... Biz deyirik ki, gözəl-göyçək cavanlarınızı nahaq yerə qırdırırsınız... Sizin

padşah bizi yer üzündən sildirməyə razı olsa da, biz heç kimin ölümünü istəmirik... Birinci şərtimiz: dağlılardan tutulmuş əsirlər bu gün azad olunsun... İkinci şərtimiz: qoşun geri çəkilsin... Bu şərtlərə sabahdan gec əməl olunsa, öz baxtınızdan küsün, yaranal...

G e n e r a l. Düşünməyə vaxt lazımdır...

H a c ı  M u r a d. Çox gözəl... Elə isə, əmr verin hücum dayandırılsın!..

G e n e r a l. Xeyr... Biz hücumu dayandırmaq fikrində deyilik...

H a c ı  M u r a d. Eləmi?

G e n e r a l. Bəli, bəli... Biz qoşunu geri çəkməyə öyrəşməmişik.

Hacı Murad. Danışığımız uzun çəkdi, yaranal... Sizdə üç-dörd kağız-kuğuz var, zəhmət çək onları tap...

G e n e r a l. Nə kağız?

H a c ı  M u r a d. Padşahınızın fərmanları... Nə bilim, hər nə varsa... Mən savadsızam, özün axtar...

A t a y (*gəlir*). Hacı Murad, tez ol!.. Qoşun gəlməyimizdən xəbər tutdu...

H a c ı  M u r a d (*gözünə dəyən, əlinə keçən bütün kağızları toplayıb qoltuğuna vurur*). Hələlik, salamat qal, yaranal... Allah səni padşahınıza çox görməsin... Şərtlərimizi unutma... Bu gün səni bu kökə salan Hacı Muraddan qorx, yaranal...

G e n e r a l. Get Şamilə söylə ki, mən ölsəm də, böyük rus imperiyasının gücünü zəiflədə bilməzsiniz...

H a c ı  M u r a d. Sən də padşaha yaz ki, Dağıstan igidlərinin hamısını qırmaq olar, ancaq Şeyx Şamili inadından döndərmək olmaz... Hələlik... (*Atay ilə bərabər yüyürüb gedir*)

G e n e r a l (özünü itirmiş halda gəzinir, zəngi basır, daxil olan bir zabitə). Bu nədir?.. Siz yatmışsınızmı?

Z a b i t. Xeyr, zati-aliləri... Onlar gözlənilmədən hücuma keçdilər... Birdən hamının üstünü aldılar.

G e n e r a l. Bu gün mənim mənzilimi kim mühafizə edirdi?

Z a b i t. Dmitrinin manqası...

G e n e r a l. Gedin, onu mənim yanıma göndərin... Özünüz də iki həftə həbs olunursunuz... Aydındırmı?

Z a b i t. Dediyinizə əməl olunacaqdır, zat aliləri... (*Təzim edib gedir*)

G e n e r a l. Sanki mən qarışıq bir röya görürəm... Hacı Murad, Hacı Murad... Şamilin sağ əli...

G e n e r a l. Sənin şüurun özündədirmi?

Dmitri sükut edir

Sualıma cavab ver!

D m i t r i. Zat aliləri, Hacı Murad bütün qaravul dəstələrini qılıncdan keçirmişdir.

G e n e r a l. Bəs nə üçün yalnız səni sağ buraxmışdır? (*Dmitrini möhkəm şillələyir*) Nə üçün sən sağ qaldın?

D m i t r i. Haqlısınız, general, mən belə şillələrdən çox yemişəm... Ordu həyatıdır, soldat da döyülmək üçün yaranmışdır...

G e n e r a l. Get!.. Səninlə sabah danışaram...

Dmitri təzim edərək gedir

B i r i n c i  z a b i t (*tövşüyə-tövşüyə yüyürüb gəlir*). Zat aliləri!.. İcazənizlə...

G e n e r a l. Nə olmuşdur?

B i r i n c i  z a b i t. Paruçik Avdeyev öldürülmüşdür, zat aliləri...

G e n e r a l. Necə? Kim?

B i r i n c i  z a b i t. Üç gün əvvəl bizim ixtiyarımıza keçmiş aulda dağlılar üsyan qaldırmış, paruçik Avdeyev də bir dağlı qızı tərəfindən vəhşicəsinə öldürülmüşdür. (*Əlindəki qılıncı generala uzadaraq*) O, can verərkən, qılıncını açıb sizə yolladı.

G e n e r a l (*qılıncı alaraq*). Bu dəqiqə paruçikləri mənim yanıma çağırın!..

R a y e v s k i (*Tamarinlə bərabər qayıdıb gəlir*). Zat aliləri, bu nə işdir?.. İndi siz nə əmr edirsiniz?

G e n e r a l. Bu dəqiqə eskadronlarınızı hazırlayın, tez!..

R a y e v s k i. Nə?

T a m a r i n (*təzim edərək*). Baş üstə, general (*Gedirlər*)

G e n e r a l (*hazırlaşır*). Paruçik, üsyan qaldıran aulun daşı-daş üstündə qalmamalıdır... Gedək... (*Onlar cəld qapıya yönəldikləri zaman müdhiş səslə gurlayan top gülləleri atılır, general dayanır*) Aha, bir də, bir də. Mən dağlıları yalnız bu top nərəsilə itaətə gətirəcəyəm... gedək!

Gedirlər

P ə r d ə

## İKİNCİ ŞƏKİL

Aul... Uzaqdan top-tüfəng səsləri eşidilir... Aulda çığırtı-bağırtı vardır. Birdən qiyafəsini dəyişmiş Soltan görünür. Aula doluşan soldatları görüb gizlənir.

G e n e r a l (*paruçik Rayevski və o biri zabitlərilə gəlir*). Od vurun, yandırın!.. Bu vəhşini yanğının acı tüstülərində boğub məhv edəcəyəm.. Tabe olmayanlara aman yoxdur...

R a y e v s k i. Əfv edərsiniz, zat aliləri, hamı auldan çəkilib gedir. Bizə müqavimət göstərən yoxdur.

G e n e r a l. İnanmayın! Hər bucaqda bir bandit, hər evdə isə yırtıcı bir heyvan gizlənmişdir... Əmr edirəm... Bütün aula od vurulsun!.. Əlahəzrət imperatorun iradəsi belədir.. Qoy Neronun da ruhu şad olsun! Yandırın!..

R a y e v s k i. Əmriniz yerinə yetiriləcəkdir, general... (*Gedir*)

G e n e r a l (*yanındakı zabitlərdən birinə*). Soltan bəy gəlmədimi?

Z a b i t. Hələ görünməyir, zati-aliləri...

G e n e r a l. Demək, sözündən döndü?

Z a b i t. Siz onların sədaqətinə inanmayın, zati aliləri...

S o l t a n (*görünür*). Salam, general... mən əhdimə vəfa göstərdim... (*Generalla görüşür*) Buyurun, əmrinizi səbirsizliklə gözləyirəm.

G e n e r a l. Şamil necə oldu?

S o l t a n. Sui-qəsddən xəbər tutduğu üçün, son günlərdə çox ehtiyatlı dolanır, general... Ancaq sizə gətirdiyim yeni xəbər, Şamilin ölümü qədər vacibdir!..

G e n e r a l. O nədir? Ən şad xəbər belə onun ölümünü əvəz edə bilməz!..

S o l t a n. Bu gün Şamil sizə arxa tərəfdən hücum edəcəkdir, general... Ehtiyatlı olun...Onunla bərabər gələn atlılar ən say-seçmə müridlərdir...

G e n e r a l. Doğrudanmı?.. Bəs böyük imamınız hiylə sevməyirdi?!..

S o l t a n. Onun bütün işləri hiylədir, general...

G e n e r a l. Çox gözəl... Onun hiylələri bu gündən sonra artıq baş tutmayacaqdır. Sağ olun, Soltan... Siz doğrudan da, əsilzadəsiniz... Xanları, mülkədarları qılıncdan keçirən bu dağlar qulunun sonuna az qalmışdır... Əlahəzrət imperator bu xidmətinizi layiqli qiymətləndirəcəkdir...

S o l t a n. İzninizlə mən qayıdıram... O, mənim yolumu səbirsizliklə gözləyəcəkdir... Mənim sədaqətimə inana bilərsiniz, general... Mən gedim, sonra məni görərlər.

G e n e r a l. Siz gedə bilərsiniz, Soltan bəy...

S o l t a n (*əl verir*). Sağlıqla qalın, general... (*Gedir*)

Bu an Kərimət evlərdən birinin damında görünür, tez gizlənib nişan alır, generalın yanındakı zabitlərdən biri yıxılır. Generalla o biri zabitlər səngər tutmaq üçün qaçışırlar.

K ə r i m ə t (*sevinclə çağırır*). Öldürdüm, anacan, atamın da, qardaşımın da hayıfını aldım...

K ə r i m ə t i n a n a s ı. Sağ ol, qızım, sağ ol... Aman Allah, aula od vurdular... Qızım, qaç, gəlirlər...

K ə r i m ə t. Dayan, hələ ürəyim soyumayıb... Bax, bu da biri. (*Atır*) Görürsənmi, yıxıldı! (*Güllə ata-ata yüyürür, anasilə bərabər gözdən itir*)

T a m a r i n (*bir dəstə qolları bağlı dağlını gətirən soldatların arxasınca gəlir*). Dayanın, generalı burada gözləyəcəyik...

F y o d o r. Cənab paruçik, biz bunları hara aparırıq?..

T a m a r i n. Doğrusu, mən özüm də bilmirəm...

D m i t r i (*yanğını görərək*). Yandırdılar, cənab paruçik... yandırdılar... Bu alov elə bil mənim ürəyimin başından çıxır... Siz deyin: bu yazıqların təqsiri nədir?

T a m a r i n. Sus, əzizim... çarın sadiq nökərləri çoxdur.

F y o d o r. Amma general gəlir... Zat aliləri nə yaman da acıqlıdır!..

G e n e r a l (*zabitlərlə qayıdır*). Auldakı bütün əhalini meydançaya toplayın... Paruçik, Avdeyevin və Lixarevin qatili bu dəqiqə tapılmalıdır!..

R a y e v s k i. Baş üstə, general, qatil yerin dibində də olsa tapılacaq... (*Bir neçə nəfərlə gedir*)

G e n e r a l. Aha, Tamarin, görürsünüzmü, günahsız qələmə verdiyiniz bu vəhşilər, igid Lixarevi öldürdülər.

T a m a r i n. Həyatın qanunu belədir, general... Can şirindir. Ölməmək üçün öldürürlər...

G e n e r a l. Rus soldatı lirikaya yabançıdır... Bu, çox gözəl xüsusiyyətdir, cənab paruçik.. Bu yerlər ilham pərisi üçün, soldat üçün yaranmışdır, deyilmi?

T a m a r i n. Bu yanğınların müdhiş alovları da şerə çox bənzəyir... Mənim şeirdən aldığım ləzzəti, siz də yəqin bu yanğından alırsınız. Eləmi?

G e n e r a l (*istehzalı*). Doğrudur. Mənim fikrimcə, bu aulda yandırılan hər bir ev uçurulan bir düşmən qalasıdır. Bu, mənim kimi bir soldata ləzzət verməyə bilməz... (*Dağlılara sarı dönərək*) Cavanlarınız hanı?

B i r i n c i d a ğ l ı. Yaranal, mənim oğuldan-qızdan heç nəyim yoxdur...

İ k i n c i d a ğ l ı. Mənim də...

Ü ç ü n c ü d a ğ l ı. Mənim də.

G e n e r a l. Deməki, hamınız axtalanmısınız, eləmi?

İ k i n c i d a ğ l ı. Xeyr, yaranal... nə bura İrandır, nə də Şamil padşah... Oğlanlarımız qılınc vurub, ox süzdürür, düşməndən hayıf alır...

G e n e r a l. O düşmən kimdir?

İ k i n c i d a ğ l ı. Kim?.. Qan töküb, qan içənlər...

G e n e r a l. Qoca, biz qan tökməyə gəlmirik, biz bu vəhşi dağların əhalisini ağ günə çıxardırıq...

İ k i n c i d a ğ l ı. Düz deyirsən... Bu yanğın da bizi ağ günə çıxardır... İşığı güclüdür, göz qamaşdırır... Ax, Şamil, Allah səni bizə çox görməsin, indi sən hardasan?..

G e n e r a l. Sus, qoca, böyük imamınız Şeyx Şamil sizə vəfasız çıxdı...

İ k i n c i d a ğ l ı. Vəfasız o deyil, fani dünyadır, yaranal?

G e n e r a l. İmamların hamısı vəfasız olur...

R a y e v s k i (*bir yığın əlsiz-ayaqsız arvad-uşağı və qoca kişiləri qabaqlayıb gətirir*). Budur, general, auldan qalan yalnız bunlardır..

G e n e r a l (*hamıya*). Bu vəhşi aulda bir nəfər igid zabitimizi öldürdülər...

B i r i n c i d a ğ l ı. O, arvadlara sataşırdı...

G e n e r a l. Sizin aranızda qatil kimdirsə, göstərin...

Pauza

Qamçı gücünə, silah gücünə dedirdəcəyəm... Bizə qılıncla cavab verən bu dağlarda ölmüş bir igidimizə yüz insan qanı əvəz olacaq... Eşidirsinizmi? Mən bu əlsiz-ayaqsız arvad-uşağa toxunmaq istəmirəm, verin qatili!..

Pauza

Paruçik, Tamarin, soldatları cərgəyə düzün!..

T a m a r i n. General, aul onsuz da bizim əlimizdədir... Mən qırğına ehtiyac görmürəm... İzn versəniz, mən qatili taparam...

G e n e r a l. Razıyam... Qatil tapılarsa, günahsızları əfv edərəm...

T a m a r i n (*əsirlərə*). Dağlılar!.. General günahsızları bağışlar... Bu qədər insanın qırılmağına razı olmayan... Verin qatili!..

B i r i n c i d a ğ l ı (*irəli çıxaraq*). Mənəm qatil. Zabiti mən öldürmüşəm...

İ k i n c i d a ğ l ı (*irəli çıxaraq*). Yox, o yalan deyir, mən öldürmüşəm...

Ü ç ü n c ü d a ğ l ı. O da yalan deyir, zabiti öldürən mənəm, yaranal...

S ə s l ə r. Biz öldürmüşük...

G e n e r a l. İş belədirsə, hamınız ölümlə cavab verəcəksiniz...

T a m a r i n. Dağlılar!.. Paruçik Lixaryevi bir nəfərin gülləsi öldürmüşdür. Müqəssiri tapın, verin!..

S ə s l ə r. Öldürün bizi, ona da razıyıq!..

T a m a r i n. Dağlılar! Bu qədər günahsız qana bais olmayın. Bu, Allaha xoş getməz.

G e n e r a l. Cənab Tamarin, sizin şeir diliniz üçün bunların gönü çox qalındır... Belə hallarda silahın dili daha qüvvətli olur. Komandamı dinləyin...

Dağlıları cərgəyə düzürlər. Rayevski soldatları atəşə hazırlayır.

T a m a r i n. Müqəssiri deyin, bu qədər günahsızın naləsinə bais olmayın, dağlılar...

Dərin bir sükut.

K ə r i m ə t (*irəli çıxaraq, cəsarətlə köksünü gərir*). Zabiti öldürən mənəm...

T a m a r i n. Oh... Bu qız nə qədər gözəldir!.. (*Rayevskiyə*) O, insan deyil, mələkdir, dostum. (*Kərimətə*) Yox, dağlar pərisi, qan sənin o incə barmaqlarını ləkələndirər... Dağlar pərisinə qatillik yaraşmaz...

K ə r i m ə t. Qatil mənəm... (*Dağlılara sarı dönərək*) Düz demirəmmi?..

S ə s l ə r. O yalan deyir. Zabiti öldürən bizik!..

T a m a r i n (*Rayevskiyə*). O həm gözəl, həm də igiddir...

K ə r i m ə t. Analar, bacılar, zabiti öldürən mənəm... Mənim ürəyim intiqam eşqilə döyünürdü. Gözümün qabağında atamı, qardaşımı öldürürdülər. Bax, evimizə də od vurdular... Qoy hamı bilsin ki, mən aulumuzun hayıfını aldım...

B i r i n c i  d a ğ l ı. Qızım, Kərimət, yazıqsan, çəkil. (*Qızı kənara itələyib, özü onun yerinə keçir* ) Öldürən mənəm...

S ə s l ə r. Biz öldürmüşük...

R a y e v s k i. Vəhşilər, sözü bir yerə qoyub deməyəcəklər...

T a m a r i n. Bu xalq ölər, əyilməz...

G e n e r a l (*Rayevski ilə Tamarinə*). Hamısını aparın!

T a m a r i n. Hara, nə üçün zati-aliləri?..

G e n e r a l. Hamısı güllələnsin!..

K ə r i m ə t. Ana, ana, onu mən öldürdüm. Dünənki zabiti də öldürən mən idim. (*Tamarinə*) Ay oğlan, sən yaxşı adamsan. Zabiti mən öldürmüşəm... Bu yazıqların günahı yoxdur...

T a m a r i n. Çəkil, dağlar pərisi, o gözəl dodaqlara yalan söz yaraşmayır...

G e n e r a l. Aparın!..

Dağlıların hamısını aralığa alıb apardıqları zaman Şamil öz müridlərilə meydançaya hücum edir. Silah səsləri şiddətlənir. Soldatlarla müridlər əlbəyaxa döyüşürlər. General, zabitlər geri çəkilirlər.

Ş a m i l. Yaranal, qaçma yaranal; kişi olan dava meydanından qaçmaz!..

T a m a r i n. O qaçdı, mən ki, buradayam. Gəl!.. (*Qılıncını sıyırır*)

Ş a m i l. Eyy, gözəl oğlan, mənim zərbəmə tab gətirməzsən, təslim ol, anan yazıqdır.

T a m a r i n. Anam mənim yolumu gözləmir. Mübahisəni qılınclarımız həll edər...

Vuruşurlar.

Ş a m i l. Təslim ol, gözəl oğlan, sevgilin yazıqdır. O, ağlar qalar...

T a m a r i n. O da mənim yolumu gözləmir, vur!..

Vuruşurlar.

Ş a m i l. Hələ mənim əlimdən can qurtaran olmamışdır. Səninlə vuruşan bilirsənmi kimdir?

Vuruşurlar, Tamarin qılıncını qəsdən yerə çırpır.

T a m a r i n. Mən vuruşmuram. Öz asudəliyini belə mərd qoruyanlara əlim qalxmayır... (*Sinəsini gərərək*) Vur, sən haqlısan.

Ş a m i l (*hər tərəfdən hücum edən soldatları bir-bir vurub yerə sərərək, Tamarinə*). Yaranallar gəlsin, bu yazıqların günahı nədir?..

T a m a r i n. Vur, öldür... Mən bu vəhşi dağların qoynunda ölməyə öz ayağımla gəlmişəm, vur!..

Ş a m i l. Dağların qanunu var: igid, basdığını kəsməz, cavan oğlan...

Tamarin sarsılaraq təəccüblə baxır. Uzaqdan top-tüfəng səsləri eşidilir.

T a m a r i n. Hanı ölüm?.. Mən onu çoxdan axtarırdım.

Şamil əlində sıyırma qılınc addım-addım Tamarinə yaxınlaşır.

K ə r i m ə t (*yüyürüb ortalığa girir*). Onu öldürmə, böyük ata, o, gözəl oğlandır.

T a m a r i n (*Kərimətin üzünə baxa-baxa*). Oh, dağlar pərisi, yenə də sən?..

P ə r d ə

## ÜÇÜNCÜ ŞƏKİL

Şamilin mənzilində böyük bir otaq. Divardan müxtəlif çeşidlərdə qılınclar, xəncərlər, tapançalar asılmışdır. Pəncərə güllü-çiçəkli həyətə açılır. Yan tərəflərdə birər qapı var... Pərdə açıldığı zaman Şamil Soltanın üstünə bağırır.

Ş a m i l. Sənə ölüm cəzası belə azdır.

S o l t a n. Mənim günahım nədir, imam?..

Ş a m i l. Günahın?.. İki yüz müridi sən qırğına verdin, sən!.. Bu xəyanətdir, yoxsa qorxaqlıq?..

S o l t a n. Heç biri, imam... Mən dediyiniz yerdən hücuma keçdim... Ancaq oradakı qoşun geri çəkilmişdi...

Ş a m i l (*daha da acıqlı*). Sən hələ mənə yalan da satmaq istəyirsən?.. Ax, namərd!.. (*Xəncəri çəkib Soltanın üstünə cumarkən, Əminət çığıraraq aralarına girir*)

Ə m i n ə t. Şamil, sən nə edirsən?.. Kimi öldürürsən?

Ş a m i l. Onun günahı çoxdur, Əminət... O, bu gün iki yüz nəfər günahsızın qanına bais olmuşdur. Onlara vaxtında kömək etmədiyi üçün, soldatların mühasirəsindən çıxa bilməyib, hamısı qılıncdan keçirilmişdir...

Ə m i n ə t. Sənin gözlərini qan örtmüşdür, nədir?.. Sən istəsən də, istəməsən də, ölüm-itim olacaq... Soltan bilə-bilə günah işlərmi?.. Bu dava meydanıdır.

Ş a m i l. Hər tərəfdən üstümüzə qoşun yeriyir, xalqın balaları sərçə kimi qırılır. Amma bu, vuruşmanın qızğın vaxtında meşəyə çəkilib istirahət edir. Ax, nə edim?.. Öldürərdim...

Ə m i n ə t. Sakit ol, Şamil. Dost var, düşmən var... Sizə hər tərəfdən min göz baxır.

Pauza

Gəl bu dəfə Soltanı mənə bağışla.

Ş a m i l. Bunların ürəyi daşdandır. Əminət... El dərdi, vətən dərdi bunların ürəyinə yaddır!

Ə m i n ə t. İş görənin qüsuru da olar.

Ş a m i l. Əminət... Sənin qardaşın naiblikdə qalmayacaqdır. Mən bir mahalın taleyini ona tapşıra bilmirəm.

S o l t a n. Doğrudur, imam... Siz haqlısınız... Bu nişanı gəzdirməyə mənim haqqım yoxdur. (*Döşündəki müridlik nişanını açıb Şamilə verir*)

Ə m i n ə t. Onu bağışla...

Pauza

Ş a m i l. Yox, Əminət, o mənim etibarımı ayaqlar altında tapdaladı.

Ə m i n ə t. O mənim qardaşımdırsa, sənin yolunda qılınc çalıb gec-tez nişanını geri alar... Naibliyinə qayıdar...

Ş a m i l. Ax, Soltan, Soltan. (*Nişanı yerə çırparaq gedir*)

S o l t a n. İndi gördünmü, bacı?.. Mən heç... məni yandıran sənin dərdindir.

Ə m i n ə t. Mənim dərdim?.. Şamil məni gözlərinin üstündə saxlayır. Mənim nə dərdim var ki?

S o l t a n. Bax, görürsənmi, sənin heç nədən xəbərin yoxmuş. (*Şübhəli nəzərlərlə ətrafa göz gəzdirir*) Şamil Hacı Muradla niyə birdən dostlaşdı?.. Onlar ki, köhnənin düşməni idilər...

Ə m i n ə t. Çünki şamilə o cür igid adamlar lazımdır.

S o l t a n. Oh... yazıq bacım... Sən bütün insanları da özün kimi sadə ürəkli bilirsən. İndi mənə qulaq as...

Pauza

Hacı Murad öz bacısını Şamilə verir. Bu işdən xəbərin varmı?

Ə m i n ə t. Yox, yox... Bu ola bilməz...

S o l t a n. Mən də inanmırdım. Amma Şamilin öz ağzından eşidən olmuşdur. Hacı Muraddan da xəbər aldım. Deyir ki, doğrudur. İndi

məni də sənin ucundan ləkələyib hörmətdən salır. Bacıcan, sən insanların dediyinə yox, elədiyinə fikir ver... O, sənin kimi arvadın üstünə dul bir qarı gətirir... Məni də yandıran budur, mənim əziz bacım. Hacı Murad şeytandır... O, Şamilin ürəyinə soxulub ifritə bacısının sayəsində hörmət qazanmaq istəyir, mən Şamili sağ qoymaram... (*xəncərini göstərərək*) Bunu görürsənmi?..

Ə m i n ə t (*dəhşətlə kənara sıçrayır*). Necə?.. Onu öldürmək?.. Yox, yox.. Mən buna dözmərəm...

S o l t a n. Dayan, çığırma!.. Mən sənin ayaq altında tapdanan namusunu qorumaq istəyirdim. Razı deyilsən, eləmi?

Ə m i n ə t. Sən nə danışırsan, qardaşım? Şamil kimi insana əlmi qaldırırsan?

S o l t a n. Yaxşı. Bu gündən sonra Soltan adlı qardaşını arayıb-axtarma... sabahda-birigündə onun ölüm xəbərini eşidərsən... Mən həmişə namusla yaşamışam... İndi isə yaşamağa haqqım yoxdur. (*Getmək istərkən Əminət onun qabağını kəsir*)

Ə m i n ə t. Getmə, qardaşım... Bəlkə sən deyənlər doğrudur?

S o l t a n. Başımdakı papağı arvad ləçəyinə döndərmək istəmirəm. Salamat qal.

Ə m i n ə t. Yox, mən səni buraxmaram... O ərimdir, amma sən bircə qardaşım.

S o l t a n. Gedirəm, binamus bacının qardaşı olmaqdansa, namus üçün ölmək yaxşıdır.

Ə m i n ə t. Sən hara gedirsən?

S o l t a n. Haraya?.. Düşmən üçün itilənən bu xəncərlə öz köksümü parçalamağa gedirəm.

Ə m i n ə t. Aman Allah, bu nə danışır?.. Sənin gözlərini qan örtmüşdür. Ölmək nədir?

S o l t a n. Ölmək, namussuz yaşamaq deyildir...

Ə m i n ə t. Sıss... gələn var.

Pauza

Gedək. Sənin ağlın başında deyil... Bəri gəl... (*Gedirlər*)

Q a z ı M ə h ə m m ə d (*gəlir*). Ata, ata!.. Mən buradayam, gəlmişəm. (*Qapını açaraq baxır*) Aman Allah, o nə yaman qəmgindir?..

Ş a m i l (*gəlir*). Oğlum, xoş gördük səni. (*Alnından öpür*) Mən səhərdən yolunu gözləyirdim.

Q a z ı  M ə h ə m m ə d. Beş yüz əlli təzə mürid hər dəqiqə amiranə müntəzirdir, ata... Həm ləzgi xəttini, həm də Xəzər dənizi tərəfi yoxladıq. Oralara güclü qoşun gəlmişdir. Soldatlar möhkəm səngər düzəldib hücuma hazırlaşırlar.

Ş a m i l. Bilirəm, oğlum. De görüm, onların sayı nə qədər olar?

Q a z ı  M ə h ə m m ə d. Onu demək çətindir, ata... Hər halda yaranalın əvvəlki qoşunundan çoxdur.

Ş a m i l. Aha... Çox gözəl... Sən bu gün dayın Soltanın yerinə gedəcəksən... Mən onu müridlikdən çıxartdım. Öz canından qorxan kişilərə düşmənəm, oğul... Get onun yerinə... çörək, yalnız mərd insanlara halaldır... Di get, vətən bizdən imdad istəyir.

Q a z ı  M ə h ə m m ə d. Baş üstə, ata...

Ş a m i l. Unutma ki, ölüm xəbərin məni ağladar, amma basıldığını eşitsəm, ölərəm.

Q a z ı  M ə h ə m m ə d. Bilirəm, ata...Oğlun Qazı Məhəmməd ölər, amma basılmaz...

Ş a m i l. Elə isə get, Allah sənə yar olsun...

H a c ı  M u r a d (*gəlir*). Salam əleykim. Şad xəbər gətirmişəm... Meşə tərəfdən hücum edən qoşunları pərakəndə salıb geri qaytardım... Aullar yenə bizim əlimizdədir... Dünən dağlıları qəsdən qırğına vermiş xain Səidin dalınca atamı yolladım. Harada olsa tapıb gətirəcəkdir.

Ş a m i l. Sağ ol, Hacı Murad, sağ ol... Sən həmişə ürəkaçan şad xəbərlərin elçisi olmuşsan... (*alnından öpür*) Əyləş!.. Bəs yaranal?

H a c ı  M u r a d. Şərtimizi ona söylədim. Razılıq vermədi. Kağızları gətirmişəm... Bu da onların planı. (*Şamilə verir*) Biz onlardan cəld tərpənsək, generalın zağlı tapançası dünənkindən də pis günə düşər.

Ş a m i l (*pəncərəyə yanaşaraq*). Dəstə başçılarını yanıma çağırın. (*Planı nəzərdən keçirir*) Vəziyyət çətindir, Hacı Murad... Bizim kəşfiyyatçıların gətirdiyi xəbərə görə ləzgi xəttindən də, Xəzər tərəfdən də qoşun göndərilmişdir.

S o l t a n (*gəlir, Hacı Muradla görüşür*).

Ş a m i l. Sən də qulaq as, Soltan... Onlar bizi üzük qaşı kimi hər tərəfdən ortalığa almaq istəyirlər...

Dəstə başçıları gəlib, dövrə vurub otururlar.

H a c ı  M u r a d. İndi sənin fikrin nədir, Şamil?

Ş a m i l. Yadınızda saxlayın. Çar qoşunu indiyə qədər bizdən iyirmi dəfə çox idi, amma indi əlli dəfə çoxdur... Onlarla qabaq-qabağa

gəlmək, bizə hər cəhətdən zərərdir. Onları əzmək üçün birinci növbədə ardı-arası kəsilməyən basqınlara əl atmaq lazımdır. Biz həmişə gözlənilməyən yerdən düşmənin arxasına keçməyi bacarmalıyıq. Biz, hələ gözləmədikləri yerdə görünməliyik. Aydındırmı?

B i r i n c i  M ü r i d. Düzdür, imam... Mən dünən yüz nəfərlə üç yüz adamın öhdəsindən gəldim... Çünki siz deyən kimi elədim. Daldan hücum çəkdim. Zabitlər dağ yerinə bələd deyillər.

Ş a m i l. Bax, yaxşı qulaq asın. Bu düz dedi: Zabitlər dağ yerinə bələd deyillər. Onlar topu sürüyüb yuxarıya çıxardana qədər siz onların üstünü alacaqsınız... Özü də arxadan... Gedin, hazırlaşın... Buradakı bütün dəstələri mən özüm aparacağam.

Dəstə başçıları dağılışırlar. Hacı Murad, Soltan və Şamil qalırlar.

H a c ı  M u r a d. İzn ver, mən bu gün ləzgi xəttindən hücuma keçim, Şamil...

S o l t a n. Necə?!.. Ləzgi xəttində qoşun yoxdur... oralar boşdur. İmam, mən Hacı Muradın fikrini başa düşmürəm...

H a c ı  M u r a d. Mən də vuruşmağın qaydasını Soltandan öyrənmirəm... Biz də azdan-çoxdan qanırıq...

S o l t a n. Sən özünü nə üçün tərifləyirsən?

H a c ı  M u r a d. On altı yara almış adamın hər şeyə haqqı var.

S o l t a n. Lovğalanma, Hacı Murad... Şamilin bədənində iyirmi yara yeri var... Onların hamısı sinəsindəndir. Amma sənin yaraların arxadandır... Bir də, yaralanmaq böyük hünər deyil...

Ş a m i l. Mübahisəniz qurtardımı?

H a c ı  M u r a d. Şamil, mən səndən cavab gözləyirəm. Bizim atamız sənsən, bu təhqirə cavab ver.

Ş a m i l. Hacı Murad, uşaq deyilsən ki?

H a c ı  M u r a d. Bu sayıqlamaları Soltandan iki dəfədir eşidirəm... Bilmirəm arada nə varsa, o məni görəndə gözlərimin içinə baxa bilmir... Heç eybi yoxdur... Mən indi gedib istədiyim kimi vuruşaram... (*Gedir*)

S o l t a n. Gördünüzmü, imam? O bizim qüvvətimizi dağıtmaq üçün hər dəqiqə bəhanə axtarır... Mənim sədaqətimə inanın, imam.

Ş a m i l. Bəsdir!.. Fitnə törətmə!.. (*Hacı Muradın arxasınca gedir*)

Ə m i n ə t (*gəlir*). Bu nə çığırtıdır?

S o l t a n (*ağlamsınaraq*). Məni boğurlar, bacı. Hər tərəfdən üstümə düşüb, tükümü didirlər... Əminət, de görüm, sən mənim ölümümü istəyirsənmi?

Ə m i n ə t. Bu dünyada öz qardaşının ölümünü hansı bacı istər?..

S o l t a n. Elə isə, mənə kömək ver, düşmənimi öldürüm. Özümün də, sənin də hayıfını alım...

Ə m i n ə t. Sən dəlimi olmuşsan?..

S o l t a n. O ölməsə, mən ölməliyəm...

Pauza

Ə m i n ə t. Mən Şamilin məhəbbətini ürəyimdən qopardıb ata bilmərəm. Öldür məni, əgər doğrudan da binamus bacıyamsa, yalnız mənim yaşamağa haqqım yoxdur. Öldür!.. Bax buradan, sinəmin düz ortasından vur, amma məni Şamildən ayırma... Onun belə qəmli günlərində, mən onun günahlarından keçərəm.

S o l t a n. Ər məhəbbəti, səndəki qardaş məhəbbətini öldürmüşdür... Oh, bu dünyada mənim heç kimim yoxdur... Şamilin qanını axıtmaq mənim əlimdə su içməkdən də asandır... Amma Hacı Muraddan qorxuram... Onun adı gələndə dizlərim əsir... Şamili öldürüb qaçsam, Hacı Murad məni axtarıb tapar. Hara getsəm tapar... İndi də ki, Şamil onun yeznəsi olacaq, əlbəttə, onun qanını yerdə qoymaz. Sən get, Əminət, Şamilin anası bura gəlir. Ürəyinə nə gələr, nə gəlməz...

Ə m i n ə t. Sən bu fikirlərdən əl çək, qardaş... Məni dirigözlü öldürmə... (*Gedir*)

A n a (*gəlir*). Oğlum, Soltan, xörək hazırlamışam... Bunlar hara getdilər?

S o l t a n (*köksünü ötürür*). Eh... Hacı Murad küsdü. Elə adamlar Şamilin qədrini nə bilir, ana?

A n a. Sən nə danışırsan, ay oğul?.. Onlar and içib, əhd eləyiblər... Yaxşı dostları qılınc da ayırmaz.

S o l t a n. Görünür, Hacı Murad üzdən dostluq edirmiş, ana... Yəqin ürəyi ilə yox... təkcə dililə and içibmiş...

Ş a m i l (*Hacı Muradla bərabər qayıdır*). Siz uşaq kimi boğuşursunuz... İndi belə xırda, mənasız sözlər danışmaq vaxtı deyildir... Soltan, sən də mənə qulaq as. Müharibə edən insanda gərək od kimi qızğın ürək, buz kimi də soyuq baş olsun... Ancaq sizin ürəyiniz buz kimi soyuq, başınız isə od kimi qızğındır... Hacı Murad, bu gün generala xəbər yolla ki, onların tərəfinə keçirsən.

H a c ı  M u r a d. Sən nə danışırsan, Şamil?

Ş a m i l. Sözümə qulaq as. Müridlərdən bir-ikisini yolla... Özün də get, hazırlaş... Guya ki, məndən ayrılırsan... Guya aramızdakı o köhnə

ədavət təzələnmişdir. Sənə inanıb qoşun verərlər... Sonrası asandır, bildinmi?

S o l t a n. Gözəl fikirdir, çox gözəl fikirdir, imam...

Ş a m i l. Sən də Soltan, mənimlə gedəcəksən... Baxarıq, sədaqətini mənim yanımda yox, vuruş meydanında göstərərsən.

S o l t a n (*səsinə olduqca mehriban ahəng verərək*). Mən ömrümdə Hacı Murada ağır söz deməmişdim... Amma bu gün məcbur oldum... çünki, mən də bu torpağın doğma oğluyam... Mən də bu yolda canımı qurban verməyə hazıram.

Ş a m i l. Barışın!.. Ürəkdən barışın!..

Pauza

H a c ı  M u r a d. Mən sənin sözündən çıxmaram... Belə ağır bir vaxtda səni meydanda tək qoyub qaçmaq, doğrudan da, kişilikdən deyildir...

S o l t a n. Mən də and içirəm ki, yalnız ölüm məni səndən ayıracaq...

Qucaqlaşıb barışırlar. Atay iki nəfər müridlə bərabər qolları bağlı Səidi gətirir.

A t a y. Yarnalın zabitlərinə bələdçilik edəndə tutdum, imam... Zabitlər qaçıb gizləndilər... Axtarıb tapa bilmədik...

Ş a m i l. Səid, mənim əlimdən qaçıb kimə pənah aparmaq istəyirdin?

S ə i d. Heç kimə... can şirindir... Ölmək istəmirdim, imam.

Ş a m i l. Gərək ki, sən söz verdin, Qurana and içdin.

S ə i d. Doğrudur.

Ş a m i l (*onun sözünü kəsərək*). Sənin heç bir sözünə inanmaram... Müqəssir də yalnız özünsən. Hacı Murad, bunun cəzasını sən ver.

S o l t a n. İmam, icazə ver, bu xaini mən öldürüm.

S ə i d. Aha... sənmi?

S o l t a n. Kəs səsini, alçaq. Mən sənin dərini boğazından çıxardıb, günahsızların intiqamını alacağam...

Ş a m i l. Hacı Murad, onu özün apar... Nə cəza versən azdır... Avar xanlarının ən axırıncı yadigarı sən Səid... Onlar xalqı əzdilər, təkcə özlərini doydurub, ölkəni aclar, səfillər yuvasına çevirdilər. Mən buna dözməzdim... Yəqin ki, yadındadır, onların hamısını qılıncdan keçirdib, günahsız xalqın canını qurtardım... İndi də sənmi onları əvəz etmək fikrindəydin?

S ə i d. Yox, imam, mən islamın düşməni deyiləm... Mən din yolunda canımı fəda etməyə yenə də hazıram. Mən kafirlərin düşməniyəm...

Ş a m i l. Sən də kafirsən... Çünki xalqı çara satırsan... Bu baş gərək sənin bədənində qalmasın... Atay!.. Bunu apar, ağlar qalmış ana-

ların gözü qarşısında edam et. Hamıya da xəbər ver ki, Şamilin qılıncı yalnız belələri üçündür... Apar!..

S ə i d (*diz çökür*). Yalvarıram, imam... Məni Allaha bağışla...

Ş a m i l. Gündə beş rükət namaz qılan kafər!.. Sən yalnız ölüm cəzasına layiqsən... Aparın!..

A t a y (*Səidi yerdən qaldırır*). Gəl, Şamilin bir sözü heç vaxt iki olmamışdır!.. (*Səidi aparırlar*)

Bir neçə an sükut davam edir.

Ş a m i l (*Hacı Murada*). De görüm gedirsənmi?

H a c ı  M u r a d. Şamil! Doğrusu, mən bu fikrini başa düşmürəm.

Ş a m i l. Qüvvəmiz azdır... Vəziyyət ağırdır... Sən ki, bunu bilirsən...

H a c ı M u r a d. Demək, hiylə işlədirsən?..

Ş a m i l. Generalın mayası hiylədən yoğrulmuşdursa, nə üçün biz onun öz silahilə özünü vurmayaq?.. Düşməni hiylə ilə tora salmaq özü də qəhrəmanlıqdır.

H a c ı  M u r a d. General o qədər də sadəlövh adam deyil. İşi o dəqiqə başa düşər... Yalnız indiyə kimi gördüklərim üçün məni dar ağacından asdırar...

Ş a m i l. Demək qorxursan?..

H a c ı  M u r a d. Yox, ehtiyat edirəm. Şamil...

Ş a m i l. İnsan adlanan məxluq üçün birinci şərt – igidlikdir... Nifrətə layiq olan birinci şey – qorxaqlıq... Get: ya ölüm, ya qalibiyyət... Başqa yolumuz yoxdur. Zəiflik və qorxaqlıq heç bir zaman, heç kimi xilas etməmişdir.

Hacı Murad, inan ki, iki başlı qartalın qanadları bizim iti qılınclarımıza dəyib parça-parça olacaqdır!..

H a c ı  M u r a d. Gedirəm, Şamil... gəl, görüşüb ayrılaq, mən ölsəm, oğlum Yusif məndən sənə yadigar qalsın. (*Qucaqlaşıb öpüşürlər*) Hələlik. (*Gedir*)

Ş a m i l. Soltan, sən də get hazırlaş... Generala özümüz cavab verərik... (*Gedir*)

S o l t a n. Hacı Murad öz ayağilə ölümə gedir... Generalla görüşüb, ona xəbər verəcəyəm.(*Bu anda güllə səsi eşidilir*)Bu ölən Səiddir!.. Bəlkə mən də onun gününə düşəcəyəm?.. Canımı üşütmə bürüdü. (*Əllərilə gözlərini örtür*)

P ə r d ə

## DÖRDÜNCÜ ŞƏKİL

Çar ordusunun qarovul xətti. Dumanlı gecə... İvan, Dmitri, Fyodor.

D m i t r i (*kimi isə görərək*). Ey, kimdir gələn?.. Aha, cavab da vermir... Bəlkə qulağı kardır. Ey, dayan!

F y o d o r. Paruçik Rayevskidir... Yəqin qarovulu yoxlamağa gəlir.

D m i t r i. Kim olur-olsun, qanun hamı üçün birdir. (*Havaya güllə atır*)

R a y e v s k i (*gəlir*). Salam, qartallar. Dmitri, atan sən idin?.. Nə üçün düz nişan almırsan?

D m i t r i. Cənab paruçik, gecələr qorxuludur... Dostla düşmanı seçmək olmur.

R a y e v s k i (*Fyodora*). Qarovul çoxdanmı dəyişmişdir?..

F y o d o r (*təzim edərək*). Yox, cənab paruçik, yarım saatdan çox olmaz.

R a y e v s k i. Ehtiyatlı olun. Dağlılar bir də qarovulumuzu qılıncdan keçirdib generalın mənzilinə basqın etməsinlər.

İ v a n. Bu, Hacı Muradın köhnə peşəsidir. Qafqaza gələn generalların çoxu onun qorxusundan qaçmışdır.

R a y e v s k i. Salamat qalın, qartallar... Hər bir soldatın həyatı bizim üçün əzizdir, ehtiyatlı olun. (*Gedir*)

D m i t r i (*onun dalınca baxa-baxa*). Tamarin əsir düşəndən bəri qaş-qabağı açılmır... Yaxın dost idilər. Fedya, a Fedya, ciblərini qurtdala görək, maxorkan varmı?

F y o d o r. Tutalım ki, var... Qarovulda çəkdiyini görsələr, dərinə saman təpməzlərmi? Rayevski yaman qan içəndir...

D m i t r i. Onu tanısaydın, belə deməzdin, Fedya... Sən yanılırsan. Tamarinin dostu qan içməz... Rayevski əsl zabitdir. Ver maxorkanı görək!..

F y o d o r (*cibindən maxorka çıxardıb ona verir*). Ala, haramın olsun...

D m i t r i (*papiros bükübovcunun içində yandırır*). Rayevski yaxşı oğlandır, Fedya, bütün zabitlər onun qədər bizi sevsəydi...

F y o d o r. Eh, nə bilim?

F y o d o r. Nə yaman qaranlıq gecədir?.. Buludlar qurğuşun kimi ağırlaşmışdır...

Sükut. Quşlar həzin-həzin ötüşür.

D m i t r i. Nə gözəl oxuyurlar. (*Yanıqlı səslə, olduqca pəsdən oxuyur*)

Göydə bir ulduz,
Parlayır yalnız...
Məni hey çəkər,
O yanan ülkər...
Baxsam hər yana,
Bağlıyam ona...
Sevdiyim o qız,
Biləydi yalnız...
Belə hər gecə,
Mən də gizlicə...
Hey yana-yana
Baxardım ona...

(*İvana yaxınlaşır*) Vanya, dünəndən bəri qaş-qabağın yerlə gedir. Döyülən sən deyilsən ki?.. Nə olub məgər, gəmilərin suda qərq olmamışdır ki?..

İ v a n. Eh... Marusyadan ötrü ürəyim darıxır...

D m i t r i. Marusyadan ötrü?.. (*Gülür*) Burada sən onun üçün darıxırsan, amma o indi yad oğlanların birilə mazaqlaşır.

İvan (*acıqlı*). Onu sən haradan bilirsən?

D m i t r i. Yuxumda görmüşəm. Marusya hər gecə yuxuma girir...

Pauza

İ v a n. Bu Şamildir, nədir, yaman bəla oldu. Vəhşini gərək tezliklə tutub falaqqaya salaq.

D m i t r i. Deməyə nə var ki... Amma onunla bircə dəfə qabaq-qabağa gəlsən, qorxudan var-yoxun qarnına gedər.

İ v a n. Onun canı bir güllədir...

D m i t r i. Bir güllədir, bir güllədir. Deməyə nə var ki... Şamil dava meydanına girəndə qorxudan adamın dodağı çatlayır.Nərə çəkəndə yer-göy titrəyir. Hələ bir atı var ki, güllədən iti gəlir.

İvan. Onunla qabaqlaşsam, əvvəlcə atını vuraram.

D m i t r i. Onun atı Marusya deyil ki, yerə yat deyəndə yatsın?..

Gülüşürlər.

Uşaqlar, o qaraltını görürsünüzmü? Hamı o tərəfə boylanır.

Hə, Vanya, titrəyirsən?.. Bəs nə tez qorxdun?.. Yazıq, Şamil gəlsə nə edərdin?

İ v a n. Bəsdir, bəsdir, zarafatı boşla.

F y o d o r (*qarşıdan gələnlərə bağırır*). Eyy, kimdir gələn!

Sükut

İ v a n. Dayan!

A t a y (*arxadan*). Tüfəngimiz yoxdur, qorxmayın.

F y o d o r. Aha, dağlılardır. Yəqin yol azıblar... əllər yuxarı!..

A t a y (*bir dağlı ilə bərabər əllərini yuxarı qaldırmış halda gəlir*). Qardaşlar, biz generalı görəcəyik.

F y o d o r. Oho... Böyük yerdən başladı.

A t a y. Bizi Hacı Murad elçi yollayıb...

İ v a n. Kim? Hacı Murad, Hacı Murad?

F y o d o r. Vanya, nədən qorxursan, Hacı Murad özü gəlməmişdir.

İ v a n. Bəsdir, Mitya, zarafatı boşla... məni bütün dağlılar da qorxuda bilməz... Dörd cəbhədə olmuşam, bu da biri.

D m i t r i. Fedya, sən bunları apar... Ancaq tez qayıt ha...

F y o d o r (*dağlılara*). Gedək!.. (*Ataya*) Amma dostum, ürəkli oğlansan. Əli silahsız gəlməyindən görünür ki, qorxmayırsan...

A t a y. Nədən qorxum? Adətdir, elçiyə toxunmazlar...

F y o d o r. Gedək!.. (*Dağlıları aparır*)

D m i t r i. Vanya, a Vanya, mənim onlara yazığım gəlir... Nə göyçək oğlanlardır!.. Tutub asacaqlar. Allah generalı yaradanda ürəyinin yerinə daş qoymuşdur... Vallah onları asdıracaq...

İ v a n. Qoy asdırsın.

D m i t r i. İnsafsız... səndə ürək yoxdurmu? Onların günahı nədir?..

İ v a n. Marusyanı tez görmək üçün bu dağlıların hamısının kəndirini özüm sabunlram.

D m i t r i. Dünyada cəllad azlıq edirdi, sən də günahsız insan qanı axıtsan, işlər lap düzələr. Eh...Vanya, bütün insanlar sən öləndə rəhmət əvəzinə lənət oxumazlarmı? Dünyanın dərdi böyükdür, Vanya... qardaş qardaşın qanını içir...

Pauza

İ v a n. Düz deyirsən, Mitya... Cəllad olmaqdan, Marusyasız qalmaq yaxşıdır... Ancaq nə edim, hər gecə onu yuxumda görürəm... Mən gələndə ikicanlı idi... Heç bilmirəm oğlu oldu, yoxsa qızı?..

D m i t r i. Qızı olsa yaxşıdır.

İ v a n. Niyə ki?

D m i t r i. Heç olmasa soldat aparmazlar...

Görəsən onlar necə oldu? (*Qarşıdan gələn adama*) Kimdir gələn?

İ v a n. Dayan, Mitya. Deyəsən doktordur. Mən onu hər gecə buralarda görürəm. Bunlara nə olub, niyə qəmgindirlər?..

D m i t r i. O da müharibəni xoşlamır, günahsızları qırmaqdan ləzzət alır... Doktorların da, şairlərin də çoxu belə olur.

İ v a n. Şair nədir?

D m i t r i. Onu bilmirsən?.. Mən bayaq onun sözlərini oxuyurdum, Vanya...

İ v a n. Kimin? Doktorun?

D m i t r i. Yox... Tamarinin sözlərini oxuyurdum... O, gözəl şeirlər yazır...

İ v a n. Aha... Sözləri şirindir... Lap ürəyimdəndir.

D o k t o r (*gəlir*). Axşamınız xeyir, dostlar.

D m i t r i. Sağ ol, doktor.

D o k t o r. Dağlıları gördünüzmü?

D m i t r i. Bəli, doktor, gördük... Hacı Muradın elçiləridir...

D o k t o r. Hacı Murad... Hacı Murad... Şamil qoçaqdır, amma o hiyləgərdir...

D m i t r i. Doktor, sizə bir sualım var...

D o k t o r. Buyur, Dmitri.

D m i t r i. Bu müharibə nə zaman qurtaracaq?

D o k t o r. Şamil əsir alınanda... İndi aydındırmı?

D m i t r i. Demək, müharibə heç bir zaman qurtarmayacaq?

D o k t o r. Dostlar, siz qarovulda bir yerə nahaq toplaşırsınız... hücum etsələr, sizi çox asanlıqla öldürə bilərlər.

D m i t r i. Doğrudur. Vanya, sən get o tərəflərə göz yetir...

İ v a n. Eh... Dünya... (*Gedir*)

D o k t o r (*o tərəf bu-tərəfə göz gəzdirərək*). Dmitri, sənin həyatın təhlükədədir, dostum...

D m i t r i. Bu nə deməkdir, doktor?.. Nə üçün?

D o k t o r. Polşadakı soldat qiyamında iştirak etdiyin üçün...

D m i t r i. Soldat qiyamı?.. Bu yalan sözdür, doktor. Mən...

D o k t o r. Məndən heç nəyi gizlətmə... Dünən generalın aldığı gizlin siyahıda sənin də adın vardır... (*İvanın qayıtdığını görərək*) Hava nə yaman qaranlıqdır!.. Sağ olun, dostlar... Gecəniz xeyirə qalsın... (*Gedir*)

D m i t r i (*düşüncəli bir tərzdə sağa-sola gəzinir*). Mənim yolum – yalnız orayadır. Tale mənimlə qanlı bir oyun oynayır. (*İvana*) O gün

paruçik Tamarin deyirdi ki, dağlılar azad qartalların yuvasını heç nəyə dəyişməzlər.

İ v a n. O yuvanın dağıdandan sonra canımız bir yolluq qurtulacaq... Eh, lap bezmişəm... (*Sükut edərək*) Hacı Muradın elçiləri yəqin tutuldu.

D m i t r i. Yox, inanmıram... Elçini tutub saxlamaq olmaz... Vanya, a Vanya, Tamarin bəzi sözlər deyirdi, heç yadımdan çıxmır...

İ v a n. Nə deyirdi?

D m i t r i. Deyərdi ki: "Bu müharibədən əlimizə heç nə gəlmiyəcək... Tökülən qanları yuyub təmizləmək üçün yüz il vaxt lazım olacaq..."

İ v a n. Tamarin paruçikdir, o belə söz deməz. O görmür ki, hər gün padşah təzə əmr yollayıb deyir irəli gedin, dağlıların hamısı qırılsa da, davanı kəsməyin?..

D m i t r i. Eh... Sənin heç nədən başın çıxmır...

Pauza

Vanya, mənim atam da soldat olmuşdu... Onu Peterburqda, Senat meydanında öldürdülər.

İ v a n. Senat meydanında?.. O nə cür şeydir?..

D m i t r i. Mən özüm də görməmişəm... Onlar padşahı istəmirdilər...

İ v a n (*qorxa-qorxa*). Suss... axmaq-axmaq danışma... Necə yəni padşahı istəmirdilər?.. Eşidən olar, boğazına qurğuşun tökərlər. Padşahsız da ölkə dolanarmı?

D m i t r i. Şamil padşah deyil ki?

Pauza

Bu yerlərin havası mənə xoş gəlir, Vanya... Tamarin deyir ki... "İnsanların azadlığını əlindən almaq hünər deyil".

İ v a n. Sən dünəndən yuxusuzsan, sayıqlayırsan...

D m i t r i. Amma yenə də onların tərəfində ölmək yaxşıdır... Əlvida, Ana Rusiya, ey qulların ölkəsi!.. Sənin oğlun vəfasız deyil, o səndən sevə-sevə ayrılır...

İ v a n. Bu kimin sözüdür?

D m i t r i. Dostumsan, Vanya... Ancaq sənə inanmıram... Gəl, vidalaşaq... Mən gedirəm, Vanya... hara getdiyimi soruşsalar, deyərsən ki, ölməyə getdi, Şamilin yanında şərəflə ölməyə... Sağ ol, Vanya, ancaq məni unutma...

İ v a n. Nə danışırsan, Mitya?.. Sən düşmənlərəmi qoşulursan?

D m i t r i (*İvanı qucaqlayaraq*). Onsuz da buradan sağ qayıtmayacağıq... Orada uca dağlar qoynunda ölmək daha gözəl deyilmi?.. Onda deyərlər ki, Mitya Şimalda doğulub, cənub dağlarında basdırıldı.

İ v a n. Aha, qayıdırlar... Görürsənmi? Fedya?.. Fedya, nə oldu?

F y o d o r (*dağlılarla gəlir*). Şamilin evi yıxıldı... Onun sağ əli Hacı Murad bizim tərəfə keçir.

İ v a n. Doğrudanmı? Bu lap qiyamət oldu.

A t a y. Onun ixtiyarındakı aullar da tabe olurlar... Sabahdan tüfəngləri, qılıncları yerə qoyub hər kəs öz işinə-gücünə gedir...

İ v a n (*sevincdən atılıb-düşür*). Deməli, dava qurtarır? Can Marusya, mənim əzizim, iki gözüm, səni röyada yox, evimizdə görəcəyəm.

F y o d o r (*dağlılara*). Gedin, yolda bizimkilərə rast gəlsəniz deyin ki, generalın yanındaydıq...

D a ğ l ı l a r. Sağ olun, qardaşlar.

Soldatlar dağlıları ötürdülər. Atay mahnı oxuya-oxuya gedir.

Yaşıl başlı telli sonam,
Qalxdı özgə gölə düşdü.
Ağlımı aldı başımdan,
Getdi çöldən-çölə düşdü...

F y o d o r. Nə yaxşı oxuyur!.. Gözəl oğlanlardır... Vallaha mənim onlardan xoşum gəlir.

D m i t r i. Oh... ürəyim nə yaman sıxılır... (*Gedir*)

F y o d o r. Hara, Mitya?

D m i t r i. Görmürsünüzmü səhər açılır?.. Doğan günəş elə bil aləmi yandıracaq...

İ v a n. Doğrudur...Bu gün hava buludsuz olacaq... Fedya, o gedir, heç salamatlaşmır da...

F y o d o r (*təəccüblə*). Hara gedirik ki?..

İ v a n. Hara?.. Şamilin yanına... “Əlvida, Ana Rusiya...” dedi... Gözləri də yaşardı... Məni qucaqlayb öpdü...

F y o d o r. Sən nə danışırsan? (*Dmitrinin dalınca bağırır*) Mitya, dayan!..

Güllə atır.

İ v a n. Mitya atası Qriqori kimi Senat meydanında ölməyə gedir... Yox, Fedya, sən ona mane olma, ölümdür, amma şərəfli ölümdür!..

Hər ikisi təəccüblə ona baxır.

P ə r d ə

## BEŞİNCİ ŞƏKİL

Meşədə Şamilin düşərgahı. Axşam çağı... Günəş qürub etmək üzrədir. Dağlılar dağınıq halda oturub silahlarını təmizləyirlər, atlarının yəhərlərini düzəldirlər. Ş a m i l özü görünmür. İki nəfər dağlı Dmitrini sürüyüb gətirir.

B i r i n c i D a ğ l ı. Yox, buna inanmaq olmaz... Bu yəqin casusdur...

İ k i n c i Da ğ l ı. Dayan, dayan, bu saat mən onun kefini xəbər alaram... Eyy, bəri bax... de görüm hardan gəlib, hara gedirsən?

D m i t r i. Şamil hanı, mən onu görmək istəyirəm...

İ k i n c i D a ğ l ı. Söz soruşuram.

D m i t r i. Hanı Şamil?..

B i r i n c i D a ğ l ı. Üst-başını axtar... gör cibində nə var.

İ k i n c i D a ğ l ı. Ya bəxt... (*Axtarır*) Bizdə o bəxt hardadır? Zalım oğlunun cibində siçanlar oynaşır.

B i r i n c i D a ğ l ı. Deməli casusdur.

Ş a m i l (*gəlir*). Siz nə edirsiniz?

B i r i n c i D a ğ l ı. Bu yəqin casusdur, imam...

Ş a m i l. Bəs sən nəsən?.. Mürid libasında quldurluqmu edirsən? Get, onun ciblərini axtaran əlin namazdan sonra kəsiləcək.

Dağlılar gedirlər.

D m i t r i (*Şamilə yaxın gələrək*). Siz deyin: Şamil hanı? Deyirlər ki, o, yaxşı adamdır.

Ş a m i l. Haralısan?..

D m i t r i. Şamili görsəm, dərdimi açıb deyərəm... O hanı?.. Budur, müridləriniz məni casus adlandırırlar. Ancaq mənə inanın: əgər bütün taleyim məndən casus olmağı tələb etsəydi də, mən bu rəzil sifətə yaxın durmazdım... Hanı Şamil?

Ş a m i l. Sakit ol. Şamil – mənəm...

D m i t r i (*inanmır*). Yalan demirsən ki?

Ş a m i l. Zarafatla aram yoxdur.

D m i t r i. Səni and verirəm Allaha, məni onun yanına aparın... (*Sükut edərək*)

Ş a m i l. Biz qonağı yox, düşməni öldürürük...

D m i t r i (*diqqətlə Şamilin üzünə baxaraq*). Mən generalın alayından qaçmışam... Əgər sən doğrudan da Şamilsənsə, izn ver müridin olum...

Pauza. Bu anda Soltan arxadan Şamilə yaxınlaşır.

Ş a m i l. Bilirsənmi, biz kiminlə vuruşuruq?

D m i t r i. Bilirəm, sizin düşməniniz – mənim də düşmənimdir.

Ş a m i l. Sən öz qan qardaşlarına güllə atarsanmı?

D m i t r i. Çar mənim qardaşım deyil... Ögey atamdır...

Ş a m i l. Topçuluğu bacarırsanmı?

D m i t r i. Bəli, mən topçuyam... heç bir gülləm boşa çıxmaz.

Ş a m i l. Sağ ol... (*Əl verir*) Sağ ol... (*Bir an diqqətlə Dmitrinin üzünə baxaraq*) Soltan, bir bax, gözlərində nə qədər dərin bir səmimiyyət vardır!..

S o l t a n. İmam, bu kafirlərə inanmayın... Generalın casusları çox hiyləgər olur...

Ş a m i l. Yoxlarıq. Bir də, rus xalqı hiylə sevməz... Sən yaranallara baxma... Onlar bizim xanlar kimi rəzildir. Bu soldatdır, bir baxışda görürəm ki, igid oğlandır... O bizə kömək əlini uzadır...

D m i t r i. Sağ ol, Şamil... Mən çoxdan bilirdim ki, sən yaxşı adamsan... Məni də öz cərgənizə qəbul edin. Senat meydanında ölən atamın intiqamını sizinlə birlikdə alım.

Ş a m i l. Aparın. Onu maral ətinə qonaq edin. (*Dmitriyə*) İndi sən bizim ən əziz qonağımızsan... Mərd igid, gözəl insan, hər yerdə mənim dostumdur...

D a ğ l ı. Gedək, qonaq... (*Dmitrini aparır*)

S o l t a n. Bilmirəm, nə olubsa, Hacı Muraddan bir xəbər yoxdur, imam... Kafərlər ondan şübhələnməsələr yaxşıdır... Yaranal çox hiyləgər adamdır. O, Hacı Murada inanıb qoşun verərmi?

Ş a m i l. Mənim Hacı Murad sarıdan qorxum yoxdur. O nə qədər ağır vəziyyətə düşsə, fikirləşib yol tapacaqdır... Amma Qazı Məhəmməd təcrübəsizdir.

S o l t a n. Siz ondan arxayın olun, imam... Qəhrəman oğlunuz Qazı Məhəmməd ömründə bir dəfə də basılmamışdır... Allah onu bizə çox görməsin, imam... Dağıstanda on nəfər elə igid olsaydı, bizim dərdimiz nə idi?

Ş a m i l. Bizim kəşfiyyatçılar çox gec qayıtdılar... Görəsən bunlar harada qaldı?..

S o l t a n. Allah bilir, imam.

Ş a m i l. Yax, hamıdan qabaq biz bilməliyik.

Pauza

Atları, tüfəngləri yoxladınmı?

S o l t a n. Bəli, imam... hər şey öz qaydasilə hazırdır...

Ş a m i l (*kənarda oturmuş dağlılardan birinə yanaşaraq*). Yəhərin hanı?

D a ğ l ı. Budur, imam.

Ş a m i l. Saz yəhərdir. Tüfəngini göstər. (*Özü alıb baxır*) Bu nədir, lüləsi qapqaradır ki, al, möhkəm təmizlə.

D a ğ l ı. Baş üstə... Bu dəqiqə, imam.

Ş a m i l. De görüm, saqqalına niyə xına vurmayırsan?..

D a ğ l ı. Xına?

Ş a m i l. Müharibə meydanında üst-başınıza fikir verin... Qoy yaranal deməsin ki, qabağındakılar sınıq-salxaq adamlardır, bildin?..

D a ğ l ı. Mənim gözlərim üstə, imam...

Bu anda harada isə qalmaqal qalxır. "Vurun, öldürün" səsləri eşidilir.

Ş a m i l. Soltan, gör nə hay-küydür...

S o l t a n. Bu saat... (*Gedir*)

Ş a m i l (*Soltanın dalınca baxaraq öz-özünə*). Müridlikdən çıxalı, Soltanın qaş-qabağı açılmır. Mən bu dünyada ən çox yaltaqlardan qorxuram. O çox əzilib-büzülür... Böyüyün qabağında sinəsini şax tutmayanlardan igid olmaz...

D a ğ l ı (*bir nəfəri sürüyə-sürüyə gətirir*). Böyük imam, bu mürtəd, bu əclaf, dünən generala on iki qoyun satmışdır... Belə xainlərə aramızda yer yoxdur!..

S o l t a n (*dağlının boğazından yapışaraq*). Bu cinayətin üstündə sənin başını bədənindən ayırmaq da azdır.

Ş a m i l. Dayan, Soltan... qalmaqal salma. (*Dağlıya*) Düzdürmü?..

D a ğ l ı. Düzdür, imam. (*Şamilin qarşısında diz çökərək*) Məni balalarının başına dolandır. Evdə bir çətən külfətim var, imam...

Ş a m i l. Qalx ayağa!.. Arvad kimi sızıldama...

Dağlı ayağa qalxır.

Ş a m i l. Haralısan?

D a ğ l ı. Qazanışlıyam...

Ş a m i l. Kimlərdən?..

D a ğ l ı. Tanımazsan, imam...

Ş a m i l. Mənim əvəzimdən danışma... Sualıma cavab ver...

D a ğ l ı. Şeyx Səidlidən.

Ş a m i l. Onları mən səndən də yaxşı tanıyıram. İgid Süleymanın nəyisən?..

D a ğ l ı. Qardaşı oğluyam.

Ş a m i l. Siz ki, dövlətli deyilsiniz, bu qədər qoyunu haradan almışdın?..

D a ğ l ı. Düz deyirsən, imam... İlin on iki ayını işləyib, onun-bunun qapısında nökərçilik edirəm... Özümün diş qurtdalamağa çöpüm də yoxdur... Qoyunlar da ağamınkı idi... hələ ona dedim yaranal düşməndir, qoyun satdığımızı imam bilər, bizdən inciyər.

Ş a m i l. Bəs o nə dedi?

D a ğ l ı. Dedi ki: "Nə imam, bu gündə-sabahda padşahın rəiyyəti olacayıq..." – mən özüm müridəm, sənin yolunda ölməyə gəlmişəm.

Ş a m i l. Sən bilirsənmi belə adamların cəzası nədir? Yaranal qüvvətdən düşmüşdür... Əgər o bizdən qoyun alırsa, demək onun ərzağı qurtarmışdır. Siz ona köməkmi verirsiniz?

D a ğ l ı. Bir də ömrüm olalı bu qələti eləmərəm. Bu dəfə keç təqsirimdən... And verirəm igid oğlun Qazı Məhəmmədin canına... (*Ağlayır*) Allahdan istəmişəm, mənim ağam bütün ömründə yaxşı gün üzünə həsrət qalsın.

Ş a m i l. Bəsdir. Mən səni bağışlayıram... Bilirsənmi nə üçün, əmin Süleyman mənim yanımda igid aslan kimi vuruşa-vuruşa öldü. Səni ona bağışlayıram. Amma indi qabağımda arsız-arsız ağladığın üçün sənə on qamçı vurulacaq...

D a ğ l ı. Haqqın var, imam... On qamçı yox, iyirmisi də vurulsa azdır...

Ş a m i l. İndi ağan hardadır?

D a ğ l ı. Çoxdan qaçıb... Bildi ki, sən onun dərisinə saman təpəcəksən. Ax, indi əlimə düşsəydi, onun tükünü didərdim...

Ş a m i l. Get, amma sözlərimi yadından çıxartma. Qamçılar səni ağıllandırar...

D a ğ l ı gedir.

S o l t a n. İmam, siz nə insaflı adamsınız? Şəriətə görə kafərlərə kömək verən adamın əlini kəsdirməli idiniz!..

Ş a m i l. (*yaralı yerinə toxunulmuş kimi səslənir*). Əlini?

S o l t a n. Bəli, imam. Siz ki, şəriətin dediklərinə əməl edirsiniz?..

Ş a m i l. Doğrudur, belə adamların cəzası böyükdür... Ancaq hər gün bir neçə adamın əli kəsilərsə, bir ildən sonra Dağıstanda topallar, şillər əlindən tərpənmək olmaz... Əslində mən şəriətə kor-koranə tabe olmuram... Mənim üçün xalq bütün qanunlardan yüksəkdə durur...

S o l t a n. Axır şəriətə görə...

Ş a m i l (*onun sözünü kəsərək*). Hücum vaxtıdır, gedək hazırlaşaq!.. (*Gedir*)

S o l t a n (*öz-özünə*). Onun əqlindən və zəkasından qorxduğum qədər heç nədən qorxmuram. (*Kimi isə görərək*) Nə oldu, nə xəbər var?

Q a s i d (*gəlir*). Şamil hanı?

S o l t a n. O yoxdur, sözünü onun yavərinə deyə bilərsən...

Q a s i d. Çox qəmgin bir xəbər gətirmişəm. Deməyə dilim də gəlmir.

S o l t a n. Hacı Muraddanmı?

Q a s i d. Yox... mən onu görmədim... Qazı Məhəmməddən xəbər gətirmişəm. Axşam üstü idi... gün yenicə bathabat idi.

S o l t a n. Nağıl açma, qurtar.

Q a s i d. Birdən qara bulud kimi bir qoşun üstümüzə yeridi. Vuruşduq, qan su yerinə axdı... Axırda geri çəkildik.

S o l t a n (*sevinir, sevincini gizlətməyə çalışaraq*). Sənin ağlın başındadırmı?

Q a s i d. Mən gördüyümü deyirəm. Biz basılıb geri çəkilirik... Aullar əldən getdi. Qazı Məhəmməd məni buraya göndərəndə yaman qəmgin idi... Üz-gözündən bulud yağırdı. Onu belə görəndə elə bil ürəyimin düz ortasından vuruldum.

S o l t a n. Bu barədə imama bir söz demə... Eşidirsənmi?

Q a s i d. Yox... Mən oğlunun sifarişini atasına çatdırmalıyam...

S o l t a n. Sus!.. Əgər başın bədəninə ağırlıq edirsə, yeri, Şamil odur, get hər şeyi ona söylə... Yazıqsan... Bədbəxt...Şamil oğlunun basıldığını xəbər verən adamı sağ qoymaz... Mən bu dəqiqə ondan xəbərsiz Qazı Məhəmmədə kömək yollaram. Sən get!..

Q a s i d. Səni and verirəm Allaha, tez yolla, igidi meydanda tək qoyma... O ölsə, Şamil on il qocalar.

S o l t a n. Bu dəqiqə yollaram... Bax, bir kəlmə də... bildinmi?..

Q a s i d. Yaxşı (*Gedir*)

S o l t a n (*öz-özünə*). İndi Şamil mənim qədrimi bilər... O ilan balası Qazı Məhəmmədi elə bir topa salmışam ki, təkcə özü canını qurtarıb qaça bilsə, Allaha şükür etsin...

Ş a m i l (*gəlir*). Soltan nə üçün hazırlaşmayırsan?

S o l t a n. Bu dəqiqə, imam. (*Getmək istərkən Şamilə sarı gələn Qasidi görüb, onun qabağını kəsir*) Çəkil!..

Q a s i d. Üstümə niyə bağırırsan?

S o l t a n. O barədə Şamilə bir kəlmə desən, özünü ölmüş bil.
Q a s i d. İmam.
S o l t a n (*qılıncla vurub onu yıxır*). Xain!..
Ş a m i l. Bu nədir, Soltan?

Pauza

S o l t a n. Sizi vurmaq istəyirdi, imam... Çox ehtiyatsız dolanırsınız... Aramızda belə xainlər yenə də vardır...

Pauza

Ş a m i l. Əllərimiz qana boyanmışdır... Bu xəyanətlər hər gün məni qocaldıb gücdən salır... Bu ölünü aparın!..

Qasidi götürüb aparırlar.

Qazı Məhəmməd də bir xəbər yollamadı. Ürəyim çox narahatdır. Görünür, başına bir iş gəldi.
S o l t a n. Siz darıxmayın, imam... Körpə aslanınızdan yalnız qalibiyyət xəbəri gətirəcəklər.
Ş a m i l. Bəri gəl, vaxt keçir... Ürəyim çox narahatdır...

Gedirlər. Birinci dağlını sürüyüb gətirirlər.

B i r i n c i  D a ğ l ı. Buraxınız məni!.. Mən getmirəm... Bir kafərin cibini axtardığım üçün əllərim niyə kəsilsin? Dağlılar! Burada bizi aldadıb bir-bir qırırlar... Ən gözəl cavanlarımızı zəhərli güllələrə qurban verirlər. Dağlılar! Kim mənimlə gedirsə, gəlsin!..

Bu anda geridən bir güllə atılır. Dağlı daş üzərindən yuvarlanır, ağzı üstə döşənib qalır. Hamı sükut içində dönüb geriyə baxır. Şamil əlində tüstülənən tapançanı qoburuna qoya-qoya yavaşca və qəmli addımlarla yaxınlaşır. İzdiham onun müdhiş nəzərləri altında dalı-dalı çəkilir.

Ş a m i l (*olduqca soyuqqanlı*). Aramıza fitnə salanlara bir dəqiqə aman verməRəm. Padşah qoşunları ilə üz-üzə durmuş xalq, gərək kəfəni boğazına dolasın!.. (*Dmitrini göstərərək*) O bizə kömək əlini uzadır. Amma bu, aramıza nifaq salır... Quldur kimi adam soyur. Şamil qənimət almaq üçün vuruşmayır. Öz ana torpağını qoruyur... eşidirsinizmi?..
K ə ş f i y y a t ç ı (*üç-dörd nəfər dağlı ilə gəlir*). Biz onlara meşənin qurtaracağında rast gəldik, imam. Yaranalın qoşunu dərə ilə qalxıb üstümüzə yeriyir. Dörd topları, minə yaxın soldatları var...

Ş a m i l. Hücuma başlayırıq... namaza durun!..

Hamı diz çöküb üzü qibləyə namaz qılır. Soltan hamının arxasında görünür. Dmitri kənarda durub təəccüblə namaz qılan müridlərə baxır.

S o l t a n. Fürsətdir. Amma onu namaz üstündə öldürüb günaha batmaqdan qorxuram. Oh, mən niyə titrəyirəm. Yox, yox, əllərim qalxmır.

D m i t r i. Şamilin qəzəblə parıldayan gözlərində nə qədər dərin bir mərhəmət var!.. Belə bir qəhrəmanı olan xalq doğrudan da, xoşbəxtdir!

Ş a m i l (*ayağa qalxaraq qılıncını siyirir*). Lailahəillələllah.

H a m ı. Lailahəillələllah!..

Ş a m i l. Ölümə hamıdan qabaqda özüm gedirəm. Qorxaqlara ar olsun!..

H a m ı. Ar olsun!..

Ş a m i l. Lailahəillələllah!..

H a m ı. Lailahəillələllah!..

Ş a m i l. İrəli!..

Hamı birdən hücuma keçir.

P ə r d ə

## ALTINCI ŞƏKİL

Generalın mənzili. General və paruçik Rayevski. Gecədir. Ətraf sükut içindədir.

G e n e r a l. Bu nədir, cənab paruçik, məğlub etdiyiniz quldur dəstələrini sona kimi izləyib məhv etməkdən qorxursunuz?

R a y e v s k i. Zat aliləri, bizim dəstələr Qazı Məhəmmədi çox təqib etdi. Ancaq bir mənasız qırğına yol verməmək üçün meşəyə çatan kimi dayanmağa məcbur olduq...

G e n e r a l. Çünki qorxu cəsarətinizə üstün gəldi, deyilmi?

R a y e v s k i. Əfv edirsiniz, general. Dağlılarla meşədə vuruşmaq, mühit dənizində balıqlarla vuruşmağa bənzəyir.

G e n e r a l. Siz də Tamarin kimi şairanə müqayisələrə əl atmayın, paruçik... Bunlar hamısı bəhanədir, özü də gülməli və əsassız bir bəhanə...

R a y e v s k i. Sizi inandırıram ki, meşədə onlar bizi görürlər, amma biz onları görə bilmirik.

G e n e r a l. Bu xüsusdakı danışığımız sonraya qalsın. Tamarin Sizin yaxın dostlarınızdan biri idi, o, Şamilə qoşulmaq üçün qaçdı?

R a y e v s k i. Çox təəssüf ki, bu xüsusda heç bir şey deyə bilmərəm. Bəlkə o artıq sağ deyildir...

G e n e r a l. O, yağışdan çıxıb, yağmura düşdü, paruçik. İndi güman etmək olar ki, o, bu işlərdən sonra ağıllanar, düz yola gəlsəydi və padşahın mərhəmətini qazansaydı, böyük qüvvə idi... Belə şairlər az-az yaranır, paruçik... belə bir insanı itirmək Rusiya üçün çox ağır olacaq. Deyilmi?

R a y e v s k i. Siz istehza edirsiniz, general. Amma məncə bu həqiqətdir... Ölkəmiz hər zaman zabitlər yarada bilər, amma şairdən yoxsuldur...

G e n e r a l (*gülür*). Şair və şeirlə cəbhələr alınmaz, paruçik. Siz bunu bilməmiş deyilsiniz. Şeyx Şamil bizim qabağımızı qılıncla saxlayır...

R a y e v s k i. Mənim eşitdiyimə görə, zat aliləri, o özü də çox gözəl şairdir.

G e n e r a l. Doğrudanmı?.. Bax, mən bundan xəbərsizdim... Bu vəhşi dağlarda şeir də yarana bilərmiş. Lakin, paruçik, unutmayınız ki, müharibə meydanında bir kötəyin gördüyü işi on cild şeir görə bilməz... Napaleon Moskvanı aldığı zaman Derjavinin odalarilə Moskvadan qovulmadı...

R a y e v s k i. Biz hər zaman vuruşma meydanında olmayacayıq... Bir vaxt insanlara şeir də gərək olacaq... Əfv edirsiniz, general, fikirlərdə, düşüncələrdə yuva salan böyük şairlər...

G e n e r a l (*onun sözünü kəsərək*). Gedin, paruçik. Doktoru mənim yanıma çağırın...

R a y e v s k i. O sizi çoxdan gözləyir, zat aliləri.

G e n e r a l. Gəlsin!..

R a y e v s k i. Bu saat. (*Gedir*)

D o k t o r (*gəlib təzim edir*). Yaralının sayı çoxdur, zat aliləri, doğrusu, işdən göz aça bilmirəm.

G e n e r a l. Bu daha yaxşı. Həkimlər üçün bu daha maraqlı deyilmi?

D o k t o r. Təcrübə üçün maraqlı olsa da, bir rus üçün...

G e n e r a l. Sizi buraya tamamilə başqa iş üçün çağırtdırmışam. Əyləşin!..

Doktor oturur.

Tamarini tanıyırsınızmı?

D o k t o r. Bəli, tanıyıram. Biz ikimiz də bir şəhərdənik...

G e n e r a l. Onunla bir dərnəkdə iştirak etdiyiniz üçün, sizə bir sual verəcəyəm.

D o k t o r. Dərnək nədir, zat aliləri?

G e n e r a l. Onu siz məndən yaxşı bilirsiniz. Sui-qəsdçilər dərnəyi.

D o k t o r. Mən bu xüsusda heç bir şey bilmirəm.

G e n e r a l. Tutalım ki, belədir... Ancaq deyin görüm, Tamarin Şamilə qoşulacağı haqqında sizə bir söz deməmişdi?..

D o k t o r. Xeyr, zat aliləri. Yalnız onu bilirəm ki, müharibədən zövq almayırdı.

G e n e r a l. Gizlətməyin... Soldat Dmitri ilə Tamarinin düşmən cəbhəsinə keçməsi haqqında siz əvvəlcədən bilməmiş deyilsiniz. Yeddi nəfərlik dərnəkdən dördü burada imiş... Sizin də bu işdən xəbəriniz vardır...

D o k t o r. Mən burada yaralıları sağaldıram, zat aliləri.

G e n e r a l. Siz eyni zamanda ruhları, düşüncələri zəhərləyirsiniz. Aydındırmı?.. Xəbərdarlıq edirəm: Rusiyanın məşhur cərrahı olduğunuz üçün, hələ sizin haqqınızda ağır tədbirə əl atmıram... Gedin, düşünün. Lazım gələrsə, əlahəzrət imperatorun özünə də yaza bilərəm.

D o k t o r (*ayağa qalxaraq*). Məncə, siz indidən yazmalısınız. Çünki mən korlanmış əsəblərimlə cərrah bıçağını işlədə bilməyəcəyəm. Rus soldatının həyatı mənmi üçün çox əzizdir, zat aliləri.

G e n e r a l. Gedin, doktor... Mənim atalıq borcum xəbərdarlıq etmək idi.

Doktor təzim etməyərək gedir.

Ordu da pozulmuşdur... (*Zəngi vurur, girən Rayevskiyə*) Bu axşam Hacı Murad gəlməli idi, onu siz özünüz qarşılayın... Bu doktorun hərəkətlərinə diqqət edin... O, bıçaq əvəzinə dişini işə salır.

R a y e v s k i. Baş üstə!.. (*Gedir*).

M a r i y a (*gəlir*). Sən çox əsəbiləşirsən, əzizim, bu səhhətinə zərərdir...

G e n e r a l. Nə etməli?.. İmperatorumuzun iradəsi belədir.

Pauza

Hacı Murad bu gün bizə qonaq gəlir, Mariya...

M a r i y a (*təəccüblə*). Hacı Murad? O kimdir?

G e n e r a l. Eşitməmişsən?

M a r i y a. Bu vəhşilərin adını heç xatirimdə saxlaya bilmirəm. O nəçidir?

G e n e r a l. O gecə bizim evə basqın edən igid Hacı Murad. (*İstehza ilə*) Ona layiqincə ehtiram göstərmək lazımdır.

M a r i y a. Mən desəm ki, biz bu vəhşilərlə dostluq etmək üçün yaranmamışıq, sən o dəqiqə cavab verəcəksən ki, imperatorumuzun iradəsi belədir. Məncə bu...

G e n e r a l. Sən çox əsəbiləşirsən, əzizim, bu, səhhətinə zərərdir...

Pauza

M a r i y a. Vitya, mən Peterburqa qayıdıram... Üç ildir ata-anamı görməmişəm.

G e n e r a l. Nə etməli, imperatorumuzun iradəsi belədir...

Pauza

Hacı Muradın öz ayağilə ölüm axtarması həqiqətən maraqlı bir hadisədir.

M a r i y a. Bu nə deməkdir?.. İnsan da öz ayağı ilə ölüm axtararmı?.. Mən belə ağılsız adama rast gəlməmişəm.

G e n e r a l. Hacı Murad doğrudan da təslim olursa, biz onu əfv edirik... Ayrı məqsədlə gəldiyi sübut olunarsa, dar ağacı indidən hazırdır.

M a r i y a. Sən belə sözləri deyərkən heç bir vicdan ağrısı duymadığına təəccüb edirəm.

G e n e r a l. Çox təəssüf ki, mən öz iradəmdən asılı deyiləm.

R a y e v s k i (*gəlir*). Əfv edirsiniz, general, Hacı Murad gəlir.

G e n e r a l (*Mariyaya*). Bizi yalnız burax, əzizim.

Mariya gedir.

Paruçik, o doğrudanmı igid adamdır? O öz ayağı ilə ölümə gələrkən, sizcə, onun məqsədi nə ola bilər?

R a y e v s k i. Zat aliləri, Şamillə Hacı Murad arasında keçmişdə də ədavət var idi. Görünür, indi də yola gedə bilmirlər... Hacı Murad çox məğrurdur. Ölər, amma əyilməz.

G e n e r a l. Çox maraqlıdır... Onu gətirin, paruçik.

R a y e v s k i. Baş üstə. (*Gedir*)

G e n e r a l. Soltan bəyin dediyi doğrudursa, Hacı Muradın ölüm gününə az qalmışdır. (*Hacı Murad gəlir*) Axşamınız xeyir. (*Görüşür*) Çox şadam, köhnə düşmənlərin yeni dostluğu yenilməz bir qüvvə olacaqdır...

H a c ı  M u r a d. Doğrudur, yaranal. (*Generalın döşündəki ordenləri göstərir*) Əminəm ki, padşahınız Sizə bir medal da verər.

G e n e r a l. Siz bir məsəl də var: “Örtülü bazar, dostluğu pozar”.

H a c ı  M u r a d. Düz buyurursunuz!

G e n e r a l. Deyin görüm: əlahəzrət Rusiya imperatoruna sədaqətinizi nə ilə isbat edə bilərsiniz?..

H a c ı  M u r a d. Şamil mənim köhnə düşmənimdir... Məncə, bu kifayət edər...

G e n e r a l. Xeyr. Bu azdır. Siz dünənə qədər dost idiniz...

H a c ı  M u r a d. Bu xəncərim, bu da qılıncım...

G e n e r a l. Padşah rəhmdildir... səmimi dostlarının ən böyük günahlarını belə əfv edər.

H a c ı  M u r a d. Şamil dünən bütün aləmi tutub zindana salmışdır...

G e n e r a l. Bu düşmənçilik nədən irəli gəldi?

H a c ı  M u r a d. Xalq Şamili İmam seçdi... Mən çoxdan bu qərardan razı deyildim.

G e n e r a l. Nə üçün?

H a c ı  M u r a d. Çünki mən özüm imam olmaq istəyirdim... İnsan zəif məxluqdur: Şöhrəti çox sevər, yaranal...

G e n e r a l. Birdən hiylə işlətsəniz?

H a c ı  M u r a d. Biz hiylə sevmərik. Müridlərimdən kim düşməni arxadan vursa, mən onu danlaram, yaranal... Şamil də belədir. O mənim düşmənim də olsa, böyük sərkərdədir... O, bizim dağların hər bir cığırını tanıyır... O, bir dəfə mənə dedi ki: “Hacı Murad, hiylədən əl çək, düşmənləri aldatma... çünki onlar sənə hörmət eləməzlər. Öz xalqın da sənə inanmaz... Mən də səndən əl çəkərəm. Hiylə mərd adamlara yaraşmaz...” İndi mən ondan ayrılmışam... dünən xəbər yolladım ki, indi yaranal yox, Hacı Murad da sənin düşmənindir...

Pauza

G e n e r a l. Çox maraqlıdır. Deyin görüm, Soltan bəyi tanıyırsınızmı?

H a c ı  M u r a d. Köhnə düşmənlərimdəndir...

G e n e r a l. O, qoçaq adamdırmı?

H a c ı  M u r a d. Hələ onun qoçaqlığını görməmişəm... Ancaq harda pul görsə, özündən çıxar... yəqin ki, özünüz bilirsiniz, pul olan yerdə cəsarət də ola bilməz.

G e n e r a l. Çox gözəl... Nə üçün ayaq üstündə durursunuz?.. Buyurun, əyləşin!.. (*Zəngi vurur*)

R a y e v s k i (*gəlir*). Buyurun, zat aliləri.

G e n e r a l. Paruçik, qonaq üçün yer hazırladın.

R a y e v s k i. Baş üstə!.. (*Gedir*)

G e n e r a l. Bəs indi nə etmək fikrindəsiniz?

Bu anda Baryatinin oğlu B o r y a yüyürüb gəlir.

H a c ı M u r a d. Ha, oğlunuzdur. Mənim də oğlum var... Onu Şamil tutub zindana salmışdır. (*Boryaya*) İgid oğlandır, bura gəl... (*Onu tutub buraxmayır*)

B o r y a. Ata, bu Şamildirmi?

H a c ı M u r a d. Yox, igid oğlan, mən Şamil deyiləm.

B o r y a (*Hacı Muradın xəncərini göstərir*). Nə gözəldir, ata!..

H a c ı M u r a d (*xəncəri, atı uşağa verir*). Buyur, igid oğlan, sənə peşkəşdir...

B o r y a (*xəncəri alır*). Mən də vuruşacağam... (*Müxtəlif oyunlar göstərərək*) Bax belə... Bax belə... Dayan, dayan!..

G e n e r a l (*gülür*). Oğlum, qonağa təşəkkür et...

B o r y a. Sağ ol, qonaq.

M a r i y a (*gəlir*). Bu nədir, Borya, sən heç utanmırsanmı?..

B o r y a. Anacan, mən Şamili bu xəncərlə öldürəcəyəm... (*Xəncəri sürətlə oynadaraq*) Bax, belə... (*Gülür*)

M a r i y a. Baş kəsən azdı, sən də başlasan, lap işlər düzələr. Bunu sənə kim verdi...

G e n e r a l. Tanış ol, Mariya.

Mariya Hacı Murada əl verir.

H a c ı M u r a d. Məni belə hörmətlə qəbul etdiyiniz üçün sizə ürəkdən minnətdaram... Söz verirəm ki, ağ padşaha ölüncəyədək sədaqətlə qulluq edəcəyəm.

M a r i y a. Borya, xəncəri sahibinə qaytar...

H a c ı M u r a d. Dağlıların adəti belədir, xanım. O bəyəndi, mən də bağışladım...

M a r i ya. Hər zaman belə etsəniz, iki günə kasıblarsınız...

H a c ı M u r a d. Eybi yoxdur. Dövlət hər bir şeydən etibarsızdır, xanım... Bizlərdə dövlətə əl kiri deyirlər.

M a r i y a. Nə gözəl sözdür!

H a c ı M u r a d. Əsl dövlət insanın özüdür, xanım...

M a r i y a (*ərinə*). Deyəsən, bu quldurun fəlsəfəsi də var...

G e n e r a l. Sən onu şübhələndirirsən...

B o r y a. Ata, Şamil də bu qonağamı oxşayır...

M a r i y a. Borya, gəl gedək. sağlıqla qalın. (*Uşağı aparır*)

G e n e r a l. Mən hələ bir söz deməyəcəyəm... Əlahəzrət imperatordan cavab almayınca, burada sizə ən əziz bir qonaq kimi hörmət ediləcəkdir. Lakin deyin görüm: siz Şamildən nə yolla intiqam almaq fikrindəsiniz?..

H a c ı  M u r a d. Mən adi bir əsgər kimi vuruşmaq istəyirəm.

G e n e r a l. Siz nə danışırsınız? İllərlə böyük qüvvələrə başçılıq etmiş görkəmli bir sərkərdə üçün bu cür təvazökarlıq yaxşı deyil...

H a c ı  M u r a d. Əgər məni ləzgi xətti ilə onun üstünə yollasanız, mənim ixtiyarıma qoşun versəniz, bir neçə gündən sonra Şamili diri-diri məndən təhvil ala bilərsiniz...

G e n e r a l. Onu biz tezliklə ölü təhvil alacayıq... Soltan bəy Şamili öldürəcəkdir!..

H a c ı  M u r a d (*həyəcanla yerindən qalxır, birdən özünü toplayır*). Bu daha yaxşı... Mən daha da şad olaram...

G e n e r a l. Sizə nə oldu?.. Rənginiz qaçdı...

H a c ı  M u r a d. Sinəmdəki yaranın ağrısı qalxdı, yaranal...

G e n e r a l. Aha... (*Sükut edərək*) Hökmdarımızla razılaşarıq... Qoşun verərik... Hələlik gedin, rahatlanın... (*Zəngi vurur*) Mənə elə gəlir ki, imperatorumuz bu gəlişinizdən çox şad olacaqdır.

R a y e v s k i. Buyurun, zat aliləri...

G e n e r a l. Hacı Muradı qonaq otağına aparın!..

R a y e v s k i. Hər şey hazırdır...

G e n e r a l. Aparın...

İçəri daxil olan soldatlar Hacı Muradı hər tərəfdən əhatə edib qollarını bağlayırlar.

H a c ı  M u r a d. Mən bunu səndən gözləyirdim. Padşahın yaxşı dərs demişdir. Amma mən Hacı Muradam, yaranal. Bu zənciri də qırmağa gücüm çatar...

G e n e r a l. Hələlik gedin!.. Hökmdarımızdan cavab gələnə kimi, yumşaq çarpayını dəmir zindanla əvəz edin!..

H a c ı  M u r a d. Unutma ki, zəncirlə bağladığın bu qollar açılanda, mənim vurduğum qılınc zərbəsinə dözə bilməyəcəksən, yaranal...

Hacı Muradı aparırlar.

G e n e r a l (*qapıya yanaşaraq*). Mariya, Mariya!..

M a r i y a. Nə var, əzizim?.. (*Gəlir*) Nə olmuşdur?

G e n e r a l. O xəncərə əl vurmayın... Birdən zəhərlənmiş olar... Bu vəhşilər hər şeyə əl atırlar.

M a r i y a. O necə oldu? Gözəl kişidir. Əsl qafqazlıdır.

G e n e r a l. Doğrudur, əzizim. Paruçik Tamarin də bunların zahiri gözəlliyinə vurulub, nəhayət özünü məhv etmədimi?

M a r i y a. O ölmüşdürmü?

G e n e r a l. Şamilə əsir düşmüşdür. Bu, ölümdən də pisdir. İndi ağıllanar... Hacı Murad da mənə əsir düşdü. İndi Şamilin sağ əli zəncirlə bağlanmışdır!..

P ə r d ə

## YEDDİNCİ ŞƏKİL

Şamilin evində bir otaq. Şamil pəncərə önündə dayanıb uzaqlara boylanır.

A t a y (*yüyürüb gəlir*). İmam, Qazı Məhəmmədin qoşunu basılıb geri qayıdır...

Ş a m i l. Bu, çoxdan mənim ürəyimə dammışdı... Bəs Qazı Məhəmməd özü hanı?.. Mən onun iki gözünü bir bəbəyindən çıxardacağam...

A t a y (*qorxa-qorxa*). Oğlunuzun heç bir təqsiri yoxdur. Siz onu yaxşı tanıyırsınız. Qazı Mirzə Sadıq aulun adamlarını vuruşmağa qoymamışdır, imam...

Ş a m i l. Sən də onun günahını azaldırsan. Təqsir mənim doğma balamdadır...

A t a y. And olsun Allaha, imam, Qazı Məhəmməd öz əlində siyirmə qılınc irəli atılıb qızmış pələng təki vuruşurdu... O, axır nəfəsinə kimi səngəri əlində saxlayıb düşməni bir addım irəli gəlməyə qoymayırdı. O basıldığını görəndə özünü çaya atıb boğmaq istəyirdi ki, mən özümü yetirib qabağını kəsdim. Sinəsi üç yerindən ağır yaralanmışdı. Ancaq yenə də ayağa qalxıb bağırırdı: “İrəli, ey ana torpağın igid oğulları!..” Yox, imam, Qazı Məhəmmədin basılmağından kədərlənməyin. Düşmənlər də ona baxdıqca “Afərin” deyirdilər.

Ş a m i l (*sevinir, amma sevincini gizlətməyə çalışaraq*). Bu sözlərində yalana bənzər bir şey olarsa, bilirsənmi, cəzan nədir?

A t a y. O zaman yalan deyən dilimi dibindən qopardın, imam...

Müridlər qollarının üstündə Q a z ı  M ə h ə m m ə d i gətirirlər və taxtın üstünə uzadırlar.

Ş a m i l (*təmkinli addımlarla oğluna yanaşır, bir an onun üzünə baxır. Onun gözləri yaşarır. Yanındakılar ağladığını duymasınlar deyə, üzünü yana çevirib göz yaşını silir*). Atay, oğlum, onu meydanda tək qoyan arsız qazını bu dəqiqə mənim yanıma gətir!..

A t a y. Baş üstə!.. (*Gedir*)

Ş a m i l. Həkimlərə göstərdinizmi?

B i r i n c i m ü r i d. Göstərdik, imam... heç bir əlac eliyə bilmədi... Güllə dərində qalıb, imam...

İ k i n c i m ü r i d. Hamı yaralarına baxıb "hayıf" deyirdi... Bu, güllə yarası deyil,top yarasıdır... Elə bil bədənində bir damcı qan da qalmayıb, imam..

B i r i n c i m ü r i d. Bağışlayın, imam, deməyə də qorxuram...

Ş a m i l. Nədən qorxursan?

B i r i n c i m ü r i d. Yaranalın qoşunu bu saat lap yaxındadı. Onların bir həkimi var. Deyirlər ki, ölünü dirildir... Məndən olsa, gedib onu çağırarıq...

Ş a m i l. O gələrmi?.. Düşməni ölümdən qurtarmağa o razılıq verərmi?..

B i r i n c i m ü r i d. Gedib yalvararıq... Qazı Məhəmməd ölsə, bizim belimiz sınar, imam... İzn verin, gedib baxtımızı sınayaq... Əsir alınmış Tamarin deyirdi ki, o həkim bütün dünyada məşhurdur...

Ş a m i l. Tamarin indi haradadır?

B i r i n c i m ü r i d. Yəqin zindandadır, imam...

Ş a m i l. Yox, yox, düşməndən imdad istəmək, ağılsızlıqdır. (*Yenə Qazı Məhəmmədin üzünə baxır, bir neçə an tərəddüd göstərir*) Düşmən də olsalar, mən onlardan imdad istəyəcəyəm... Ata ürəyinin sızıltılarını duyan həkimdirsə, gələr... Gedin, onu gətirə bilsəniz, ömrüm uzunu sizə minnətdar olaram...

D m i t r i (*gəlir*). İmam, doktor Tamarinin yaxın dostudur... Gedim ondan kağız alım... Sizi inandırıram ki, o saat gələr, razısınızmı?

Ş a m i l. Zindana salınmış bir əsir, belə kağız verərmi? Doktor gələrmi?

D m i t r i. Məncə, gələr, imam... Dostunuzun ricasını yerə salmaz...

Ş a m i l. Razıyam, get... Düşmən, oğlumu əlimdən alır, Dmitri... mən nə qədər bədbəxt adamam...

D m i t r i. Mən getdim... Bu dəqiqə qayıdıram... (*Yüyürüb gedir*)

Q a z ı  M ə h ə m m ə d (*sayıqlayır*). Namərd, geri qaçma. Hara? Gəl, gəl, hələ mən ölməmişəm... (*Ayağa qalxaraq qılınca sarılır və hücum vəziyyəti alaraq yüyürür; Şamil onun qabağını kəsərkən, Qazı Məhəmməd atasını görüb dəhşətlə onun üzünə baxır, əlini alnına vuraraq*) Ata! Sənsənmi? Ar olsun mənə!..

Ş a m i l. Sakit ol, mənim körpə aslanım, sakit ol... Ananın südü sənə haladır!.. Sinəndəki yaraların hər biri bir şücaətli hücumdan yadigardır!.. (*Onu gətirib yerinə uzadır*) Sən nə üçün məndən kömək istəmədin, oğlum?..

Q a z ı  M ə h ə m m ə d. Dalınca qasid yollamışdım, ata... Səndən cavab gəlmədi... məni bağışla... Görürsənmi, sinədən aldığım yaralar məni öldürür...

Ş a m i l. Göndərdiyin qasid kim idi?..

Q a z ı  M ə h ə m m ə d. Müridlərdən birini yollamışdım... qazanışlı Murtuzanı...

Ş a m i l. Aha... (*Xatırlayaraq*) Soltan öldürən qasiddir?.. Odur, özüdür. (*Yanındakı müridlərə*) Bunu o biri otağa aparın. Anası görməsin... yanına heç kimi buraxmayın...

Müridlər Qazı Məhəmmədi o biri otağa keçirirlər.

D m i t r i (*gəlir*). Tamarindən kağız aldım, imam... Buyurun!.. O sizin tərəfdarınızdır, imam...

Ş a m i l. Səndən çox razıyam, Dmitri. Ancaq onun sağalmağına heç bir ümid qalmamışdır. (*Müridlərə*) Bu kağızı da aparıb gedin. Allah sizə yar olsun, övladlarım...

B i r i n c i M u r a d. Bu saat, imam... (*Bir nəfərlə gedir*)

Ş a m i l. Dmitri!.. Onun yaraları polad ürəkli Şamili bir dəqiqənin içində gücdən saldı. Aman Allah, o ölsə, mən dözə bilərəmmi?..

D m i t r i. Qorxmayın, imam... Doktor gələrsə, Qazı Məhəmmədi mütləq ölümdən xilas edəcəkdir. O, Tamarinin sözündən çıxmaz.

Ş a m i l. Tamarin nəçidir, Dmitri?

D m i t r i. Paruçikdir, imam... Özü də Rusiyanın böyük şairidir. Hər sözü dillər əzbəridir. Çox gözəl şairdir...

Ş a m i l. Şair? Yox, yox, şair qəlbi zindanlara sığışmaz... Onun dərin xəyallarını zəncirləmək, böyük nəzakətsizlikdir.

D m i t r i. O bizimlə bərabər çar qoşunlarının qabağına çıxıb vuruşarsa, böyük qüvvədir. Onu görən soldatlar, o dəqiqə silahlarını töküb bizim tərəfimizə keçərlər...

Ş a m i l. Dmitri, sən bilirsən ki, bizə kömək əlini uzadan urusa, gözlərimiz üstündə yer var... Mən yoxlaram... O ürəkdən bizə tərəfdar olsa, günü bu gün həbsdən buraxıb, dəstələrdən birini ona tapşıraram... (*Müridlərdən birinə*) Get, Tamarini mənim yanıma gətir.

M ü r i d. Baş üstə! (*Gedir*)

A t a y. Qazını qabağına salıb gətirir. Budur, imam, o, bu Qazıdır...

Ş a m i l (*nifrətlə ona baxır*). Bu Qazı deyil, ağzı otlu heyvandır...

Q a z ı. Xadim ədyan üçün bu təhqirat şərən məqbul deyil, imam...

Ş a m i l. Xadim ədyan... Xadim ədyan... Axmaq!.. Sənin borcun dinə yox, insana qulluq etməkdədir... Bu əmmamənin altındakı başdırmı, yoxsa saman çuvalıdırmı?..

Q a z ı. Mənim günahım nədir, imam həzrətləri?..

Ş a m i l. Sən bilirsənmi avar xanlarının başı nə üçün kəsildi?..

Q a z ı. Bilirəm, əlbəttə bilirəm, imam...

Ş a m i l. Bilsəydin, öz başının da qədrini bilərdin...

Q a z ı. Onlar din islamının düşməni idi.

Ş a m i l. Onlar xalqın düşməni idi. Get, o sarığı çıxart, körpəli analara deyin, qoy bölüşdürüb uşaq əskisi eyləsinlər. Bundan sonra fikirləşəndə topuğunla yox, başınla düşünməyi öyrən... cəbhələrdə qanını axıdan xalqın sənə veriləsi müftə çörəyi yoxdur... Get, itin qanına əl bulaşdırmağa nə həvəsim var, nə də vaxtım...

Q a z ı. Pərvərdigara, mən nə günahın sahibiyəm?

Dodağının altında mırıldana-mırıldana gedir.

A t a y. Canın yaxşı qurtardı, Qazı... get Allahına şükür elə... (*Gedir*)

Ş a m i l. Qazı... müftə çörəyə dadanmış itlərin hamısı belə ruhanidir. Bunların kökünü kəsəcəyəm... Gəl, Dmitri, biz səngəri yoxlamağa gedək!.. (*İçəri otaqdan Qazı Məhəmmədin iniltilərini eşidərək dayanır*) Oh... doktor gələcəkmi?

Gedirlər. Səhnə boşalır. Birdən S o l t a n içəri girir. O tərəf-bu tərəfə boylanır. Qazı Məhəmməd olan otağın qapısından boylanır, üzü gülür.

S o l t a n. Sevin, ürəyim!.. Mənə qan ağladanların səadət sarayı uçdu!.. Mən bilirəm ki, şamillər də, generallar da ölüb gedəcək... Amma qızıl pulların qiyməti də, özü də əbədidir... Ox, Şamil!.. İndi meydanda bircə sən qalırsan, Əminət! Əminət!.. Bunlar haradadır!.. Əminət!..

A n a (*gəlir*). Oğlum, Soltan, Şamil hanı?

S o l t a n. Bilmirəm, ana... yəqin el üçün ağlayır... Görünür, səngəri möhkəmdir. Ana, Hacı Murad generalın tərəfinə keçdi, oğlunu meydanda tək qoydu.

A n a. Sən nə danışırsan, ay oğul?

S o l t a n. Bəli. Mən deyənə inanmırdı. Öz doğma qaynının sözünə baxmadı. Hanı Hacı Murad?.. Şamili öldürmək istədi, amma bacarmadı. Odur ki, dəstəni başsız qoyub getdi. düşmənlərə qoşuldu. (*Sükut edərək*) Əminət hanı, ana?..

A n a. Burdadır. (*Qazı Məhəmmədin iniltisini eşidərək*) Bu nə səsdir, oğul?

S o l t a n (*dərindən ah çəkərək*). Bu da bir itki... Qazı Məhəmmədə bir şey olsa, mən də özümü öldürərəm, ana...

A n a. Qazı Məhəmməd?.. Aman Allah, onu yaralayıblarmı? (*Cəld onun yanına gedir*)

S o l t a n (*yenə çağırır*). Əminət!..

Ə m i n ət (*gəlir*). Soltan, sənsən?

S o l t a n. Şamilin toyu nə vaxtdır?

Ə m i n ə t. Hansı toy, qardaş?

S o l t a n. Sən niyə mənim sözlərimə inanmayırsan, bacıcan. Məgər burada səni məndən çox istəyən varmı?..

Ə m i n ə t. Mən Şamildən xəbər aldım... O, qəh-qəh çəkib güldü... "Nə Hacı Murad?" dedi...

S o l t a n. Əlbəttə, gülər... Üstünə arvad alanda səndən üzr istəməyəcək ki?.. Dünən hücumdan qabaq dostlarından ikisini elçi göndərdi.

Ə m i n ə t. Sən gördünmü?..

S o l t a n. O, bu əhvalatı məndən də gizlədir...

Ə m i n ə t. Yox, yox, mən də sevda üçün doğulmuşam... Onun nəvazişləri mənim haqqımdadır... Belə olsa, özümü çaya atıb boğaram... İyirmi il, düz iyirmi il bütün əziyyətlərə qatlaşıb, onun hər dərdinə şərik oldum. Qüssələrini bölüşdüm... Onun yaralarını sarıyan mən, iniltilərini eşidəndə ürəyimin yağını əridən mən... Yox, qardaşım, bu dərdə mən dözmərəm. Mən özümü boğub öldürərəm.

S o l t a n. Yox, yox, mən sağ ikən hayıfını onda qoymaram. (*Qazı Məhəmmməd olan otağı göstərərək*) Günahsızların qarğışı onu tutdu. Odur, oğlu ölüm yatağındadır.

Ə m i n ə t (*qulaqlarına inanmayaraq*). Kim, mənim oğlummu?

S o l t a n. Vallah, məni də yandırır... Sənin balandır... Müqəssir ərindir, bir parça uşağı tovlayıb ölümə yolladı.

Ə m i n ə t. Aman Allah, bu əzaba təkcə mənimi layiq gördün. (*Dəli kimi özünü o biri otağa atır. Hönkürtü ilə ağlayır*)

S o l t a n. Bacımdır. Amma bu fəryadı ürəyimdəndir. Müqəssir mən deyiləm, qoy Şamilin beli sınsın, yalnız o zaman qədrimi bilər...

Ə m i n ə t (*saçını yola-yola qayıdır*). Onu kim bu günə saldı, kim?.. (*Birdən dayanır, dizi üstə qapanır*) İlahi, onu əlimdən alıb, məni gözüyaşlı qoyma... Ey böyük Tanrı, Qazı Məhəmmədi mənə çox görmə...

S o l t a n. Ürəyimə od salma, bacı... Sənin bu acı fəryadın ciyərimi qana döndərdi...

Ə m i n ə t. Ey yeri-göyü yaradan Allah, biz nə günahın sahibiyik? (*Yenə hönkürüb ağlayır*)

S o l t a n (*onun qollarından tutub qaldırır*). Qalx, Əminət, qalx... Gedək, bacıcan, Allah kərimdir... (*Onu o biri otağa aparır*)

M ü r i d (*Tamarini gətirib gəlir*). Otur, Şamil buraya gələcək.

T a m a r i n. Doktor gəldimi?

M ü r i d. Yox, hələ gəlməyib... Sən bilən, yaranal ona izn verər?

T a m a r i n. O razı olmaz... Ancaq özü mənim kağızımı alsa, gələr...

Pauza

M ü r i d. Aha, İmamdır... Sən onun qabağında baş əy... Böyüyümüzdür... Onun hörmətini saxla... ha...

T a m a r i n (*qımışaraq*). Baş üstə!..

Ş a m i l (*Dmitri ilə bərabər qayıdır*). Aha, Tamarin budurmu?.. (*Ayağa qalxmaq istəyən Tamarinin çiyinlərindən basıb oturdur*) Lazım deyil... Bunsuz da keçinə bilərik.

D m i t r i (*təzim edərək*). Salam, cənab paruçik.

T a m a r i n. İndi mən paruçik deyiləm. Dmitri... Əsirə təzim etməzlər...

Ş a m i l. Nə oldu, doktor gəlmədimi?

M ü r i d. Hələ yox, imam...

Pauza

Ş a m i l. Tamarin! Mən düşmənə qarşı amansızam...

T a m a r i n. Başqa cür də ola bilməzdi...

Ş a m i l. Amma deyirlər ki, sən bizim düşmənimiz deyilsən...

T a m a r i n. Mən bütün insanların dostuyam...

Ş a m i l. Sizin padşah da insandır...

T a m a r i n. Yox, o, insan qatilidir... Yaratdığı ən böyük əsər də dar ağacıdır.

Ş a m i l. Mən düşmənəm... mənimlə bərabər qılınc çalmaq istəsən, din ayrılığı, millət ayrılığı bizim dostluğumuza mane ola bilməz.

T a m a r i n. Mən qılınclara, qalxanlara da düşmənəm.

Ş a m i l. Bunlarsız azadlıq mümkün deyil...

T a m a r i n. Onu da bilirəm, bilirəm ki, yalvarıb-yaxarmaqla kar aşmaz... Lakin sənin də yolun insanları səadətə çıxartmayacaq...

Ş a m i l. Nə üçün?

T a m a r i n. Sən zülmə qarşı islam bayrağı qaldırırsan... İslam da xristiyanlıq kimidir... Bütün dinlər yer üzündəki səadətlərin düşmənidir.

Ş a m i l. Dmitri, sənin dostun iki yol ayrıcında qalmış mürtəddir...

D m i t r i. Cənab paruçik, imam sizi dost kimi yanına çağırmışdır... bax, mən də rusam. Mən ona qardaşlıq əli uzatdım... məni də müridliyə qəbul etdi... İmamın qoşununda üç yüz əllidən çox rus soldatı vardır.

T a m a r i n. Dmitri, sən ki, bilirsən, min illərdən bəri yalnız ölüm axtarıram...

Ş a m i l. Ancaq ölüm də qurtuluş yolu deyil... Gələcək nəsillərin dərdini düşünməyən igidin həyatı mənasızdır.

T a m a r i n. Mən döyüş meydanında yalqız qalmış bir insanam, imam, mən sürgünlərdə, dar ağaclarında, zindanlar küncündə məhv olmuş böyük bir nəslin son qırıntısıyam...

Ş a m i l. O, hansı nəsildir, Tamarin?..

T a m a r i n. O nəsil, ana Rusiyanın səadəti yolunda vuruşub namus üçün məhv olan Puşkinin nəslidir.

Ş a m i l. O, kimdir?

T a m a r i n. Omu?.. Bütün insanların dostu, mənim müəllimim böyük Puşkin... mən onun yolunda öləcəyəm, imam...

Ş a m i l. O doğrudan da böyük şairdirsə, mənə tərəfdar olar. Çünki mən də gözəl sənətkarlara pərəstiş edirəm. Mən də insan zəkasının azadlığını qoruyuram... Bu qılıncı din yolunda, islam yolunda oynatmıram... Mən də sizin düşmənlərinizlə vuruşuram...

K ə r i m ə t (*yüyürüb gəlir*). İmam... Böyük ata... Yalvarıram. (*Şamilin qabağında diz çökür*) Mən onu tanıyıram. O bizi ölümdən qurtardı. Onu öldürməyin!..

Ş a m i l. Dustaq olmaq, ölmək deyil, qızım...

K ə r i m ə t. O bizim dostumuzdur, imam... Onu bağışlayın.

Ş a m i l. Aparın!.. Fikirləşsin... Mən oğlumun dərdini unuda bilmirəm.

K ə r i m ə t. Ayaqlarına düşüb yalvarıram, böyük ata. Mən ona yemək aparmışdım. Zindanın qarovulçusu dedi ki, zabiti öldürməyə apardılar.

Ş a m i l. Qızım, onu heç kim öldürmək fikrində deyil. Mən onu əsirlərə dəyişəcəyəm. (*Müridə*) Apar!..

Tamarini aparırlar.

K ə r i m ə t. Yazıq oğlan. (*Hönkürtü ilə ağlayaraq gedir*)

B i r i n c i m ü r i d (*yoldaşı ilə bərabər gəlir*). Həkim gəlmədi, imam...

Ş a m i l. Onu gördünüzmü?

B i r i n c i m ü r i d. Atımızı yel kimi çapıb onun qərargahına getdik. Əvvəlcə bizi yaxın qoymaq istəmirdilər... Ağ bayraq qaldırdıq, razı oldular... Həkimin özünü görə bilmədik... Bir nəfər soldat kağızı bizdən aldı, dedi ki, nə təhər olsa həkimə çatdıraram...

Ş a m i l. Deməli, həkim ümidi də puç oldu... Dostum, Dmitri, söylə, mən nə etməliyəm, nə?

D m i t r i. Darıxmayın, imam... Sizə bədbinlik yaraşmır.

Ş a m i l. Gəl, Dmitri... (*Qazı Məhəmmədin iniltisini eşidərək dayanır*). Yox, mən onun yaralarına bir də baxa bilmərəm. Gedək, Dmitri, nə qədər uzaqda olsam yaxşıdır.

Gedirlər.

S o l t a n (*gəlir*). Getdilər. Doktor çağırdılar. Əbləhlər! Gör kimdən kömək gözləyirlər... Generalın başına hələ soyuq dəyməmişdir. O, atdığı güllənin yarasını sağaltmağa doktor yollasaydı, ona mən də axmaq deyərdim... (*Kimi isə görərək*) Bu nədir?.. Mən yuxumu görürəm? Rus həkimi burayamı gəlir?..

D o k t o r (*eşikdən*). Şamil!..

S o l t a n. Buyurun, cənab...

D o k t o r (*gəlir*). Şamil hanı? Mən dağların azad soltanını görmək istəyirəm... yaralı hanı?

S o l t a n. Hansı yaralı?.. Əvvəla burda heç bir yaralı-filan yoxdur... İkinci, Şamil gavurlara yaralı tapşırmaz.

D o k t o r. Aha, sizi mən harda isə görmüşəm... Siz Mefistofel kimi harada aş olsa, orada başsınız, deyilmi?

S o l t a n. Mefistofel nədir?

D o k t o r. O, insan olsaydı, sənə oxşardı... Ancaq o şeytandır...

S o l t a n. Artıq-əskik danışma. Əkil burdan, yoxsa hər tikən qulağın boyda olar. (*Xəncəri qınından çıxardaraq*) Get, yoxsa...

D o k t o r (*revolverini çəkir*). Əl saxla, cənab... Mən yaralıları sağaltdığım kimi, sağ adamları yaralaya da bilərəm...

S o l t a n. Rədd ol burdan... Mən razı olmaram ki, dinsizlər bizim yaralılara əl vursunlar...

D o k t o r. Sənin razılığını soruşmaq fikrində deyiləm. Məni Şeyx Şamil özü çağırtdırmışdır. Aha, gələn yəqin odur.

S o l t a n. Ax, xain!.. (*yüyürüb cəld gözdən itir*)

Ş a m i l (*gəlir*). Sən kimsən?..

D o k t o r (*qımışaraq*). Gündə yüzlərcə yaralını operasiya edib yorğun düşmüş doktoram.

Ş a m i l. Sənə kim dedi?

D o k t o r (*kağızı göstərərək*). Dostum Tamarin yazmışdı... Atı minib köməyə gəldim... Yaralı hanı?.. Mən elmin gücünü sınamaq istəyirəm.

Ş a m i l. Düşməni sağaldarsanmı?

D o k t o r. Yaralı insan hər yerdə mənim dostumdur...

Ş a m i l. Böyük insan da hər yerdə Allah qonağıdır... Xoş gəlmisən... Buyur. (*Əlilə Qazı Məhəmməd olan otağı göstərir*) Sən get, mən onun iniltilərinə dözmürəm... Mən yaralının atasıyam...

D o k t o r. Qorxmayın... Ürəklə çalışaram... İgid insanları müalicə edərkən, xüsusi ləzzət alıram... (*Gedir*)

A n a (*Qazı Məhəmmədin otağından çıxır. O, gözlərinin yaşını silir. Şamili görüb dayanır*). Oğlum, bu dərdə mən necə dözüm, necə?.. (*Ağlayır*)

Ş a m i l. Ağlama, ana... Qazı Məhəmməd mənim oğlumdur... Ölməyəcək... Sinəsindən yaralanmaq bizim adətimizdir...

A n a. Onu qan aparır. Rəngi kağız kimi ağarıb... Həkim əlac edə biləcəkmi?

Ş a m i l. Get, ana, Allah kərimdir.

O, gözlərini silə-silə gedir.

S o l t a n (*gəlir, Şamili görüb çəkilmək istərkən, Şamil də onu görür. O dayanır*). Xoş gördük, imam. Aşağılarda səngəri möhkəmlətdim... Bərk dayanmışıq... Bu mühasirə on il də sürsə, mənim iradəmi zəiflədə bilməz.

Ş a m i l. Soltan, sən də belə?.. (*Acığından dəhşətlə parıldayan gözlərini Soltana zilləyərək, addım-addım yaxınlaşır*) Düşmən qorxulu deyilmiş... Ən qorxulu insan mənim dostlarımın arasında imiş...

S o l t a n. Nə olmuşdur ki?.. Nə üçün belə acıqlısınız, imam?

Ş a m i l. De görüm, Qazı Məhəmmədin yolladığı qasid sənə nə demişdi?.. O nə xəbər gətirmişdi?

S o l t a n. Nə xəbər?!

Ş a m i l. Bəli, bəli, nə xəbər gətirmişdi?

S o l t a n. Bilmirəm siz hansı qasidi deyirsiniz?

Ş a m i l. Sən öldürəni...

S o l t a n. Mən?.. Qasidi öldürmüşəm?.. Dəli deyildim ki?

Ş a m i l. Sən çox ağıllısan... Ancaq de görüm qasidi niyə öldürdün?..

S o l t a n. O, qasid deyildi... Tüfəngi qaldırıb sizi nişan aldığı zaman mən onu vurmaya bilməzdim, imam.

Ş a m i l. Sualıma cavab ver... O, Qazı Məhəmmədin yanından qayıdarkən nə xəbərlə gəlmişdi...

S o l t a n. O mənə heç bir şey demədi, imam.

Ş a m i l. Soltan, xain mənim öz doğma balam da olsa, mən onun başını bədənindən ayıranda uf demərəm... Eşidirsənmi?..

S o l t a n. Siz mənim sədaqətimə şübhə edirsiniz. İmam... Mənim üçün yalnız ölüm əfsəldir. (*Xəncərini çəkib özünü vurmaq istəyir*)

Ş a m i l (*xəncəri dartıb alır, qınına soxur*). Axmaqlama!..

S o l t a n. Bir halda ki, mənə etibar eləmirsiniz, bu papaq mənə haramdır, imam...

Ş a m i l. Yaraqlarını tök yerə.

S o l t a n (*xəncərini, qılıncını, tapançasını açıb yerə tökür*). Əmr edin boynumu vursunlar... (*Dizi üstə qapanır*)

Ş a m i l. Dur, get... bu gündən mənim Soltan adlı qaynım yoxdur... Öldürərdim, amma Əminətə bağışlayıram.

S o l t a n (*qalxıb gedə-gedə*). Sədaqət göstərən adamların axırını həmişə belə gördüm. Mən indi gördüm ki, doğrudan da axmaq adamam. Sizi öldürmək istəyən xainə mane olmasaydım, indi mən də bir kişi idim... Siz haqlısınız, imam... Mən gedirəm... Amma qoy Allah özü şahid olsun ki, mənim vicdanımda bir nöqtə qədər də ləkə yoxdur...

Ş a m i l. Get, bir də gözümə görünmə...

S o l t a n. Eybi yoxdur. Səhvinizi düşünəndən sonra, kimin haqlı olduğu aydınlaşar... (*Gedir*)

D o k t o r (*gəlir*). Qaynar su versinlər.

Ş a m i l. Bu dəqiqə...

Şamil gedib bir qab su gətirir, doktora verir.

Doktor, heç ümid varmı?

D o k t o r. Səbr edin... (*Gedir*)

Ş a m i l. Səbr edin... Mənim iztirabımı duymayır... (*Təəccüblə baxaraq*) Bu nədir?

D m i t r i, bir neçə Müridlə S o l t a n ı qolları üstündə gətirir.

D m i t r i. Özünü vurdu, imam...

Ş a m i l (*sarsılaraq*). Doğrudanmı? Birdən o haqlı olsa? Yox, yox, oğlum mənə yalan deyə bilməz...

Soltanı taxtın üstünə uzadırlar.

D m i t r i. Bərk yaralanmışdır, imam...

S o l t a n (*gözlərini açır, bir an hərəkətsiz dayanıb məchul bir nöqtəyə baxır və iniltili bir səslə çağırır*). İmam, imam.

Ş a m i l. Mən burdayam.

S o l t a n. Ölürəm. Son nəfəsimdir. İnanın ki, mən sizin yolunuzda ölürəm. mənim sədaqətimə inanın. Soltan ölər, amma xəyanət eləməz.

Ş a m i l. Elə qüvvətli bir gözüm olaydı ki, onun ürəyindəkiləri görə biləydim... O biri evə aparın... Bu gün bizimki belə gətirdi...

D m i t r i (*Soltanı götürüb apara-apara*). Bu dirilməz. Sinəsindən qan çeşmə kimi axır...

A t a y (*yüyürüb gəlir*). İmam, imam!.. Hücum başlandı!.. Gəlirlər.

Ş a m i l. Bağırma, Atay, hücum qabağı adam özünü itirməz... Sənə nə olmuşdur? Hamını toplayın... (*Dmitrini yanıma çağır*)

A t a y. Bu saat... (*Gedir*)

Ş a m i l. Ax...Hacı Murad... Hacı Murad... Mən sənin qədrini yalnız indi bilirəm... Ana, ana!.. Bura gəl...

A n a (*gəlir*). Qurbanın olum, həkim neylədi?..

Ş a m i l. Ana, sən adamları məndən yaxşı tanıyırsan. De görüm, Soltan nə yuvanın quşudur?

A n a. Soltan?.. Niyə xəbər alırsan, qadan ürəyimə?

Ş a m i l. Sən onu uşaqlıqdan tanıyırsan...

A n a. O nəslə mənim etibarım yoxdur, oğul... Onlardan bircə gəlinimdir...

Ş a m i l. Soltan özünü sinədən vurmuşdur, ana. Bu, igidlik nişanəsidir. Hacı Murad yaxşı adamdır, yoxsa Soltan?

A n a. Mən nə deyim, oğul?.. Deyirlər Hacı Murad uruslara qoşulub... Doğrudurmu, bala?..

Ş a m i l. Bu böhtanı sən kimdən eşitdin?

Ə m i n ə t (*gəlir*). Mənim qardaşım nə günahın sahibidir? Ondan nə istəyirsən?.. Oğlumun dərdi mənə bəs deyildimi, yoxsa sən məni bütün ömrüm boyu gözü yaşlımı qoymaq istəyirsən?

Ş a m i l. Əminət, Soltanı vuran mən deyiləm, özüdür...

Ə m i n ə t. Aman yarəbbi, o ölsə mən neylərəm! Ver mənim qardaşımı, onun ölümünə bais sənsən... Ver mənim oğlumu, onu da sən tovlayıb ölümə yolladın...

Ş a m i l. Əminət, mən Qazı Məhəmmədi də, Soltanı da səndən az istəmirdim... Qardaşın günah işlətdi, mən də onun yaraqlarını aldım. O özünü sinədən yaralasa, da mən onun günahından keçmirəm...

Ə m i n ə t. Yox, yox, bütün günahlar səndədir... Sən qardaşımı qəsdən bu günə saldın. Sən Hacı Muradla qohum olub, qardaşımı gözdən salmaq istəyirdin.

Ş a m i l. Bu nə deməkdir?

Ə m i n ə t. Sən bunu dana bilməzsən... Elçi yolladığını məndən niyə gizlədirsən?..

Ş a m i l. Bu böhtanları uyduran əlimə düşsəydi, mən onun dilini kəsib, yerinə duz səpərdim... Əminət, bir Allah özü şahiddir ki, mən sənin qəlbini zərrə qədər də incitmək xəyalında deyiləm.

Ə m i n ə t. İlahi, oğlumu da, qardaşımı da əlimdən alırsan... Bu dünyada mənim heç kimim qalmayacaqmı? (*hönkürüb ağlayır*)

Ş a m i l. Ağlama, Əminət, ağlama... (*Ona yaxınlaşıb boynunu qucaqlayır*) Unutma ki, mən də atayam. Yadındadırmı, hələ o, səkkiz yaşında ikən mən ölümcül yaralanmışdım. Bizi hər tərəfdən düşmənlər bürümüşdü. Mən özüm güclə yeridiyim halda Qazı Məhəmmədi dalıma götürüb bütün gecəni sürünə-sürünə dağlara dırmaşdım. Səhər açılanda sən məni tanımadın. Mən onu düşmənə verməmək üçün bütün qanımı yollarda axıda-axıda gəlmişdim. Sən mənim üzümə baxanda

quruyub qalmışdın. "Bu nədir? – deyirdin. – Səndə bir damcı qan da qalmamışdır..." Yox. Mənim öz balamı nə cür istədiyimə sən şahidsən...

Ə m i n ə t (*yenə Qazı Məhəmmədin iniltisini eşidərək*). Odur, Qazı Məhəmməd orada ölümlə pəncələşir. O mənim yeganə oğlumdur, o birisi... Hanı Cəmaləddin? Sən onu Rusiya padşahına əmanət yollamadınmı? Sən, dünyanın bütün nemətlərindən əziz olan doğma balamı qurban vermədinmi?

Ş a m i l. Sakit ol, Əminət, bu vətəndir, biz hamımız onun üçün yaşayırıq. Sən körpə aslanımın anasısan, sən göz yaşı axıtmağa haqlı deyilsən... Get, Soltanın yaralarını bağla...

A n a. Gəl, qızım... belə uğursuz günlər getsin, gəlməsin... (*Əminəti aparır*)

Ş a m i l. Əminət, Əminət... Sən nə qədər sadə ürəklisən... (*Qazı Məhəmməd inildəyir*) Oh... bu səs... (*Qazı Məhəmmədin yanına keçir*)

K ə r i m ə t (*gəlir*). Bu nə iniltidir?

Pauza

Zabit... Zabit... Onun adı gələndə ürəyim necə döyünür... O, insandırmı, yoxsa mələkdirmi?.. Mən onu zindandan qurtarıb özümlə bərabər uzaqlara apara bilsəydim... Bütün qüssələrim bir anda yox olub gedərdi. Yalnız o bilsəydi ki, bu ürəyimdə ona qarşı nə qədər böyük, nə qədər ülvi bir məhəbbət var. Yox, mən onu ölümdən qurtaracağam... (*Soltanın yerə atdığı xəncəri götürür*) Budur, açar... Dustaqxananın qapısını bu xəncərlə açacağam. (*Gedir*)

D o k t o r (*gəlir*). Budur, səhərdən bəri əlləşib tapdım... (*Əlində tutduğu mərmər qırıntısını Şamilə göstərərək*) Oğlunuzu narahat edən bu idi...

Ş a m i l. Doktor, məni bağışla, onun sağlamlığına ümid varmı?

D o k t o r. Aslan ürəkli igidlərə ölüm yaraşmaz... Oğlunuz sağalacaqdır. Böyük bir atanı sevindirdikcə nə qədər şad olduğumu bilsəydiniz...

Ş a m i l. Çox razıyam... Yaralı düşməni görəndə igidin qəlbi gərək ipək kimi yumşaq olsun... Bu unudulmaz dostluğumuzun xatirəsinə yadigar üçün ən çox sevdiyim köhlən atımı sənə bağışlayıram...

D o k t o r. Sağ olun... Mən vətənə qayıdıram... Rusiyaya. Moskvaya qayıdıram. Mənə at lazım deyil...

Ş a m i l. Peşkəşi geri qaytarmazlar.

D o k t o r. Böyük insanın bir təşəkkürü, hər şeydən qiymətlidir...

Ş a m i l. Sənin kimi rusları mən ürəkdən sevirəm... (*Doktoru qucaqlayır, alnından öpür*) Dostlarına söylə ki, Şamil özünü də, istəkli oğlunu da doğru yola qurban demişdir... Get, Allah sənə yar olsun...

Bu anda azan verilir, uzaqdan baraban səsləri gəlir.

D o k t o r. Gəlirlər... Yaralı bir neçə gün heç yana tərpənməsin...

Ş a m i l (*Doktoru ötürür*). Bu səsi eşitdikcə ürəyimin qanı gözlərimə vurur. (*Pəncərədən uzaqlara boylanaraq*) Ax, Hacı Murad, Hacı Murad... Sən and içdin, söz verdin...

A t a y (*gəlir*). İmam, gələn qoşuna baxdıqca adamın gözü qaralır... Geri çəkilsək yaxşıdır.

Ş a m i l (*həyəcanla*). Geri?.. (*Qazı Məhəmməd olan otağa sarı baxaraq*) Atay, sənin oğlun varmı?

A t a y. Var, imam.

Ş a m i l. Var. Amma yaralı deyil, eləmi?

Baraban səsləri yaxınlaşır, azan səsi güclənir.

A t a y. Ayrı yolumuz yoxdur... Bir baxın, bir baxın... Qoşun bulud kimi qaralır. On mindir, yüz mindir, bilmək olmur... Geri çəkilmək hamısından məsləhətdir...

Ş a m i l (*yenə pəncərədən baxır*). Dayandılar... O atlıları görürsənmi?

A t a y. Yəqin onların elçiləridir, İmam...

Ş a m i l. Qoy gəlsinlər... Sən get, elçini qarşıla.

A t a y. Baş üstə! (*Gedir*)

Ş a m i l (*qılıncını, xəncərini və tapançasını yoxlayır, üst-başını düzəldir, yenə pəncərədən boylanır*). Ax, Hacı Murad, Hacı Murad, sən indi haralardasan?..

A t a y (*Paruçik Rayevski bir neçə soldatla bərabər gəlir*). Bunlar yaranalın elçiləridir, tam...

Ş a m i l. Buyursunlar.

R a y e v s k i. Generalın təklifi belədir. İki saat müddətində bu qalanı tərk edin. Yoxsa iyirmi beş topla güllələbaran ediləcəksiniz...

Ş a m i l. Vəssalam?

R a y e v s k i. Bəli...

Ş a m i l. Mənim də cavabım onun təklifi kimi qısa olacaq... O bizdən qılınc yarasından başqa heç nə ala bilməz... Hücumu gözləyirəm.

R a y e v s k i. Aydındır. Gedək! (*Gedirlər*)

Ş a m i l. Atay, hamı hazırdırmı?

A t a y. Bəli, imam... Arvadlar, qızlar da əllərinə tüfəng alıb daxmaların, daşların dalına giriblər. Hamısı deyir ki, Qazı Məhəmmədi düşmənə verib getməmək üçün ölməyə də hazırıq.

Ş a m i l. Sağ olsunlar. İndiyə kimi, düz iyirmi il mən onlar üçün vuruşurdum, indi də onlar mənim üçün vuruşurlar...

A t a y. Gəlirlər, imam... Hücum başlandı. Qoşun dərədən sel kimi axıb üstümüzə gəlir. Onların nizələri, meşə kimi qaralır... Atlarının yerdən qaldırdığı toz, göyə dirək olmuşdur...

Bu anda top səsi eşidilir, minacat oxunur.

Ş a m i l. Mən hazıram... (*Qılıncını sıyırır*)

P ə r d ə

## SƏKKİZİNCİ ŞƏKİL

Şamilin mənzilində başqa bir otaq. Açıq pəncərədən eşikdə əli silahlı gəzinən qarovulçu görünür. İçəridə T a m a r i n yalqız durmuş, dərin xəyal içindədir.

T a m a r i n (*gözlərini uzağa zilləyərək*)

Görünür azadlığa həsrət qalacağam mən,
Hər acı məhbəs günü bir ilə bərabərdir.
Pəncərələr ucadır, əl çatmaz ona yerdən,
Qapımda da hər zaman gəzən keşikçi vardır...

Sakit-sakit baxıram məhbəs pəncərəsindən;
Gözlərimin önündə mavi boşluq açılır.
O mavilik içində şən quşlar qanad çalır,
Nə yaman sıxılıram onlara baxdıqca mən...

Sürətlə çap, ey zaman, ey quş qanadlı durna,
Bu dar məhbəs içində çatlayır bağrım aman.
Çatınca üzəngimi tutacaq ölüm, ancaq,
O zaman inqilabı əllərim qaldıracaq...

Sağ tərəfdəki qapı açılır, Tamarin təəccüblə baxır. A t a y l a D m i t r i daxil olurlar.

D m i t r i. Cənab paruçik, mən ən yaxın bir dost kimi sizin yanınıza gəlmişəm.

T a m a r i n. Çox şadam, Dmitri... Amma təəssüf ki, belə yerdə görüşürük...

D m i t r i. Hər şey özünüzdən asılıdır. Şamil sizi gözləri üstündə saxlar.

T a m a r i n. Mən yenə təəssüf edirəm ki, bu qanlı vuruşmaların sonu qaranlıq bir heçliyə doğru gedir.

D m i t r i. Gələcəyi bütün varlığı ilə sevən bir adam, gərək heç vaxt ümidsiz olmasın. Bax, mən ümidsiz deyiləm... Hətta biz hamımız bu vuruşmalarda məhv olsaq da, təəssüf etməməliyik...

T a m a r i n. Yox, Dmitri, mən buradan sağ qurtula bilsəm, düz birbaş vətənə qayıdacağam...

D m i t r i. Qayıtmayın, cənab paruçik, Puşkini məhv edən qatillərin arasına qayıtmayın. Kübarlar Sizi də onun gününə salmasınlar...

T a m a r i n (*təəccüblə Dmitrinin üzünə baxır*). Sən belə şeyləri haradan bilirsən, Dmitri?

D m i t r i. Mənmi?.. Siz buna nə üçün təəccüb edirsiniz?.. Mən soldat deyiləm, paruçik. Yalnız indi sizə açıb deyirəm. Mən də vətənindən cəbhəyə sürgün olunmuş bir ziyalıyam... Lermontovu xatırlayırsınızmı?

Namusun əsiri şair vuruldu!
Düşdü böhtanlara, düşdü şərlərə.
Sinəsində güllə, intiqam oldu,
O məğrur sənətkar yıxıldı yerə!..

Sizdəmi bu günə düşmək fikrindəsiniz?

T a m a r i n (*sarsılaraq*). Dmitri, mən yalnız indi səni tanıyıram...

D m i t r i. Gəlin, paruçik, bu qanlı vuruşmalarda polad qılınclarımızı sındırsaq belə tarix bizi təqsirləndirə bilməz. Xatırlayırsınızmı, hələ Puşkin deyirdi "Qandalları döyüb qılınc qayırın?" Biz də o deyən yolla gedirik... Bu qılınclar sınarsa, qandallarımızı döyüb təzə qılınclara çevirərik...

T a m a r i n. Şamil islam dinini...

D m i t r i (*onun sözünü kəsərək*). Qoy dinlər ayrı olsun, ancaq məslək bir... Odur, neçə gündən bəri mühasirədəyik. Amma yenə də ölüm heç birimizin iradəmizi zəiflədə bilməmişdir...

T a m a r i n. Məni görməyə gəldiyiniz üçün hədsiz təşəkkürlər...

A t a y. Dmitri, gecikərik, bəri gəl, qoy fikirləşsin...

D m i t r i. Şamil sizi əsirlərə dəyişmək fikrindədir... Məgər Siz bir də generalın yanınamı qayıtmaq istəyirsiniz?..

T a m a r i n. Yox, yox mən bu cür şərəfsiz ölmək istəmirəm... O, məni öldürmək üçün bəhanə axtarırdı... Yox, mən bir də onun yanına qayıtmaram.

D m i t r i. Mən də istərdim qayıtmayasınız... Siz doğrudan da şərəfsiz ölümə layiq deyilsiniz... Biz gedirik, paruçik... sabah yenə gələrik... Gecəniz xeyirə qalsın...

T a m a r i n. Sağ olun...

Çıxırlar. Tamarin yenə dərin fikrə gedir. Bir neçə saniyə hərəkətsiz dayanıb inadla bir nöqtəyə baxır. Bu anda, eşikdən nəğmə səsi eşidilir:

Mavi dumanlıqda, tutqun sularda,
Ağarır dənizdə tənha bir yelkən.
Nə arar o qərib, uzaq diyarda?
Neçin ayrılmışdır öz vətənindən?..

T a m a r i n. Rusca oxuyurlar. Demək, burada dil də azaddır. (*Qapıya yanaşaraq*) Gözətçi, gözətçi?

G ö z ə t ç i (*pəncərə qabağından*). Buyurun, cənab paruçik.

T a m a r i n. Oxuyanlar kimdir?..

G ö z ə t ç i. Kim?.. Şamilin müridləri.

T a m a r i n. Ruslardırmı?

G ö z ə t ç i. Elədir ki, var. Qafqaza sürgün olunmuş şair Lermontovun şerini oxuyurlar, cənab paruçik...

T a m a r i n. Aha... demək, o da mənim kimi sürgündədir?

G ö z ə t ç i. Bəli... Dmitri belə deyirdi... Onu da sürgünə yollayıblar...

T a m a r i n. Gözəl şeirdir... Mən də onu xatırlayıram...

Mavi dumanlıqda, tutqun sularda,
Ağarır dənizdə tənha bir yelkən...
Nə arar o qərib, uzaq diyarda?
Neçin ayrılmışdır öz vətənindən?..

(*Sükut edərək*) Gözətçi, səndən bir ricam vardır: onlara söylə ki, bir də bu nəğməni oxumasınlar.

G ö z ə t ç i. Niyə, cənab paruçik?

T a m a r i n. Çünki mən bu nəğməni dinlərkən öz yalqızlığımı xatırlayıb sıxılıram...

G ö z ə t ç i. Onlar mənim əmrimə tabe olmazlar, cənab paruçik, onlar da bu dağlılar kimi azaddırlar.

T a m a r i n. Azaddırlar?

G ö z ə t ç i. Bəli, nə üçün təəccüb edirsiniz?.. (*Oxuyur və gəzinməyə başlayır*)

Altında şəfəqli sular həmdəmi,
Üstündə günəşin ziyası parlar...
Fırtına axtarır üsyankar kimi,
Sanki fırtınada asudəlik var...

T a m a r i n. Hamı oxuyur... Bu mahnı bütün Qafqaz dağlarında da səslənir:

Fırtına axtarır üsyankar kimi,
Sanki fırtınada asudəlik var...

Var, asudəlik. İndi yoxdursa, bir zaman olacaq... Artıq mən buna inanıram.

G ö z ə t ç i (*pəncərə önündən görünərək*). Yorulmuşam... Dünəndən bəri vuruşurdum. Üç gündür yatmamışam. (*Oturub tüfənginə söykənir*) Eh... nə vaxt Sizin gözünüzə yuxu gedəcək?

T a m a r i n. Gözəl yerlərdir. Buradakı dağlar, dərələr, çaylar, nə qədər dilbərdir!..

G ö z ə t ç i. Cənab paruçik, niyə yatmırsınız?

T a m a r i n. Sən yat, mən heç bir yana gedən deyiləm. (*Otaqda gəzinə-gəzinə*)

Fırtına axtarır üsyankar kimi,
Sanki fırtınada asudəlik var...

Aha, o yatdı. Qoy yatsın.

K ə r i m ə t (*birdən içəri girir*). Məni bağışla, gözəl oğlan. Səni buradan qurtarmağa gəlmişəm.

T a m a r i n. Qurtarmağa?.. Yox, dağlar pərisi, görünür mən azadlığa həsrət qalacağam... Sən ki, gördün... Qapımda əli tüfəngli keşikçi

vardır... Burda keçirdiyim hər dəqiqə bir ilə bərabərdir, dağlar pərisi... (*Öz-özünə*) Hər səhər həsrətli gözlərimlə uzaq yamaclara, azad təbiətə baxdıqca, ürəyimdə onun, o qara gözlünün heykəli gəlib durur... Sənin adın nədir, gözəl pəri?..

K ə r i m ə t. Pərilər işgəncədən uzaq olurlar... Amma mən... yox, gözəl oğlan, mən yalnız işgəncədən yoğrulmuş bir zavallıyam.

T a m a r i n. Sənin adın nədir? Kərimət deyilmi?.. Taleyindən şikayət sənin kimi qızlara yaraşmaz... Oh, elə bil ürəyim bu dəqiqə parçalanacaq. Kərimət, pəncərəmdən baxan o ulduzları görürsənmi?.. Sənin bu qara gözlərin də o ulduzlar kimi parıldayır. Mən könlüm üçün cənnəti də, cəhənnəmi də belə qara gözlərdə tapmışam...

Siz ey mehriban, gözəl, qara, cənub gözləri,
Siz eşqə, məhəbbətə edamlar yazırsınız..
Gündüzümün, gecəmin, artıq o gündən bəri,
Parlayan ulduzları bilin sizsiniz yalnız...

Yox, yox, mən vəfasız deyiləm. Orada, ana vətəndə məni gözləyən var, Kərimət. O, məni hələ də gözləyir.

K ə r i m ə t (*öz-özünə*). Aman Allah, mənim üçün ölüm bu sözlər qədər güclü ola bilməzdi...

T a m a r i n. Kərimət, məni sevirsən, deyilmi?

K ə r i m ə t (*güclə*). Sevirəm... Özü də elə bir məhəbbətlə sevirəm ki, bu yolda məni öldürsələr, tikə-tikə doğrasalar belə uf demərəm...

T a m a r i n. Mənim qolum-qanadım açılsaydı, qara yallı atımı ruzigar kimi çaparaq yarın vüsalına yetişərdim... Mənim də qara gözlüm uzaqlarda ağlayır, əsən ruzigardan belə məni soruşur, Kərimət... Görünür, mən ona da həsrət öləcəyəm. Odur, bax, qapımda əli tüfəngli keşikçi vardır...

K ə r i m ə t (*qoynundakı xəncəri göstərərək*). Mən sevgilim üçün bu günahsız barmaqlarımı al qana boyamaq istəyirdim. Mən səni uzaqlara, hey uzaqlara aparmaq istəyirdim... Elə bir yerə ki, orda insanlar azad quşlar kimi azad yaşayırlar...

T a m a r i n. Bu dünyada elə yer vardırmı?

K ə r i m ə t. Var, Tamarin, bizim uca dağların qoynunda... Elə yerlər var ki, orada gül gülü, çiçək çiçəyi çağırır. Gedək oraya. Biz orada bülbüllərin nəğməsinə, çayların şırıltısına qulaq asarıq... Səsimizi onların səsinə qatıb həzin mahnılar oxuyarıq.

T a m a r i n. Yox, məni əfv et, dağlar pərisi, insan oğlu hər yerdə qolu zəncirli quldur. O yaşarmış gözlərinə, o şəlalə kimi sinənə tökülmüş uzun qara saçlarına, o məsum dodaqlarında çırpınan ülvi, saf məhəbbətə and olsun ki, mən onu sevirəm. O məni hələ də gözləyir... Onun üzündəki qoşa ulduzlar, bax bu dəqiqədə mənim təsəvvürümdə parıldayır.

K ə r i m ə t. Oh... Deməli mən gecikmişəm?.. Aman Allah, mən niyə ölmədim, niyə?

T a m a r i n. Məni bağışla, Kərimət... İllərdən bəri öz ayağı ilə ölüm axtaran bu kimsəsiz insanı öldür, amma bağışla.

K ə r i m ə t. Mənim xəncərim böyük məhəbbəti öldürmək üçün deyildi... Mən onunla sənin qapını açmaq istəyirdim... Ancaq indi çox gecdir. Ulu Tanrım, sən bu gözəl oğlanı öz sevgilisinə qovuşdur... O, vəfalıdır... vəfalı ürəklər isə bir dəfə sevərlər. Əlvida, gözəl oğlan, əlvida!.. (*Sakit addımlarla büdrəyə-büdrəyə gedir, qapı ağzında divara söykənir, hönkürtü ilə ağlayır*)

P ə r d ə

## DOQQUZUNCU ŞƏKİL

Çar ordusunun düşərgahı. Hər iki tərəfi sıldırım qayalıq olan dərənin qurtaracağında meşə görünür. Hava buludludur...Uzaqlardan göy gurultuları eşidilir. General hündür bir yerdə durub, qarşıdakı düşmən cəbhəsini gözdən keçirməkdədir. Birinci planda soldatlar oturub söhbət edirlər. Orda-burda ocaq tüstülənir.

İ v a n. Eh... Yağışın altında durmaqdan islanmış toyuğa döndük.

F y o d o r. Bəs necə bilirsən, iyirmi ildə almadığın yeri bir gündə alacaqsan?.. Bura cəbhədir, bığ yerin tərləyəndə gəlib, saçın-saqqalın ağaranda getmədin nə ləzzəti?.. (*Oxuyur*)

Yayın gecələrində parıldar çoxlu ulduz;
Neçin sizdə onların vardır ikisi yalnız?
Siz ey cənub gözləri, qara cənub gözləri,
Tale görüşdürmədin bir xoş gündə bizləri.

İ v a n. Fedya, oxuma, general eşidir. (*Sükut edərək*) Neyləyim, Şamil düşmədi əlimə, yoxsa çoxdan divanını tutmuşdum. Qorxusundan heç özünü də göstərmir ki...

F y o d o r. Qorxusundan?.. Qorxu sözünü dağlılar daha kitabından silib. (*Ətrafına göz gəzdirərək*) Vanya, görəsən poruçik Tamarin necə oldu?

İ v a n. Tamarin?.. (*Az qala pıçıltı ilə*) Şamilə qoşuldu. Deyirlər əvvəldən fikri bu imiş... Eh, bir azdan hücum başlanacaq... Yazıq Hacı Muradın evi yıxıldı.

F y o d o r. Nə oldu, asıldı?

İ v a n. Yox... Rayevski onu həbsdən gətirməyə getdi. Biz hücuma keçəndə Hacı Muradı qabağa salacaqlar, biz də onun dalınca gedəcəyik...

F y o d o r. Qəribədir... Bu kimin ağlına gəldi?

İ v a n. Nə bilim?.. (*Sükut*) Bircə arzum var: bu gecə ya biz ölüb qurtaraydıq, ya da Şamil əsir alınaydı...

C e n e r a l. (*dikdirdən aşağı enir, dövrəsinə toplaşan zabitlərə dönərək*). Cənablar, sizin fikrinizcə bu gün yağış yağacaq, yoxsa dolu?

B i r i n c i  z a b i t. Heç biri, zat aliləri...

G e n e r a l. Sən nə üçün belə düşünürsən?

B i r i n c i  z a b i t. Çünki Sizin iradəniz belədir, zat aliləri.

G e n e r a l. Çox təəssüf ki, Allah mənimlə hesablaşmır. Onun da iradəsi Şamilinki kimi öz əlindədir...

Pauza

İ v a n. Fedya, a Fedya, bu gün bərk dolu yağacaq... Qorxuram o qədər yağsın ki, bədənimdə bir sağ yer qoymasın... (*Lap yaxında şimşək çaxır, göy gurultuları eşidilir*)

F y o d o r. Bu gurultuların axırı pis olacaq...

Pauza

G e n e r a l. Cənablar, Hacı Muradı gətirirlər... Onu belə görəndə mən zəncirlənmiş Prometeyi xatırlayıram.

B i r i n c i  z a b i t. Doğru buyurursunuz, zati-aliləri... Hacı Murad tutulandan bəri Şamilin müqaviməti xeyli zəifləmişdir.

G e n e r a l. Məncə əksinə... Şamil daha da quduzlaşmışdır.

Pauza

F y o d o r. Sən doğru deyirsənmiş, Vanya, onu gətirirlər...

İ v a n. Düşmən də olsa, igiddir, vallah... Bir bax, nə qədər də məğrurdur!..

F y o d o r. Dağlılar düz deyirlər: qürur, igid insanın ziynətidir...

R a y e v s k i (*qolları bağlı, ayaqları qandallı Hacı Muradı generalın hüzuruna gətirir*). Təzim edib raport verirəm, zat aliləri, məhbusların

hamısı yerindədir... Birinci polkdan üç soldat xəstələnmişdir... Yaralılardan on beş nəfəri ölmüşdür.

G e n e r a l. Tamarini gətirdilərmi?

R a y e v s k i. Xeyr, zat aliləri... O gəlmək istəmir.

G e n e r a l. Necə onun əvəzinə on nəfər dağlı veririk, o isə gəlmək istəmir?.. Paruçik, şahid olun, Sizin dostunuz mənim mərhəmətimi anlamadı...

R a y e v s k i. Onlar Tamarinin əvəzində Hacı Muradı istəyirlər, zati-aliləri.

G e n e r a l. Bu çox ucuz olmazmı? (*Hacı Murada*) Xatirinizdədirmi, o gün padşaha sədaqətlə qulluq edəcəyinizə söz verirdiniz?..

H a c ı  M u r a d. Mənim yadımdadır... Sən də söz verdin: mənə əziz qonaq kimi ehtiram göstərəcəkdin... Sən qonaqlara həmişə beləmi hörmət edirsən?

G e n e r a l. Buraya nə üçün gətirildiyinizi bilirsinizmi?

H a c ı  M u r a d. Mənim razılığımı soruşan olmadı, yaranal.

G e n e r a l. Sizə güllə atsalar, gizlənməyə icazə verərik...

H a c ı  M u r a d. Mən bilmirəm, sənin fikrin nədir?..

G e n e r a l. Əlahəzrət imperatorun iradəsilə, mən dağlıların heç birinə inanmıram. Sizi də onun üçün həbsə almışam. Əgər doğrudan da sədaqətinizi sübut etmək istəyirsinizsə, qabağımıza düşün, böyük imamın qalasına birlikdə hücum edək.

H a c ı  M u r a d. Mən həmişə qılınc olmuşam, yaranal, qalxan olmamışam...

G e n e r a l. Eybi yoxdur, bir dəfə də qalxan olarsınız. Zərbə endirmək, zərbəyə dözməkdən asandır... İndi aydındırmı?..

H a c ı  M u r a d. O baxar adamına... Biz hər ikisini bacarırıq.

G e n e r a l. Sabahdan o yana bu görünən qalanın izi-tozu qalmayacaqdır.

H a c ı  M u r a d. Qalanı da, səngəri də uçurda bilərsən... Amma sinələrdən yaranmış istehkama gücün çatmaz, yaranal... O, dəmirdən də, daşdan da möhkəmdir.

G e n e r a l. Siz buna əminsinizmi?..

H a c ı  M u r a d. Bəli... Özümə əmin olduğum kimi...

G e n e r a l. Yazıq dağlı... Sənin başın zədələnmişdir.

H a c ı  M u r a d. Təqsir özündədir. Mənimlə çox söhbət edirsən...

G e n e r a l. (*Rayevskiyə*). Paruçik, komandanları mənim yanıma çağırın!..

R a y e v s k i. (*təzim edərək*). Baş üstə!.. (*gedir*)

G e n e r a l. Qandallar ağırlıq etmir ki?..

H a c ı  M u r a d. Mənə yox... Amma sənin vicdanına ağırlıq edib-etmədiyini deyə bilmərəm...

G e n e r a l. Mənə də yox... Bu qandallar olmasaydı, böyük Rusiya imperiyasında quldurların əlindən tərpənə bilməzdik.

H a c ı  M u r a d. Bir ölkə üçün yüz milyon quldur çoxdur, yaranal...

G e n e r a l (*acıqlı*). Bu nə deməkdir?..

H a c ı  M u r a d. Bu o deməkdir ki, rusetdə qandalaqsız adam yoxdur...

R a y e v s k i. (*gəlir*). Zat aliləri, komandarlar sizi gözləyir...

G e n e r a l. Çox gözəl... (*İstehzalı*) Qonağa ehtiram göstərin. (*Gedir*)

R a y e v s k i. (*soldatlara*). Vasili, Fyodor, İvan, bunun qarovulunda durun...

H ə r  ü ç ü (*təzim edərək*). Baş üstə!..

R a y e v s k i. (*Hacı Murada*). Otura bilərsən... (*Gedir*)

F y o d o r. Vanya. Hacı Muraddan qorxma, əli-ayağı qandallıdır.

İ v a n. Heç zarafatın yeridir?..

F y o d o r. Bir diqqət elə... Görürsənmi nə yaman kədərlidir?..

İ v a n. Adam ölümünü qabaqcadan biləndə yaman pis olur, Fedya... mənim də buna yazığım gəlir... (*Sükut edərək*) Sabah Marusyaya kağız yazacağam. Yazacağam ki, mən elə-belə soldat deyiləm, Hacı Muradın qarovulunda durmuş soldatam...

F y o d o r (*gülür*). Marusya... görəsən Dmitri onu yenə də yuxuda görürmü?

İ v a n. Eh... Sən də zarafat eləməyə vaxt tapdın?..

F y o d o r. Yaxşı... Gülüb danışmasaq, fikirdən adamın bağrı çatlamaz?.. Vanya, dünən gecə Marusya yuxuma girmişdi... deyirdi ki, Vanyadan bir şey çıxmadı, sənsə mənim dərdimə əlac elə...

İ v a n. Bəsdir, bəsdir, zarafatın yeri deyil...

H a c ı  M u r a d. (*öz-özünə*). Allahdan heç nə istəmirəm, bircə oğlum sağ qalsaydı... ax, Şamil, Şamil, məni sən kələyə saldın...

İ v a n. Adamın hayfı gəlir... Əslinə baxsan, günah özündədir.. Buralarda nə iti azmışdı?.. (*Yan tərəfdə kim isə qəmgin səslə oxuyur*)

Yanağın solğun bir yarpağa bənzər...
Rəngi sapsarıdır: bir zaman vardı,
O düşmən üstünə cumsaydı əgər,
Düşmənin də rəngi belə qaçardı...

İ v a n. Eyy, sakit ol, general eşidir.

Nəğmə birdən xırp kəsilir.

H a c ı M u r a d. (*öz-özünə*). Yox, Şamil ona dəyməz... Özü də ata deyilmi?.. (*Fyodora*) Ay urus, Şamil onu öldürərmi?..

F y o d o r. (*təəccüblə*). Kimi?..

H a c ı M u r a d. Mən heç... Bəlkə bu qollarım heç açılmadı. Mən ölümdən qorxmuram. İlahi, sən Şamilə kömək ol... Yorğunam. Fikrim özümdə deyil. O bizim dağların yeganə pənahıdır.

Birdən trivoqa siqnalı guruldayır.

İ v a n. Aha, başlandı.

G e n e r a l (*gəlir*). Soldatlar, əlahəzrət imperatorun əmri alınmışdır... O yazır ki, Dağıstan quldurunun indiyə qədər əsir alınmaması böyük Rusiya imperiyasının nüfuzunu azaltmışdır. Mən, ixtiyarımdakı qüvvələrə bu gün son hücum əmrini verirəm... Və əminəm ki, bir neçə saatdan sonra bu görünən qalanı xarabaya döndərəcəyik.

R a y e v s k i. Zati-aliləri, Şamil elçi yollamışdır. Qəbul edəkmi?

G e n e r a l. Gəlsin...

A t a y. (*bir nəfər ilə gəlir*). Şamilin təklifi belədir: mənasız qırğına yol verməmək üçün qoşununuzu geri çəkin... yoxsa hamınız qılıncdan keçiriləcəksiniz...

G e n e r a l. Mənim də cavabım budur: bu gün Şamilin qalasından bir əsər belə qalmayacaqdır. Sən get, bizim gücümüzlə zarafat edən Şamilə söylə ki, arvad-uşaqların naləsindən qorxub, qalanı könüllü olaraq tərk etsin!..

A t a y. Bu sözləri Siz onun cənazəsinə deyə bilərsiniz, yaranal... Dağlıların vuran əli, qoca Şamil siyirmə qılıncına söykənib səni gözləyir. (*Yoldaşına*) Gedək!.. (*Gedirlər*)

G e n e r a l. Piyadalar Hacı Muradın arxasınca... irəli?..

Rayevski cərgə ilə düzülən soldatların qabağına Hacı Muradı gətirir, baraban çalınır, soldatlar onun ahənginə uyaraq irəliləyirlər.

P ə r d ə

## ONUNCU ŞƏKİL

Şamilin evi qarşısında geniş bir həyət. Soltan həyətdəki ağaca söykənib uzaqlara baxır. Birdən iki nəfər dağlı gəlir.

B i r i n c i D a ğ l ı. Şamil hanı? Biz onu görmək istəyirik.

S o l t a n. Nə var, nə üçün lazımdır?

B i r i n c i D a ğ l ı. Kəndlərimiz dağıldı, uşaqlarımız acından qırıldı... On gündür mühasirədəyik. Daha tab gətirə bilmirik...

Ə m i n ə t (*gəlir*). Soltan, qardaşım, sən nə edirsən? Yaralı-yaralı özünü havaya verib ölməkmi istəyirsən, bəri gəl.

S o l t a n. Bu saat, Əminət, bu saat gəlirəm.

İ k i n c i Da ğ l ı. Bizdə can qalmadı, bacı. Arvad-uşağımız içməyə bir qurtum da su tapmır... Yaranal bulağın suyunu da zəhərlədib. Aman günüdür... bizə rəhminiz gəlsin...

Ə m i n ə t. Bunu Şamil özü bilmirmi?..

B i r i n c i D a ğ l ı. Bilir, amma razı olmur.

Ə m i n ə t. Nəyə razı olmur?

B i r i n c i D a ğ l ı. Biz istəyirik ya bir dəfəlik ölək, ya da tabe olaq...

Ə m i n ə t. Sən nə dedin?.. Sən bilirsənmi bu nə sözdür?.. Onun cənazəsinə də bu təklifi eləmək olmaz... Şamil iyirmi il niyə saç ağardırdı?.. Axırda tabe olmaq üçünmü?.. (*Soltana*) Sən niyə dinmirsən, qardaşım?

S o l t a n. Mən nə deyim, bacı?.. Xalqda can qalmamışdır. İndi heç kəs vuruşmaq istəmir... Ac-susuz, gecə-gündüz səngərlərdə çürüməkdən cana doyan xalq, nəhayət, bir gün tabe olmalıdır, ya yox?..

Ə m i n ə t. Aman Allah, siz nə danışırsınız?.. Qardaşım, sən doğrudanmı tabe olmaq istəyənlərə tərəfdarsan. Yox, yox, bu uzun məşəqqətlərdən sonra qorxaq acizlər kimi düşmənə boyun əymək... Özü də indi. Buna nəinki Şamil, mən də dözmərəm... (*Dağlılara*) Siz gedin, amma bu sözü başqa bir yerdə danışmayın... Mən arvad ola-ola sizin yerinizə utanıram. Ar olsun sizə!.. Şamil sizin üçün neyləmədi?.. Onun sinəsində qılınc dəyməyən yer qalmadı... Ona Allahın yuxusu da haramdır... Utanın! Bu papaq əvəzinə ləçək bağlayın!..

S o l t a n. Odur bax, Şamil özü də gəlir. Nə sözünüz varsa ona deyin... Bura bax... (*Dağlılardan birini kənara çəkərək*) Siz Şamilin anasını görün... Dərdinizi ona deyin... Şamil onu çox istəyir, razı olar... Gedək, bacı.

Ə m i n ə t. Gedək!.. Vəfasız insanlar. Onu meydanda tək qoyub qaçmaq istəyirlər. Sən də, qardaşım, onlara yol göstərirsən...

S o l t a n. Ayrı yolumuz yoxdur. Bu mühasirədən çıxmaq üçün bizdə qüvvət qalmamışdır. Bacarmarıq...

Ə m i n ə t. Namusla ölməyi necə?.. Onudamı bacarmadın?.. (*Dağlılara*) Siz gedin, tabe olursunuz, olun... Amma bu sözü Şamilə deyib onun ürəyinə toxunmayın. Onsuz da kədərlidir... (*Soltanın qolundan tutub aparır*)

B i r i n c i d a ğ l ı. Düz deyir... Anasını görək... gedim, çağırım. Buradaca məni gözlə. (*Gedir*)

Ş a m i l (*Atayla bərabər gəlir*). Bütün dəstə başçılarını mənim yanıma çağır... Dmitriyə de ki, topları məscid qabağında düzdürsün... Atlılar hazırlanıb məni gözləsinlər... (*İkinci dağlını görərək*) Sən kimi istəyirsən?

İ k i n c i D a ğ l ı. Yoldaşımı gözləyirəm, imam...

Ş a m i l. Gözləmək vaxtı deyil, hazırlaşmaq lazımdır. Yarağın hanı?..

İ k i n c i D a ğ l ı (*özünü itirərək*). Evdədir, imam...

Ş a m i l. Get, mənim adımdan dəstənizə de ki, bir azdan hücum başlanacaq.

İ k i n c i D a ğ l ı. Baş üstə, imam. (*Gedir*)

Ş a m i l. Sən də, Atay, durma... Tapşırıqlarımı yerinə yetir...

A n a (*birinci dağlı ilə gəlir*). Oğlum, dünəndən acsan.

Ş a m i l. Atay, oğlum, sən get... Amma tez qayıt, mənə xəbər ver...

A t a y. Bu dəqiqə, imam... (*Gedir*)

A n a. Oh, pərvərdigara, bu nə zülmdür, bizə eləyirsən?..

Ş a m i l. Nə olmuşdur, ana?.. Bu sızıltı nə üçündür?

A n a. Yazıqlar acından həlak olub gedir, oğlum...

Birinci dağlı sürətlə uzaqlaşıb gözdən itir. Şamil onun dalınca bir neçə an zənn ilə baxır.

Ş a m i l. Səndə söz var, ana... Məndən gizlətmə...

A n a. Səhərdən iki kərə gəliblər. Lap nəfəsləri kəsilib... Dözmürlər... yorulublar.

Ş a m i l. Gələn kimdir?

A n a. Tabe olmaq istəyirlər, oğul...

Ş a m i l (*vurulmuş kimi*). Tabe olmaq istəyirlər?..

Pauza

Bu sözü səndən yox, bir başqasından eşitsəydim, bilirsənmi neylərdim, ana?.. Mən dünyada iki sözə düşmanam: bir əzilmək, bir də tabe olmaq sözünə. Sən ki, bilirsən ana...

A n a. Eh, oğlum...

Ş a m i l. Ax, ana, ana... Bu çox ağır yara oldu... Bu güllə sinəmə yox, ürəyimə dəydi... Qollarımın qüvvətini azı on qat zəiflətdi, ana... Saçım-saqqalım ağarmışdı, amma qocalmamışdım... Bu xəbər məni düz iyirmi il qocaltdı... (*Gedir*)

A n a. Dilim-ağzım qurusun, oğul mən neylədim?..

S o l t a n (*gəlir*). İndi mən öz doğma bacıma da inanmıram, ər məhəbbəti onu da mənim əlimdən aldı... Aha, Şamil buradadır. (*ətrafa göz gəzdirərək*) Bundan da gözəl fürsət olarmı?.. Hamı namaz üstündədir... Hamı bir olan Allaha dua edir. Hamının gözü sonsuz fəzalara dikilib Tanrıdan imdad istəyir. Şamil də namaz üstündədir...Ancaq o, duamı edir, yoxsa düşünürmü? Yox, yox, onun göylərə zillənmiş gözləri Allahdan imdad istəmir... O yalnız öz qollarının və beyninin gücünə inanır... Odur ki, mən də düz onun beynin nişan alıram. (*Ağaca söykənir, tapançasını çıxardıb nişan alır*)

Ə m i n ə t (*çığıraraq gəlir*). Soltan, sən kimə güllə atırsan?..

S o l t a n (*səksənib geri sıçrayır, tez özünü toplayır*). Bu nə çığırtıdır? Mən təzə tapançamı yoxlamaq istəyirdim...

Ə m i n ə t. Yox, sən titrəyirsən... Sənin gözlərin şübhə ilə parıldayır...

Ş a m i l (*görünür*). Nə olmuşdur, Əminət?.. Niyə çığırırdın?..

Pauza

Ə m i n ə t (*sinəsini gərərək*). Öldür, məni, qardaşım, öldür... Düz buradan vur... Mən bu xəyanətini gizlədə bilmərəm... Qazı Məhəmmədin atası ölümə layiq deyil...

S o l t a n. Əminət, sənin ağlın başındadırmı?

Ə m i n ə t. Mən öz gözümlə gördüm. Mən hər gün, hər gecə səni izləyirdim. Oh, mən qarışıq yuxumu görürəm nədir?.. (*Ərinin qabağında diz çökür*) Sən haqlısan, Şamil. Məni bağışla... Niyə bir-birinizin üzünə baxırsınız?.. Günah məndədir. Öz doğma qardaşını satan bacının yaşamağa haqqı yoxdur...

Ş a m i l. Soltan, at yerə, tapançanı!..

S o l t a n. Baş üstə, imam... (*Tapançanı yerə atır*) Vərdiş eləmişəm... İndi yadıma düşdü ki, mənim silah götürməyə haqqım yoxdur.

Ş a m i l (*Əminətin qolundan tutub ayağa qaldırır, tapança ilə dalbadal iki güllə atır*) Soltan, ağaca söykən, tez!..

S o l t a n. Mənim günahım nədir, imam?

Ş a m i l. Sənin heç bir günahın yoxdur... Bütün günahlar məndədir ki, sənin kimi xaini dünya işığına həsrət qoymamışam.

Səsə gələn müridlər Şamilin ətrafını bürüyürlər.

S ə s l ə r. Nə var, nə olmuşdur?
– Tüfəngi atan kim idi?
Ş a m i l. Səssiz!..

Aralığa sükut çökür.

Mən hələ cavan ikən qapımda boz bir it saxlardım. O, böyüyəndə qudurub ayağımı dişlədi. Mən də onu öldürdüm. Bax, belə. (*Tapança ilə güllə atır, Soltan yıxılır*)
Ə m i n ə t. Aman!.. qardaşım!
Ş a m i l. Qardaşın xəyanəti daha dəhşətli olur... (*Müridlərin birinə*) Sən get, Tamarini gətir...
M ü r i d. Baş üstə, imam. (*Gedir*)
K ə r i m ə t i n a n a s ı (*kişi paltarı geyinmiş və yaraqlanmış Qızının qolundan tutub gətirir*). İmam!..
Ş a m i l. Nə istəyirsən, bacı?..
K ə r i m ə t i n a n a s ı. Eşitdim ki, bu gün qazavatdır...
Ş a m i l. Doğrudur... Yaranalın qoşunu dörd yanımızı halqa kimi bürümüşdür... Biz indi dəryada tufana düşmüş bir qayıq kimiyik... Bata da bilərik, üzüb sahilə çıxa da bilərik... Bax, hər yandan barıt qoxusu gəlir. Sən necə bilirsən, bu halqanı qırıb kənara çıxmaq lazımdır, yox?
K ə r i m ə t i n a n a s ı. Lazımdır, İmam... Sənin yolunda iki oğlumu qurban vermişəm, bir də ərimi... İndi də al, bu qızımı apar... Qoy deməsinlər ki, mənim daxmamdan qazavata gedən yoxdur.
Ş a m i l. Sağ ol. Ömrümdə heç belə sevindiyim yadıma gəlmir. Dağıstanda yüz sənin kimi ana olsaydı, qarşımda ölüb belə diz çökərdi... Sağ ol, ana, aslan ürəkli ana. (*Sakit nəzərlərlə kütləyə baxaraq*) Tabe olmaq istəyən kimdirsə, irəli çıxsın.

Pauza

Ana!.. Onları mənə göstər!
A n a. Oğul! Bu qoca ananın sözünə bax... İstəyirlər, qoy tabe olsunlar. Keçmə namərd körpüsündən, qoy aparsın sel səni!..
Ş a m i l. Qoy tülküdən belə qorxaq olan kişilər bu aslan ürəkli ananın qızına baxıb utansınlar.

Bu anda Qazı Məhəmməd əlində siyirmə qılınc səndirləyə-səndirləyə atasına yanaşır.

A n a. Bala, sən neyləyirsən?

Q a z ı  M ə h ə m m ə d. Mən bu gün atamla yanaşı getmək istəyirəm, nənə... (*Kəriməti göstərərək*) Dağıstanın qızları qılınca sarılarsa, mən ağır yaralı da olsam, kənardan durub tamaşa eləməyə haqlı deyiləm.

Ş a m i l (*onun qolundan tutaraq*). Gedək, oğlum. Səni ayaq üstündə gördüm, cavanlığım yadıma düşdü. İşdir, bu vuruşmadan sağ çıxmasam, bu qoca atanın vəsiyyətini unutma: dağlarımızın məğrur başı, yağıların önündə əyilməsin... Bu torpağın hər qarışında analarımızın göz yaşı var, oğlum.

Q a z ı  M ə h ə m m ə d. Vəsiyyətini ömrüm boyu unutmaram, ata.

Müridlər Tamarini gətirirlər.

Ş a m i l. Paruçik, generalınız razılıq verdi. Mən səni əsirlərə dəyişirəm...

T a m a r i n mən getmirəm, imam.

Ş a m i l. Nə üçün?..

T a m a r i n. Şərəfsiz ölməmək üçün...

D m i t r i. Sağ olun, cənab paruçik. Mən həmişə sizdən bu cavabı gözləyirdim.

T a m a r i n (*Kəriməti göstərərək*). Bu igid qız məni yuxudan oyatdı. O, mənim yolumu aydınlatdı. O dedi ki: "Daldan yaralanan oğlanları, analar oğulluqdan çıxardırlar". Siz məni generalın ixtiyarına göndərirsiniz. Orada məni arxadan vuracaqlar. Ancaq, mən bunu istəmirəm, imam! Din ayrılığı, millət ayrılığı bizim dostluğumuza mane ola bilməz. Mənə də qılınc verin!..

Dmitri qılınc gətirib Tamarinə verir.

Bu dağlar səni də oğulluğa qəbul edir... Rus bölüyü! Tamarinin komandasını dinləyin.

A t a y (*dağlı ilə bərabər gəlir*). Yaranal şərtimizə razı olmadı, imam... Qoşunu yeriyib üstümüzə gəlir...

Ş a m i l. Aydındır... Ümidimizi yalnız qılınclarımıza bağlayıb, onları qabaqlarıq...

T a m a r i n (*hündür bir yerə qalxaraq*). Dağıstanın azad qartalları!.. İndi də məni dinləyin...

Hamının gözü Tamarinə zillənir.

Ölüm, özü də şərəfli ölüm, bizim hamımızı doğma qardaş kimi birləşdirdi... Burada iki dünya üz-üzə durmuşdur... Bu dünyanın birində uzun, lakin işgəncəli həyat, o birində isə hələlik qan və ölüm vardır... Mən ikinci yolu qəbul edirəm...

S ə s l ə r. Biz də, biz də...

Baraban səsləri yaxınlaşır.

Ş a m i l Aha, gəlirlər. (*Qılıncını sıyıraraq*) İndi tabe olmaq istəyənlər, gedib çarın təpiyi altında səadət axtarsınlar...

Pauza

Mən tabe olmayacağam... Mən bu dəmir hasarı uçurmağa gedirəm... Mənimlə gedənlər gəlsin!..

Bu anda qoşunun qabağı görünür, qolları zəncirli Hacı Murad başını məğrur tutaraq gəlir, onlar dayanırlar.

G e n e r a l. Son dəfə təklif edirəm: Təslim olun!..

Ş a m i l (*Hacı Muradı görərək*). Bu nədir?.. Hacı Murad?

H a c ı  M u r a d. Şamil, qorxma, vur! Ölüm hər yerdə mənim üçün birdir!..

G e n e r a l. Onu susdurun!..

H a c ı  M u r a d. Yaranal, unutma ki, mən Hacı Muradam...

G e n e r a l. Soldatlar! İndi sizin qarşınızda yalnız dağlılar deyil, vətən xaini Tamarinlə Dmitri də durmuşdur...Onları diri-diri tutarsınız!.. Qoy bu mürtədlər Senat meydanındakı dar ağacını öz gözlərilə görsünlər!..

Ş a m i l (*yanındakı çalğıçılara*). Çalın!.. (*Müridlərə*) Oynayın!..

Dağlılar ləzgi havasına uyaraq oynayırlar və birdən qoşun üzərinə şığıyırlar. Əlbəyaxa döyüş başlanır. Əli-qolu açılmış Hacı Murad vuruşma meydanına atılır, soldatlar vuruşurlar. Şamil nərə çəkib böyük bir dəstəni yarır... Birdən Dmitri ilə general qarşılaşır.

G e n e r a l. Təslim ol, mənim önümdə yalnız sən deyil, bütün Qafqaz dağlıları baş əyir!..

D m i t r i. Mən təslim olmaq üçün qılınca sarılmadım...

Vuruşurlar.

G e n e r a l. Mən səni atan Qriqori kimi dar ağacında görmək istəyirəm!..

D m i t r i. Sən onu görməyəcəksən, general... Ürəyimdə yanan intiqam alovu səni yandırıb külə döndərəcəkdir!..

Vuruşurlar, Dmitri generalı vurub, yerə sərir.

İ v a n (*Dmitrini görərək*). Mitya!.. Ax, yaramaz. Sən generalı öldürdün?..

D m i t r i. Vanya, səni xoş gördük! Marusyadan nə xəbər? Dünən onu yuxumda görmüşəm...

Bu anda Şamil bərk yaralanmış Tamarini qolları üstündə gətirib yerə uzadır, Dmitri ilə İvan onları görüb təəccüblə baxırlar. Yavaşca addımlarla onlara yaxınlaşırlar.

T a m a r i n (*gözlərini açaraq*). İmam, imam... mən ölürəm...

Ş a m i l. Yox, əzizim... Biz ki, yenicə dost olmuşuq... Bax, düşmən basılıb geri çəkilir. Sən ölməyəcəksən... Sən hələ uzun illər yaşayıb, dağların faciəsini yazacaq və gələcək nəsillərə əbədi bir yadigar qoyacaqsan...

T a m a r i n. Yox, imam. Namərdlər arxadan vurdular. Mən artıq ölürəm... Çoxdan aradığım ölümü indi tapdım... (*gözlərini yumur, huşa gedir*)

K ə r i m ə t (*Şamilə yaxınlaşdığı zaman Tamarini görüb dayanır, onun gözləri yaşarır, çiyinləri qalxıb-düşür*). Ulu Tanrım, sən onu sevgilisindən ayırma... Onun da gözləri yoldadır.

T a m a r i n (*gözlərini açaraq*). Əlvida, dağlar... Əlvida... vətən...

Nə arar o qərib uzaq diyarda,
Neçin ayrılmışdır öz vətənindən?..

Kəriməti görərək.

Ağlama, dağlar pərisi, siz qalib gələcəksiniz!..

Bu anda yaralanmış Hacı Murad qılınca söykənə-söykənə Şamilə yanaşır.

T a m a r i n. Bu xalq məğlub olmayacaqdır, imam... Siz qalib gələcəksiniz...

Ş a m i l. Biz iyirmi ildir vuruşuruq... Bəs nə zaman qalib gələcəyik, dostum?

T a m a r i n. Nə zamanmı!.. Qəhrəman rus soldatı bu dağlara ölüm yox, böyük xalqın böyük məhəbbətini gətirəndə. (*Ölür*)

Ş a m i l. Eşitdinmi, o nə dedi, Hacı Murad?

H a c ı  M u r a d. Böyük xalqın böyük məhəbbətini gətirəndə.

Ş a m i l. Düz dedi, Hacı Murad... Bu məhəbbət bizə qismət olmadısa, övladlarımıza qismət olacaq...

Yavaş-yavaş, əli silahlı müridlər və dağlılar Şamilin ətrafına toplaşırlar, Şamillə Hacı Murad Tamarinin cənazəsi önündə diz çökür. Onları halqa içərisinə alan xalq getdikcə artır.

P ə r d ə

*21 aprel 1941*

# NİZAMİ

## İ Ş T İ R A K  E D Ə N L Ə R

N i z a m i  G ə n c ə v i
Q i v a m i – onun qardaşı
X ə d i c ə – Nizaminin anası
M ə h s ə t i  G ə n c ə v i
Ə b d ə k – memar
A f a q – onun bacısı
T o ğ r u l – Bərdə cəngavəri
D ə s t ə g ü l – onun bacısı
Ç i n g i z – Bərdə cəngavəri
Y u s i f – Nizaminin dostu
Ş i r v a n  h ö k m d a r ı
O n u n  v ə z i r i
M u n i s – saray şairi
B i r i n c i  c ə n g a v ə r
İ k i n c i  c ə n g a v ə r
Q a s i d l ə r
V a l i – Gəncə hakimi

B ə r d ə  q ı z l a r ı,  c ə n g a v ə r l ə r,  x ə z ə r l ə r,  ş ə h ə r l i l ə r,  s a r a y  a d a m l a r ı,  r ə q q a s ə l ə r...

## BİRİNCİ ŞƏKİL

Gəncə. Nizaminin eyvanı qarşısında bağça. Hər tərəf sakitdir. Mütəmadiyən ötən bülbülün nəğməsindən başqa bir səs eşidilmir. Sürətli addımlarla gələn Q i v a m i sağa-sola baxınır. O, kədərlidir.

Q i v a m i. Nizami özgə vaxt bu ağacın kölgəsinə döşənib səhərdən-axşama kimi yazardı... (*Çağırır*) Nizami!

X ə d i c ə. Nə var, oğlum? Niyə töyşüyürsən?

Q i v a m i. Heç soruşma, ana... Bədbəxtlik üz vermişdir... Nizami hardadır?

X ə d i c ə. Sən həmişə yazıq ananın ürəyini qana döndərirsən, oğlum... Nə bədbaxtlıq?

Q i v a m i. Eh, ana, təqsir özümdədir. Ad çıxartmaq istədim, ara yerdə olan-qalan adımı da rüsvay elədim... Hanı Nizami?..

X ə d i c ə. Yəqin bağçanın o başında bülbüllərlə söhbət eləyir.

Q i v a m i. Mənim ürəyim qan ağlayır, qardaşım isə, bağçada gəzinib şeyda bülbülün nəğməsinə qulaq asır. Mən niyə içirəm, niyə? Mən əvvəldən bunu bilirdim ki, şərab məni quru yerdə qoyacaq... (*Daha da ucadan çağırır*). Nizami!

X ə d i c ə. Oğlum, dərdini mənə de, qoy İlyas işindən avara olmasın.

Q i v a m i. Yox, yox, bu dərdə sən dözməzsən, ana... Sən get, mən özüm onu axtarıb taparam...

X ə d i c ə. Oxu atıb yayı niyə gizlədirsən?.. Dərdin nədir?

Q i v a m i. Deyirəm, sən get... Bu dərdə nəinki sən, bütün dünya da tab gətirməz...

X ə d i c ə (*köksünü ötürərək*). Yaxşı, odur bax, qardaşın gəlir, dərdini ona de... (*Gedir*)

N i z a m i. Aha, nə yaman coşmusan!.. Deyəsən, təzə yazdığın qəzəli oxumaq istəyirsən...

Q i v a m i. Qəzəl nədir, qəsidə nədir, ölmüşəm – üstümdə Quran oxuyan yoxdur...

N i z a m i. Qardaşım, sən həyatdan doymuş adamlara bənzəyirsən...

Q i v a m i. Yanılırsan... Əzizim... bu geniş dünya bir süfrədir, mən də bu süfrədən gözü doymamış bir müsafir...

N i z a m i. Bax mən, yeni əsərimi yazıb qurtarmışam... Bizim sevincimizdən ümidsizlər, gözüyaşlılar, dərdi-səri olan bütün insanlar ilham alıb sevinəcəklər. Səninlə qabaq-qabağa oturub doyunca şərab içəcəyəm... Durma, dostumuz Yusifin ovladığı ceyranı apar, təndirdə qızartsınlar.

Q i v a m i. Təndir?.. Təndir nədir! Ocağımı da söndürdülər.

N i z a m i. Nə olmuşdur ki?..

Q i v a m i. O məni xoruza yüklədi. Bir məni yox, bütün Gəncə şairlərini...

N i z a m i. Kim?

Q i v a m i. Munis... Saray şairidir... Çox uğursuz adamdır.

N i z a m i. Onun nə məqsədlə gəldiyini bilirəm. Bu xüsusda Xaqani mənə yazmışdı...

Q i v a m i. Deyişdik, hamımızı məğlub etdi. Mən hələ onun qədər sürətlə deyişən şairə rast gəlməmişdim. Səninlə üz-üzə gəlməyə çox can atırdı. Sən də məğlub olsan...

N i z a m i. Onunla qabaqlaşarıq... Görək taleyimiz bizə nə göstərir... Məhsəti xanıma da xəbər yolla.

Q i v a m i. Yusif xəbər apardı.

N i z a m i. Qoy gəlsin. Gəncənin ən böyük şeir ustadı Məhsəti xanım sənətin qüdrətini Munisə göstərər.

Q i v a m i. Mən yenə də hazırlaşacağam. Ana, ana!

X ə d i c ə (*eyvanda görünərək*). Nə var, oğlum?

Q i v a m i. Mənim kuzəmi harda gizlətmisən?

X ə d i c ə. Oğlum, bəsdir, bu içki zəhrimardan doymadınmı?

Q i v a m i. Oh, ana, ürəyim xarab olar... Ona hər nə deyirsən de, zəhrimar demə. Mənə bu dünyanı sevdirən şərabdır. (*Gedir*)

X ə d i c ə. Niyə belə fikirlisən, oğlum?

N i z a m i (*eyvana, anasının yanına gəlir*). Sən bilərsən, anacan, dünyada ən yüksək, ən ülvi şey nədir?

X ə d i c ə. Sözündən heç nə başa düşmədim, oğlum.

N i z a m i. Bilmək istəyirəm, dünyada ən böyük nemət nədir?

X ə d i c ə. Dünyanın iki böyük neməti var: biri cavanlıq, biri də məhəbbət !

N i z a m i. Sağ ol, ana. Lap ürəyimdən xəbər verdin.

Mehrabı eşqdir uca göylərin,
Eşqsiz, ey dünya, nədir dəyərin?!

X ə d i c ə. Anan sözlərinə qurban, oğul!

N i z a m i. Deyəsən mən, "Xosrov və Şirin" dastanını tez başlamışam. "Biri cavanlıq, biri də məhəbbət..." Mən Bərdəyə getməliyəm, anacan! Şirinin sevdiyi yaşıl çəmənləri, gəzdiyi əlvan yaylaqları seyr edəcəyəm. Mən sevib sonra yazacağam. (*Gedir*)

Q i v a m i (*əlində şərab kuzəsi, o biri qapıdan çıxır*). Gəl ey vəfasız, bir an səndən ayrılanda, gözlərimdə dünya qaralır.

Xərabat üstündə bir ay ucaldı,
Fələyin damında bir çadır saldı;
Qəflətən çadırdan ucaldı bir səs:
"Bu dünya bir saman çöpünə dəyməz!".

Eh, Məhsəti xanım, sən də doyunca şərab içsəydin, bu sözləri deməzdin. Dünyanın qədrini bilərdin. (*Qədəhini doldurub içir*) Bax belə, mənim kimi... İndi hamı əmin olsun ki, bütün dünya şairləri toplaşıb gəlsə də, mənim qabağımda dura bilməz, çünki, şair barıtdır, şərab isə qığılcım;

bunlar bir-birinə toxunanda alov qalxır, onları da yandırar, məni də... Bəs Nizami hara getdi? Aha, bilirəm, mən şərab içib keflənəndə onun qələmi keflənir... (*Kimi isə görərək*) Aha, Munis gəlir... Bir dayan, Nizami səni ürəyindən qopan şeir alovunda yandıracaqdır!.. Buyurun, buyurun!

Bir neçə adam M u n i s l ə bərabər gəlir. Hamı bağçada salınmış xalı üstündə oturur.

M u n i s. Qivami, hara gedirəmsə, sənə rast gəlirəm, mən səninlə deyişdim ki...

Q i v a m i. Doğrudur... Ancaq indi mən o gördüyün Qivami deyiləm... Aha, Məhsəti xanım da gəldi... Bugünkü şeir məclisinə o, zinət verəcəkdir. Bir baxın, gəldiyi yerə günəş kimi şəfəq salır...

M ə h s ə t i G ə n c ə v i gəlir. Qivami ehtiramla ona baş əyib, əlini sıxır, tamaşaçılar gəlib bağçanı doldurur.

Y u s i f. Bu gün dostum Nizaminin bağçasında hamını ceyran kababı ilə şəraba qonaq edəcəyəm..

Q i v a m i. Əziz dostum, sənin təndirin yaxşıdır, ovladığın ceyranı apar, bütöv qızartsınlar...

Y u s i f. Hər şey hazırdır, deyişmənin sonunu gözləyirəm.

M ə h s ə t i. Bəs, Nizami hanı, nə üçün görünmür?

Q i v a m i. Bu saat gələr... Çox fikrə getdiniz, Məhsəti xanım... Nə üçün kədərləndiniz?

M ə h s ə t i. Heç... Mən də öz gəncliyimi xatırladım. Gənclik və məhəbbət dünyanın ən böyük nemətidir.

M u n i s. Mənimlə deyişmək istəyən şair kimdir? Mən dəfələrlə çağırdım, meydana çıxan olmadı.

Y u s i f. Kimdir?.. Siz hələ onu görməmişsiniz... (*Bu anda eyvanda görünən Nizamini göstərərək*) Odur, bax! Bilməyirsinizsə, bilin. Nizami Gəncəvi!

Nizami gəlib Məhsəti xanımla və Munislə görüşür.

M u n i s (*Nizamiyə*). Çox məğrurusan, şair...

N i z a m i. Mən səbir edirəm... Səbir isə məğrurluq deyildir.

M ə h s ə t i (*öz-özünə*). Mənim nəzərimdə Nizamini dağlar qədər əzəmətli göstərən də onun zəkasıdır. Onun gözlərinə baxdıqca ürəyim bu geniş kainata belə sığmayır.

M u n i s. Başlayaq.

Y u s i f. Münsiflər təyin olunsun!

S ə s l ə r. Olunsun, olunsun!..

M u n i s. Münsif Məhsəti xanım olsun... (*Nizamiyə*) Razısınızmı?

N i z a m i. Bəli!.. (*Məhsəti xanıma*) Özünüz necə?

M ə h s ə t i. Mən münsifliyi qəbul edirəm... Şərtim budur: əvvəlcə Munis başlasın!

Hər kəs öz gücüylə girsin meydana
Söyləsin fikrini mərd-mərdanə,
Əzəldən nə imiş qoca kainat,
Nədən yaranmışdır anamız həyat?

M u n i s

Xilqət səhifəsi açılmamışdan,
Bircə qüvvət varmış: o da yaradan!..

N i z a m i

Bizim dünyamızda ağıllı bir kəs,
Görünməyən şeyə inana bilməz!

M u n i s

Bu dərya təbimlə bəhsə girmə sən;
Xəzinə ruhumu gəl dindirmə sən!
Saqiyə get söylə buraxsın qəmi;
Doldursun şərabla qoy piyaləmi!

N i z a m i

Gəl at bir tərəfə boş xəyalları,
Aç, hünərin varsa, bu sualları;
Sən ovçu deyilsən, get dolan bir az,
Bu körpə aslandan sənə ov olmaz!

M ə h s ə t i. Dayanın, hər ikiniz şairsiniz, amma sualdan uzaqlaşdınız. Əsl qüvvət söylənəcək fikirdədir. Kim doğru fikir söylərsə, o, qalib gələcəkdir.

M u n i s

Əzəldən yox imiş qoca kainat;
Bir heçdən yaranmış anamız həyat.

N i z a m i

O böyük yaradan nədirsə, gerçək,
Hər nə yaratmışsa, alçaq ya yüksək, –
İnsan zəkasını ilk yaratmış O,
Onu öz nurilə aydınlatmış O...

M ə h s ə t i. Bu suala cavab heç biriniz doğru cavab vermədiniz... Munis kainatın yaranışını düzgün təsəvvür etmir. Lakin Nizami çox qiymətli bir fikir söylədi. O, insan zəkasının qüvvətini tərif edərkən, əlbəttə, yanılmadı.

Y u s i f. Hə, buna Nizami deyərlər, onun yanlışı da bir naxışdır!

M ə h s ə t i

Şairlik etdikcə mən ucalmışam,
Firuzə göyləri seyrə dalmışam.
Bir də sualım var: söyləyin mana,
İlk əzəl yar olan nədir insana?

Y u s i f. Sağ ol Məhsəti xanım, ruhun var, ruhun...

Q i v a m i. Onun ilhamı Gəncənin gur çeşmələri kimi coşğundur. O mən deyiləm ki, get-gedə təbi qurusun?

M ə h s ə t i. Başlayın!

M u n i s. İlk əzəl yar olan nədir insana?

M ə h s ə t i. Bəli, cavab gözləyirəm.

M u n i s

Mənə sualınız tanışdır, tanış,
İnsan xəyanətlə ekiz yaranmış.
İnsandır ilk dəfə fitnə düzəldən;
Küdurət insana yardır əzəldən.
O, kinlə gələrək böyük varlığa,
Sirdaş kəsilmişdir hiyləkarlığa.
İnsanın varlığı kindir, hiylədir.

(*Məhsətiyə*)

Bu gözəl cavaba sözünüz nədir?

N i z a m i

Yox, səhv edirsiniz, böyükdür ürək,
Bəzi sinələrə bir yükdür ürək.
Müqəddəs yaranmış dünyada insan,
Hər zaman insanla fəxr etmiş cahan.
Məndə hiss-hörmət vardır insana;
Əvvəldən məhəbbət yardır insana.
Sevgi bu dünyada ilk xilqət olmuş,
İnsanın ilk sözü məhəbbət olmuş!

M ə h s ə t i. İnsan qəlbində yalnız kin və fitnə axtaran şair tez məğlub olar, Munis! Nizami isə, öz məhəbbətilə qalib gələcəkdir. Mən bu deyişmədə ona üstünlük verərəm!

Qərarımdan razısınızmı?..

Y u s i f. Böyük şairənin qərarı Allahın hökmü qədər müqəddəsdir.

M u n i s. Yenə davam edək!.. Sualınızı gözləyirəm.

M ə h s ə t i. Böyük şairin dühasını iki misradan da görmək olar, Nizamiyə haqq verin!.. Sizə bir məsləhətim vardır: xəbər alsalar, yalnız həqiqəti söyləyin!

M u n i s. Mən yalan danışmağı sevmirəm, mən həqiqət aşiqiyəm. Mənim vicdanım ləkə götürməz.

Q i v a m i
(*Nizamiyə*)

Qardaşım, qüvvət ver o xoş səsinə,
Açar sal təbinin xəzinəsinə,
O bağlı qapıya kim tapsa açar,
Gizlin xəzinədə – dür, gövhər tapar!

Y u s i f. De gəlsin, başına dönüm... ceyran əti ona da, sənə də halaldır.

M ə h s ə t i (*Munisə*). Şair! Bu qədər məyus olmayın!

M u n i s. Xeyr. Mən sevinirəm. Nizami, doğrudan da böyük şairdir. Mən onun istedadına pərəstiş etməyə hazıram.(*Ayağa qalxaraq*) Məni əfv edin. Yolum uzaqdır. İzninizlə mən gedim.

Q i v a m i. Yox, bu heç yaxşı olmadı. Qonağa ehtiram göstərmək borcumuzdur. Əyləşin, ceyran ətinə qonaq olun...

M u n i s. Çox razıyam. Məni Şirvan sarayında işrət məclisləri gözləyir... (*Gedir*)

Q i v a m i. Munis bizdən çox narazı getdi. Kələyi baş tutmadı, daş qayaya rast gəldi. (*Gülür*)

M ə h s ə t i. Bu gəlişin mənası mənə aydın olmadı. Sizcə o, Şirvan sarayından buraya nə məqsədlə gələ bilər?

N i z a m i. Bu, şahın tədbiri idi. Şirvan hökmdarı Gəncənin sənət sarayını uçurub, bizi özünə tabe etmək istəyirdi. Gəncə şairlərini məğlub etdirib, bizi susdurmaq istəyirdi.

M ə h s ə t i. Gəncənin sənət sarayını heç bir zəlzələ uçura bilməz, şair! Sənin şerin isə, dağ çeşməsi qədər saf və coşğundur. Onun büllur suyu heç bir ləkə götürməz.

Q i v a m i. Baxın, ürəyim nə böyük sevinclə döyünür.

Məhsəti oxusun, dilə gəlsin saz!..
Bülbüllər bağçada sakit oturmaz!

(*Məhsətinin özünə*)

Qızışsın ürəyim sənin nəğmənlə,
Bəlkə bu lal könlüm bir gəlsin dilə...

M ə h s ə t i. Mən indi qürub edən bir günəşə bənzəyirəm. Nizami isə, yeni doğan bahar günəşidir. Nizami oxusun!

N i z a m i. Gəncənin zinəti, şerimizin anası Məhsəti xanım oxusun, dostlar. Sizi inandırıram ki, Məhsəti xanımın şeirlərini dinlədikcə, insanın könlü bu böyük kainata belə sığmayır. O oxusun!

Y u s i f. Oxusun!.. Oxusun!..

M ə h s ə t i

Ey dost! Məhəbbətin ömrə duzaqdır,
Arzum istəyimdir, bu sözüm haqdır!
Aldı qərarımı gül üzün sənin,
Səbr dedikləri məndən uzaqdır.
Toxunma könlünə biçarə gülün,
İncitmə qəlbini avarə gülün;
Sabahın eşqilə olmuşdur, ey dost,
O qanlı köynəyi sədparə gülün.

P ə r d ə

## İKİNCİ ŞƏKİL

Qədim Bərdə yaxınlığında bir ovlaq. Göz işlədikcə uzanan dərədə şəhər görünür. Gözəl saraylar yaşıllıq içindədir. Q i v a m i ağacın kölgəsindəki çeşmə başında oturub pəsdən zümzümə edərək, şərab içir. Arabir əsən xəfif külək, onun qıvrım saçlarını oxşayır. Qivamidən iki-üç addım kənarda Y u s i f uzanıb yatmışdır. Günorta vaxtıdır. Hər tərəfdən quşların nəğməsi eşidilir.

Q i v a m i

Bu dünya qızıl bir kuzəyə bənzər,
Şərabi gah şirin, gah da ki, zəhər.
Çox da öyünmə ki, uzundur ömrün,
Əcəl köhləənində hazırdır yəhər.

Yox, düz demirsən! Mənim kuzəmdəki şərab zəhər deyil, şərbətdir! (*Ötən bülbülün səsini dinləyərək ayağa qalxır*) Mən səni içəndə, bülbüllərin nəğməsindən həzz alıram; yaşıl çəmənləri daha odlu bir məhəbbətlə sevirəm... Qardaşım Nizaminin hər misrasından qüvvət alıram. (*Birdən gözü Yusifə sataşır*) Sən yat əzizim, bərk yat! (*Qədəhini dolduraraq*) Bu da sənin əvəzinə! Ömər Xəyyam, Məhsəti xanım! Siz şərabı tərifləyin, mən də içim... Sizin sağlığınıza!.. (*İçir, yenə zümzümə edir*)

Əzizim, sarayından,
Xan gəlir sarayından,
Gündə bir kərpic düşür,
Ömrümün sarayından...

Sən də yalan deyirsən! Hər gün ömrümün sarayından bir kərpic düşsəydi, mənim ürəyim bu dərdə tab gətirməzdi; ölərdim, bu geniş dünyanın gözəl şərabları tökülüb qalardı... (*Qədəhini yenə doldurub içmək istərkən, kimi isə görür*)

Əbdək bir nəfər cəngavərlə gəlir.

Ə b d ə k. Nuş olsun!..

Q i v a m i. Sağ ol, qardaş!.. (*Səndirləyə-səndirləyə Əbdəkə yaxınlaşır. Diqqətlə onun üzünə baxır*) Səni ömrümdə ilk dəfə görürəm. Amma bir baxışından kim olduğunu bildim: gözəl oğlansan! (*Qədəhi ona uzadaraq*) Al, nuş olsun!

Ə b d ə k. Sağ ol!.. (*Alıb içir*)

Q i v a m i (*cəngavərə*). Al, sən də iç, qardaş, belə işdə geri qalmaq yaxşı deyil.

C ə n g a v ə r. Sağ ol! (*İçir*)

Q i v a m i. Mənim bu dünyada iki böyük dostum var. Onlardan biri şərabdır, biri də şeir.

Ə b d ə k. O gələn kimdir?

Q i v a m i. Şairdir. Onun şerində Allah gücü vardır. Sən kimsən?

Ə b d ə k. Mən kuzəçiyəm, memarlıq da edirəm.

Q i v a m i. Doğrudanmı? Yəqin bu kuzəni də sən bişirmisən. (*Yenə Əbdəkin qədəhini dolduraraq*) Bir də nuş olsun!

Ə b d ə k. Qoy bunu da yoldaşınız içsin.

Q i v a m i. O, ayda-ildə bir kərə içər. Onun gözəl Bərdəyə məftun nəzərləri onsuz da sərxoşdur... O, günün-günorta çağı göylərdə bəxt ulduzunu axtarır.

N i z a m i (*gəlir*). Nuş olsun!

Q i v a m i. Qardaşım, göydə axtardığın ulduzu tapdınmı?

N i z a m i. Yox, əzizim, mən o ulduzu yerdə tapacağam. O yalnız gecələr deyil, gündüzlər də parlayacaq.

Ə b d ə k (*dolu qədəhi Nizamiyə uzadaraq*). Alın, dostunuz dedi, mən də tanıdım: siz Nizamisiniz!

N i z a m i (*qədəhi alaraq*). Yer ulduzlarının sağlığına! (*İçir*) Ox... İndi mən dünyanın böyüklüyünə inanıram. Mən bu yerləri gəzdikcə, hər budaqdan bir bülbülün səsini eşidirəm, çiçəklərin dilini öyrənirəm.

Q i v a m i. Nə, nə? Çiçəklərin dili?

N i z a m i. Çiçəklər bəzən insandan da mənalı danışmağı bacarırlar. İti görən göz, yaxşı eşidən qulaq, bənövşənin sözlərini reyhandan, qızıl gülün sevincini yasəməndən dərhal seçə bilər... (*Gözü Yusifə sataşır, gəlib onu yuxudan oyadır*) Yusif, mehriban dostum, qalx, o dünyada çox yatacaqsan, indidən hayıfını al...

Y u s i f (*narazı*). Belə getsə, o dünyada da heç rahat olmaram... Turacdan, qırqovuldan vura bilmədin, yenə boş qayıtdın?

N i z a m i. Dostlar, hamınızı inandıra bilərəm ki, Bərdənin bu ilahi gözəlliyi məni heyran etmişdir.

Ə b d ə k. Lakin bu gözəllik bizə qismət olacaqmı?

N i z a m i. Bərdəni seyr edən insanın gözləri heç bir zaman həyatdan doymayacaqdır. Ana yurdunun bu qərib, bu ucsuz-bucaqsız laləzarını tərif etmək, bilirsinizmi şair üçün nə böyük səadətdir.

Ə b d ə k. Dünyada səadət varmıdır, şair?

N i z a m i. İnsan olan yerdə səadət də vardır, gözəllik də!

Ə b d ə k. Lakin bu gözəllik əbədi deyildir.

N i z a m i. Dünyada əbədi olan bir şey vardır: Məhəbbət!.. Bu gözəlliyi məhəbbət yaşadacaqdır.

Q i v a m i. Qardaşım, mən gözlərindən oxuyuram, sənin ürəyin doludur. De, de gəlsin!

N i z a m i

(*Əlini Qivaminin çiyninə qoyaraq*)

Bərdə nə gözəldir, oh, nə göyçəkdir!
Yazı da, qışı da güldür, çiçəkdir!
Yayında dağlara lalələr səpər;
Qışını baharın nəsimi öpər...
Oxuyur kəkliyi, ötür turacı,
Qırqovul yuvası hər sərv ağacı...
Səssizlik içində dincəlir gülşən,
Torpağı azaddır qayğı, kədərdən...
Quşlar yığılırkən bu gözəl yurda,
Quş südü istəsən, taparsan burda...
Belə şux, sevimli gülşən harda var?
Harda var xəzinə saçan bu diyar?!

Ə b d ə k. Ah... Bu sözlər qəlbimin kədərini daha da artırdı.

N i z a m i. Qəhrəman insanların ən böyük düşməni məyusluqdur. Səni kədərləndirən nədir, qardaşım?

Ə b d ə k. Bu görünən sarayları quran da, onlara baxdıqca ən çox sevinən də mənəm. Amma ürəyimdəki dərdi hamınız bilin: gözəl Bərdəni fəlakət gözləyir! Qanımla yaratdığım bu sənət abidələrini vəhşi xəzərlər uçurub xarabaya döndərməyə gəlirlər. Budur, dünəndən bəri at belində Bərdənin istehkamlarını gəzərək yoxlayırıq... Ümidimizi yalnız öz qolumuzun gücünə bağlayırıq... Dedilər ki, Şirvan hökmüdarı Bərdəyə ova çıxmışdır. Biz onunla görüşüb kömək istəyəcəyik. Dərbənd əmiri bizə kömək verməkdən boyun qaçırtdı. Bərdənin dostu yoxdur.

N i z a m i. Vardır, əzizim... Vətənimiz kimsəsiz deyildir!

Ə b d ə k. O kimdir, şair?

N i z a m i. Əlini qılınc, sinəsini qalxan edənlər... Qorxmayın, buraya ölüm gətirənlərin son yeri qəbiristandır. Bu torpağın oğulları hər şeydən yoxsul olsalar da, namusdan yoxsul deyildir.

C ə n g a v ə r. Sağ ol, Nizami! Sən uzaqda, Gəncədə yaşasan da, cəngavərlərimizin ürəyinə yaxınsan. Biz dava meydanına gedəndə, sənin sözlərindən qüvvət alacağıq.

Ə b d ə k. Əmin olun, dostlar, bizim yarağımız həmişə əlimizdədir. Ölərik, amma basılmarıq!

N i z a m i. Eşidirsinizmi? "Ölərik, amma basılmarıq!" Siz də eşidin, igid dostlarım. Nizami yalnız Azərbaycan igidlərinin eşqilə yaşayır.

Ə b d ə k. Sağ olun! (*Gedirlər*)

Cəngavərlərdən biri oxuyur:

Dərya səndən kim keçdi,
Kim qərq oldu, kim keçdi?
Yadıma kimlər düşdü,
Xəyalımdan kim keçdi.

Əzizim katan yaxşı,
Geyməyə kətan yaxşı:
Gəzməyə qürbət ölkə,
Ölməyə vətən yaxşı!

N i z a m i. Onun yerişi aslan pəncəli bir igidin yerişinə bənzəyir. (*Sükut edərək ətrafa baxır*) O ceyranları görürsünüz?

Y u s i f. Hanı, hanı mən görmürəm?

N i z a m i (*nişan alıb atır*). Aha, sən görənə kimi mən vurdum!

Y u s i f. Afərin, Nizami, Əhsən! İndi bildim ki, şairdən də ovçu olarmış...

Hər üçü yüyürüb gedir. Bir zaman Şirvan şahı öz adamları ilə ov paltarında gəlir.

Ş a h. Vəzir, ovçuları görürsənmi? Bizim dünəndən axtarıb tapmadığımız ceyranlar indi onlara rast gəlmişdir.

V ə z i r. Şahım, o ovçulara deyərik, vurulmuş ceyranı sizə bağışlarlar...

Ş a h. Bunun heç bir qiyməti olmaz, vəzir... Mən öz taleyimi sınadım, qarşıma heç nə çıxmadı.

V ə z i r. Xeyr, şahım, bu, tale deyildir. Biz bu yerlərə yaxşı bələd olmadığımız üçün...

Ş a h (*onun sözünü kəsərək*). Aha, qayıdırlar. Bu xoşbəxt ovçularla bir neçə kəlmə danışmaq heç də pis olmaz.

Yusif Qivami ilə bərabər qayıdır.

Y u s i f. Tapa bilməyəcək... Yaralı ceyranı tapmaqdan çətin iş yoxdur... Amma hayıf, qiyamət ceyran idi! (*Şahı və adamlarını görərək*) Bunlar kimdir, görəsən?

Q i v a m i. Biz? Heç kim; dünya evinin əziz qonağı...

Q i v a m i. Hardansınız, qardaşlar?..

V ə z i r. Biz Şirvan sarayındanıq... Bəs siz kimsiniz?..

Ş a h. Gülməli kişidir...

Q i v a m i. Xeyr, mən gülməli deyiləm. Yalnız ürəyiaçıq, könlü şad bir adamam.

N i z a m i (*vurulmuş ceyranı gətirir, yerə atır*). Alın! Hər şeydə taleyim belə gülsə, xoşbəxtlikdə heç kim mənimlə rəqabətə girişməz...

Yu s i f (*xəncərini qınından çıxardaraq*). Nizami, ala, başını kəs!

N i z a m i (*gülümsünərək*). Şair baş kəsməz. Bu işdə sənin məharətin daha çoxdur!

Ş a h. Nizami?.. Sən şair Nizamisən, eləmi?

N i z a m i. Bəli... Ancaq mən hələ özümü şair adlandırmağa cəsarət etmirəm.

Ş a h. Yox, belə təvazökar olma! Bu ad sənə layiqdir. Xaqani səni təriflədi. Mən sənə ürəkdən vuruldum.

N i z a m i. Xaqanini mən hələ görməmişəm. Mən onu yalnız məktublarından tanıyıram... Böyük şair nədənsə son məktublarını mürəkkəblə yox, göz yaşları ilə yazır... Onun sözlərindən Azərbaycanın dərin kədərini oxunmaqdadır.

Ş a h. Şair, arzum budur: bütün dərdini unut, sarayıma gəl! Məcnun eşqinə dair dürr kimi bir söz de! Bacarsan, bakirə Leyli kimi iki-üç kəlmə bakirə söz yarat!

N i z a m i. Əfv edərsiniz, ey şah, Bərdəyə hazırlanan hücumdan xəbərdarsınızmı?

Ş a h. Hücum edən kimdir?

N i z a m i. Vəhşi xəzərlər.

Ş a h. Yox, bu mənim üçün təzə xəbərdir. Bir də, Bərdə Şirvan hökmüdarının ixtiyarında deyildir.

N i z a m i (*dərindən köksünü ötürərək*). Elədir, Odlar yurdu on yerə parçalanmışdır. Hər dərənin bir hökmüdarı var! Nə üçün, ey şah? Məgər bir insanın qəlbi belə xırda hissələrə bölünərkən, yaşaya bilərmi?

Ş a h. Əvvəldən belə olmuşdur, şair... Bunun günahı məndə deyil, tarixdədir.

N i z a m i. Əsl qüvvət də, tarixin səhvini düzəldən hökmüdardadır. Azərbaycanın belə bir hökmüdara ehtiyacı vardır. Siz də çalışın, bir ürək on yerə parçalanmasın. Bunu sabah bütün xalq sizdən tələb edəcəkdir!

Ş a h. Səndən cavab gözləyirəm, şair, sənin kimi mahir bir şeir ustadı sarayda, naz-nemət içində yaşamalıdır!

N i z a m i. Məncə, şair hər şeydən əvvəl insanların qəlbində yaşarsa, daha gözəl olar, ey şah! Bir də, mən bu yerlərdə ötən quşlar kimi azadə nəfəs almaq istərdim. Mən bu yerləri sevirəm. Sevgi isə, mənim ən böyük ilham mənbəyimdir.

V ə z i r. Sizcə, bu yerlərdən uzaqda yaşayan saray adamlarının hamısı bədbəxtdirmi?

N i z a m i. Baxın, bu gün mənim bəxtimdən ceyran sürülərinin sayı-hesabı yoxdur. İzninizlə biz gedək.

Ş a h. Buyurun, mən sizi saxlamıram. Amma yaxşı düşün!..

N i z a m i. Mən ömrüm boyu düşünəcəyəm... Dünyanın, həyatın sirlərini kəşf etmək istəyən bir insan üçün düşünmək həm ilk, həm də son vəzifədir. Yusif, qardaşım, gəl! (*Gedirlər*)

Ş a h. Vəzir, Nizami saraya gəlib mənim qanadım altında böyüməlidir. O, Gəncədə nə qədər çox qalarsa, bizə bir o qədər də ziyan verə bilər. İndi biz buradan Gəncəyə gedirik. Demək, qət olundu. Qoy Nizaminin şöhrəti mənim sarayımla bağlansın...

Gedirlər. Oxuyan qızların səsləri eşidilir.

Burdan bir atlı keçdi,
Atın oynatdı, keçdi;
Günəş kimi parladı,
Ay kimi batdı, keçdi.

Afaq bir neçə qızla, belində səhəng, əlində bardaq, bulaq başına gəlir.

A f a q (*Nizaminin ovladığı ceyranı görüb təəccüblə baxır*). Bu ceyran kimindir? Oh... Yazığın ürəyindən dəyib... Qızlar, bu heç yaxşı olmadı. Bizdən kimi isə ürəyindən oxlayacaqlar...

D ə s t ə g ü l. Sən özündən qorx! Bərdənin birinci gözəli sənsən...

A f a q. Əsl gözəl sənsən, Dəstəgül! Belə gözəl olmasaydın, qardaşım Əbdək sənə vurulmazdı... Bilirsənmi, o, Bərdə gözəlləri içində səni seçdi.

D ə s t ə g ü l. Eh, səndən səhər də, axşam da bu sözü eşidirəm.

B i r i n c i q ı z. Ovçular gəlir, qızlar... tez olun, səhənginizi doldurun!

A f a q. Yazıq ceyran! Səni anandan ayırdılar! İndi o yəqin hardasa gizlənib qanlı göz yaşı tökür. Zalım ovçu, bu yazığa necə qıydın? Onu istəkli anasından niyə ayırdın?

D ə s t ə g ü l. Tez olun, qızlar. Odur bax, gəlirlər. Ayıbdır...

İ k i n c i q ı z. Nədən ayıbdır? Kor deyilik, keçəl deyilik! Bir də, bulaq başında yorğun ovçuya əlin titrəyə-titrəyə su vermədin, nə ləzzəti!

B i r i n c i q ı z. Buna sözüm yoxdur. Savab işdən qaçmaram...

Nizami yoldaşları ilə bərabər qayıdıb gəlir.

Y u s i f. Olmadı, mən işi korladım. Ayağımın səsi onları hürkütdü.

Q i v a m i. Aha, bir dəstə ceyrana da burda rast gəldik.

Y u s i f. Mən ölüm dayanın, qaçırdarsınız... Bu ceyranlar da əlimizdən çıxar.

N i z a m i (*qızlara yaxınlaşaraq*).

Gözüm aydın gözümə surəti-canan görünür,
Bəxtimin güzgüsünə sünbülü reyhan görünür.

Gözəl Bərdənin pərilərinə salam olsun. Dağları, dərələri gəzib yorğun düşmüş qərib ovçulara su verməzsinizmi?

A f a q. Elimiz-obamız qonaqsevəndir. Qərib ovçulara onun gözləri üstündə yer var! (*Bardağını su ilə doldurub Nizamiyə tərəf uzadır*) Buyurun!

N i z a m i. (*Afaqı süzür, onun gözəlliyinin qarşısında sarsılır, öz-özünə*). Aman Allah, onun gül yanaqlarına, dağ çeşməsi kimi qaynayan gözlərinə baxdıqca, ürəyimin çırpıntılarını nə qədər aydın eşidirəm! Bəlkə o göydə axtardığım ulduzdur? (*Afaqa*) Pərilər sultanı, sən bir həqiqətsən, yoxsa xəyal?

A f a q. Yox, xəyal deyiləm...

N i z a m i (*Qivamiyə*). Eşitdinmi o nə dedi? (*Əli titrəyə-titrəyə Afaqın üzünə baxır; bardaq əlindən yerə düşüb qırılır*) İlahi, sındı! Pərilər sultanı, sənin verdiyin su mənə qismət olmadı! Eşqi şərab kimi qədəhə tökdüm, huşə gedəndə, əlimdən düşüb daşlara toxundu...

A f a q. O sındı, al sənə ovcumda su verim!

N i z a m i. Yox, yox, sən səadət timsalı olan bu qara gözlərindən mənə həyat suyu verdin... Sağ ol.. (*Məyus addımlarla uzaqlaşır. Hamının gözü ona tərəf zillənir*)

Q i v a m i. Sağ olun, gəncliyin qəlbinə şövlə salan qızlar, sağ olun! (*Gedirlər*)

D ə s t ə g ü l. Sənə nə oldu, Afaq, niyə qəmginsən? Sınan təki bardaq olsun.

A f a q. Yox, sınan o deyil, Dəstəgül, sınan ürəyimdir! O gözlər... o baxışlar... ömrümün sonuna kimi mən o gözləri unutmaram! Görəsən o həqiqətdir, yoxsa xəyal?!

P ə r d ə

## ÜÇÜNCÜ ŞƏKİL

Bərdə şəhərində geniş bir həyət. Bir tərəfdə uca saraylar, o biri tərəfdə isə, Əbdəkin evi görünür. Hava yeni-yeni işıqlanır. Əyri-üyrü küçə ilə T o ğ r u l və Ç i n g i z gəlir.

Ç i n g i z. Toğrul, bizdən başqa şəhərdə bir başıpapaqlı qalmamışdır. Vəhşi xəzərlərin birini də sağ buraxmayacağıq. Niyə dayandın? Bəri gəl, gecikərik.

T o ğ r u l. Dayan, Çingiz! Heç olmasa bircə dəfə Afaqın üzünə baxım. O, həmişə bu vaxtlar bulağa su gətirməyə gedir.

Ç i n g i z. Bu saat hamı qalanın bürclərinə dolub, şəhəri mühafizə edir. Biz də səngərdə olmalıyıq.

T o ğ r u l. Mən onu sevirəm, Çingiz, Afaqı görmədiyim zaman elə bil yaşamıram.

Ç i n g i z. Bəri gəl, hər şeyin vaxtı var. Ölməyib sağ qalsaq, yenə Afaqı görüb dərdini söylərsən.

T o ğ r u l. Əbdək, bacım Dəstəgülün könlünü ovladı. Amma Afaqı mənə layiq görmədi. Mənim elçimi geri qaytarmaq? Mən Əbdəkdən intiqam alacağam. Mən indi qollarımda aslan qüvvəsi duyuram.

Ç i n g i z. Gedək, Toğrul, üç-dörd gün bundan əvvəl meşədə Əbdək qoca bir aslanı böyrü üstə yıxıb, dərisini boğazından çıxartdı.

T o ğ r u l. Sən özün gördünmü?

Ç i n g i z. Gördüm, gördüm. Əbdək onunla bir xeyli güləşdi. Axırda aslan tab gətirməyib dizlərini yerə qoydu, sonra da Əbdək qılıncla boynunu vurdu.

T o ğ r u l. Məni qorxudub fikrimdən daşındırmaq istəyirsən? Yox, yox, Əbdək ölməsə, mən ölməliyəm.

Əbdək gəlir.

Ə b d ə k. Bütün şəhərin igidləri qanlı vuruşma meydanındadır. Siz kimi gözləyirsiniz?

T o ğ r u l. Aha, sən öz ayağında gəlib çıxdın. Səni öldürəndə bir dəfə də uf desəm, anamın südü mənə haram olsun.

Ə b d ə k. Toğrul, sənin başına havamı gəlmişdir? Elimiz, obamız alov içindədir. Amma sən dostuna qılınc qaldırırsan. Ar olsun sənə, Toğrul, ar olsun!

T o ğ r u l. Sən məni el içində rüsvay etdin. Sən Afaqa göndərdiyim elçini geri qaytardın. Mənim elçimi geri qaytarmaq?

Ç i n g i z. Bəsdir, Toğrul. Bu sözlərin yeri deyil. Sən Əbdəkin yanında bizim cəngavər şənimizə ləkə vurma, gedək!

T o ğ r u l. Sən mənim dostumsan, yoxsa düşmənim? Siz məni Afaqdan ayırmaqmı istəyirsiniz?

Qılıncını çəkir.

Ə b d ə k. Qılıncla sevgi tutmaz, Toğrul! Sən cəngavərsən, get qılıncınla düşmənə zərbə endir!

T o ğ r u l. Mənə ağıl öyrətmə, qorxaq!

Vuruşurlar.

Ç i n g i z (*onları aralamağa çalışır*). Toğrul, ayrılın! Əbdək, bəsdir! Vəhşi xəzərlər irəliləyir. (*Çağırır*) Köməyə gəlin! Köməyə gəlin! (*Onlar daha da bərk vuruşduğu zaman, Afaq evdən hövlnak çıxıb, onların arasına girir*)

A f a q. Qardaşım, bu nədir? Siz nə edirsiniz?

Ə b d ə k. Mənim sevimli bacım, qorxdun, eləmi?

A f a q. Vətənin cəngavərləri beləmi ad çıxarırlar? Bülbüllər ötən gözəl şəhərimiz bayquş yuvasına dönsə, siz müqəssir olacaqsınız!

Ə b d ə k. Sən get, bacıcan! Mən ona sevməyin qaydasını öyrədəcəyəm.

T o ğ r u l. Aman Allah, onu son dəfə gördüm. Onun çöhrəsi gözlərimi qamaşdırdı. Daha mən düşmənimi görə bilmirəm.

A f a q. Əbdək, əziz qardaşım, sən nə edirsən? Dəstəgülün qardaşına əl qaldırmaq?

Ə b d ə k. Günah məndə olmadı, Afaq. O, məni qorxaq adlandırdı. Eh, görünür, taleyim belə imiş ! İndi mənimlə Dəstəgül arasında tikanlı bir ağac bitdi. Məndən Dəstəgülə salam yetirməyi unutma. De ki, Əbdək ölüm dəqiqələrində də onun eşqindən qüvvət alacaq.

A f a q. Deyərəm, qardaşım, deyərəm.

Ə b d ə k. Mən aslanı bu qılıncla öldürmüşdüm. Al, mən həmişə yanında olmayacağam, özünü də, Dəstəgülü də düşməndən qoru!

A f a q Sağ ol, qardaşım. Heç bir düşmən mənim üçün qorxulu deyildir.

Ə b d ə k. Sağlıqla qal, mənim igid bacım! (*Gedir*)

A f a q (*qılıncı divara söykəyir*). Toğrul, Toğrul, sən məni qılıncla xatırlayırsan. O isə... Ah, ey böyük Tanrı, mən onun sözlərini bir də eşidəcəyəmmi? (*Qılıncı götürərək*) Yox, bu qanlar, məni də, sevgimi də vaxtsız öldürəcəkdir. Amma nə üçün? İnsan dünyaya böyük bir məhəbbətdən zövq almaq üçün gəlməyirmi? (*Bu anda Dəstəgül çiynində səhəng, bulaq başından qayıdır*) Of, Dəstəgül, Əbdək, bax, indicə getdi, görüşdünüzmü?

D ə s t ə g ü l. Yox, tale bizi görüşdürmədi. Mən onu çeşmə başında, çinarın altında çox gözlədim. Yenicə doğan günəşi onsuz qarşıladım.

A f a q. Əbdək çox kədərli idi. Sənə dönə-dönə salam yollayırdı.

D ə s t ə g ü l (*səhəngini yerə qoyur*). Mənim də könlüm dərdlidir. Afaq, ölümə gedən Əbdək deyil, mənim eşqimdir. Ölüm Bərdəni qara bulud kimi çulğamışdır. Hara baxırsan, səssizlikdən qulaq tutulur. Şəhər elə bir qəbiristandır. Bu əlindəki qılınc nədir?

A f a q. Əbdək verdi, “lazım olar!” dedi. Eh, Allah bilir kim öləcək, kim qalacaq...

D ə s t ə g ü l. Qoy biz mahnı səsi eşidib, ölümü unudaq, Afaq. O gözəl nəğməni oxusana!..

A f a q (*qılıncı divara söykəyir*). Bax, gün doğdu. Necə də parıldayır. Bizim də bəxtimiz belə parıldasaydı! (*Rudunu götürüb sinəsinə basır*) Dəstəgül, görəsən bir də ona rast gələcəyəmmi?

D ə s t ə g ü l. Kimə, kimə, Afaq?

A f a q. Heç, o bir xəyal kimi göründü. Bir xəyal kimi də süzülüb getdi. Əbdək onun qəzəllərini oxuyurdu. Nə gözəl şair imiş! Hər sözü bir hicran qədər güclü idi. (*Rudunu çalır, həzin və titrək bir səslə oxuyur*):

İndi ki, mən həsrət qaldım bu dünyada bir dildara,
Səyyah kimi üz qoymuşam bu diyardan, o diyara.
Könlümün bu qəmlərini, ciyərimin al qanıyla,
Çoxdan bəri hey yazıram qayğı bilməz divarlara.

Cəbhədən müdhiş bağırtılar eşidilir, qılınc səsləri get-gedə yaxınlaşır. Afaq, Dəstəgül həyəcanla o tərəfə boylanırlar.

D ə s t ə g ü l. Bax, görürsənmi? Xəzərlər şəhərə doluşdu. Bərdənin qanlı günləri başlandı. Of... Adamın tükləri ürpəşir. Niyə insanlar vəhşi heyvan kimi bir-birini yeyir. Bu qırğınlar nə üçündür, Afaq?!

A f a q. Bir qarış torpaq üçün. Tökülən qanlar, ölən insanlar, göz yaşları – hər şey, hər şey bu qara torpaq üçündür. Aman ya rəbbi, o qoşundurmu, yoxsa ucsuz-bucaqsız bir insan dənizidirmi?

D ə s t ə g ü l. Gəl, Afaq, gəl biz də köməyə gedək!

Bu zaman şəhərdən qalxan alov havada əks edir. Qızlar sarsılaraq baxırlar.

A f a q. Od vurdular, yandırdılar. Oh, gözlərin çıxsın, vəfasız dünya!

D ə s t ə g ü l. Ora bax, Afaq, oxlar göydən quzğun kimi tökülür.

A f a q. Bizimkilərdən yıxılanlara bax. Can, gör necə vuruşurlar!

D ə s t ə g ü l. Gəl, Afaq, gedək onların yarasını bağlayaq! Bəri gəl.

Dəstəgül Afaq ilə bərabər getmək istərkən, birdən dayanırlar. Gözləri böyümüş halda dal-dalı addımlayırlar.

A f a q. Bu nədir, mən yuxumu görürəm? Dəstəgül, o gətirdikləri Əbdək deyilmi?

D ə s t ə g ü l. Yox, yox, o deyil! Ola bilməz! (*İki nəfər cəngavər qollarının üstündə, bərk yaralanmış Əbdəki gətirib çardağın altında yerə uzadırlar. Dəstəgül dəhşətdən böyümüş gözləri ilə ona baxır*)

A f a q (*qardaşının üstünə atılaraq*). Of... Əziz qardaşım. Kaş ki, gözlərim kor olaydı, sənin bu qanlı sinəni görməyəydim!

1-c i c ə n g a v ə r. Namərdlər arxadan vurdu, qızım. Toğrulun qılıncı daldan dəydi.

D ə s t ə g ü l. Yox, yox, bu ola bilməz! Toğrul Əbdəkimi vurdu?

1-c i  c ə n g a v ə r. Ağlama qızım, ağlama Afaq! Belə mərd igidlərin bacısına göz yaşı yaraşmayır.

Ə b d ə k. Məğlub olduq, bacıcan! Düşmənlər qabaqdan ox yağdıranda, dostlar daldan qılınc vurdular. Qan su yerinə axdı...

1-c i  c ə n g a v ə r. Qızım, Afaq, sən bunun yaralarını bağla. Biz yenə qayıdarıq! Gedək, bir də bəxtimizi sınayaq!

D ə s t ə g ü l. Əmican, bəs Toğrul özü hanı?

1-c i  c ə n g a v ə r. Toğrul? (*sükut edərək*) O sənin nəyindir?

D ə s t ə g ü l. Qardaşımdır; yoxsa onun başına bir iş gəldi?

1-c i  c ə n g a v ə r. Təqsir özündə oldu, qızım. Öz doğma balam da olsaydı, mən onun günahından keçməzdim!

D ə s t ə g ü l. Demək ölmüşdür! (*Ağlayır*)

1-c i  c ə n g a v ə r (*Dəstəgülə*). Qardaşın vətənə ləkə vurdu. Mən onun atası olsaydım göz yaşıma heyfim gələrdi. Gedək! (*Cəngavərlər gedirlər*)

Ə b d ə k. Ağlama, Dəstəgül! Yaxın gəl, yaxın gəl, məni vuran sənin qardaşın Toğruldur. Onun qılıncı düşmənə yox, sevgiyə dəydi! (*yerində dirsəklənərək*) Ağlamayın, mənim əzizlərim. Mərd igidlərimiz qılınc çaldı, ox süzdürdü. Qalanın qapılarında xəzərlərin qəbri qazıldı. Of, mən ölürəm... Aşiq olanlara ölüm də xoşdur. Dəstəgül! (*Yıxılır*)

A f a q. Get ananı çağır, Dəstəgül! (*Dəstəgül yüyürüb gedir*) Əziz qardaşım, mən and içirəm qanını yerdə qoymayacağam! (*Birdən sükut edərək*) Ancaq mən kimdən hayıf alacağam?

Bu halda həyətə doluşan xəzərlər müxtəlif tərəfə dağılışırlar. Onlardan biri Afaqı görüb dayanır.

X ə z ə r. Aha, Bərdə gözəli, yanaqların yeni doğmuş ay, gözlərin ahu gözləridir.

A f a q (*səksənir*). Sən kimsən? (*Qorxub geri çəkilərkən, gözü qılınca sataşır, tez onu götürür*) Çəkil!

X ə z ə r. O incə barmaqlara polad qılınc yaraşmayır. Bərdə gözəli, at yerə o qılıncı, təslim ol! Səni zəngin saraylara qənimət aparacağam, mənim də küskün taleyim güləcək. Təslim ol!

A f a q. Bir addım da irəli gəlsən, öz qanında boğulacaqsan!

D ə s t ə g ü l ü n  s ə s i. Afaq, köməyə gəl! Afaq!..

X ə z ə r. Bax, onu da aparırlar. Bu gündən sonra bütün Bərdə gözəlləri bizim ixtiyarımızdadır.

A f a q (*o tərəfə yüyürmək istəyərkən, Xəzər onun yolunu kəsir*). Çəkil deyirəm sənə! (*Qılıncla kəskin bir zərbə endirir*) Unutma ki, Bərdə qızlarının beşiyi köhlən at belidir, oyuncaqları da polad qılınc!

Vuruşurlar.

X ə z ə r. Qorxusundan yanağında göz yaşı parıldayan bu qız qılınc oynatmağı da bacarırmış. Sən qılınc zərbəsinə dözməyəcəksən! Gedək zəngin saraylara!

A f a q. Doğma gülşənini sevən bülbülün ən böyük düşməni qızıl qəfəsdir. Saraya məni yox, mənim vurduğum qılınc yaralarını hədiyyə apar! Al, bu da biri! (*Xəzəri vurur. O, dizi üstə qapanır*)

X ə z ə r. Köməyə gəlin! Köməyə gəlin! (*Afaq ona yaxınlaşır*) Amandır, məni öldürmə, yalvarıram, keç günahımdan.

A f a q. Ye bu torpaqdan doyunca!

X ə z ə r. Mən bu torpağı necə yeyim?

A f a q. Elə isə öləcəksən!

X ə z ə r. Yalvarıram, sənə əzrail olmaq yaraşmayır, sən mələksən!

A f a q. Ye bu torpaqdan, deyirəm sənə.

X ə z ə r. Sizlərdə adət belədirmi?

A f a q. Bəs bu qədər vuruşmaq, günahsız insan qanı tökmək, bu gözəl sarayları yandırıb külə döndərmək nə üçündür? Qoy səni göndərənlər bilsinlər ki, adətimiz belədir! Düşməni məğlub edəndə, biz ona doyunca torpaq yedirdirik. (*Vurub öldürür. Yüyürüb Dəstəgül tərəfə getmək istərkən, bir dəstə xəzər onu əhatə edir. Afaq yenə də vuruşur, amma qılınc əlindən yerə düşür*)

B i r X ə z ə r. Aparın, bu mələk saraylara layiq bir hədiyyədir.

A f a q. Əbdək, qardaşım, gəl!

Dəstəgülün səsi: "Yox, məni apara bilməyəcəksiniz, ölərəm, getmərəm!" Afaqı sürüyüb aparırlar. O, dartınırsa da, xəzərlərin qolları arasından çıxa bilmir. Bu zaman Əbdək gözlərini açır. Güclə özünü doğruldaraq yüyürmək istərkən yıxılır. Sürünə-sürünə irəliləyir.

Ə b d ə k. Ulu Tanrım, sən özün şahid ol ki, müqəssir mən deyiləm! (*Yenə sürünür*) Əlvida, Afaq, əlvida!

Gücdən düşüb üzü üstə yıxılır

P ə r d ə

## DÖRDÜNCÜ ŞƏKİL

Gəncə yaxınlığında bir ovlaq. Yaşıl bir təpə. Uzaqda çadırlar ağarışır. Təpənin başında şah dayanıb uzaqlara baxır. Arxadan gələn vəzir ona yanaşır. Şah onun gəldiyini hiss edərək, ona tərəf dönür.

Ş a h. Vəzir, Nizamini çağırmağa gedən qasid hələ qayıtmamışdırmı?

V ə z i r. Xeyr, şahım, ondan yenə də bir xəbər yoxdur. Görünür, Nizami həddindən artıq məğrurdur.

Ş a h. Düz deyirsən, vəzir, mən onu əsərlərindən tanımışam. Nizami Qaf dağı kimi məğrur və əyilməzdir.

V ə z i r. O, nə qədər məğrur olsa da, hökmüdarın qarşısında əyilməlidir, şahım!

Ş a h (*kimi isə görərək*). Bu gələn atlı kimdir? Bizim qasid deyilmi? O, yenə təkdir?

Q a s i d (*gəlir, şaha təzim edir*). Fərmanınızı ona yetirdim, şahım!

Ş a h. Nizami gəlmədimi? Bu nə cəsarətdir?

Q a s i d. Xeyr, Nizami hüzurunuza gələcəkdir.

V ə z i r. Mən sizə ərz elədim, şahım, o, hökmdarın fərmanından boyun qaçıra bilməz. Nizami şairdir, amma siz hökmüdarsınız!

Q a s i d. O əvvəlcə gəlmək istəməyirdi... Bərdənin fəlakətindən xəbər tutanda...

Ş a h (*onun sözünü kəsərək*). Gedə bilərsən.

Qasid təzim eləyib gedir.

V ə z i r. Şahım, Bərdədən alınan xəbər doğrudan da acıdır. Nizami düz deyirmiş, vəhşi xəzərlər şəhərə dolub daşı-daş üstündə qoymamışlar. O böyük sarayların nə izi qalmışdır, nə də tozu.

Ş a h. Doğrudanmı? Bu heç yaxşı olmadı, vəzir, mən buna ürəkdən təəssüf edirəm. O yerlərə ova çıxarkən, insan dünyanın hər bir dərdini unudurdu. Təəssüf, çox təəssüf!

Q a s i d. Aha, Munis də gəlir.

V ə z i r. Yəqin Gəncə şairləri ilə deyişməkdən qayıdır. Şirvan sarayının belə şairləri var ikən, sizin də könlünüz hər zaman güləcəkdir, şahım. Siz öləndən sonra da sizi əbədi yaşadacaqdır.

Ş a h. Amma Nizami ayrı aləmdir, vəzir, onun şeirlərində ilahi bir qüdrət vardır.

M u n i s (*Gəncə valisi ilə gəlib şaha təzim edir*). Şikarınız uğurlu olsun, şahım!

Ş a h. Sağ ol, Munis. Söylə görüm, Gəncə şairləri ilə deyişdinmi?

M u n i s. Bütün deyişmələrdə böyük hökmdarın adını göylərə ucaltdım, şahım!

Ş a h. Nizami ilə qarşılaşdınmı?

M u n i s. Müqəssir özü oldu. Qarşıma çıxmağa cəsarət etmirdi. Dedim: "Şair, adın dillər əzbəridir. Hünərini göstər!" Dedi: "Mən böyük Munislə qabaqlaşmağa utanıram".

Ş a h. Doğrudanmı? Munis, doğrusu qulaqlarıma inana bilmirəm, Nizami həqiqətən belə cəsarətsizdirmi? Yox, ifrata varırsan, Munis.

M u n i s. Şahı aldatmaq ən böyük cinayətdir. Mən həqiqət aşiqiyəm, mənim vicdanım ləkə götürməz. Gəncə valisi özü söyləsin.

V a l i. Munis doğru buyurur. Mənim Nizamidən şikayətim vardır, şahım. O, Məhsəti Gəncəvidən dərs almışdır. Özü də xırda qoşmalardan başqa heç nə yaza bilmir.

Ş a h. Xırda qoşmalar?

V a l i. Bəli, bəli, onun adı var, özü yoxdur. O başqalarının tərifi ilə yaşayır.

Ş a h. Yox, Nizaminin hər bir misrası almaz kimi itidir. Ürəklər daşdan da olsa, onları kəsib özünə yol açacaqdır.

V a l i. Hökmdar özü bilən yaxşıdır. Gələr, görərsiniz. Dinsiz üsyankarları belə sevirsinizsə, Nizamini də sevəcəksiniz.

Ş a h. Sən yanılırsan, Vali, mən Nizaminin qəzəllərini ürəkdən sevmişəm. Onlar doğrudan da, nadir incilərdir. Şirvan sarayı bu nadir inciləri yaradan ustaya malik ola bilsə, böyük İsgəndər özü mənə qibtə edəcəkdir.

M u n i s. Gəncə valisi haqlıdır, şahım. Mən həqiqət aşiqiyəm, mənim vicdanım ləkə götürməz. Nizaminin işlədiyi cinayəti mən sizdən gizlətmək istəmirəm.

Ş a h. Cinayət? Kimi öldürmüşdür? Vali, bu nə sözdür?

V a l i. Adam öldürsəydi, mənə bu qədər təsir etməzdi. O, Məhsəti xanımla birləşib, böyük hökmdarı xalq içərisində rüsvay edir. Belində xəncər gəzdirən əxiləri başına toplayıb, xalqı üsyana çağırır. Mən Məhsətinin həcvlərini öz qulağımla eşitdim.

Ş a h. Bəsdir. Bu sözlərin biri doğru olsa, and içirəm gözə görünməz böyük Tanrıya, mən Nizamini də, Məhsətini də daşqalaq etdirəcəyəm. Amma siz uşaq kimi sadəsiz. (*Cibindən bəyazı çıxardır*) Bu qəzəllər qoşma deyildir, gövhərdir. Xalq onu belə şeirləri üçün sevir.

M u n i s. Bəlkə də biz yanılırıq, ola bilər. Sizi bu rəyə gətirən Xaqanidir. O, mənim düşmənimdir. Məni gözdən salmaq üçün Nizamini tərifləyir. Mən həmişə sizdən gizlədirdim. Amma daha dözə bilmirəm. Hər şeyi açıb deyəcəyəm: Nizaminin "Sirlər xəzinəsi"ni xatırlayırsınızmı? O, ölkəni xarabaya döndərməkdən zövq alan zalım Ənuşirəvanın simasında sizi təsvir etmişdir.

Ş a h. Aha, bu çox qəribədir. Demək, mən bayquşların nəğməsindən həzz alıram, eləmi?

M u n i s. Mən həqiqət aşiqiyəm, şahım!

V ə z i r. Şahım, Bərdədən qasid gəlmişdir. O bizdən kömək istəyir.

Ş a h. Gözəl Bərdə xarabaya dönəndən sonra bu kömək nəyə lazımdır?

V ə z i r. Əsir düşmüş bərdəliləri vəhşi xəzərlərin pəncəsindən xilas etmək lazım deyilmi? Şahım unutmayın ki, bir zamanlar Şirvanı düşmənlər hədələyəndə, Bərdə cəngavərləri bizə kömək əlini uzatmışdı.

Ş a h. Vəzir, sən bu tarixi nə üçün xatırlayıb mənim nəşəmi korlayırsan? Mən o zaman heç kimə yalvarmadım.

V ə z i r. Qardaş qardaşa yaman gündə gərək olar, şahım!

Ş a h. Onu çağırtdır gəlsin!

Vəzir baş endirib gedir.

M u n i s. Siz bərdəlilərə borclu deyilsiz, şahım.

Ş a h. Doğrudur, mən heç kimə borclu deyiləm. (*Vəzir Əbdəklə bərabər qayıdır. Əbdəkə*) Səni buraya kim yolladı?

Ə b d ə k. Bərdəlilər yolladı, böyük hökmdar!

Ş a h. Kömək istəyən adam əvvəlcədən xəbər verərdi.

Ə b d ə k. Biz dedik, özümüz onlara üstün gələrik. Düşmənlərimiz xeyli qüvvətli imiş.

Ş a h. Yaxşı, şəhər yanıb külə dönəndən sonra, mənim köməyimdən nə çıxar?

Ə b d ə k. Biz xəzərlə vuruşub əsirlərimizi xilas edə bilərik.

Ş a h. Eləsə, çalışaram sizin ricanıza əməl olunsun.

Ə b d ə k. Mən rica etməyə yox, tələb etməyə gəlmişəm.

Ş a h. Necə?

Ə b d ə k. Siz nahaq acıqlanırsınız, şahım. Xatırınızdadırmı, bərdəlilər Şirvan qalasını müdafiə edərkən, yüzlərcə qurbanlar vermişdilər. Bərdə cəngavərləri ilə bərabər Şirvan qalasını düşmənlərdən mən də bax, bu sinəmlə müdafiə etmişəm. Borclu-borcluya belə cavab verməyə haqlı deyildir.

Ş a h. Eşidirsinizmi? Mən heç kimə borclu deyiləm! Gəldiyin yol ilə geri qayıt! Səni göndərənlərə söylə ki, Şirvan hökmdarı qorxaqları müdafiə etməyəcəkdir.

Ə b d ə k. Mən onların adından sizə cavab verə bilərəm. Qoy, bütün dünya şahid olsun ki, daş ürəkli, quş beyinli hökmdarlar ana vətənin qəlbinə yara vurmaqdan həzz alırlar.

Ş a h. Görünür, sən də ölümdən həzz alırsan. Vəzir, bunun beyni xarab olmuşdur. Başı bədənindən ayrılarsa, ağlı başına gələr. Aparın, gün batanda dar ağacından asılacaqdır, sonra da baş kəsiləcəkdir.

Vəzir. Şahım, qasidi öldürmək adətdən kənar işdir.

Ş a h. Sus, get mənim fərmanıma əməl et!

Ə b d ə k. Bu ölüm məni qorxutmayır, ey şah! Lakin bu qan yerdə qalmayacaqdır. Şahlar bizim qanımızda boğulacaqdır.

V ə z i r. Xarabaya dönmüş bir mahalın qasidini öldürmək? Yox, yox, insan ürəyi buna tab gətirməz, şahım!

Ş a h. Nə qədər fəryad qoparsan da, fərmanım qətidir! Kimi gözləyirsən, vəzir?

V ə z i r (*baş endirir*). Hökmdarın əmri Allah fərmanıdır, şahım.

Ə b d ə k. Dayanın, siz də şahid olun: mən düşmənə sinəsini qalxan tutub on yara almış bir cəngavərəm. Hökmüdarınız isə, əli qanlı, həris bir cəlladdır. Qoy onun bu zülmündən sonsuz göylər də fəryada gəlsin! (*Əbdəkin qollarını bağlayırlar*)

Ş a h. Aparın!

Aparırlar.

M u n i s. Bax, Nizaminin bütün dostları belədir, şahım! Onun qəzəllərini oxuyan hər kəs mələk kimi məsum da olsa, nəhayət belə bir asi olur.

V ə z i r. Şair adı ilə fəxr edən insan, gərək başqalarının fəlakətində özü üçün səadət axtarmasın. Məncə, dünyada bundan böyük cinayət yoxdur.

Q a s i d (*gəlir*). Şahım, Nizami qulluğunuzda hazırdır. Gəlsinmi?

Ş a h. Gəlsin! (*Qasid Nizamini gətirir. O, şaha təzim eləyir*)

N i z a m i. Əfv edin, ey şah! Gecikməyim səbəbsiz deyil.

Ş a h. Son qəzəlinizi oxudum, şair. Bütün sözləriniz ürəyimdəndir.

Bu doğrudur, ədalətə arxalanır hər bir zəfər,
Hər zülmüdən, haqsızlıqdan yer üzündə doğar zərər.
Öz eybinə örtük olur insanların səxavəti,
Hünərləri pərdələyir qara fikir, paxıl kəslər.

V ə z i r. Doğrudan da, gözəl rübaidir, şahım. Şairin məsləhəti bizə çox xeyir verəcəkdir.

Ş a h. Şairin bizdən xahişi nədir?

N i z a m i. Yalnız bircə arzum vardır, ey şah!

Ş a h (*Vəzirə*). Bu gün böyük bir işrət məclisi qurulsun, saqilər gərdişə çıxsın!

V a l i. Gəncənin ən gözəl bağçalarından birində böyük süfrə açılmışdır, şahım!

Ş a h. Gəncə yaxınlığındakı yeddi para kənd şairə bağışlansın! (*Vəzirə*) Gedək, qoy şairin lətif qəzəlləri bizim ruhumuzu oxşasın.

N i z a m i. Ey şah, mənim deyəcəyim sözlər, oxuyacağım qəzəllər sizi yalnız kədərləndirə bilər.

Ş a h. Bu görünən bağlar, bağçalar da sənə azlıqmı edir? Sən nə üçün belə kədərlisən?

N i z a m i. Bahar fəslində şaxta vurmuş bir bağçanın bülbülü şən nəğmələr oxuya bilərmi?

M u n i s. O, hər zaman sizin iradənizə qarşı olmuşdur.

Ş a h. Sən dayan, Munis!

M u n i s. Mən həqiqət aşiqiyəm, şahım. Mənim vicdanım ləkə götürməz.

N i z a m i. Həqiqət aşiqi? Yox, nəfəsindən yalan qoxusu gələn insanın sözü ayın gül camalına nəqş olunsa da, yenə iyrəncdir.

Ş a h. Şairin belə kədərlənməsi yəqin səbəbsiz deyildir?

N i z a m i. Ey hökmdar, gözəl Bərdəni yandırıb külə döndərdilər. Azərbaycanın dilbər guşələrindən biri də məhv olub getdi. Böyük bir ölkənin xəstə qəlbinə yenə sağalmaz bir yara vuruldu. Analar övladlarından, bacılar qardaşlarından ayrı düşdü. Odur, baxın, Bərdənin yaralı igidləri sizdən kömək istəyir. Qardaş qardaşdan kömək istəyir. Of, mənim elə bir qüvvətim olaydı ki, qılıncların xarabaya döndərdiyi vətəni qələm gücünə gülşənə çevirəydim. Hanı elə bir hökmdar ki, bu xarabaları görərkən, ürəyindən qopan ah səsi bütün dünyanı titrətsin?!

M u n i s. İndi gördünüzmü, şahım? O, yenə də sizə böhtan atır!

Ş a h. Şair, mən səni üsyan etməyə çağırmadım. Nəşəni korlayan şairə mənim ehtiyacım yoxdur. Sarayımda belələri onsuz da azlıq etmir. Xaqaninin şeirlərini yəqin ki, oxumuşsan. Onun göz yaşları artıq məni təngə gətirmişdir. O da üsyan etməkdən zövq alır.

N i z a m i. Şairi Xaqani kimi qolu zəncirli bir qula çevirmək olar. Onu zindanlara da atmaq olar. Lakin, azad xəyallarını zəncirləməyə hökmdarların belə gücü çatmaz.

Ş a h. Şair, mən səni öz sarayıma dəvət edirəm.

N i z a m i. Ey şah, unutmayın ki, yurdumuzun böyük şairi Əbülülanı zindanda çürüdən saray oldu. Şairlər peyğəmbəri Xaqaninin də yolu orayadır.

Ş a h. Onların hər ikisi üsyankardır... Yox, şair, sənin də dalğın çöhrəni bürümüş kədər buludları görünür, heç zaman dağılmayacaqdır. Sənin səsindən şikayət yağır.

N i z a m i. Müqəssir mən deyiləm. Nə etmək ki, hökmdarlar bayquşu bülbüldən çox sevirlər!

Ş a h. Aha, demək Munis haqlı imiş. Sən məni zalım Ənuşirəvana bənzədirsən, eləmi?

N i z a m i. Mən yalnız həqiqəti yazmışam, hökmdar!

Ş a h. Həqiqət, həqiqət!.. Şairlərdən başqa bu yükü daşıyan yoxdurmu?

N i z a m i. Həqiqət doğrudanmı yükdür? Lakin bu yükü yalnız ürəyi olan insanlar daşıyır.

Ş a h. Vəzir, söylə ki, Nizami gəldiyi yol ilə geri qayıtsın.

V ə z i r. Şairin əlindən zəhər içmək də xoşdur, şahım. Nizami belə rəftara layiq deyildir.

Ş a h. Onun özünü də, əsərlərini də oda atmaq belə azdır!

N i z a m i. Ey hökmdar, mən sənin zülmündən şikayət edən məzlumların ah-naləsiyəm! Mən parçalanmış bir ölkənin şikəst ürəyindən qopub gələn bir fəryadam! Mən "Sirlər xəzinəsi"ndə olanların yüzdə birini demişəm. Mən bir güzgüyəm ki, sənin həqiqi simanı göstərmişəm. Əgər sifətin eybəcərdirsə, onun ləkəsini təmizlə! Bəs nə üçün güzgünü sındırırsan?

Ş a h. Vəzir, fərmanıma əməl olunsun!

V ə z i r. Hökmdarın əmri Allah fərmanıdır, şahım.

Nizami məğrur addımlarla gedir, hamı onun ardınca baxır.

M u n i s. İndi gördünmü, şahım, mən həqiqət aşiqiyəm, mənim vicdanım ləkə götürməz!

Ş a h (*Valiyə*). Sən haqlısan!

V a l i. Şahım, o, Məhsətinin fikirlərini təkrar edir. Nizami onun şagirdidir, o, bütün cavanları zəhərləyib yoldan çıxardır.

Bu anda geridən qalmaqal qalxır: "Qaçdı, qoymayın, tutun!" səsləri eşidilir.

V ə z i r. Bu nə səs-küydür? Nə olmuşdur?

M ü h a f i z l ə r d ə n  b i r i (*gəlir, şaha təzim edir*). Şahım, Bərdədən gələn Əbdək gözətçinin xəncərini qoparıb bizdən iki nəfəri öldürdü. Özü quş kimi ata sıçrayıb qaçdı.

Ş a h. Bu saat onun dalınca bir dəstə atlı göndərin! Yerin dibində də olsa tapılsın!

Mühafiz yüyürüb gedir.

Vali, biz ondan qisas almalıyıq!..

V a l i. Doğrusu, mən xalqın qəzəbindən qorxuram, şahım! Məhsətini sevməyən çox azdır. Bütün Gəncə onun başına and içir. Ona yaxın durmaq olarmı? Beli xəncərli igidlər məni tikə-tikə doğrarlar.

Ş a h. Gəncədə özündən başqa tərəfdarın yoxdurmu, Vali?

V a l i (*tərəddüd içində*). Hökmdarın əmri Allah fərmanıdır, şahım!

Ş a h. İndi mənim fərmanımı dinlə, Vali! Məhsəti burada, bax, mənim ayağımın altında daşqalaq edilsin! Bu Nizaminin sinəsinə dağ çəkər. O, mənim təklifimdən boyun qaçırdı. Mən özüm ondan intiqam alaram. Durma, get! Mən bu üsyankarlar yuvasına od vuracağam. Qoy Gəncədə şair səsi yox, bayquş naləsi ucalsın!

P ə r d ə

## BEŞİNCİ ŞƏKİL

Yenə orada, səhər tezdəndir. Günəş yeni-yeni tülu edir. Hər tərəf bomboşdur. Dərin sükut içində quşların həzin-həzin nəğmələri eşidilir. Birdən iki nəfər şəhərli görünür. Onlar elə bir qorxa-qorxa ətrafı dinləyirlər.

1-c i  ş ə h ə r l i. Eh... fani dünya!

2-c i  ş ə h ə r l i. Nə yaman ah çəkdin, əmican!

1-c i  ş ə h ə r l i. Oğlum, bir azdan Məhsəti xanımı buraya gətirəcəklər. Dünən padşahın çadırları, bax, burada qurulmuşdu.

2-c i  ş ə h ə r l i. Əmican, niyə həmişə yaxşı adamları öldürürlər? Dünyada pis adam azdır?

1-c i  ş ə h ə r l i. Nə bilim, oğlum? Görünür dünyanın bünövrəsinə daş qoyan namərd olubdur.

2-c i  ş ə h ə r l i. O daş yığınını görürsənmi? Onları yəqin Məhsəti xanımın üstünə yağdıracaqlar.. Of, adamın bədəninə üşütmə düşür. Axı, sən demədin onun günahı nədir?

1-c i ş ə h ə r l i. Nə olacaq, bu dünyada doğru söz danışmaqdan böyük günah yoxdur. Bax, Vali gəlir. Gedək, ağacın dalında gizlənək, görək axırı nə olar.

2-c i ş ə h ə r l i. Gəlsənə gedib əxiləri çağıram, Valinin dəstəsinə hücum çəkib Məhsətini qurtaram. Hə, nə deyirsən, əmican?

1-c i ş ə h ə r l i. Yox, oğlum, bundan heç bir şey çıxmaz. Nahaq yerə cavanlarımızı bada verməyin. Vali insan qanına çoxdan hərisdir. Gedək, sonra gəlib yalvararam. Bəlkə ürəyi yumşaldı, Məhsəti xanımın günahından keçdi. Gedək, oğlum! (*Gedirlər*)

V a l i (*bir neçə mühafizəçi ilə gəlib dayanır*). Bu işdən bir adam da xəbər tutmasın. Sizlərdən kim bu sirri açsa, onun dilini kəsdirərəm!

1-c i m ü h a f i z ə ç i. Doğrudur, Vali həzrətləri, xalq eşitsə, şəhərdə iğtişaş qalxar.

V a l i. Ehtiyatlı olun, sizdən başqa buraya bir insan ayağı dəyməsin!

1-c i m ü h a f i z ə ç i. Baş üstə, o edam olunan zaman, burada bir milçək belə səslənə bilməz. (*Gedir*)

V a l i. O, hökmdarın da, mənim də sinəmə dağ çəkmişdir; yalnız o öləndən sonra gözümə yuxu gedəcəkdir. (*Qolları bağlı Məhsətini bir neçə mühafizəçi əhatə edib gətirir*) Dayanın, böyük hökmdarımız bu yeri nişan verdi. Məhsətinin qəbri burada qazılacaqdır. (*Mühafizəçilər onun qollarını açırlar. Vali ona yaxınlaşır, istehza ilə*) Böyük şairə, izn ver son dəqiqələrində üzünə doyunca baxım.

M ə h s ə t i. Çəkil, mənim üzüm bir aynadır, bu aynada insan qanına boyanmış simanı görüb qorxarsan.

V a l i. Eşidirsinizmi o nə deyir? Sənin başına bəla gətirən də acı dilindir.

M ə h s ə t i. Amma yenə də qorxan mən deyiləm, sənsən, Vali həzrətləri!

V a l i. Mənim heç nədən qorxum yoxdur. Bütün Gəncə mənim adım gələndə zağ-zağ əsir.

M ə h s ə t i. Yalandır, səni bu biyabana gətirən də qorxudur. Sənin başındakı papaq deyil, ifritə qadın ləçəyidir.

V a l i. Bu mənasız qürurdan əl çək! Sənin bu sözlərin mənim qulağımda bir milçək vızıltısıdır. Budur, bax, sənin ki, qorxudan belin əyilib ikiqat olmuşdur.

M ə h s ə t i. Namərd, mən yerə tərəf əyilərkən, burada, bu vəfasız torpaqda, vaxtsız ölən gəncliyimi axtarıram.

1-c i ş ə h ə r l i (*yoldaşlarıyla bərabər gəlir*). Vali həzrətləri, məni bağışlayın. Bu acı xəbəri eşidəndə, ürəyim tab gətirmədi. Gecə yarıdan sizin yolunuzu gözləyirdim.

V a l i. Bunu sənə kim dedi, qoca?

1-c i ş ə h ə r l i. Vali həzrətləri, bütün şəhərdə Məhsətinin daşqalaq olunmasından danışırdılar. Onun ana mərhəmətindən hamı nəvaziş görmüşdür. Amma siz onu öldürmək fikrindəsiniz.

V a l i. Bu, hökmdarın fərmanıdır, qoca.

2-c i m ü h a f i z ə ç i (*yüyürüb gəlir*). Vali həzrətləri!..

V a l i. Nə var? Nə olmuşdur?

2-c i m ü h a f i z ə ç i. Şəhərdən sel kimi bir izdiham axıb gəlir!

V a l i. Sən dəlimi olmuşsan, izdiham nədir? (*Mühafizəçilərə*) Bu saat qabaqlarını kəsin! Birini də yaxına buraxmayın!

2-c i m ü h a f i z ə ç i. Onların qabağınca şair Nizami də gəlir. Mən ona toxuna bilərəmmi?

V a l i. Uzun danışma, qorxaq tülkü, bir addım da irəli gəlsələr, sənin boynun vurulacaqdır. Get, fərmanıma əməl et. Tez!

2-c i m ü h a f i z ə ç i. Baş üstə! (*Gedir*)

1-c i ş ə h ə r l i. Vali həzrətləri, Allahın qəzəbindən qorxmayırsan, insanların naləsini eşit, insafa gəl! (*Valinin qabağında diz çökərək*) Ayaqlarına düşüb yalvarıram, keç onun günahından.

V a l i. Bəsdir, qoca, get, bir də gözümə görünmə!

1-c i ş ə h ə r l i. Belə insana əl qaldıran, Allahın qəzəbinə düçar olar, Vali həzrətləri.

V a l i. Sus qoca! Səni o ağ saqqalına bağışlayıram. Çəkil get, yoxsa balaların yetim qalar.

1-c i ş ə h ə r l i. Gedək, oğul! Bütün Gəncə axıb Məhsətinin dalınca gəlir. Sürüdən ayrılan qoyunu qurd qapar! Biz də gedək, onlara qarışaq!

Gedirlər. Bu anda Nizami, Qivami və Yusif gəlir

Y u s i f. Şükür Allaha, o sağdır. Nizami, əzizi dostum, onu ölümdən sən qurtaracaqsan!

M ə h s ə t i (*Nizamini görərək*). Gəl, Nizami, gəl, özün şahid ol. İlahi, çox şükür, faciəm nə qədər böyük olsa da, bu müdhiş ölüm daha məni qorxutmayır.

N i z a m i. Mən gözlərimə inanmaq istəmirəm. Edam üçün gətirilən bu qadın, Gəncənin fəxri Məhsəti xanım deyilmi? Vali, sən əsrimizin qaranlığı içərisində parlayan bu dan ulduzunu söndürməkmi istəyirsən?

V a l i. Yaxın gəl, şair. O, ulduz deyildir, sən Məhsətini yaxşı tanısaydın, onun şirin dilinə aldanıb özünü bədbəxt etməzdin.

Q i v a m i. O, şəhərimizin yeganə zinətidir.

Y u s i f. Onun günahı nədir?

V a l i. Hökmdarı həcv edən mən deyiləm, Məhsətidir. O, padşahı qaniçən, zalım adlandırmışdır. Şəhərimizin cavanlarını azdırıb yoldan çıxardan da odur. Padşahın fərmanı belədir. O gərək burada, hökmdarın nişan verdiyi bu yerdə daşqalaq edilsin.

N i z a m i. Eşidin, ulu göylər! Bu sonsuz mavi səmanın altında, bu güllərin, bu çiçəklərin ətirli qoynunda böyük bir insan ürəyini susdururlar. Lakin, nə üçün? Kimin üçün?

V a l i. O, hökmdarı bayquş adlandırdı. O öləcəkdir. Şirin yuxu üzünə həsrət qalan Gəncənin ürəyi bu gündən sonra rahat döyünəcəkdir.

N i z a m i. Lakin unutma, Vali, Məhsəti Gəncəvi ölsə də, bayquş heç bir zaman dönüb bülbül olmayacaqdır.

V a l i (*Mühafizəçilərə*). Başlayın!

M ə h s ə t i. Adətdir, caniləri belə, dar ağacına apardıqları zaman, dilinə kəlmeyi-şəhadət almağa izn verərlər. İndi mənə qulaq asın!

V a l i. Danış! Qoy o, gözə görünməz Tanrı şahid olsun ki, mən bu adəti pozmaq istəmirəm.

M ə h s ə t i. Mən böyük bir insan eşqinin övladı idim. Həyatımın yelkəni qayalara toxundu.

Heç pozan olmadı qəza-qədəri;
Doğradı ümmidi eşqin xəncəri.
Sevgi badəsini içdimsə, heyhat,
Yenə tapılmadı eşqin gövhəri!

N i z a m i. Aman ya rəbbi, bu insan səsi deyildir, mələk səsidir.

"Heyhat, yenə tapılmadı eşqin gövhəri".

1-ci m ü h a f i z ə ç i (*tövşüyə-tövşüyə gəlir*). Vali həzrətləri, Vali həzrətləri, onlara heç nə əsər etmir. Yoldaşımızı ayaqlayıb öldürürlər. (*Yusifə işarə edir*) Hamısı bunun işidir. Beli xəncərli əxilərin də başçısı budur. Gəlirlər, tədbirin nədir?

V a l i (*əsəbi*). Xəncərlə, qılıncla qabaqlarını kəsin, irəli soxulanların başını bədənindən ayırın!

1-c i m ü h a f i z ə ç i. Baş üstə! (*Yüyürüb gedir*)

V a l i. Onları öz qanlarında boğduracağam! (*Nizamiyə*) Sən də, şair, hökmdarımızın yanında günahkarsan. Bunu sənə bir də xatırladıram. Bundan gözəl fürsət ələ düşməz.

N i z a m i. Aha, günahkaram, doğrudur, mən bunu tamam unutmuşdum!

V a l i. Məhsəti mənim doğma bacım da olsaydı, mən onu öz əllərimlə daşqalaq edərdim.

Q i v a m i. O vaxt heç kim sənə namuslu qardaş deməzdi.

V a l i. Şair, unutma ki, hökmdarın qəzəbi də özü qədər böyükdür. Onun mərhəmətini yalnız bir yolla geri qaytara bilərsən. Məhsətiyə sən özün cəza ver!

N i z a m i. Qəzəb, mərhəmət... doğrudur. Mən hökmdarı çox acıqlandırdım. Günahım böyükdür.

V a l i. Bir də bundan gözəl fürsət ələ düşməyəcək.

N i z a m i. Mən öz günahımı Məhsətinin qanilə yuyub təmizləyəcəm. (*Məhsətiyə yaxın gəlir*)

V a l i. Afərin, Nizami, indi bildim ki, sən həqiqətən böyük şairsən! Bu gündən sonra hökmdarımız səni gözləri üstündə saxlayacaqdır. Qızıllar, evinə dəvə karvanları ilə göndəriləcəkdir. Qoy bütün aləm şahid olsun ki, mən də sənin günahlarından keçirəm.

M əh s ə t i (*Valiyə*).

Haqqımı əlimdən şəriət aldı;
Hüquqsuz eləyib bu günə saldı.
Qırıldı tərlanlar, boş qaldı bağlar;
Yurdu sənin kimi sarlara qaldı!

Y u s i f. Sağ ol, Məhsəti xanım, öləndə də belə mərd ölmək yaxşıdır!

V a l i (*Bir müddət sükutdan sonra, Nizamiyə*). Bu tərəddüd nə üçündür, şair? Bax, o izdiham sənin dalınca gəlmişdir. Təkrar edirəm, yalnız bir yolun vardır: Məhsətiyə ilk daşı sən özün at! Qoy xalq sənə baxıb onun cəzasını versin... (*Nizami Məhsətiyə lap yaxın gələrkən o təəccüblə Nizamiyə baxır, aralığa daha dərin bir sükut çökür*)

N i z a m i. İnsanların qabağı qılınc-qalxanla kəsildi. Onlar bu faciənin şahidi ola bilmədilər. Qoy bu faciəyə mavi göylər şahid olsun. Mən öz intiqamımı səndən alıram, Məhsəti xanım! (*Hamı Nizaminin üzünə baxır, intizarlı sükut xeyli davam edir. Nizami həyəcanla əyilib Məhsətinin əlindən öpür*)

P ə r d ə

## ALTINCI ŞƏKİL

Gəncə, Nizaminin eyvanı qarşısında bağça. Q i v a m i süfrə başında oturub şərab içir. O oxuyur. Arxasından sakit addımlarla gələn N i z a m i n i görmür.

Q i v a m i (*şərabla dolu qədəhi içərək*).

Ey, ürək, gəl ömrü vermə, sən bada,
Gülüb yetməmisən kama, murada.
Kimsə yetişmədi dadıma, heyhat,
Mən ürək əlindən gəldim fəryada.

N i z a m i. Bu fəryad nə üçündür, Qivami?

Q i v a m i. Aha, qardaşım, gəl sən də iç!

N i z a m i. Bəsdir, bu qədər içməkdən yorulmadınmı?

Q i v a m i. İçməkdən yorulmamışam, amma yaşamaqdan yorulmuşam. (*Ürəyini göstərərək*) Bax, burada o qədər dərdim var ki... Şahlar sənin qədrini bilmədi. Hamı səndən üz döndərdi. Mən bilirəm. Nə qədər kefli olsam da, eh... Mən heç, mən gəldi-gedərəm. Amma sən daima yaşayacaqsan. Bu həyat məni sıxır, qardaşım... (*Ayağa qalxır*) Al iç, al!

N i z a m i. Sən ağlayırsan? (*Qivaminin boynunu qucaqlayaraq*) Uşaq deyilsən ki? İnsan həyatın ağırlığı qarşısında belə acizlik göstərməz.

Q i v a m i. Mən yalnız o dünyada rahat olacağam... Al, iç!

N i z a m i. Şərab dünyanın ağrılarını azaltmaz!

Q i v a m i (*istehza ilə gülərək*). Bu ağrı deyildir, bu dünya kədəridir. Mən öləndən sonra da bu kədər əbədi yaşayacaq, daş ağırlığı ilə insanların qəlbinə çökəcəkdir.

N i z a m i. Qivami, sən içəndə, qoca anamız gizlin bir bucağa çəkilib hey ağlayır. Axı, mən onun iztirablarına dözə bilmirəm.

Q i v a m i. Ana... Yoxsa mən dözürəm, yoxsa mənim ürəyim daşdandır? Yax, yox, inan ki, onun iztirablarına mən də dözə bilmirəm. Amma dərdim o qədərdir ki, eh...

N i z a m i. Ümidsiz olmaq acizlikdəndir, insan yer üzünə səadət üçün gəlir, qardaşım.

Q i v a m i. Yalandır, bu dünya evi heç bir zaman səadət sarayı ola bilməz. Bu dünya böyük bir çanaqdır ki, insanların göz yaşı oraya tökülür.

N i z a m i. Səadət öz-özünə yaranmaz, onu biz yaratmalıyıq. Gəl gedək, mən bu gün yazdıqlarımı sənə oxumaq istəyirəm. Biz hər ikimiz

şerimizlə dünya kədərinə qalib gələcəyik. Biz bu kədərin önündə dağ kimi durub, sözdən insanlar üçün səadət sarayı yaradacağıq!

Q i v a m i. Eh, qardaşım, sən tufanlı, qaranlıq bir gecədə parıldayan bir məşələ bənzəyirsən. Sənin əməllərin, arzuların böyükdür. Lakin zəmanəmizin hakimləri dünyanı zülmətə çevirməkdən zövq alır, onlar sənə hər addımda göz verib işıq vermirlər. Bu işləri gördükcə, mənim gözlərimə qaranlıq çökür.

N i z a m i. Bu səni kədərləndirməsin, əzizim. Hər qaranlıq gecənin günəşli bir gündüzü də var! Səni qorxudanların həyatı ən mənasız bir həyatdır. İnsan əsl həyatının mənasını, dünyanın sirlərini – hər şeyi, hər şeyi zəhmətlə kəşf edəcəkdir. Gəl gedək, həm bağçada işləyib qoca anamıza kömək edək, həm də bülbüllərin nəğməsinə qulaq asa-asa şeir yazaq. Gəl, bəsdir, daha içmə! (*Uzaqlaşmaq istəyir*)

Q i v a m i. Bax, içmirəm. Oxu şerini, bəlkə bir az nəşələnim. Getmə, buraxmaram!

N i z a m i. Əziz qardaşım, mən Xosrovla Şirinin qəmli dastanını yazıram. Bərdənin pərilər sultanı mənim xəyalımdan bir an silinməyir. Onun acı sərgüzəşti məni hər an düşündürür. Mən elə gövhər yaratmaq istəyirəm ki, onu heç kim, heç bir yerdə tapa bilməmişdir.

Mehrabı eşqdir uca göylərin,
Eşqsiz, ey dünya, nədir dəyərin?!
Eşqin qulu ol ki, doğru yol budur,
Ariflər yanında bil, eşq uludur.
Eşqsiz olsaydı xilqətin canı,
Dirilik sarmazdı bütün cahanı.
Eşqdən başqa söz könlümə yaddır,
Ömrümün quşuna o, bir qanaddır.

Q i v a m i. Of... qardaşım, sənin qələmindən süzülən nədir? İlahi sözlərmi, yoxsa ürək dolusu məhəbbətmi? Oxu, oxu neçin dayandın?

Bu anda darvaza döyülür.

N i z a m i. Bu kimdir görəsən? (*Hər ikisi o tərəfə boylanır*)

X ə d i c ə (*əlində toxa, bağçadan Qivamiyə yanaşır*). Oğlum, gəl mənə kömək eylə!

Q i v a m i. Sən dayan, baxım görüm kimdir.

Çadraya bürünmüş bir qızla q a s i d gəlir.

X ə d i c ə. Ya rəbbi, sən özün balalarıma rəhm eylə! Yenə bir bədbəxtlik üz verməsin...

Q a s i d. Hörmətli şairin evini soruşdum, hamı bu həyəti göstərdi.

N i z a m i. Hansı şair? Gəncə şairlər vətənidir.

Q a s i d. Bizə böyük şair Nizami Gəncəvi lazımdır.

N i z a m i. Buyurun! Ana, bu xanımı evə apar, ona layiqincə ehtiram göstər!..

X ə d i c ə. Əziz qonağa gözlərim üstə yer var (*Qızı evə aparır*)

Q a s i d (*cibindən məktub çıxardıb Nizamiyə verir*). Dərbənd əmirindəndir, buyurun!

N i z a m i (*oxuyur*). "Dərbənd əmirindən böyük şair Nizamiyə. Məclisimizdə oxunan qəzəllərin xoşuma gəldi, göndərdiyim hədiyyələri qəbul et. Əgər həyatını yaxşı keçirmək və ömründən ləzzət almaq istəyirsənsə, durma, qədrini bilməyən yerlərlə vidalaş. Gəl sarayımdakı şairlərlə bir yerdə yaşa!".

Q a s i d. Qəzəlləriniz oxunanda, hamımız sevindik, şair. Mən də sizə pərəstiş edirəm. Sarayda hamı yolunuzu səbirsizliklə gözləyir.

N i z a m i. Sizə ürəkdən təşəkkür edirəm. Lakin mən saraya gedə bilməyəcəyəm.

Q a s i d. O nə üçün? Sarayda hər bir qəzəliniz qiymətli bir inci kimi parıldar.

N i z a m i. Əziz dost, mən getməyəcəyəm. Əmirə söylərsiniz ki, hamı məndən üz döndərərkən, o məni xatırladığı üçün, ona ürəkdən minnətdaram.

Q i v a m i. Səni böyük bir saraya çağırırlar. Yaxşı fikirləş, Gəncədə saray yoxdur. Şirvanşah da sənə düşməndir. Dərbənd əmirinin bu dəvəti şair üçün böyük ehtiramdır.

Q a s i d. Əmir dedi ki, Nizami bütün ailəsi ilə köçüb gəlsin.

Q i v a m i. Bu daha gözəl. Gedərik, sən də dastanı yazıb qurtararsan.

N i z a m i. Yox, yox, mənim ilhamıma burda heç bir şey mane olmayır.

Q a s i d. Sizin böyük bir gələcəyiniz vardır. Sarayda dan ulduzu kimi parıldayıb, bütün dünyaya şölə salarsınız.

N i z a m i. Əziz dost, bu balaca gülşəni görürsünüzmü? Biz bu gülləri, çiçəkləri öz əlimizlə bəsləyib böyütmüşük. Biz burada doğulmuşuq. Burada da öləcəyik. O da, mən də qoca anamızdan ayrılıb, qızıl həbsxanalara getmərik.

Q i v a m i. Sağ ol, qardaşım, mən həmişə səndən bu cavabı gözləyirdim.

Q a s i d. Axı, siz ki, əvvəlcə razıydınız?

Q i v a m i (*bu anda eyvanda anasını görərək*). Anacan, oğlun Qivami kefli olsa da, hər zaman səni sevəcəkdir. (*Kuzənin son damlalarını qədəhə töküb qasidə verir*) Dostum, alın için, son badəni sizə verirəm.

Q a s i d. Sağ ol! (*Badəni alıb içir*) Mən bu gün qayıdacağam. O qızı əmir Nizamiyə kəniz yollamışdır. Sarayın birinci gözəli idi. Bir neçə ay bundan əvvəl yüz dirhəmə alınmışdı. Əmir dedi ki, belə gözəl bir şairə gərək ölkənin ən dilbər cananı qulluq etsin.

N i z a m i. Yox, yox. Mən özüm heç kimə qul olmaq istəmədiyim kimi, başqasını da özümə qul etmərəm. Onu da özünüzlə bərabər geri aparın!

Q a s i d. Geri? Siz nə danışırsınız? Göndərilən hədiyyəni geri qaytararlarmı?

N i z a m i. Əmirə söyləyin ki, Nizami qul tacirlərinə nifrət edir.

X ə d i c ə (*gəlir*). Oğlum, yazıq qızcığazın gözlərindən qanlı yaş tökülür, hey ağlayır.

N i z a m i. Anacan, əldən-ələ satılmış bir qızın ağlamasına nə üçün təəccüb edirsən? Ata-anasından, vətənindən ayrı düşmüş zavallının göz yaşından başqa bir pənahı ola bilərmi?

Q i v a m i. Anacan, qonağa hörmət eylə. O qıza da söylə ki, biz də onun qardaşı, ağlamasın.

X ə d i c ə. Yaxşı, qadan alım. (*Qasidə*) Buyur, oğlum.

Q a s i d. Yox, mən qayıdacağam. O qızı gətir, xala.

X ə d i c ə. Ayıbdır, bala, görən nə deyər? Atların təri də qurumayıb.

Q a s i d. Eyb etməz. Get onu gətir, xala (*Xədicə gedir*) Şair! Bu çox igid bir qızdır. Saraydakılardan biri ismətinə toxunmaq istərkən, qız onun xəncərini qaparaq düz sinəsindən vurub yerə sərmişdi. Əmir fərman verdi ki, qızı edam etsinlər. Onu min əziyyətdən sonra öldürməyə apardıqları zaman qız “Of, Nizami, Nizami!” deyib inlədi. Mən əmirə yalvardım ki, Nizaminin xatiri üçün onu öldürməsin. Əmir tez cəllada “dayan!” hökmünü verdi. Sabahı bu məktubu yazdırıb onu sənin ixtiyarına göndərdi.

Q i v a m i. İnsanın kədəri heç bir zaman azalmayacaq. Gör dünyada nə böyük faciələr yaranır.

X ə d i c ə. (*qızla bərabər gəlir; qız hıçqıraraq ağlayır*). Ağlama, qızım, ağlama. Mən səni öz doğma balam kimi saxlaram. Oğlum, o mənə yalvarır ki, rəhm edin, məni doğma yurdumdan geri qaytarmayın. Sarayda ömrüm çürüməsin. İlyas, getməsin, oğul. Onsuz da mənim qızım yoxdur.

N i z a m i. Yaxşı, ana. Onun göz yaşlarına mən də dözməyirəm. Qoy qalsın!

X ə d i c ə (*sevinərək*). Aç bu duvağı qızım, bizim qızlar həmişə duvaqsız gəziblər. (*Onun duvağını və çadrasını götürəndə, Nizami donub qalır. Qız Afaqdır*)

N i z a m i. Aman Allah, mən kimi görürəm? Gözlərim məni aldadır. Yox-yox bu röyadır!

A f a q (*Nizamini görərək*). Bu nədir, mən hardayam?

N i z a m i. Pərilər sultanı, sən bir həqiqətsən, yoxsa xəyal?!

A f a q. Odur, o!..

N i z a m i (*Afaqa yaxınlaşaraq*).

Gözüm aydın, gözümə surəti-canan görünür,
Baxtımın güzgüsünə sünbüli-reyhan görünür.
Allaha şükr edirəm, ey gözümün nuru, bu gün
Yar gəlib göz önünə sərvi-xuraman görünür.
Yarə yetmək iki dünyaya bərabər kimidir,
Bunu duydum, duyuram öylə ki, hicran görünür.

Hamı mənalı bir sükuta qərq olur.

P ə r d ə

## YEDDİNCİ ŞƏKİL

Yenə Nizaminin eyvanı qarşısında bağça. Qürub etməkdə olan günəş meyvə ağaclarının yarpaqları arasından balaca arxın sularına əks edir. A f a q yalnız dayanmış, kədərli-kədərli baxır. Onun gözləri yaşarmışdır. Oxuyur.

A f a q

İndi ki, mən həsrət qaldım bu dünyada bir dildara,
Səyyah kimi üz qoymuşam bu diyardan, o diyara.
Öz könlümün qəmlərini, ciyərimin al qanıyla
Çoxdan bəri hey yazıram, qayğı bilməz divarlara...

Of... yazıq qardaşım, mən niyə yaşayıram, niyə? Yox, o yəqin ölmüşdür. Yoxsa indiyə kimi məni çoxdan axtarıb tapardı.

Q i v a m i (*əlində kuzə, yan tərəfdən çıxaraq*). Afaq, bu axşam qızıl güllərə özüm su verəcəyəm. Bu nədir, gözlərin yaşarmışdır!

A f a q. Heç... Sən çox sevindiyin üçün hamını da belə şad, gülər üzlü görmək istəyirsən.

Q i v a m i. Afaq, mənim əziz bacım, dərdini aç mənə söylə. Elə bil öz doğma qardaşına söyləyirsən.

A f a q. Doğrusu, çəkdiyim iztirablar, məşəqqətlər hər gün gözlərimin önündən gəlib keçir. Xəzərlər məni əsir alandan sonra əldən-ələ satdılar, yuxusuz gecələr, qanlı göz yaşları mənim həmdəmim oldu. Hələ ac, susuz günlər... Bir yandan öz dərdim, o yandan da Əbdəkin intizarı məni taqətdən saldı... (*Ürəyi gedən kimi olur*)

Q i v a m i. Sənə nə oldu, bacıcan?

A f a q. Eh, heç... bunları sənə danışıb keyfini pozmaq istəmirəm.

Q i v a m i. Afaq, bacıcan, bu təkcə sənin dərdin deyil, bütün elimizin, obamızın dərdidir. Bir vaxt mən də kədərli idim. Məni bu kədərdən qardaşım Nizami xilas etdi. Bax, onun üzü həmişə gülür. O, böyük bir sevinclə ölməz dastanlar yaradır.

A f a q. Mən özündən soruşmağa utanıram. Onun yazdığı nədir?

Q i v a m i. Yazdığı “Xosrov və Şirin” dastanıdır. Böyük bir məhəbbət macərasından bəhs edir.

A f a q. Nizaminin gözlərindən oxunan məhəbbəti bütün insanlar arasında bölüşdürsələr də, hamıya pay düşər. Nizami doğrudan da, böyük şairdir.

Q i v a m i. Düzdür, bacıcan. Mən onu ilahi bir məhəbbətlə sevirəm, O, saraylara getmədi. Əsl şair üçün ağac kölgəsi min qızıl saraydan qiymətlidir.

A f a q. Qoy yazsın, onun dastanının qəhrəmanlarını mən də tirmədə toxuyacağam. Bu da məndən yadigar qalacaqdır.

Q i v a m i. Sağ ol, Afaq! İndi bildim ki, mən öləndən sonra qardaşım həmdəmsiz qalmayacaqdır.

A f a q. Ölmək nədir, Nizami deyir ki, ən pis həyat ən yaxşı ölümdən yüksəkdir.

Q i v a m i. Sən çox ağıllı qızsan, Afaq. Sən ona layiqsən (*uzaqlaşır*)

A f a q. O, nə dedi? Yox, yox. Mənim qulağım səsə düşdü. Bəlkə o sözlər mənim ürəyimdən gələn ək-səda idi? (*Əyilib arxda əl-üzünü yuyarkən, Nizami yan tərəfdən əlində kitab gəlir və Afaqı görüb dayanır*)

N i z a m i (*öz-özünə*). Eşq əlindən bu məcnun könlümdə tabü-təvan qalmamışdır. Mən onu görəndə, elə bil Şirinlə qabaq-qabağa gəlirəm. Of, Afaq, Afaq! Sən nə qədər məsum, nə qədər ülvi bir xilqətsən.

A f a q (*onun gəlişini duymadan, qəmgin və titrək bir səslə oxuyur*).

Ayrılmaram ölməyincə səndən;
Qəm xəncəri qəlbə, qanə yetdi.
Eşqi necə gizlədim cahanda,
Naləm o biri cahana yetdi.

N i z a m i. Düz deyirsən, Afaq, düz deyirsən. Dünyada eşqi gizlətməkdən çətin iş yoxdur.

A f a q (*səksənən kimi olur*). Aman Allah, sənsən?!

N i z a m i. Oxu, oxu, neçin susursan? Mən bu həzin səsi bilirsənmi nə qədər sevirəm?

A f a q. Mən kədərimin çoxluğundan oxuyuram. Səni gördüm, hər şeyi unutdum.

N i z a m i (*sevinərək*). Mən də eləyəm, Afaq. Sən bu balaca gülşənə böyük bir sevinc gətirdin. Bu sevinci yalnız mən yox, anam da, qardaşım da hiss edir.

A f a q. Qivami çox gözəl insandır. Səni Qivami kimi sevən ikinci bir adam varmı?

N i z a m i (*sükut edərək*). Bəlkə yoxdur. Ola bilər, nə deyim? Amma yox, məni ondan da çox sevən bir mələk vardır.

A f a q ( *həyəcanla*). O kim idi, adı nə idi?

N i z a m i. Sən nə çətin bir sual verdiyini bilirsənmi, Afaq?

Könlüm sitəminlə canə yetdi;
Ahım odu asimanə yetdi.
Ayrılmaram ölməyincə səndən,
Qəm xəncəri, qəlbə, qanə yetdi.
Eşqi necə gizlədim cahanda,
Naləm o bir cahana yetdi.
Karvan hələ çatmamış, yolunda...
Köç növbəti gəldi canə yetdi.
Gözlə gələrəm, deyən Nizami
Ah eyləyibən fəğanə yetdi.

A f a q. Bu qəzəli də ona demişsən, eləmi?

N i z a m i. Mən sevmədiyim gözələ söz qoşmağı bacarmıram. Sevgi kiçik şairə də böyük bir qanad verib onu göylərə qaldıra bilər.

Dünyanın nəhəng şairləri Homer, Firdovsi sevərək, duyaraq yaratmışlar. Afaq. Mən də bu yolla gedirəm. Sevgidən məhrum olan insanın yüz canı da olsa, yenə ölüdür!

Məhəbbətdən bağlamışam dastanımın kəmərini,
Məhəbbətin gözü ölçər hər bir sənət əsərini.
İnsan oğlu bu dünyada öz eşqiylə güləcəkdir,
Məhəbbətlə öpəcəkdir gələcəyin səhərini.

A f a q. İndi mən çoxlu yaşamaq, bu böyük sözlərdən hər gün eşitmək, hər gün sevinmək istəyirəm. Görəsən, dünyada sənin sevgilindən xoşbəxt adam varmı?

N i z a m i. O mənim sevgimi xoşbəxtlik saysa idi, mənim sevincim yerə-göyə sığmazdı!

A f a q (*sevinir, ancaq sevincini gizlətməyə çalışaraq*). Doğrudan, görəsən o kimdir?

N i z a m i (*Afaqa daha yaxın gəlir*).

Eşqimi canım ilə bəslədi birlikdə könül,
Onsuz ey sevdiciyim, can evi viran görünür.
Ey sənəm, vəslin ilə eylə ki, şad oldu könül,
Yırtdı qəm köynəyini, gül kimi xəndan görünür.
Şadlığından alışıb yandı Nizami, dedi ki:
Gözün aydın, gözümə surəti-canan görünür!

Afaq uzaqlaşmaq istəyir

Yox, yox, uzaqlaşma, bir an səni görməyəndə, könlüm evi doğrudan da viran görünür.

A f a q. Aman Allah, görəsən mənim taleyim nə zaman güləcək.

N i z a m i (*birdən Afaqın kədərləndiyini görüb*). Sənə nə oldu?

Nə üçün üzünü birdən kədər buludları çulğaladı? Yoxsa mənim sözlərim qəlbinə toxundu, Afaq?

A f a q. Yox, yox, sənin söz piyalən zəhərlə də dolu olsa, mən onu şərbət kimi içərəm.

N i z a m i. Elə isə, bəs nə üçün kədərləndin? Bəlkə sənin qara zülflərin mənim qara günlərimin timsalı olacaq?..

A f a q. Yox, sən kədərlənmə. Sən yer üzündə insanların kədərini azaltmaq üçün yaranmısan. Bütün gülüstanlar axırda xəzana dönsə də, sənin yaratdığın gülüstan həmişə gülzar olacaqdır.

N i z a m i. Sağ ol, Afaq. Mən doğrudan da insan kədərinə qalib gələcəyəm. Məni oxuyanların qəlbindəki ümidsizlik yox olub gedəcəkdir. Mən buna inanıram. Zaman gələr, mənim qurduğum şeir sarayını gələcəyin ustaları tikib tamamlarlar. Mən yalnız böyük ümidlərdən ilham alıb sevinirəm. (*Sükut*) Lakin söylə, Afaq, sən dərdini məndən nə üçün gizlədirsən?

A f a q. İndi həyatımın ən əziz dəqiqələridir. Mənim sevincim də sənin gülşənin kimi çiçək açmışdır. Amma ürəyimdə dərdim var, şair. Mən yenə onu xatırladım. Kim bilir, bəlkə o ölmüşdür!..

N i z a m i (*təəccüblə*). O kimdir?

A f a q. Soruşma. Onu düşmənlər bərk yaralamışdılar. Məni əsir aldılar. O, mənə həm atalıq, həm də analıq edirdi.

N i z a m i (*öz-özünə*). Bu sözlərin hər biri qəlbimə iti nəştər kimi sancılır. O kimdir?

A f a q. O, mənim qardaşım idi.

N i z a m i. Adı nə idi?

A f a q. Onu Bərdədə tanımayan yox idi. Şəhərin ən yaxşı saraylarını o yaratmışdı. Adı Əbdək idi.

N i z a m i. Bu ad bilirsənmi mənim ürəyimə nə qədər yaxındır. Onu ilk dəfə mən Bərdə ovalığında görmüşdüm. Sonra cəngavərlərlə Gəncəyə gəlmişdi. İgid və mərd bir oğlan idi.

A f a q. Bəs sonra? Sonra o hara getdi?

N i z a m i. Sonra Şirvan hökmdarı onu edam etdirmək istərkən, o, dar ağacından qaçıb bizə pənah gətirdi. “Mehriban dostum, bəlkə görüşmədik”dedi. Sonra “əsir düşmüş bacımı düşmənlərdən xilas etməyincə, rahat olmaram. Mən onu arayıb tapacağam!” – deyə vidalaşıb getdi. Bu hadisə çoxdan olmuşdur. O gündən bəri mən Əbdəkdən xəbərsizəm.

Y u s i f (*gəlir, əlindəki ovlanmış quşları Nizamiyə tərəf uzadaraq*). Al, dostum, indi mən sənin də əvəzinə ovçuluq edirəm. Dastanından ayrılma. Qoy Gəncəmiz tarixə yeni qızıl bir səhifə də yazsın.

N i z a m i. Sağ ol, qardaşım! (*Quşları alır*)

Y u s i f. Orada bir atlı səni görmək istəyir.

N i z a m i. Kimdir? Tanımadınmı?

Y u s i f. Nizamini görməyə gələn adamların hamısını tanımaq, dünyanın yarısını tanımaqdır. Bilmədim kimdir.

N i z a m i. Çox kədərlənmə, Afaq, o bir gün qayıdacaqdır. O, səni axtara-axtara, nəhayət gəlib bura çıxacaqdır. Sən bunları al, Afaq, evə apar. Anam bişirsin. Gedək, Yusif... (*Quşları Afaqa verib gedir. Afaq gələn atlıya sarı baxır*)

A f a q. Aman ya rəbbi, bəlkə Nizaminin qonağı Əbdəkdir. Yox, o deyil... Mən həm sevinirəm, həm də kədərlənirəm. Görəsən qardaşıma rast gələcəyəmmi? (*Meyvə ağaclarına söykənərək quşlara baxa-baxa yenə titrək səslə oxuyur*).

Qızılgül olmayaydı,
Saralıb solmayaydı;
Bir ölüm, bir ayrılıq,
Heç biri olmayaydı.

P ə r d ə

## SƏKKİZİNCİ ŞƏKİL

Nizaminin evi; gecədir. Pəncərədə yanan çıraq otağa ölgün bir işıq salır. Dibdə şairin kitabları görünür. Xədicə pəncərəyə yaxın oturub qabağında beşiyi yırğalayır.

A f a q. Anacan, Nizami gəlmədimi?

X ə d i c ə. Yox, qızım, o dağlardan gül-çiçək yığıb səninçin dərman qayırmağa getdi.

A f a q. Mənimçinmi? Zəhməti hədər gedəcək, anacan. Uzun işgəncələr, Əbdəkin intizarı məni o qədər gücdən saldı ki, bir də sağalmağa ümidim yoxdur.

X ə d i c ə. Elə demə, qızım, onun dərmanları insanlara şəfa verir. O, sənin dərdinə əlac tapar.

A f a q (*gözü Nizaminin əlyazmasına sataşır*). Ana, Nizami deyirdi ki, Şirvana gedib "Xosrov və Şirin" dastanını Xaqaniyə oxuyacağam.

X ə d i c ə. Sənin dərdin hər şeyi onun yadından çıxartdı, qızım.

Afaq beşiyə yanaşır.

A f a q. Mən indi xoşbəxtəm: indi mən ölümdən qorxmuram. Balaca Məhəmməd məndən ona yadigar qalacaq. O, Məhəmmədin üzünə baxdıqca məni xatırlayacaq... (*Əyilib uşağı oxşayır*)

Q i v a m i (*səssiz addımlarla içəri girir, qapıya söykənir, öz-özünə*). Ey fani dünya, sən kimə vəfa göstərdin ki, bizə də göstərəsən! Dünən öz nəğmələriylə bağçamızı şənləndirən bülbül indi oxumayır. (*Afaqa yaxınlaşaraq*) Afaq, bacıcan, indi necəsən?

A f a q (*gülümsünərək*). Çox yaxşıyam. Görürsən ki, yatağımdan da qalxmışam. Yalnız bircə arzum var. Əbdəki görəydim, sonra ölsəm də, qorxum yoxdur.

Q i v a m i. Mən onu çox axtardım, bacıcan, heç yerdə tapılmadı. Ancaq ürəyini sıxma, onu mən yenə də axtaracağam. Aylar illər keçsə də. Əbdək tapılacaq, sən onu görəcəksən.

A f a q. Aman Allah, Dəstəgül öləndən sonra o yaşaya bilərmi?

Q i v a m i. Kim, Dəstəgül?

A f a q. Əbdəkin bir sevgilisi var idi. Mələk xasiyyətli gözəl bir qızdı. Xəzərlər şəhərimizi alanda, əsir düşməsin deyə, özünü öldürmüşdü. Eh... dünya necə vəfasızmış! (*Sükut*) Bəs Nizami qayıtmadımı? (*Bu anda qapı döyülür*)

Q i v a m i. Kimdir?

Yusif. Mənəm, Qivami, Yusif. (*Afaq o biri otağa keçir*)

Q i v a m i (*qapını açaraq*). Gəl, əzizim.

Y u s i f. Bərdədən gəlirəm. O gördüyümüz yerləri bir də gəzdim. Bu ceyrandan başqa heç kimə rast gəlmədim... Qayıdanda bir kişi gördüm. Ondan soruşdum, dedim ki, “O gündən Əbdəki görməmişəm”. Bu ceyranı Afaq üçün ovlamışam. (*Ceyranı yerə qoyur*)

Q i v a m i. Bu geniş dünyada bizə vəfa göstərən yalnız sənsən. Eh, iki aydan bəri qapımızı açan yoxdur. Valinin casuslarından qorxub heç kim buraya ayaq basmır. Bircə əxilər mərdlik eylədi, sağ ol, əzizim.

Y u s i f. Vaxtında dedim, sözümə baxmadılar. Məndən olsaydı, indi onun qəbri də, sümükləri də çürümüşdü. O indi başqalarının da hayıfını Məhsətidən alır.

Q i v a m i. Deyirlər, şahın fərmanı ilə Vali Məhsəti xanımı Gəncədən sürgün edir, doğrudurmu?

Y u s i f. Elədir. Ona öz torpağında zindanı da çox görürlər. Bərk xəstədir. Yolda, ölməsə yaxşıdır.

Q i v a m i. Of... Elə bil ürəyim parçalanır. Gedək, Yusif. Mən bu dərdə dözə bilmirəm... Kədərimin çoxluğundan səhərə kimi içib məst olacağam. (*Gedirlər*)

X ə d i c ə (*uşağın üzünə baxaraq*). Yatdı...

A f a q (*gəlir. Sükut*). Ürəyimə damdı. Bilirəm, Əbdəki yenə də tapmamışdır. (*Beşiyə yanaşır*) Anan sənə vəfasız çıxır, oğlum. Bu qara gözlərinə həsrət gedir. Yox, yox, mən ölməyəcəyəm. Mən sənə yenə lay-lay çalacağam.

Lay-lay dedim yatasan,
Qızıl gülə batasan.
Qızıl gülün içində,
Şirin yuxu tapasan.
Lay-lay balam, lay-lay,
Körpə balam, lay-lay...

(*Lay-lay tədricən ağlamaq səsinə keçir. Afaq beşikdən aralanarkən, vurulmuş ceyranı görüb duruxur*) Of, yenə ceyran. Bu xatirədir, yoxsa nədir. Sən nə üçün məni addım-addım izləyirsən? Bu qədər fəlakətdən sonra da məndən əl çəkməyəcəksənmi? Ah, Nizami, Nizami! Sən haradasan, əzizim? Nə üçün belə vəfasız çıxdın?

N i z a m i (*səssiz addımlarla daxil olur. Afaqın son sözlərini qapı ağzında eşidərək*). Yox, mən vəfasız deyiləm, Afaq. İki günlük yolu yarım günə gəlmişəm. Odur, bax, mindiyim atın ürəyi partladı.

A f a q (*sevinərək*). Sağ ol, məni bağışla. Çox gözlədim. Dedim: görüşməyəcəyik. Mən hər dəqiqə hiss edirəm ki, ömrümün sonu yaxınlaşır.

N i z a m i. Yox, yox, sən yaşayacaqsan. Mən qoca təbiəti köməyə çağırdım. Səni uca dağlarımızın başından yığdığım bu çiçəklərlə sağaldacağam. Ölüm bizim məhəbbətimizə təslim olacaq.

A f a q. Mən sağalacağam, mən yaşayacağam. Mən səninlə yaşayacağam.

N i z a m i. Afaq, yuxusuz gecələrimin meyvəsi, könlümün məhəbbətimin dastanı “Xosrov və Şirin” hazırdır, əzizim. Mən onu aparıb şahlara hədiyyə edəcəyəm. Kim bilir, bəlkə də Əbdək onların dustağıdır. Lazım gələrsə, mən şaha yalvaracağam. Yalnız sənin üçün, Afaq, sənin xətrin üçün!

A f a q. Yalvarma, şahın qabağında əyilmək sənə yaraşmayır. Qoşqar dağı hansı fəlakətin qabağında əyildi ki, sən də şahların hüzurunda əyiləsən!

X ə d i c ə. İlahi, sən özün balama kömək ol.

Q i v a m i (*sərxoş halda içəri girir*). Ona yalvarma. O, qaranlıq bir kölgədir. O, insanlar üzərinə işıq sala bilməz.

X ə d i c ə. Oğlum, sən nə danışırsan?

Q i v a m i. Mən? Danışıram? Yox, anacan, məni danışdırırlar. Qardaşımın bəxt ulduzu sönəndən sonra, bağçamızın yaralı bülbülü kiriyəndən sonra... (*Afaq hıçqıraraq o biri otağa keçir. Nizamiyə*) Eh, qardaşım, məni bağışla, dərdim çoxdur...

N i z a m i. Axı, sən...

Q i v a m i. Bilirəm, bilirəm, məni danlamağa haqqın var. Ancaq mənim də haqqım var. Mən şair olsaydım, böyük bir dastanımda onun xatirəsini əbədiləşdirərdim.

Y u s i f (*gəlir*). Nizami, yenə bir fəlakət! Gözlərimə inana bilmirəm. Məhsəti xanımı mühafizlər dövrəyə alıblar. Deyəsən, onu sürgünə aparırlar.

N i z a m i. Yox, yox, bu ola bilməz. Sən nə danışırsan?

Y u s i f. Mən ona yaxınlaşmaq istədim. Mühafizlər qoymadı. O, çox kədərli idi. Pərişan saçlarına baxanda, ürəyim qana döndü.

M ə h s ə t i (*gəlir. Onun qolları zəncirlidir. Üz-gözündən ağır əziyyət çəkdiyi görünür*). Şair, vəfasız dünyanın mənə verdiyi ən böyük mükafat budur.

N i z a m i. Yüzlərcə rübai yazan bu əllər qızıla tutulmalı ikən, paslı zəncirlə bağlanmış?!

M ə h s ə t i. Məni buraya gətirmək istəmirdilər. Yalvardım, razı oldular. Səni də, Afaqı da görməmiş getsəydim, bu mənə ömrüm boyu dərd olardı. Eşitdim Afaq xəstədir.

N i z a m i. Of, bu dünya gözümdə qaralıb cəhənnəmə dönür. Mən bütün kainatı öz ahımla sarsıdacağam.

M ə h s ə t i. Artıq gecdir, Nizami. Hökmdarın fərmanı qətidir. Bax, məni qəsdən şər qarışanda sürgün edirlər. Kor tale! Məni günəş işığında öz doğma yurduma həsrətlə baxmağa da qoymurlar. Şahlar məndən belə intiqam alırlar. Qoy olsun! (*Afaq gəlir*)

A f a q. Aman Allah, bu nədir, Məhsəti xanım! Sizi...

M ə h s ə t i. Afaq, əzizim, necəsən? (*Afaqı ehtirasla qucaqlayır*)

A f a q. Gənc yaşlarımda ona vəfasız çıxıram. Ölümüm hər an yaxınlaşır. (*Nizami dərin bir xəyala dalır*)

M ə h s ə t i

Qəlbinə eşqdən söz yazan hər kəs,
Bir ləhzə ömrünə puç deyə bilməz.
Bir həmdəm aradıq, ömrümüz boyu
Bizə həmdəm oldu yanıq bir nəfəs!..

Bu anda Valinin mühafizlərindən iki nəfər daxil olur, içəridəkilər sükut içərisində onlara baxırlar.

N i z a m i. Sizə kim lazımdır?

1-c i m ü h a f i z. Biz eşikdə Məhsəti xanımı gözləyirdik. Vali bu işdən xəbər tutsa, ikimizi də dar ağacından asdırar. Məhsəti xanım, buyurun!

N i z a m i. Ürəyinizin yerindən daşmı asılmışdır? Kimi sürgün etdiyinizi bilirsinizmi?

1-c i m ü h a f i z. Sizin xətriniz üçün ölümdən qorxmayıb razı olduq. Bizi əfv edin. Gedək, xanım!

N i z a m i. Yox, yox, mən onu heç yana buraxmaram. Qoy şahlar onun intiqamını məndən alsınlar.

M ə h s ə t i. Sənin həyəcanın müqəddəsdir, şair! Lakin hökmdarlar Allahdan da inadkardırlar. Mən gedirəm.

Vətəndən qovulan bikəsdir ürək,
Mənə deyirlər ki, canından əl çək!
Nə deyim, bu dünya karvansaradır,
Bir qara pula da dəyməzmiş gərçək!..

N i z a m i. Mən bütün dünyanı, o böyük yaradanı köməyə çağıracağam. Mən bu zülmü yerdə qoymayacağam. Qoy şahların içdiyi insan qanı cuşə gəlib bu zülm evini uçursun!

M ə h s ə t i. Mən gedirəm, şair. Harada olsam, şerin səsi yenə eşidiləcəkdir. Həyatımın son günlərində mənə bu da bəsdir. (*Nizamiyə və Afaqa*) Yaşayın, əzizlərim, xoşbəxt olun.

Mühafizlər Məhsəti xanımı apardıqları zaman, Afaq sarsılaraq Nizaminin qolları arasına düşür. Dərin sükut içində Nizami onun üzünə baxır. Onu götürüb yerinə uzadır.

N i z a m i. Ey böyük Tanrı, biz öz məhəbbətimizlə insanları əsrin çamurluğundan nəhayətsiz göylərə, dibsiz fəzalara qədər yüksəltmək istərkən, sən öz fitnənlə nə üçün bizim səadət sarayımızı uçurursan?

Ey fələk, sənin gərdişin nə üçün rəqqasələr kimidir? Ey böyük Yaradan, əgər sən yox deyilsənsə, cavab ver! Bilirsənmi bu kimdir? Bu mənim Afaqımdır. Gözlərim önündə böyük üfüqlər açan ilahi bir məhəbbətin canlı heykəlidir. Afaq, mənim qaranlıq daxmamı, soyuq evimi öz nəfəsilə isidən bir ocaqdır ki, indi sən onu söndürmək istəyirsən!..

A f a q (*gözlərini açaraq*). Beş günlük ömrümü də Məhsəti xanımın fəlakəti əlimdən aldı. Mən ölürəm, əzizim... Odur bax, yaralı ceyran... O məni yenə də axtarıb tapdı...

N i z a m i. O sənin taleyin deyildir, Afaq! O, yaralı vətənin timsalıdır, əzizim. Vətənin yaraları isə, əbədi deyildir. O yaralar sağalacaq. İstəkli qardaşın Əbdək də tapılacaqdır...

A f a q. Of, qardaşım, indi sən haradasan?( *Nizamiyə*) Bilirəm, Şirvana onu axtarmağa gedirsən. Sağ ol, səndən yalnız bir ricam var. Mən öləcəyəm. O şerini bir də oxu, qoy son görüşümüzdə ürəyim bizim ölməz xatirəmizdən qüvvət alsın!

N i z a m i. Yox, yox, Afaq, biz hələ yaşayacağıq! İrəlidə görəcək xoş günlərimiz var. Biz əbədi səadət üçün yaranmışıq.

A f a q. Elədir, əzizim... Əbədiyyət qədər ölməz olan məhəbbətimiz bizi yaşadacaqdır. Rica edirəm oxu!..

Nizami (*tuncdan tökülmüş bir heykəl kimi dayanaraq*).

Gecə xəlvətcə bizə çeşmi xumar gəlmiş idi,
Üzü aydan da gözəl nazlı nigar gəlmiş idi.
Tər axıb gül yanağından, bulud örtmüşdü ayı,
Onu düşmənmi qovub, könlü qubar gəlmiş idi.
Mən ona göz yetirib, xəlvəti baxdım, baxdım...
Ovçunun ovlağına körpə şikar gəlmiş idi.
Uyuyub hər ikimiz rahat olub bir yatdıq,
Bəxtimin bağçasına güllü bahar gəlmiş idi.
Dedi: getmək dəmidir, söylə nə istərsən yar?
Tez oyandım, demə röyama o yar gəlmiş idi!..
Qəsəm etdi ki, Nizami... oyanıb gördüm o yox,
Demə röyada bizə çeşmi-xumar gəlmiş idi...

Dərin bir sükut içində.

P ə r d ə

## DOQQUZUNCU ŞƏKİL

Şirvan sarayında böyük bir otaq. Orta əsr memarlığı üslubunda tikilmiş bu otağın naxışları ararsından sarayın başlandığını və qurtardığını bildirən tarix görünür. Dibdə buxarı yanır. Ş a h, v ə z i r və M u n i s gəlir. Onların dalınca əyanlar və saray adamları daxil olur. Şah otağa baxa-baxa, taxtı qoyulmuş yerə tərəf addımlayır.

Ş a h. Gözəl saraydır. Bu gündən sonra bütün dünyanın hökmdarları mənə qibtə edəcəkdir.

V ə z i r. Doğrudur, şahım. Bu naxışları çəkən əllər o ustanın adını tarixin səhifəsinə nəqş eylədi. Memarlıq sənəti də bir növ şeirdir. Baxın, bu naxışların hər biri Ömər Xəyyamın rübailəri qədər mənalıdır.

Ş a h. Doğrudur, vəzir, sən haqlısan.

V ə z i r. Çox istedadlı insandır, şahım. Amma nədənsə, sənətkarlığını tərifləyəndə, həmişə gözlərini yerə dikir. Özü də sarayda qalmaq istəmir.

Ş a h. Memarı çağırın gəlsin! (*Onu çağırmağa bir nəfər gedir*)

M u n i s. Bu gözəl sarayda şeir yazmaq böyük səadətdir, şahım. Qoy hökmdarın sevinci asimana ucalsın!

Ş a h. Kef məclisi qurulsun. Saqilər gərdişə çıxsın. Qoy bu möhtəşəm saraydan qalxan musiqi səsindən bütün dünya rəqsə gəlsin. Hanı rəqqasələr? (*Kef məclisi başlanır. Rəqqasələr gəlib oynayırlar*) Hanı Xaqani? Neçə gündən bəri saray məclislərinə də gəlməyir. O haradadır?

M u n i s (*istehza ilə*). Onun əziz dostu Gəncədən buraya təşrif gətirmişdir, şahım.

Ş a h. Dostu? Kimdir onun dostu?

M u n i s. Kim olacaq? Nizami! Xatırınızdadırmı şahım, neçə dəfə onu saraya dəvət etdiniz. O, tənəzzül edib gəlmədi. Onun hamıdan xəbərsiz bu gəlişi çox şübhəlidir.

Ş a h. Necə? Şübhəli?

M u n i s. Mən həqiqəti sizdən gizlətmək istəmirəm, şahım. Mənim vicdanım ləkə götürməz. Mən həqiqət aşiqiyəm.

Ş a h. Fikrini açıq söylə, Munis!

M u n i s. O, Xaqani ilə bərabər sizin taxtü-tacinizə sui-qəsd hazırlayır, şahım.

Ş a h. Munis, sən dəlimi olmusan? Şair nədir, sui-qəsd nədir?

M u n i s. Mən həqiqət aşiqiyəm, şahım, mənim vicdanım ləkə götürməz... Gəncədəki əxiləri xatırlayırsınızmı? Onlar yenə də yaşayırlar.

Xaqaninin onlarla gizlin əlaqəsi vardır. Gəncədən Şirvana, Şirvandan da Gəncəyə gizlin məktublar gəlib-gedir.

1-c i  ə y a n. Elədir ki, var, şahım. Munis doğru buyurur. Hətta, şahım, "Xosrov və Şirin" dastanını gətirib sizə təqdim etmək fikrindədir.

Ş a h (*təəccüblə*). Necə? Doğrudanmı? Bəlkə o mənimlə barışmaq istəyir?

M u n i s. Yox, şahım, bunlar hamısı cinayətin üstünü pərdələmək üçündür. Hələ əsərlərinin birində üzünü Xaqaniyə tutub bilirsinizmi nə deyir?

Ş a h. Heç bir şeyi məndən gizlətmə, Munis.

M u n i s. Deyir ki, nə üçün rəzillərin önündə alçalırsan? Nə üçün namərdlərə baş əyirsən?!

Ş a h. O rəzil, o namərd kimdir?

M u n i s. Şahım, o bu sözlərlə kimə ləkə vurmaq istər? Əlbəttə, sizə!

Ş a h. Demək belə!

M u n i s. Yenə deyir ki:

Tikan tək çiynində tut yarağını,
Qoruya biləsən gül budağını.

O, sizin üstünüzə xəncər qaldırmağa çağırır, şahım. Onun buraya gəlməkdə məqsədi öz yaxın adamlarını toplayıb sizi qətlə yetirməkdir.

Ş a h. Aha, cəsarətə bax, mən onları öz qanlarında boğdurub qurd-quşa yemi etdirəcəyəm! Vəzir, sən nə üçün bu işdən xəbərsizsən? Şah nəslinə xəncər qaldırmaq?! Mən elə bir tufan qopardım ki, Zöhhak özü qəbirdən baş qaldırıb mənə afərin desin!

S a r a y  a d a m ı. (*gəlir*) Memar hüzurunuza izn istəyir, şahım.

Ş a h. Vəzir, ona istədiyi bəxşeyişi ver. Qoy bütün dünya bilsin ki, mən hər zaman böyük insanların dostu olmuşam.

V ə z i r. Hökmdarın əmri Allah fərmanıdır, şahım. O, heç bir şey istəmir. Onun yalnız bir arzusu vardır.

Ş a h (*gülür. Saray adamına*). Memarı buraxın gəlsin!

Ə b d ə k daxil olur, hökmdara təzim edir.

Nə cür mükafat istəsən sənə halaldır.

Ə b d ə k. Mənim heç nəyə ehtiyacım yoxdur, şahım. Mən harada olsam, bir parça çörək taparam.

Ş a h. Yox, yox, belə təvazökar olma. Sənin haqqın doğrudan da, böyükdür.

Ə b d ə k. Sizdən yalnız bir ricam vardır, şahım.

Ş a h. Söylə, çəkinmə!

Ə b d ə k. İzn verin, Bərdəyə qayıdım, yandırılmış sarayları yenidən bərpa edim. Şəhər dağılarkən sinəmdə açılmış yara bu gün də sağalmamışdır.

Ş a h. Bərdəlilərdən ki, sağ qalan yoxdur, sən o sarayları kimin üçün tikəcəksən?..

Ə b d ə k. Dağlarda, daşlarda yuva salmış zavallı vətəndaşlarımın dərdi, məni bir an belə rahat buraxmayır, şahım.

Ş a h. Sənin bu arzun gülməli də olsa, getməyinə izin verirəm. Sən doğrudan da, simu-zərə layiq bir memarsan!

Ə b d ə k. Sağ olun, çox razıyam, böyük hökmüdar! Xalq üçün əlləşən insanların nəzərində cavahiratın da, qızılın da heç bir qiyməti yoxdur.

Ş a h. Sən bu sarayı xalq üçün yox, mənim üçün yaratdın.

Ə b d ə k. Lakin bu sarayın ömrü insan ömründən uzundur!

Ş a h. Sən bununla nə demək istəyirsən?!

Ə b d ə k. Yalnız onu deyirəm ki, insan ömrü insanın yaratdığından az olur!

M u n i s. Şahım, bu memarın dediyi sözlər Nizaminin şeri kimi tikanlıdır.

Ş a h. "İnsan ömrü insanın yaratdığından az olur!" Aha, indi söylə görüm, bu saraya bənzər ikinci bir sarayı tikə bilərsənmi?

Ə b d ə k. Doğrusu, şahım, bu sarayı tikərkən, öz məharətimi layiqilə göstərə bilmədim.

Ş a h. Göstərə bilmədin?

Ə b d ə k. Böyük hökmdar, məni buraya sevimli bacımın məhəbbəti gətirdi. Sənə dedilər ki, əsir düşmüş bacım Şirvan sarayına göndərilən kənizlərin arasındadır. Lakin mən onu sarayda tapmadım. Onun qəmli dastanı məni hər an düşündürür. Onu tapa bilsəydim, sevincdən aldığım qüvvətlə bundan yüz qat möhtəşəm bir saray tikə bilərdim.

Ş a h (*acıqlı-acıqlı ayağa qalxır*). Yüz qat möhtəşəm?!.. Bu baxışlar, bu kinli gözlər mənə haradansa tanışdır. Dünya işığı sənə haramdır!

Ə b d ə k. Dünyaya işıq gətirən insanın hamıdan çox yaşamağa haqqı var, şahım!

Ş a h. Bu sözləri sənə dedirdən vardır. Sən də sui-qəsdçilərin miskin fikirləri ilə yaşayırsan. Mənə mükafat yox, ölüm cəzası veriləcəkdir.

Bundan sonra Şirvan sarayına bənzəyən ikinci bir saraya həsrət qalacaqsan!

Ə b d ə k. İxtiyar sənindir. İndi mən möhkəm divarlar arasındayam, görürsünüzmü, silahım da yoxdur. Öz yaratdığım sarayı da uçurmağa qüvvətim çatmaz!

Ş a h. Aha, odur, o canidir! And olsun yeri-göyü yaradan ulu Tanrıya, səni min əziyyətlə öldürəcəyəm... Bu nankor, dünya işığına həsrət qoyulsun!

M u n i s. Şahım, o bizim hamımızı öldürmək xəyalilə saraya soxulmuş bir canidir.

Ş a h. Zindana atılsın, qurdlara, quşlara yem edilsin!

Əbdəki mühafizlər hər tərəfdən əhatə edirlər, qollarını bağlayırlar.

Ə b d ə k. Mən ölümdən qorxmayıram. Gec-tez hamı bu qara torpağın əbədi qonağıdır. Mən ölsəm də yaşayacağam, siz yaşasanız da ölüsünüz! (*Mühafizlər Əbdəki aparırlar*)

Ş a h. Bu sui-qəsddir! Qoy, canilər bilsin ki, mənim taxtü-tacımı qana boyamaq istəyənlərin hamısı öz qanında boğulacaqdır! Hanı rəqqasələr, şərab gətirilsin!

Rəqqasələr oynayır, şərab paylanır, məclis qızışır, birdən saray xidmətkarı gəlib şaha təzim eyləyir.

X i d m ə t k a r. Nizami gəlmişdir!

Rəqsə ara verilir, küzələri yığışdırırlar.

Ş a h. Aha, cani öz ayağiylə gəlib çıxdı. Bu daha gözəl. Çağırın onu!

X i d m ə t k a r. Buyurun! (*Nizami gəlir*)

V ə z i r. Şahım, Nizaminin "Xosrov və Şirin" dastanı doğrudan da böyük hədiyyədir!

Ş a h. Yadındadırmı şair, saraya gəlmək istəmirdin!

N i z a m i. Yadımdadır, mən indi də saraya gəlmək fikrində deyiləm.

Ş a h. "Xosrov və Şirin"i nə üçün yazdın?

N i z a m i. Sevdiyim üçün!

Ş a h. Çox gözəl... Mən bu dastanı nə ilə mükafatlandıra bilərəm?

N i z a m i. Mən ürəyimdə məhəbbət adlanan qiymətsiz bir gövhər əzizləyirəm. Mənim nəzərimdə cavahiratın daşdan fərqi yoxdur.

Ş a h. Eləsə, bu uzun yolu dəlməkdə məqsədin nədir?

N i z a m i. Hökmdar, Məhsəti Gəncəvi sizin fərmanınızla öz doğma şəhərindən sürgün edildi. Bu hadisə tarix üçün böyük bir ləkədir. Dünya şerini zinətləndirən bu qadın zindanlara yox, böyük bir ehtirama layiq şairdir.

Ş a h. Mənim nəzərimdə o artıq ölmüşdür.

N i z a m i. Xeyr, hökmdar! O yalnız bundan sonra yaşayacaqdır!

Ş a h. Demək, səni Gəncədən buraya gətirən də budur. Eləmi?

N i z a m i. Mən indi bu möhtəşəm sarayı yaradan Əbdəki görmək istəyirəm.

Ş a h. Aydın oldu. Memarlıq edən o rəzil mənə qarşı hazırlanan sui-qəsdin iştirakçısıdır. O, sabah gün çıxmamış dar ağacından asılacaqdır. Vəzir, o cani edam ediləndə, şəhərdə tonqallar qalansın. Qoy bütün aləm tamaşaya gəlsin.

V ə z i r. Yox, yox, artıq səbrim tükəndi. Sən bu qoca vəziri ayaqlar altında çox tapdaladın... Eşit, Nizami, məğrur başın sarayların önündə əyilməsin! Saray adlanan bu qızıl həbsxanada mən də artıq qul olmaq istəmirəm! (*Gedir*)

Ş a h. Aha, demək belə... Durmayın, qolları bağlı birbaş hüzuruma!..

M u n i s. Mən bunu sizə göstərib kefinizi pozmaq istəmirdim. Şeir adına dinsizlik və əxlaqsızlıq dərsi verən bu kitab dünya üzü görməyə haqlı deyildir. Buyurun, özünüz oxuyun.

N i z a m i. Danış, danış, vətən mülkü xarabaya dönəndə, ötmək növbəsi bayquşlarındır.

M u n i s. Gördünüzmü, şahım, mən həqiqət aşiqiyəm, mənim vicdanım ləkə götürməz. Bu da “Xosrov və Şirin” dastanı...

Ş a h. Deyirlər bu əsər dünyanı lərzəyə gətirmişdir!.. (*Dastanı gözdən keçirərək*) Azərbaycan dilində yazılmışdır. Çox qəribədir. Şair, unutma ki, biz yüksək nəsildənik. Al, mən bu dildə şeir oxumağa tənəzzül etmərəm!.. (*Kitabı yerə atır*)

N i z a m i. Mən dastanımı bu sarayı yaradan Əbdəkin ana dilində yazmışdım.

Ş a h. Onu yalnız bu dar ağacında görərsən.

N i z a m i. Şahlar böyük sənətkarlar vətəni Azərbaycana ölüm gətirirsə, qoy bundan tarix utansın.

Ş a h. Şair, sözlərinə diqqət yetir! Sənin şöhrətin məni qorxutmayır. Sənin dostun Gəncə əxiləri də məni öldürmək xəyalilə yaşayırlar. Mən düşmənlərimdən intiqam alacağam, intiqam...

N i z a m i. Mən də qələmimlə hökmdarların tökdüyü insan qanını qanla yuyan igidlərə köməyimi əsirgəməyəcəyəm!

Ş a h. Aha, bu doğrudan da dəhşətdir. Lakin bütün sui-qəsdçilər bilsin ki, Azərbaycan da yoxdur, onun dili də!

N i z a m i. Tarixi vərəqlə! Çoxları əlifba dərsini qədim Midiyalılardan almışdır.

Ş a h. Bu, Nizaminin tarixidir...

N i z a m i. Onu tərsinə yazanlara həqiqəti göstərmək mənim üçün böyük bir şərəfdir. Bir zaman gələr ki, Məhsətini, Əbdəki yetirən xalqın qəzəbi alov kimi göylərə ucalar və bu müdhiş alov hökmdarların əlilə yaranmış qaranlıq zindanları yandırıb külə döndərər.

Ş a h. Bəsdir, buyurub gedə bilərsən!

Bu halda vəziri gətirirlər.

Dayan! Sui-qəsdçilər, canilər!

V ə z i r. Ey hökmdar, ey əli qanlı zülmkar, mən də Nizamini yaradan böyük xalqın oğluyam. Gəl, Nizami, bizi yetirən ananın, ana torpağın visalına gedək!

Ş a h. Nankor, vəzir! Sənə bu müəzzəm sarayın göz qamaşdıran şöləsi yox, soyuq zindanların qatı qaranlığı yaraşır.

V ə z i r. Firdovsi Tus şəhəri üzərində parıldayan bir ay idisə, Nizami Gəncədən doğan bir günəşdir!

Ş a h. Aparın, Firdovsi Tus şəhəri üzərində parıldayan bir aydısa, Nizami Gəncədən doğan bir günəşdir? Əmr edirəm, dastan yandırılsın.

M u n i s. Yandırın!

Vəziri aparırlar. O, məğrur addımlarla gedir. Munis “Xosrov və Şirin”i buxarıya atıb yandırır.

Ş a h (*alovdan dəhşətə gələrək*). Söndürün, söndürün! Mən bu alovdan qorxuram!

N i z a m i (*məğrur dayanmış halda*). Yandırın!.. Yandırın!.. Bu gündən sonra yalnız insanlar deyil, dağlar, dərələr də səs-səsə verib deyəcəkdir: Gəncə haradadır, Nizami kimdir!..

P ə r d ə

*Bakı, 1940-41-ci illər*

# C A V A N Ş İ R

## İŞTİRAK EDİRLƏR

C a v a n ş i r – Ağvan hökmdarı
Z i b e y d ə – Onun arvadı
E l ç i n – Onların oğlu
S ö h r a b – Cavanşirin vəziri
S a r a n – Cavanşirin xəzinədarı
Q a r t a l – Cavanşirin cəngavəri
Q ı l ı n c – Şair, cəngavər
Ş a h i n – Qartalın atası
A y b ə n i z – Söhrabın bacısı
Q ə n i m ə t – Girdman taciri
F ə r i d – Cəngavər
B ə h r a m – Sasani sərkərdəsi
P o l a d – Onun cəngavəri
R e y h a n – Bəhramın qızı, Elçinin sevgilisi
Q a r a t e l – Onun rəfiqəsi
K a b u s – Bəhramın cəngavəri
A l o v – Tacir, Fəridin atası
Q ı z ı l t a c – Tacir
D ə m i r d a ş – Tacir
K a r x a n a s a h i b i
G ü n ə ş a n a – Mərhum Altuntacın zövcəsi
Q ı v r ı m t e l – Onun qızı
K ə y a n e l ç i s i
B i z a n s e l ç i s i
C a v a n ş i r i n x i d m ə t ç i s i
B ə h r a m ı n x i d m ə t ç i s i
X a n ə n d ə

## BİRİNCİ ŞƏKİL

Muğan qalası

B ə h r a m. Heç bir zaman ehtiyatı əldən verməyin, unutmayın ki, biz zəbt olunmuş bir şəhərdəyik. Cavanşir Muğan qalasını geri almamış bir an belə, rahat ola bilməyəcək. Əsirləri gətirin. Qala qapılarını yoxlayın. Keşikçiləri gözdən keçirin. Aydındırmı?

P o l a d. Aydındır...

B ə h r a m. Hanı Qartal? Mənə qarşı qiyam etmiş o sərsəmi nə üçün gətirmədiniz?

K a b u s. Qartal dünəndən bəri şüurunu itirmişdir. Yalnız indi özünə gəlmiş.

B ə h r a m. Yoxsa ona işgəncə vermişsiniz?

K a b u s. Xeyr, xeyr. O, vuruşmada yaralanmış, çoxlu qan itirmişdir. İndi isə artıq ayağa qalxmış. Baxın, onu gətirirlər...

Gözətçilər qartalı halqa içərisində gətirirlər. Qolları və qıçları qandallı, üst-başı qan ləkələri ilə örtülmüşdür, saçları dağınıq. Lakin o qürurla dayanmışdır.

B ə h r a m (*Qartala*). Siz məğlub oldunuz... Mənə qarşı qiyam yatırıldı.

Q a r t a l. Yox... Yatırıldı deməyin, qan dənizində boğuldu deyin...

B ə h r a m. Hökmdarınız Cavanşir isə köməyinizə gəlmədi.

Q a r t a l. Doğrudur, gəlmədi. Çünki Ağvanın şimalında vəhşi xəzərilərlə vuruşur. Mən inanıram ki, böyük sərkərdəmiz Cavanşir düşmənləri əzib vətənimizin müqəddəs torpağından kənara atacaq. Sonra da buraya, Muğan şəhərinə hücum edib sənin qanlı hökmranlığını yıxacaqdır. O zaman namərdliklə qəsb etdiyimiz bu Ağvan torpağı azad nəfəs alacaqdır.

B ə h r a m (*Polada*). Eşitdinmi o nə dedi?

P o l a d. Bəli, möhtərəm sərkərdə, eşitdim...

B ə h r a m. Səncə bu körpə uşağın ağlı başındadırmı? (*Qartala*) Sönüb külə dönmüş bir od, heç nəyi yandıra bilməz. Cavanşir artıq sönmüş bir oddur. Cavanşir... Hücumu... ha, ha, ha...

Q a r t a l. Bu gün gülürsünüz, lakin sabah ağlaya bilərsiniz...

B ə h r a m. Sasani dövlətinin önündə dayana biləcək bir qüvvə yoxdur.

Q a r t a l. Lovğalıq gücsüzlərin silahıdır.

B ə h r a m. Burax bu inadı, Qartal... İndi ki, mən səni öldürmək fikrində deyiləm. Mən səni əfv etmək istəyirəm. Yalnız bir şərtim var... Sən həmvətənlərinə üz tutub deməlisən ki, daha bəsdir bu üsyanlar. Artıq inadınızdan əl çəkin. Qiyamlara son qoyun. Doğrusu, bu qanlı dar ağacları məni artıq təngə gətirmişdir.

Q a r t a l. Mən də dar ağacını gözləyirəm.

B ə h r a m. Demək, sən öz igidliyin müqabilində yalnız bu mükafatı istəyirsən? Təəssüf, çox təəssüf...

Q a r t a l. Görürəm ki, sənin həris gözlərin hələ də qandan doymamışdır.

B ə h r a m (*qəzəblə*). Aparın, bu inadkar sabah dar ağacından asılacaqdır.

Gözətçilər Qartalı aparırlar.

P o l a d. Möhtərəm vali, vuruşma meydanında basılmış igid bir əsgəri dar ağacına göndərmək bizim şənimizə yalnız ləkə gətirə bilər.

B ə h r a m. Nə etməli, Polad. Zəmanəmiz qanla yoğrulmuşdur. Bu mənim günahım deyildir. Mən Muğanı da öz xoşumla zəbt etmədim. Bu, ulu hökmdarın əmri idi. Cənubda qəsbkarlar hücuma başlayıb ölkəmizi taladılar, bu ziyanı yalnız Ağvanın tükənməz sərvətləri ödəyə bilərdi.

P o l a d (*öz-özünə*). Yox, yox, mən Qartalı ölümdən qurtarmalıyam... (*Getməyə hazırlaşır, işıq sönür, pərdə salınır*)

## İKİNCİ ŞƏKİL

Bəhramın saray otaqlarından biri

B ə h r a m. Razı oldularmı?

K a b u s. Bəli, igid sərkərdə, hər ikisi razı oldular.

B ə h r a m. Aha, çox gözəl. Deməli biri...

K a b u s. Bəli, biri Cavanşirin vəziri Söhrab, o biri isə məşhur Girdman taciri Qənimət. Hər ikisi Cavanşirin qanını içməyə belə hazırdır.

B ə h r a m. Sən onların hiylə işlətmədiklərinə əminsənmi?

K a b u s. Özümə əmin olduğum qədər...

B ə h r a m. Çağır gəlsinlər...

K a b u s. Baş üstə... Buyurun...

S ö h r a b və Q ə n i m ə t daxil olurlar.

B ə h r a m. Cavanşirin vəziri Söhrab hansınızsınız?

S ö h r a b. Mənəm, igid sərkərdə...

B ə h r a m. Çox şadam. Muğan şəhərinə gələrkən qorxmadığınıza təəccüb edirəm.

S ö h r a b. Sizi özümüzə dost bilib gəldik. Əmin olun ki, Cavanşirin məhəbbəti dilimizdə, sizin məhəbbətiniz ürəyimizdədir.

Q ə n i m ə t. Gətirdiyimiz bu kiçik hədiyyələri qəbul etsəniz, özümüzü həddindən çox xoşbəxt sanarıq. 100 min dinar qızıl, bir də dəstəyi mirvari ilə bəzənmiş bir qılınc. Buyurun...

B ə h r a m. Çox razıyam. Birdən Cavanşir bu gəlişinizdən xəbər tutarsa?

S ö h r a b. Sizinkilər xəyanət etməzsə, heç kimdən qorxumuz yoxdur. Biz buraya Cavanşirin oğlunu qarşılamaq bəhanəsilə gəldik. O, bu gün Bizans elçiləri ilə bərabər gəlib buradan keçəcək.

B ə h r a m. Cavanşirin oğlu? Nə gözəl təsadüf. Mən onu tutub girov saxlarsam?

S ö h r a b. Xeyr, xeyr, bu mümkün deyil, böyük sərkərdə Cavanşirin oğlu Bizans elçilərinin karvanı ilə gəlir. Onlara toxunmaq adətdən kənar işdir.

P o l a d. Bizans dövlətini də düşmənə çevirmək?

B ə h r a m. Elədir, Polad. Bu indiki halda bizim xeyrimizə deyil. Yaxşı, Söhrab, tələblərimiz sizə bəllidirmi?

S ö h r a b. Söylədilər... Yəqin ki, siz də bizim tələblərimizdən xəbərdarsınız.

B ə h r a m. Xəbərdaram... Lakin siz hiylə işlətmədiyinizi nə ilə sübut edə bilərsiniz?

S ö h r a b. Cavanşirin ölümündən sonra Ağvanda hökmdar olaramsa, qızınız Reyhanı Ağvan hökmdarının məlikəsi görmək istərdim.

B ə h r a m. Demək siz qızım Reyhanı sevirsiniz?

S ö h r a b. Bütün varlığımla. Mən Reyhanın yolunda hər bir fədakarlığa hazıram...

B ə h r a m. Bu çox möhkəm sübutdur... Bəs sən?

Q ə n i m ə t. Cavanşirin əmri ilə iki aya kimi 100 kisə qızıl verməliyəm. O, Ağvan qoşunlarını mənim hesabıma dolandırmaq fikrindədir. Onun əmrini yerinə yetirməsəm boynumu vurduracaq. Özüm ölməmək üçün onu öldürməyə məcburam...

Yavər daxil olur.

Y a v ə r. Möhtərəm Söhrab, gözlədiyiniz Bizans elçiləri artıq şəhərə girdilər.

S ö h r a b. Elə isə bizi əfv edin... Cavanşirin oğlu Elçin bizim burada olduğumuzdan xəbər tutmamalıdır. Hələlik...

B ə h r a m. Xoş gəldiniz...

Söhrab və Qənimət gedirlər.

P o l a d. Belə xainlərin sədaqəti də özləri kimi rəzil olur... Onları qəzəbsiz dinləmək belə mümkün deyildir.

B ə h r a m. Demək, Cavanşirin əleyhinə iki qüvvə vuruşur. Məhəbbət, qızıl. Bu qüvvələrin birliyi dağları da yerindən tərpədə bilər... Cavanşir öldümü, bunların ikisi də o dünyaya göndəriləcək. Qoy bu sirri də özləri ilə bərabər aparsınlar. Gedək, Polad. Bu qələbədən sonra eyş-işrət məclislərinə bir gün də ara verməyəcəyəm.

İşıq sönür, musiqi başlayır, pərdə salınır.

## ÜÇÜNCÜ ŞƏKİL

Bəhramın sarayı, xanəndə oxuyur.

O gün mən əhdi-peyman eylədim bir nazlı yarilə,
Fəzayi eşqi canım çürütdüm etibar ilə,
Ey saqi nadandır gəl, halidir dünya,
Mey göndər, alışsın qoy başımda sevda.
Bahar ömrün xəzan oldu, gəl, ey gül üzlü yar,
Məqamdır gəl, çal, oynasın qara gözlü dildar.
Ah yandım, bu eşq odu yandırdı canımı,
Ah yarəbbi, fələk qoyma bu xoş dövranımı.
Ah cahan səanindir, bu can sənindir,
Sən əmr etsən bu cahan sənindir,
Bahar ömrüm xəzan oldu gəl ey gül üzlü yar,
Məqamdır gəl, çal, oynasın gül üzlü yar
Gəl, gül üzlü yar... Gəl gül üzlü yar...

K a b u s daxil olur.

K a b u s. Fəlakət... Fəlakət...

B ə h r a m. Nə olmuşdur?

K a b u s. Bu gecə kim isə Qartalı zindandan qaçırmışdır.

B ə h r a m. Qartalı? Sənin başını bədənindən ayırmaq belə azdır...

Y a v ə r daxil olur.

Y a v ə r. Qasidlərdir...

B ə h r a m. Kayan tacidarının qasidlərini layiqli ehtiramla qarşılayın...

Q a s i d daxil olur.

Q a s i d. İgid sərkərdəmiz Bəhrama salam və ehtiram. Şahlar şahının fərmanı...

B ə h r a m. Xoş gəlmişsiniz, möhtərəm qasid. Bu nədir, mən gözlərimə inana bilmirəm...

Q a s i d. Çox təəssüf ki, orada yazılan hər bir söz eyni həqiqətdir. Düşmən qoşunları birdən hücuma keçib İran torpağına ayaq basdılar. Sərhəd boyunca ucsuz-bucaqsız bir insan dənizi üstümüzə yeridi. Şahlar şahının fərmanı ilə bir an belə yubanmadan Cavanşirə ittifaq təklifi aparmalısınız. Ayrı çarəmiz yoxdur, igid Sərkərdə...

B ə h r a m. Bəs tökülən qanlar, ölən insanlar? Uçan saraylar, yanan xanimanlar? Demək, mən bu qılıncımı nahaq qana boyamışam.

Q a s i d. Ulu tacidarımız dedi ki, dəvə karvanı ilə yolladığımız cavahiratı, qızılları Cavanşirə hədiyyə aparın... Necə olursa-olsun, düşmənlərə qarşı onunla hərbi ittifaq bağlayın. Məncə bu gözəl tədbirdir. Xəzinədən yoxsul olan Cavanşir belə ittifaqdan boyun qaçırmaz. İnan ki, o, yenə Fərat, Dəclə sularını düşmən qanına boyayıb İran torpağını xilas edəcəkdir.

B ə h r a m. Bəs Muğan? Bəs qılıncımla zəbt etdiyim bu qızıl torpaqlar?

Q a s i d. Hələlik burdan geri çəkilməyin... Cavanşir bizim ittifaq təklifimizdən boyun qaçırarsa, Muğan qalası yenə də bizə gərək ola bilər.

B ə h r a m. Möhtərəm qasid, siz nə qədər acı bir xəbər gətirdiniz. Gedək hazırlaşaq.

Q a s i d. Hər şey hazırdır... Karvan sizi gözləyir. Biz yubanmadan yola düşməliyik.

İşıq sönür, pərdə salınır.

## DÖRDÜNCÜ ŞƏKİL

Bəhramın saray həyətində bağ, qızlar mahnı oxuya-oxuya rəqs edirlər.

Q ı z l a r ı n m a h n ı s ı.

Qarlı dağlar qızı Reyhan, Reyhan, Reyhan
Parlaq dan ulduzu Reyhan, Reyhan, Reyhan
Aləm sənə heyran Reyhan, Reyhan, Reyhan
Qarlı dağlar qızı Reyhan, Reyhan, Reyhan

Nə gözəlsən ay qız
Gül çiçəksən ay qız
Bir dənəsən ay qız
Dürdanəsən ay qız.

Gözün aydın Reyhan, Reyhan, Reyhan
Gəlir yarın Reyhan, Reyhan, Reyhan
Aləm sənə heyran Reyhan, Reyhan, Reyhan
Gözün aydın Reyhan, Reyhan, Reyhan

Nə gözəlsən ay qız
Gül çiçəksən ay qız
Bir dənəsən ay qız
Dürdanəsən ay qız.

Q a r a t e l. Yaxşı bax, qabaqda gələn o gözəl oğlanı mən harada isə görmüşəm.

R e y h a n. Qaratel, əzizim, mən də görmüşəm. Bax, bu məktubu da o göndərmişdir. İndi mənim sevinməyə haqqım var, Qaratel...

Q a r a t e l. Axı, o kimdir?

R e y h a n. Mənə ürəyimdən də yaxın bir müsafir – Ağvan hökmdarı Cavanşirin oğlu Elçin. Sən özün düşün, mən heç onu unuda bilərəmmi? O, Suriyada təhsil alıb, sonra dünyanın uzaq ölkələrini – Hindistanı, Çini dolaşıb qayıdır, 3 ildir, düz 3 ildir ki, mən onun xəyalı ilə yaşayıram... Birdən o məni tanımazsa?

Q a r a t e l. Tanıyar, tanıyar. Sevən oğlanın yadından hər nə çıxsa da, istəklisinin sifəti çıxmaz. Reyhan, əzizim, sən nə qədər xoşbəxtsən... sənin taleyin müqəddəs günəşin şüaları kimi gülümsəyir. O yaxınlaşır, biz gizlənək...

R e y h a n. Məni təkmi buraxırsınız? Yox, dayanın, yaxşı gizlənin. Yox, dayanın... Siz gedin, qızlar.

Q a r a t e l. Düz deyirsən, uzaqdan tamaşa etmək daha yaxşıdır. Reyhan, əzizim, ehtiyatlı ol. Birdən sizi görüb atana xəbər verərlər. Gəlin, qızlar, gedək keşikdə dayanaq.

R e y h a n. Qayıdın, qızlar...

Q a r a t e l. Dayanın, qızlar, Reyhan hələ fikrini çox dəyişəcək. Yox, gizlənək... (*Qızlar gizlənir. Elçin daxil olur*) Bax, Elçin Reyhanı gördü... Bax, bax, tanıdı... Bu saat Reyhan dünyada yalnız Elçini görür...

E l ç i n. Reyhan, ayrılıq uzun çəkdi. Lakin səni unutduğum bir an belə olmadı. Söylə, Reyhan, söylə, bizim əhdi-peymanımızı unutmamışsan ki?

R e y h a n. Öz adımı unutsam belə əhdimi unutmaram, Elçin.

E l ç i n. Zaman dəyişdi, Reyhan, mən Suriyaya gedərkən İranla Ağvan dost idi, vətənimizi ayaqlamaq istəyən yağılara qarşı birgə vuruşurduq. O, vaxt bizim atalarımız da qardaş kimi idilər. Bir-birinə can deyib can eşidirdilər. Mən Suriyadan vətənə qayıdarkən nə böyük arzular bəsləyirdim. Lakin o arzularımın hamısı duman olub havaya uçdu. Zaman nə qədər tez dəyişdi. Nə üçün, Reyhan, nə üçün?

R e y h a n. Kayan hökmdarının əmri ilə atam qoşun çəkib Muğanı aldı. Əsir tutduğu Ağvan əsgərlərini qılıncdan keçirtdi... Bu qanlı divanı xatırladıqca qəzəbimdən az qala boğuluram. Atamın Cavanşirə qarşı vəfasızlığı mənim də qəlbimi yaraladı. İndi Muğanda ölüm qara bir kabus dəhşətilə ətrafı sarımış, insanların acı fəryadı göylərə ucalmış.

E l ç i n. Reyhan, əzizim, sən kədərlisən. Gözlərin də yaşarmışdı. Bilirəm ki, bu qəmli hadisə səni də sarsıtmışdır. Nə etməli, görünür taleyimiz belə idi. Mən artıq getməliyəm, Reyhan. Lakin yenə gələcəyəm sən məni hər səhər, hər axşam gözlə.

R e y h a n. Ağvanın paytaxtı Girdman uzaqdadır. Sən buraya hər səhər, hər axşam necə gələ bilərsən?

E l ç i n. Sevən ürəklər üçün heç bir məsafə yoxdur, Reyhan. Mənim qəlbimin həmdəmi daim sən olacaqsan. Yalnız sən... Bəlkə səni aramızdakı düşmən sərhədi qorxudur, Reyhan, açıq söylə...

R e y h a n. Mən özüm üçün yox, sənin üçün qorxuram, Elçin... Atamın əlləri onsuz da günahsız qana boyanmışdır. O səni də...

E l ç i n. Öldürər... Elə bilirsən uf deyərəm... Yox, əzizim, dünyalar qədər sevdiyim Reyhan üçün ölmək belə mənim nəzərimdə ən böyük səadətdir.

Ayaq səsləri

R e y h a n. Aman, gəldilər... Get, Elçin, get...

Qızların mahnısı

Xoşbəxt olmaq, sevinmək mümkün ikən ölümü nə üçün arzulayırsan? Dayanma əzizim, get, səni and verirəm o müqəddəs günəşə, bu gənc yaşımda mənim eşqimi nakam qoyma.

E l ç i n. Əlvida...

R e y h a n. Əlvida...

E l ç i n gedir, qızlar Reyhanın başına toplaşırlar.

Ən böyük arzuma çatdım, Qaratel. Elçin məhəbbətlə yanan ürəyini mənə bir də açdı. Mən onun odlu nəfəsini bir də duydum. Mən indi doğrudan da xoşbəxtəm. Ah, aramızdakı düşmən səddi uçub tökülsəydi. Qan, ölüm yerinə yalnız qardaşlıqla məhəbbət hakim olsaydı...

İşıqda pərdəni sal, antrakt

## BEŞİNCİ ŞƏKİL

Cavanşirin sarayında bir otaq

Z i b e y d ə. Oğlum, Elçin, səni and verirəm o müqəddəs günəşə, at yerə o qılıncı...

E l ç i n. Qılıncı yerə atmaq günahdır, ana... Bax, görürsənmi atam Cavanşir odlu qılınca nə qədər hörmət edir.

Z i b e y d ə. Mən onsuz da səni heç yana buraxmayacağam. Hələ doyunca üzünə də baxmamışam. Üç illik həsrətin ürəyimdə tabi-təvan qoymayıb, oğlum, Elçin... Elçin...

E l ç i n. Anacan, mən bir an belə yubanmadan atamın yanına – vuruş meydanına getməliyəm. Mən də onunla qəsbkarlara qarşı qılınc oynadıb, ox süzdürməliyəm. Qoy qanlı vuruşmalar tezliklə qurtarsın. Ana torpağımızın hər tərəfindən həyat səsi, sevinc nəğməsi ucalsın...

Söhrab daxil olur.

S ö h r a b. Elçin... Elçin hara? Ananın sözündən çıxma. Zübeydə xatun, Elçinlə gəlmiş qonaqlar səni gözləyir. Buyur... Mən ana ürəyinin müqəddəs arzusunu oğluna anladaram.

Z i b e y d ə. Çox sağ ol, Söhrab... Sən Elçindən təcrübəlisən, onu fikrindən daşındır. (*Gedir*)

E l ç i n. Bilmirəm nə üçün heç kəs mənim vuruş meydanına getməyimə razı deyil..

S ö h r a b. Çünki sən həm anan üçün, həm də elimiz üçün əzizsən... Elçin, unutma ki, sən Cavanşirin yeganə oğlusan...

E l ç i n. Mən atamla vuruş meydanında görüşərsəm, bu daha gözəl olmazmı?

S ö h r a b. Əgər o sənin gəlişindən xəbər tutsaydı, inan ki, quş kimi qanad açıb ongünlük yolu bir nəfəsə gələrdi.

E l ç i n. Atam çox qocalmışdır, eləmi?

S ö h r a b. Əsla... Yox, Elçin, saysız vuruşmaların hamısından qalib çıxmış bir sərkərdə də qocalarmı? İnan ki, o səni görəndən sonra ürəyinə yeni sevinc, qollarına yeni bir qüvvə gələcəkdir.

E l ç i n. Bu daha gözəl... Mən gedirəm, dostum, artıq səbr edə bilmirəm...

S ö h r a b. Tələsmə, Elçin, tələsmə, aldığımız son xəbərlərə görə o, xəzəriləri tar-mar etmişdir. Əgər bu xəbər doğrudursa, Cavanşir bu gün, sabah mütləq qayıdar...

E l ç i n. Bir yandan ata həsrəti, bir yandan da... Eh, əziz dostum. Bu ağır intizar qəlbimi didib parçalayır.

S ö h r a b. Aha, sən eşq odunda yanan aşiqlərə bənzəyirsən.

E l ç i n. Sən bunu nədən bildin, qardaşım?

S ö h r a b. Bax, bax, bax, sevgi bəlasına tutulmasaydın, səsin çalınmış bir sim kimi titrəməzdi...

E l ç i n. Sən haqlısan, qardaşım... İndi mənim qəlbimin hər bir teli doğrudan da, çalınmış bir simə bənzəyir. O mənim bütün varlığıma hakimdir.

S ö h r a b. Kim, Elçin?

E l ç i n. Mən onu ilk dəfə gördüyüm andan bu günə kimi heç bir vaxt onun xəyalından ayrılmamışam. Kayan gözəlinin adını bax buraya, qəlbimə yazmışam... Reyhan... Reyhan, indi sən haralardasan?

S ö h r a b. Nə, Reyhan? Yox, yox, bu ola bilməz...

E l ç i n. Reyhan mavi göylərdən yerə enmiş bir ayparadır. Onun yolunda həyatımı yüz min kərə qurban vermək mümkün olsaydı, bir yol da uf deməzdim. Ey müqəddəs günəş, səndən yalnız bir xahişim var, mənim ömrümdən kəsib Reyhanın ömrünə cala...

S ö h r a b. Elçin... Elçin, sus, eşidərlər... Bəs bu necə ola bilər ki, Cavanşirin oğlu onun düşməninin qızına vurulsun...

E l ç i n. Ən böyük fəlakət də elə budur, dostum... Ancaq inanıram ki, mən gec-tez Reyhana qovuşacağam.

Z i b e y d ə x a t u n daxil olur.

Z i b e y d ə. Elçin, qonaqlarımız səni gözləyir...

E l ç i n. Mənim qəlbimsə başqa bir arzu ilə çırpınır, anacan!..

Z i b e y d ə. Unutma ki, atan burada deyil, onu sən əvəz etməlisən...

E l ç i n. Gedək, ana, mən inanıram ki, taleyim günəş tək gülüm-səyəcək.

Z i b e y d ə. Elədir, oğlum, sənin taleyin günəşdən belə parlaq olacaq. (*Gedirlər*)

S ö h r a b. Taleyim günəşdən belə parlaq olacaq. Yox, mən öz miskin taleyi ilə barışan acizlərdən olmaq istəmirəm. Cavanşirin adını göylərə ucaldan bu odlu qılınca mən də sarılacağam.

P ə r d ə

## ALTINCI ŞƏKİL

Cavanşirin sarayı

E l ç i n. Ox, ata, ata... Sən nə qədər səbirlisən, sevgilim uzaqdadır. Gözlərini yola dikib hər səhər, hər axşam məni gözləyir. Mən də səni gözləyirəm, ata.

S ö h r a b daxil olur.

S ö h r a b. Şad xəbər var... Elçin, şad xəbər...

E l ç i n. Bu nədir? Şeypur səslərindən sevinc yağır? Bəlkə gələn atamdır?

S ö h r a b. Doğrudur, bu adət bizə babalardan yadigar qalmışdır. Atam vəzir olarkən də həmişə böyük sərkərdəmizi şeypur səsləri ilə qarşılardı. Eşidirsənmi, Elçin, şeypurun səsindəki o inilti nidaları böyük sərkərdəmiz Cavanşirin yaralandığına işarədir. (*Zibeydə xatun və saray xanımları gəlirlər*) İndi yaralı cəngavərlərdən biri gəlib əvvəlcə anan Zibeydə xatuna xəbər verəcək. Aha, bu gələn qasid Ağvanın şairi Qılıncdır.

Q ı l ı n c daxil olur.

Ey cəngavər şair, gətirdiyin şad xəbərləri əvvəlcə sərkərdəmizin istə-kli oğlu Elçinə söylə...

Q ı l ı n c. Xoş gördük, Elçin... Mənim sərkərdəm, sənin atan Cavanşir xəzər xaqanı ilə özü qarşılaşdı. Qarı düşmən qara dırnaqlı atını böyük hökmdarımın üstünə səyirdərək əyri qılıncını onun başına endirdi.

Z i b e y d ə. Söylə, oğlum, söylə Cavanşir hanı?

Q ı l ı n c. Xəzər xaqanı ilə o özü qarşılaşdı, Ağvan torpağının vuran əli, hünər, rəşadət timsalı Cavanşir birdən köhlən atını onun üzərinə şığıdaraq qara kəlləsini bədənindən ayırdı.

S ö h r a b. Afərin, afərin...

Z i b e y d ə. Mənim igid balalarım, siz necə mərdliklə vuruşmuşsunuz...

Q ı l ı n c. Qan məni aparır, dostlar, əgər mən ölsəm:

İstərəm hər tərəf ilk bahar olsun.
Hər kəs öz yarına düz ilqar olsun.
İnsan bu dünyaya gəldi-gedərdir
Təki sevdiyimiz vətən var olsun.

Z i b e y d ə. Cəngavər şairin yarasını bağlayın. Tez... (*Urra*)

Qılıncı aparırlar, saray adamları Cavanşiri qarşılamağa gedirlər.

A y d ə m i r. Hanı hökmdar, söylə, hanı, yoxsa...

X i d m ə t ç i. Gələn böyük sərkərdəmiz Cavanşir özüdür...

H a m ı. Eşq olsun, eşq olsun...

Cavanşir daxil olur.

C a v a n ş i r. Oğlum, Elçin... Həsrətindən anan göz yaş axıdırdı. Mən isə qocalırdım, oğlum. İndi qollarımın qüvvəsi birə yüz oldu. Daha mənim yaram ağrımır. Xəzər qılıncı ilə sinəmə vurulan yaradan mənə ölüm yoxdur. Yox, mən Ağvan üçün yaşayacağam...

H a m ı. Eşq olsun... Eşq olsun...

C a v a n ş i r. Söylə, Elçin... Söylə, qollarıma qüvvə, gözlərimə işıq verən mehriban oğlum. Sən qərib ölkələrdən atana nə gətirdin?

E l ç i n. Elini, obasını sevən saf bir oğul ürəyi sənə bəs deyilmi, ata...

C a v a n ş i r. Afərin, mənim tərlan balam, urra. Siz də eşidin, mənim əziz övladlarım, Elçin Suriyadan qayıtdı. Qərib ölkənin iqlimi onun vəfalı ürəyinin hərarətini azaltmadı. Urra... Urra... Sizlərdən çoxunuzu da Suriyaya, Çinə, Bizansa göndərəcəyəm. Arzum budur oxuyun, öyrənin, qoy dünyanın bütün elmləri Ağvan torpağını öz nuru ilə işıqlandırsın. Qoy Ağvan yolları dünyanın hər tərəfinə uzansın. Amma ürəklərimiz həmişə Ağvanın sönməz eşqi ilə döyünsün. Urra... Urra... Obalarınıza qayıtmadan əvvəl on gün mənə qonaqsınız. Urra.. Urra...

Sən də hazırlıq gör, Söhrab xəzərilərlə vuruşmuş igidlərimin hamısına özüm mükafat verəcəyəm.

Z i b e y d ə. Gedək, Cavanşir, yaran səni incidir.

C a v a n ş i r. Gedin dincəlin, övladlarım... Yuxu yorulmuş cəngavərin dostudur. Ağvan cəngavərlərinin qədrini bilin. Mən ona ürəyimi də versəm, yenə azdır. Urra... Urra...

Cavanşir, Elçin, Zibeydə gedirlər. Söhrabla Aybəniz irəli gəlir, onların dalınca baxırlar.

P ə r d ə

## YEDDİNCİ ŞƏKİL

Cavanşirin sarayı

S ö h r a b. Girdman tacirləri həmişə günorta üstü yola düşürlər, bu gün nədənsə zınqırov səsləri çox tez eşidildi. Görəsən bu karvanlar hara gedir?

S a r a n. Onlar getmir, gəlir... Yəqin böyük hökmdarımız Cavanşirə hədiyyə gətirirlər.

S ö h r a b. Cavanşir özgələrinin hədiyyəsinə möhtac deyil.

S a r a n. Boş xəzinəmiz belə hədiyyələrə möhtacdır, vəzir, aha, mən deyəndir... hədiyyə gətirirlər.

S ö h r a b. Sən bunu nədən bilirsən?

S a r a n. Karvanın önündə bir atlı da var...

S ö h r a b. Girdman taciri Qənimət də karvanın qabağında gedəndə həmişə atlanır...

S a r a n. Bu atlı tacirə bənzəmir. Bizim tacirlər uzun əba, dikburun çəkmə geyirlər. Amma bu gələn atlının əynində parıltısı göz qamaşdıran qısa cəng libası var. Çəkmələri isə mirvari ilə bəzənmişdir. Bax, qızıl bazubəndi buradan da görünür... Yəqin böyüklərdəndir. Kim bilir, bəlkə bir ölkənin hökmdarıdır.

S ö h r a b. Bu axşam xəzinədar olsa da, düz deyirmiş...

S a r a n. Vəzifənin böyüklüyü ağlın dərəcəsini artırsaydı, sən yenə də həmişəki qədər mənasız danışmazdın.

S ö h r a b. Aha, karvan dayandı... Ey, açın sarayın darvazalarını, əziz qonaqları ehtiramla qarşılayın...

S a r a n. Xəzinə bomboşdur, gecələr gözümə yuxu getmir.

S ö h r a b. Suss...

S a r a n. Mən səni nəzərdə tuturam... Çoxdan bəri boş xəzinəyə vəzirlik edirsən...

S ö h r a b. Suss dedim...

S a r a n. Bu sirri hamıdan gizlətsəm də, Cavanşirdən gizlətməyəcəyəm. (*Gedir*)

S ö h r a b. O mənim cinayətimi açıb söyləyənə kimi, mən onun qəbrini qazmalıyam.

B ə h r a m və q a s i d daxil olurlar.

Q a s i d. Ağvan hökmdarı Cavanşirin sarayı budurmu?

S ö h r a b. Siz kimsiniz?

B ə h r a m. Mən Sasani qoşunlarının sərkərdəsi Bəhramam.

S ö h r a b. Doğrudanmı? Cavanşirin sarayına gələrkən qorxmadığınıza təəccüb edirəm. Siz çox cəsur adamsınız...

B ə h r a m. Biz böyük hökmdarınız Cavanşirlə görüşməyə gəldik. Onun xəzərilər üzərindəki qələbəsi hamımızı sevindirmişdi. Təbrik üçün gələn elçiyə toxunmazlar...

S ö h r a b. Elçiyə toxunmasalar da, sizə toxunarlar. Unutmayın ki, Cavanşirin babalarından yadigar qalmış Muğan torpağını qəsb edən sizsiniz...

P o l a d. Görünür, biz bura nahaq gəlmişik...

B ə h r a m. Demək mən geri qayıtmalıyam...

S ö h r a b. Yox... yox, mən belə demədim... Hökmdarımızı gözləyin, sizdən başqa Bizansdan, Suriyadan, Gürcüstandan, elçilər gəlmişdir.

S a r a n. Hədiyyələrə baxdım, qızıla vurulsa beş yüz min dinar qiyməti var...

B ə h r a m. Bu qoca kimdir?

S a r a n. Bu vaxtacan xəzinədardım, indi isə vəzirimizə təlxəklik edirəm...

B ə h r a m. Gülməli qocadır...

S a r a n. Cibi boşalmış xəzinədara qoca olmasa da gülərlər.

B ə h r a m. Təlxək hökmdarı əyləndirər, sən nə üçün vəziri əyləndirirsən?

S a r a n. Məsələ uzundur. Bir zamanlar vəzirimiz Söhrab pulları oynadırdı, son vaxtlar nədənsə məni oynadır...

S ö h r a b. Qoca, hər sözün yeri var, çəkil get...

S a r a n. Hara gedim? Dar ağacına, yoxsa qoyun otarmağa.

B ə h r a m. Bu sözünü də anlaya bilmədim...

S a r a n. Bütün sözlər anlaşılmaq üçün söylənilsə idi, vəzirimiz Söhrab ömründə bir kəlmə də olsun dinib danışmazdı. Dar ağacı yaxşıdır... Qoyunların sayını artırsam vəzirimiz onlara da sahib çıxacaq. (*Gedir*)

S ö h r a b. Onu dəli zənn etməyin, Cavanşirin ən yaxın müşaviridir...

B ə h r a m. Onu tez susdur, eşidirsənmi?

S ö h r a b. Eşidirəm, əziz qonaqlara ehtiram göstərmək borcumuzdur, buyurun...

Gedirlər.

S a r a n. Mən Bəhramdan çox razıyam, onun hədiyyələri bizə bir il kifayətdir. Amma doğrusu, bir şeydən qorxuram...

S ö h r a b. Nədən, qoca?

S a r a n. Qızılların səsindən...

S ö h r a b. Sən yenə də sayıqlayırsan?

S a r a n. Göylərə and olsun ki, yox... Mən yalnız qulaqlarımla eşitdiklərimi, gözlərimlə gördüyümü danışıram. Qızılların səsi doğrudan da qorxuludur... Özü də bilirsən nə vaxt?

S ö h r a b. Nə vaxt?

S a r a n. Gethagetdi başlayanda, sən ki, bunu yaxşı bilirsən...

S ö h r a b. Qoca, sən bu boş danışıqlarından əl çək...

S a r a n. Xəzinəmiz dolsun ki, mən bir kəlmə danışmaram...

S ö h r a b. Xəzinəni boşaldan sənsən, alçaq... Mən səni bu gün zindana saldıraram, alçaq...

S a r a n. Məni öldürsən də öz günahlarını azalda bilməzsən. Vicdan ləkəsini qanla da yumaq olmaz...

S ö h r a b. Get fərmanımı gözlə...

S a r a n. Gözlərəm həm sənin fərmanını, həm də Cavanşirin.

S ö h r a b. Bu saat zindana...

P ə r d ə

## SƏKKİZİNCİ ŞƏKİL

Cavanşirin sarayı, Cavanşir, Elçin, Zibeydə oturublar. Kütlə də səhnədədir. Fərid daxil olur.

F ə r i d. Böyük hökmdar, Bizans hökmdarının elçisi hüzurunuza izn istəyir... Dostluq, ittifaq arzusundadır.

C a v a n ş i r. Ağvana dost kimi gələnlərə gözüm üstə yer var. Düşmən kimi gələnlər isə əzilmiş başdan savayı heç bir şey qazana bilməyəcəklər. Qoy bu xəbəri Sasani sərkərdəsi Bəhram da eşitsin.

Bizans elçisi daxil olur.

B i z a n s e l ç i s i. Bizans hökmdarının hədiyyəsidir. Hökmdarımız dedi ki, babamın vəsiyyətinə əməl edib əsrimizin ən böyük sərkərdəsi Cavanşirə göndərirəm. (*Qılıncı Cavanşirə verir*)

C a v a n ş i r. And içirəm, dostlar, gün doğan ölkələrdə asayiş yaratmaq üçün bu qılıncı sədaqətlə oynadacağam.

Q a r t a l. Böyük sərkərdə, Suriyadan, Misirdən, Gürcüstandan da elçilər gəlmişdir.

C a v a n ş i r. Ah, Qartal... Afərin, mənim aslan cəngavərim. Sasanilərə qarşı necə inadla vuruşduğunu mənə söylədilər. Onlara da bir vaxt növbə yetişər. İndi isə əziz qonaqlara sarayın ən gözəl otaqlarını ayırın. Yeni tikilmiş binaları, yeni salınmış meyvə bağlarını, Girdman çayının üzərindəki yeni körpüləri onlara göstərin.

Q a r t a l. Baş üstə... (*Gedir*)

C a v a n ş i r. Elçin Suriyaya təhsil almağa gedəndə Ağvanın bədxahları bizə dodaq büzürdülər. Lakin yox, mən öz oğluma və bütün vətən övladlarına da Ərəstunu, Əflatunu, Homeri öz dilində oxudacağam. Dünyanın ən gözəl əsərləri Ağvan dilinə çevrilib tez bir zamanda kitab sarayını bəzəyəcəkdir.

S ö h r a b. Bundan gözəl fikir ola bilərmi?

C a v a n ş i r. İndi isə yollarımız məni düşündürür

S ö h r a b. Tacirlər üçün bu qədər əziyyət çəkməyin nə mənası var? Böyük hökmdar...

C a v a n ş i r. Yox, Söhrab, yox... Ticarət yolu ölkənin qan damarıdır. Mən istərdim ki, bu yollarla gedib-gələn ticarət karvanları indikindən yüz qat çox olsun. Unutma ki, Girdman ipəyini daşıyan hər bir karvan Misirdən, Bizansdan bizə daha qiymətli şeylər gətirir. Onlar uzaq ölkələrdən bura yeni fikir, yeni düşüncə, yeni elmlər gətirir.

S ö h r a b. Doğrudur, böyük hökmdar, çox çəkməz ki, sizin gözəl tədbirləriniz sayəsində Ağvan diyarı həqiqi bir cənnətə dönər... Lakin bütün bunlar bizdən min ətək qızıl tələb edir. Xəzinəmiz isə hələlik yoxsuldur.

C a v a n ş i r. Hanı mənim xəzinədarım? Mən qoca Saranı görmək istəyirəm...

S ö h r a b. O xain zindana salınmışdır...

C a v a n ş i r. Nə üçün? Onun günahı nədir?

S ö h r a b. Xəzinənin pullarını havaya sovurduğu üçün... Dövlətimizin gücünü azaltmaq istəyən hər bir xainlə belə rəftar edirəm.

C a v a n ş i r. Gedin onu mənim hüzuruma gətirin... Of, sinəmdən ağrı qopdu.

Z i b e y d ə. Gedək, Cavanşir, sən hələ yorğunsan... Gedək dincəl.

C a v a n ş i r. Hələ dayan, Zibeydə. Mən qocanın nə günah işlətdiyini öyrənməliyəm...

X i d m ə t ç i. Sasani sərkərdəsi Bəhram hüzurunuza gəlmək istəyir...

C a v a n ş i r. Kim Bəhram? O vəfasız?

E l ç i n. O öz səhvini anlayıb peşman olmuşdur, ata...

C a v a n ş i r. Oğlum, Elçin, səhv başqa, xəyanət başqa... Yox, mən onunla üz-üzə gəlmək istəmirəm...

Z i b e y d ə. Cavanşir, əzizim, Bəhrama nifrət bəsləməyə doğrudan da haqqın var. Çünki o, Ağvanın düşmənidir. Lakin sən onunla danışmalısan, sən onu dinləməlisən. Unutma ki, Bəhram böyük bir ölkənin elçisidir.

C a v a n ş i r. Yaxşı, mən bu barədə düşünərəm... (*Saranı gətirirlər*) Xoş gördük, Saran...

S a r a n. Cavanşir sərkərdəyə salam... Sevinc yaşları məni boğur, ömrümün son günlərində səni görməyə çox şadam... Boş xəzinədə oturmaqdansa, zindan küncündə çürümək yaxşıdır.

C a v a n ş i r. Mən nəyin yaman, yaxşı olduğunu soruşmuram. Günahın nədir?

S a r a n. Vəzirimiz Söhrab qala hasarları tikdirmək bəhanəsi ilə məndən qızıl istədi. Mən də verdim, indi isə xəzinəmiz boşdur.

S ö h r a b. Sən nə danışırsan, qoca? Qala nədir, hasar nədir?

S a r a n. Böyük hökmdar, göylərin müqəddəs günəşinə and içirəm ki, mənim dediklərimdə zərrə qədər yalan yoxdur.

S ö h r a b. Sərsəm qoca. Sən öz cinayətini hökmdarımızdan gizlədə bilməzsən... Yaxşısı budur ki, özün etiraf et.

S a r a n. Mənə indi üç addım qara torpaqdan başqa heç nə lazım deyil.
S ö h r a b. Sərsəm qoca...
C a v a n ş i r. Söhrab... Saran – xain? 50 ilin sadiq dostu – cani? Gedək, Saran, gedək... Bu dolaşıq düyünü mən özüm açaram...

Cavanşir, Saran və bütün kütlə gedir. Söhrab tək qalır.

S ö h r a b. Mənəm günahkar, o qocanı tez susdursaydım, indi onun göz yaşları Cavanşirin qəlbini ipək kimi yumşalmazdı. Mən Cavanşirin nəzərində yenə də özümü doğrulda bilərəm. Hələlik əlimdə fürsət vardır...

Q ə n i m ə t gəlir.

Q ə n i m ə t. Cavanşir gəldimi?
S ö h r a b. Hər ikimiz məhv olduq... Artıq heç bir şey bizi ölümdən xilas edə bilməz...
Q ə n i m ə t. Yenə nə fəlakət üz verdi?
S ö h r a b. Hanı qızıllar?
Q ə n i m ə t. Gətirmişəm...
S ö h r a b. Suss, yavaş, neçə dinar?
Q ə n i m ə t. Hələlik yüz min dinar...
S ö h r a b. Hardadır, bəs qalanı?
Q ə n i m ə t. Sənin evində, qalanını da bir neçə gündən sonra...
S ö h r a b. Xəncərin itidirmi?
Q ə n i m ə t. Bu sual nə üçündür?
S ö h r a b. Cavanşir otaqda təkdir... O dedi ki, yuxu cəngavərin dostudur. Lakin məncə yuxu cəngavərin ən böyük düşmənidir...
Q ə n i m ə t. Heç bir şey anlamıram...
S ö h r a b. Bundan gözəl fürsət ələ düşməz...
Q ə n i m ə t. Mən ona əl qaldıra bilmərəm...
S ö h r a b. O ölməsə, sən öləcəksən... Əziz bir dostum olduğun üçün xəbərdarlıq edirəm...
Q ə n i m ə t. Mən onun nəinki dirisinə, heç ölüsünə də yaxın düşə bilmərəm...
S ö h r a b. Onda özün bil, o bir az əvvəl dedi ki, Qəniməti gətirin, edam edin...
Q ə n i m ə t. Doğrudanmı?
S ö h r a b. Bax, o, yatağında uzanmışdır. Arxadan möhkəm bir zərbə kifayətdir... Bu fürsəti əldən buraxma... Bu ölüm yeganə xilas yoludur.

Qorxma... qorxma! Mənə inana bilərsən... (*Qənimət xəncərini çəkib içəri girir*) Aha, indi mən xilas oldum. Cavanşirin nəzərində yalnız bu yolla yüksələcəyəm. Qənimət isə öz əli ilə özünə ölüm qərarı yazdı...

Xəncər əlində qışqıraraq Qənimət geri dönür.

Q ə n i m ə t. Aman, Cavanşir oyaqmış...

S ö h r a b. Dayan... Dayan, at yerə xəncəri... (*Söhrab qılıncla Qənimətin xəncərini vurub salır*)

Cavanşir və saray adamları daxil olurlar.

C a v a n ş i r. Bu nə deməkdir, Söhrab?

S ö h r a b. Ehtiyatsız dolanırsınız, böyük hökmdar... Ehtiyatsız. Bir dəqiqə belə geciksəydim bu namərd bizi həmişəlik gözü yaşlı qoyacaqdı. Mən indi anladım ki, Sasanilərə hədiyyə aparan bu alçaq imiş...

C a v a n ş i r. Nə alıb satırsan, ipək, yoxsa vicdan...

Q ə n i m ə t. Mən... mən... Məni aldatdılar... yüz min dinar qızılım özgələrə qismət oldu, Söhrab, bütün xəyanətlərə bais sənsən...

S ö h r a b. Bu xəncər kimindir? Sual verirəm, bu xəncər kimindir?

C a v a n ş i r. Aparın, bu satqının boynunu öz xəncərilə vurun...

Q ə n i m ə t. O, xaindir, böyük hökmdar, onun vicdanı ilan zəhərindən də mənfurdur...

S ö h r a b. Sənin cinayətlərini ulu Tanrı özü də açsaydı, səndən yalnız bu sözləri eşidərdi.

C a v a n ş i r. Aparın...

Q ə n i m ə t. O, xaindir, o, xaindir... (*Qəniməti aparırlar*)

C a v a n ş i r. Onu buraya kim buraxmışdır?

N ö v b ə t ç i. Hökmdarı istəyirəm dedi, mən də vəzirin yanına göndərdim...

C a v a n ş i r. Söhrab, indi sən cavab ver, nə üçün o səni xain adlandırırdı?

S ö h r a b. Siz buna nə üçün təəccüb edirsiniz, böyük hökmdar? Sizə bəslədiyim sonsuz məhəbbəti düşmənlər xəyanət adlandırırsa, bu məni yalnız sevindirə bilər...

C a v a n ş i r. Bu sui-qəsddə sənin də əlin vardır...

S ö h r a b. Siz nə danışırsınız, böyük hökmdar...

C a v a n ş i r. Mənim ürəyimi aldatmaq, sən düşünən qədər asan deyildir.

S ö h r a b. Hökmdarın nifrəti mənim üçün ən böyük cəzadır. (*Xəncərlə özünü vurub yıxılır*)

C a v a n ş i r. Ölməmişdir. Tez həkim çağırın... Mənim sarayımda əqrəb gizlənmişdir.

A y b ə n i z (*gəlir*). Ah, Söhrab, əziz qardaşım, səni kim bu hala saldı, kim?

S a r a n. Heç kimdə günah yoxdur, qızım... O özü-özünü vurdu...

A y b ə n i z. Can qardaş, sən mənim üçün həm ata, həm anasan... Sənsiz mənim bir günüm olmasın...

C a v a n ş i r. Bəlkə mən yanılıram...

Həkimlər gəlirlər.

Z i b e y d ə. Mən əminəm ki, Söhrab sənə xain baxa bilməz. Onun atası Ağvan sarayına düz qırx il sədaqətlə vəzirlik etdi...

C a v a n ş i r. Xəzinəni dağıdan Söhrab deyildimi?

Z i b e y d ə. Xəzinənin qızıllarına xəyanət etsə də, sənə əl qaldırmağa cəsarət etməz...

C a v a n ş i r. Mənim fikrimi sapdırma, Zibeydə... Söhrab mənim gözlərimə düz baxa bilmirdi...

Z i b e y d ə. Ürəyini yoxla... İnsanın zahirinə baxıb aldananlar çox olur...

S ö h r a b. Mən ölürəm, hamınız bilin ki, mənim ürəyimdə böyük hökmdara qarşı məhəbbətdən başqa heç bir şey yoxdur. Böyük hökmdar, ölkəmizin çətin vəziyyətini nəzərə alaraq qızılları Sarandan alıb ehtiyatla saxladım. Qızıllar mənim evimdədir. Məni bağışla, böyük ata, bunların hamısı hökmdara qarşı bəslədiyim böyük məhəbbətdir...

C a v a n ş i r. O mütləq sağalacaqdır...

Hamı təlaş içində

P ə r d ə

## DOQQUZUNCU ŞƏKİL

Cavanşrin saray otaqlarından birinin həyəti. Elçin səhnəyə daxil olur və gedir. Zibeydə xatun və Aybəniz daxil olurlar.

Z i b e y d ə. Elçin burada yoxdur, qızım... Mən onu nahaq yerə gözdən qoyuram... Elçin yoxdur...

A y b ə n i z. O həmişə yalqız gəzir... At çapıb, qılınc oynatmaqdan zövq alır, Zibeydə xatun, elə bil başqa sənət tapmır...

Z i b e y d ə. Görəsən dünyada anadan çox əziyyət çəkən bir insan varmı? Elçin məni qocaltdı, qızım? 3 il yolunu gözlədim... İndi də ki, özün görürsən...

A y b ə n i z. Qardaşım Söhraba deyərəm, Elçinə öyüd verər... Elçin Söhrabın xətrini çox istəyir...

Z i b e y d ə. Mən də ona tapşıracağam... Qızım, Aybəniz, o səni gördümü? Aranızda söz-söhbət olmadı ki?

A y b ə n i z. O məndən həmişə uzaq gəzir. Söhrab deyir ki, yox, yox, bəlkə bu sirri açmaq olmaz...

Z i b e y d ə. Qorxma, qızım, söylə...Oğulun sirrini heç kim anasından möhkəm saxlaya bilməz...

A y b ə n i z. Söhrab deyir ki, Elçin Sasani sərkərdəsi Bəhramın qızını sevir...

Z i b e y d ə. Sevir?..

A y b ə n i z. Elçin Reyhanın vurğunudur... Mən onların məhəbbətinə mane olmaq istəmirəm... (*Aybəniz gedir*)

E l ç i n (*gəlir*). Yox, anacan, mən Aybənizə könül verməzəm...

Z i b e y d ə. Bu nədir, Elçin? Sən gizli söhbətə qulaq asırsan?

C a v a n ş i r. Qulaq asmasam da bilirəm. Ana, mən Aybənizi sevməmişəm, mən onun xəyalı ilə yaşamamışam...

Z i b e y d ə. Mən isə anayam... Əgər mən təkcə öz səadətimi düşünsəydim...

E l ç i n. Sözlərim qəlbinə toxundusa, üzr istəyirəm, ana. Lakin mənim də könlümü dinlə. Sən, mehriban ana, ürəyimin fəryadını eşitməsən öz əlinlə mənə ölüm qərarı yazacaqsan... Mən Kayan gözəlini sevirəm... İnan ki, sən onu görsəydin, qadın ola-ola özün ona vurulardın...

Z i b e y d ə. Doğrudanmı? Sən o nazənini bu qədər sevirsən?

E l ç i n. Anacan, Reyhanın ala gözləri, qumral saçları, şümşad kimi dümdüz qaməti, hələ nəğmə oxuyarkən titrəyən səsi... Of, görəsən dünyada məndən də xoşbəxt bir sevgili varmı?

Z i b e y d ə. Bilirəm... Dünən gecədən bəri səni evdən didərgin salan da odur. Reyhanın atası öz ayağı ilə bizə qonaq gəlmişdir. Bu bizim üçün ən böyük səadət deyilmi? Daha bəsdir, görünür sən indidən ananın hər sözünə yox deyəcəksən... Özün bil, amma yadında saxla. Bəzən göyçək qızların ürəyi külək kimi hər səmtə əsər.

E l ç i n. Of... Anacan, Reyhan göydən yerə enmiş məsum bir mələkdir. Ona belə sözləri necə qıyırsan?

Z i b e y d ə. Yaxşı, sən deyən olsun... Razıyam. Bilmirəm Aybənizin göz yaşlarına dözməyə daş ürəyi mən haradan alım.

E l ç i n. Bəs mənim ürəyim? Bəs mənim eşqim, bəs mənim andım?

Z i b e y d ə. Sən atanın qəzəbindən qorxmursanmı? O buna razı olmazsa?

E l ç i n. Anacan, mənim bütün ümidlərim sənədir... Reyhan məni hər səhər, hər axşam gözləyəcək... Əgər Elçinin ölümünü istəmirsənsə...

Z i b e y d ə. Bəsdir, oğlum... Görürəm sən inadından dönməyəcəksən... Gedək Firuzəabada. Mən bir yol tapıb onu – Reyhanı yanıma çağırtdıraram... Özüm onunla danışaram...

Gedirlər.

S ö h r a b. Aha, ala gözlü sona yuvasından uçmamış xoşbəxt ovçunun oxuna hədəf oldu. Bəs mən kiməm, dünyanın ən bədbəxt bir ovçusuyam? Yox, mən ömrümü sarayların nökərçiliyində çürüdən bir qul deyiləm! Yox, Söhrab, tale sənə əmr edir... Fürsəti buraxma. Şöhrət Elçindədirsə, qüvvət səndədir. Reyhan sənin alnına yazılmışdır! Bacım Aybənizin ülvi məhəbbətini tapdalayan məğrur Elçindən intiqam almalısan...

P ə r d ə

## ONUNCU ŞƏKİL

Cavanşirin sarayı

S ö h r a b. Hökmdar...

C a v a n ş i r. Mən öz qərarımı bildirirəm. Sasani qoşunlarının sərkərdəsi Bəhrama rədd cavabı verilsin...

Q a r t a l. Namərdlərə bundan gözəl cavab ola bilməz.

C a v a n ş i r. Dost kimi gələn elçilərə isə yalnız bir cavabım var. Dostluq arzusunda olan hər kəs mənim sədaqətimə əmin ola bilər.

S a r a n. Böyük hökmdar düşmən də olsa, siz öz nəzakətinizi Bəhramdan əsirgəməyin...

C a v a n ş i r. Fikrini açıq söylə, Saran...

S a r a n. Sənin qərarın mənə bəllidir, böyük hökmdar. Bu dünya görmüş qocanın məsləhətini dinləmək istəyirsənsə, Kayan elçisini hörmətlə yola sal...

C a v a n ş i r. Mənim iradəmlə oynayanlar məndən aman gözləməsinlər.

Z i b e y d ə xatun gəlir.

Z i b e y d ə. Bəhram səninlə görüşməmiş qayıdır... Cavanşir, adına-sanına ləkə vurma... Qoy düşmən belə, sənin alicənablığını görsün, öz qəbahətindən utanıb yerə girsin...

C a v a n ş i r. Bəhramdan heç bir alicənablıq gözləmirəm, lakin çağır onu...

F ə r i d. Bu saat... (*Gedir*)

C a v a n ş i r. Hamınıza xəbərdarlıq edirəm. Sizin aranızda Kayan dövləti ilə ittifaq bağlamaq arzusunda olan varsa, qoy onlar özünü aldatsın, namərd körpüsündən keçən özü də namərddir...

B ə h r a m, P o l a d, K a b u s və q a s i d daxil olurlar.

B ə h r a m. Mən bura – Girdmana dost kimi gəlmişdim. Lakin məni düşmən kimi yola salırlar. Belə rəftarın səbəbi mənə bəlli deyildir...

C a v a n ş i r. Möhtərəm elçi, Kayan tacidarına söylədiniz ki, mənim qılınca, mərdliyə arxalanan bir ölkəm vardır. Onu yer üzündən silmək istəyənlərə də qılıncla cavab veriləcəkdir...

B ə h r a m. Mehriban bir dost kimi əl-ələ vermək mümkün ikən, qılıncla danışmağa ehtiyac yoxdur, Cavanşir...

C a v a n ş i r. Mən müqəddəs Ağvanın göylərə baş vuran uca dağlarını bu vaxtadək düşmənlərin quduz hücumundan qorumuşam. İndi isə namərd dostlardan qoruyacağam...

B ə h r a m. Ulu hökmdarımız ərəblərə qarşı səninlə ittifaq bağlamaq arzusundadır.

C a v a n ş i r. Bu ittifaqın məqsədini bilmək olmazmı?

B ə h r a m. Məqsəd düşmənə qarşı birgə müharibə...

C a v a n ş i r. Ərəb sərkərdəsinə sülh təklifi aparmışsınızmı?

B ə h r a m. Düşmənə silah təklifi etmək qorxaqlıqdır.

C a v a n ş i r. Daim müharibə xəyalı ilə yaşamaq isə sərsəmlikdir.

B ə h r a m. Biz yenə dost ola bilərik, Cavanşir...

C a v a n ş i r. Xəyanətini unutdunmu? Möhtərəm elçi?

B ə h r a m. İnsanın həyatında səhv ola bilər... İnan ki, Cavanşir, ürəyim həmişə səninlə olmuşdur. Muğan torpağını xarabaya döndərən qəsbkarlardan səni qorumaq üçün işlətdiyim bu müvəqqəti siyasət bizim qardaşlıq məhəbbətimizə mane ola bilməz...

C a v a n ş i r. Hanı Qartal?

Q a r t a l. Burdayam, ulu hökmdar...

C a v a n ş i r. Muğan şəhərində qurulmuş dar ağaclarından asılan kimlər idi?

Q a r t a l. Kayan qoşunlarının əsir tutduqları Ağvan cəngavərləri...

C a v a n ş i r. Eşidirsənmi, möhtərəm elçi? Sədaqətdən dəm vurarkən vicdan ağrısı duyursanmı?

B ə h r a m. Mən ömrüm boyu bu cinayətlərimi lənətlərlə yad edəcəyəm. Namusuma and içirəm ki, bu ləkəni öz qanımla yumağa hazıram...

E l ç i n. Atacan, əgər ürəkləriniz bir-birinə yaxınsa, Ağvan dağları heç bir vaxt bizim aramızda səth ola bilməz. Barış, atacan... Qoy sizi ülvi bir məhəbbət birləşdirsin...

C a v a n ş i r. Elçin, əziz balam... Mən Sasanilərlə əbədi dost olmaq fikrində idim. Lakin namərdlər xalqımızın boğazına əsarət zənciri keçirdilər. Qəsbkarların bizdən məhəbbət ummağa heç bir haqqı yoxdur. Əgər biz Kür-Araz sahillərində əzəmətli dövlətimizi yenə bərpa etməsək, bütün el-oba bizə lənət oxumazmı? Sən isə, möhtərəm elçi, hökmdarına bildir ki, mənə göndərdiyin o hədiyyələr Ağvan igidlərinin qanına boyanmışdır. Mən o igidlərin qatillərindən amansız bir qisas almamış bir an belə rahat ola bilməyəcəyəm.

Cavanşir və saray adamları gedirlər. Səhnədə Bəhram, Polad, qasid, Kabus və Saran qalır. Saran gedərkən

Q a s i d. Qoca, qızıllar da, cavahirat da əldən çıxır. Sən Cavanşiri yola gətir...

S a r a n. Möhtərəm elçi, get sən xaini başqa yerdə axtar. Mən xəzinədaram, amma qızılı da, cavahiratı da elimin namusundan üstün tutmaram... Get...

Saran gedir

B ə h r a m. Artıq sülh danışıqlarının mənası qalmadı. Muğan torpağında qurduğum dar ağacları çox azdır. İndi də Girdman üzərinə qoşun çəkəcəyəm... Hanı Söhrab? Onun qəlbini gəmirən şöhrət qurdu indi mənə gərək oldu...

P o l a d. Böyük sərkərdə, məni əfv edin... Onun əsgəri azdırsa da, bizə qarşı kini çox böyükdür...

B ə h r a m. Lakin kin ordu deyildir...

P o l a d. Cavanşirin qəzəbi artdıqca hər bir cəngavəri bir orduya bərabər olur.

B ə h r a m. Demək Cavanşir səni qorxudur...

P o l a d. Mən əsil həqiqəti söylərkən, özümün qorxduğuma işarə etmək fikrində deyiləm. Mən deyirəm ki, bu böyük kinə qarşı vuruşmaq mənasızdır...

B ə h r a m. Kindən də qüvvətli bir ordu vardır...

P o l a d. O nədir?

B ə h r a m. Hiylə... Qoy Cavanşir öz qılıncını itiləsin. Mənsə onu hiylə toruna salıb məhv edəcəyəm... Çağırın Söhrabı, o məndən köməyini əsirgəməz. Onun qəlbini gəmirən şöhrət qurdu indi mənə gərək oldu...

P o l a d. Söhrab ağılsız deyil... O indi Cavanşirdən qorxub bizə kömək verməz...

B ə h r a m. Sən insanları hələ tanımırsan... Ehtiras quduz bir canavardır, ehtiras ən ağıllı insanları belə, məhrum bir quzu kimi parçalaya bilər...

Söhrab gəlir.

S ö h r a b. Sözlərimə inanın, böyük sərkərdə, onu bilin ki, Cavanşirin məhəbbəti dilimdə, sənin məhəbbətin isə ürəyimdədir... Siz hər zaman mənim sədaqətimə əmin ola bilərsiniz...

B ə h r a m. Elə isə gedək... Qoy Kayan hökmdarı mənə daha qüvvətli bir ordu versin. Mən Cavanşirlə yalnız vuruş meydanında danışacağam...

S ö h r a b. Uğurlu yol... Əgər Cavanşirin qollarındakı gücü bir heç məqamına endirmək istəyirsənsə, sizə daha yeni bir xəbər verə bilərəm...

B ə h r a m. O nədir, Söhrab?

Aybəniz daxil olur, onların söhbətini eşidib gizlənir və qulaq asır.

S ö h r a b. Bu gün Cavanşirin o gözəl qadını Zibeydə xatun oğlu Elçinlə Firuzəabada gedir. O, sizin ciyərparənizlə çox gizli bir mətləb barəsində danışmaq fikrindədir...

B ə h r a m. Mənim ciyərparəmlə?.. Gizli bir mətləb barəsində?

S ö h r a b. Bəli... Bəli, onları yolda tutub əsir apara bilsəydiniz. Bu, gələcək qələbənin yarısı deməkdir. Uğurlu yol... Söhrabı unutmayın... Zaman gələr Kayan tacidarı özü də məndən təşəkkürünü əsirgəməz.

Bəhram, Polad, qasid və Kabus gedirlər, Aybəniz daxil olur.

A y b ə n i z. Sən nə elədin, Söhrab... Nə üçün vicdanına silinməz bir ləkə vurdun...

S ö h r a b. Aybəniz... Ləkə nədir?

A y b ə n i z. Bütün elin, obanın nifrətindən qorxmursanmı? Qardaşım, Cavanşirə xəyanət nə böyük nankorluqdur.

S ö h r a b. Suss... Suss... Sən hansı xəyanətdən danışırsan? Burax sərsəmliyi...

A y b ə n i z. Mən Bəhramla sənin söhbətini başdan ayağa dinlədin... Bu fikirdən əl çək, qardaşım... Böyük hökmdarımız bu əhvalatdan xəbər tutsa... Səni bir an belə sağ qoymaz... Yalvarıram sənə, get özün ona xəbər ver ki, düşmənlər Zibeydə xatunu hiylə toruna salmaq istəyirlər. Qoy onu Firuzəabada göndərməsin...

S ö h r a b. Sənin ağlın başında deyil, nədir? Heç nələr sayıqladığını bilirsənmi?

A y b ə n i z. Sən deməsən də, mən deyəcəyəm...

S ö h r a b. Dilini dibindən kəsərəm...

A y b ə n i z. Kəs... Aman...

S ö h r a b. Cınqırını çəksən...

A y b ə n iz. Ən uzağı ölümdür... Ölümdən qorxan səndən də namərddir... Ah...

Söhrab Aybənizi xəncərlə vurub öldürür.

S ö h r a b. Ah... Mən nə etdim... Demək, Elçin onun məhəbbətini rədd etdiyi üçün öz-özünü vurdu... Ah, əziz bacım. Fəlakət... Fəlakət...

C a v a n ş i r və bütün s a r a y a d a m l a r ı daxil olurlar

C a v a n ş i r. Bu nədir?.. Bu nə dəhşətdir?

S ö h r a b. Böyük ata... Mənim bacım, ata-ananın yeganə yadigarı, Elçinin rədd cavabından sonra özünü həlak etdi.

C a v a n ş i r. Mənim oğlum Elçin...

P ə r d ə

## ON BİRİNCİ ŞƏKİL

Cavanşirin sarayı, Qılınc daxil olur.

Q ı l ı n c. Mənim əziz hökmdarım, biz sənin əmrinlə Kayan tacidarının hüzuruna getdik... Bütün tələblərini ona yetirdik. Dedi ki, əgər əsgərlərinizin nahaq qanına bais olmaq istəmirsinizsə, tezliklə Muğandan geri çəkilməlisiniz, Ağvana dəymiş bütün ziyanları ödəməlisiniz. Lakin Kayan tacidarı bizim təkliflərimizdən qəzəbləndi... Rədd cavabı verdi.

C a v a n ş i r. Rədd cavabı?

Q ı l ı n c. Bəli, hökmdar, rədd cavabı... Hətta məni də, dostlarımı da dar ağacı ilə hədələdi... Axır sözündə yalnız bunu söylədi ki, Cavanşir xam xəyala qapılmasın. Bundan sonra Ağvan diyarı Kayan hökmdarlığına xərac verən bir əyalət olaraq qalacaqdır. Doğrusu bu sözləri eşidərkən qan beynimə vurdu. Ürəyim kin və qəzəb ilə alışıb yandı. Cavabında dedim ki, Ağvan cəngavərləri mərdliklə ölməyi ana torpağının əsarətindən min qat üstün tutur.

C a v a n ş i r. Afərin, mənim qəhrəman şairim, mən səndən həmişə belə mərd cavablar eşitməyə alışmışam. İnsanın səbri tükənməz deyil... İndi bizim ancaq bir yolumuz qaldı. Muğan diyarını yadların tapdağından bu odlu qılınclarımız xilas edəcəkdir.

F ə r i d (*gəlir*). Böyük hökmdar, sənin tapşırığınla Ağvan kübarlarını, tacirlərini, ipək karxanaçılarını çağırmışam... Hamısı əmrinizi gözləyir.

C a v a n ş i r. Çox gözəl, Fərid... Onlarla mən özüm danışacağam. Gəlsinlər... (*Kübarlar, tacirlər, ipək karxanaçıları daxil olurlar*) Əyləşin... Əyləşin... Sizi nə məqsədlə çağırtdırdığımı yəqin ki, bilirsiniz. Dövlətimiz elin gücünə arxalanır. Vətənin ağır günlərində siz Ağvan qoşunlarından köməyinizi əsirgəməməlisiniz. Mən sizdən cavab gözləyirəm... Sən söylə.

D ə m i r d a ş. Mən bütün var-yoxumdan keçməyə hazıram. Ancaq çox təəssüf ki, Muğana getmiş dəvə karvanımızı Bəhram tutub saxlamışdır.

C a v a n ş i r. Muğan tezliklə Sasanilərin əsarətindən xilas ediləcəkdir. Ümidvaram ki, karvan tezliklə qayıdacaqdır.

D ə m i r d a ş. Əgər qayıtsa, dəvələri də, qazandığı pulları da sənə bağışlayıram.

S a r a n. Bu nisyə oldu. Nəğd nə verə bilərsən?

D ə m i r d a ş. Evim bomboşdur. Özgə heç nəyə ümidim gəlmir.

S ö h r a b. Yalan demə kişi, neyçün bizi aldadırsan... Sən sərvətini Cavanşirdən gizlədib, əl altından Sasanilərə kömək vermək istəyirsən...

C a v a n ş i r. Dayan Söhrab, qoy o fikirləşsin... Hamını xəyanətdə təqsirləndirmək lazım deyil... İndi sən cavab ver.

A l o v. Mən qızıl verə bilmərəm... Üç sürü qoyunumu cəngavərlərə bağışlayıram... Oğlum Fəridi də sənin yolunda ölümə yollayıram...

S a r a n. Qızıl lazımdır, qızıl. Qoyunu xəzinədə saxlamaq olmaz...

A l o v. Qoyunu qızıla dəyişmək asandır...

C a v a n ş i r. Oğlun Fərid bütün vuruşmalarda əsil igid olduğunu sübut etmişdir...

A l o v. Öz hesabıma beş yüz təzə qılınc, bir qədər də qalxan tədarük etmişəm. Oğlum Fəridin dəstəsinə beş yüz at vermişəm. Mümkün edə bilsəm yenə qılınc hazırladaram...

C a v a n ş i r. Mənim adımdan qılınc ustalarına salam söylə.

A l o v. Çox sağ ol, böyük hökmdar... Onlar gecə-gündüz əlləşib cəngavərlərə kömək edəcəklər.

C a v a n ş i r. İndi sizdən cavab gözləyirəm...

K a r x a n a  s a h i b i. Doğrusu mən özüm də kömək verərdim... Amma iş burasındadır ki... Əslinə baxsan...

C a v a n ş i r. Yaxşı... Yaxşı, əgər ürəyinizdə məhəbbət əvəzinə qara yellər əsirsə, mənim sizə deyiləcək heç bir sözüm yoxdur... Sən nə üçün danışmırsan, Qızıltac?

Q ı z ı l t a c. Mən hökmdarın xəzinəsinə həmişə qızıl vermişəm. İndi isə...

S ö h r a b. Məni əfv edin, hökmdar... Qızıltac belə ağır günlərdə həmişə yaxasını kənara çəkir. Heç utanırsanmı? Son dəfə xəzinəyə nə vaxt qızıl vermişsən?

S a r a n. Sənin rəhmətlik atan vəzir olanda...

S ö h r a b. Tamaşa edin, tamaşa edin... O vaxtdan ən azı 7 il keçir... Bəs indi, bu xəyanət deyil də nədir?

C a v a n ş i r. Cavab ver, Qızıltac...

Q ı z ı l t a c. Mən axı...

C a v a n ş i r. Aydındır... Bir az dərindən düşünün, ağalar... Unutmayın ki, sizin dəvə karvanlarınıza yol açan, dövlətinizin keşiyində duran Ağvan cəngavərləridir... Ona verdiyiniz bugünkü cavabdan bir

az sonra özünüz utanacaqsınız... Siz öz sərvətinizi düşünürsünüz. Lakin yadların zülmü altında inləyən qan qardaşlarınızın taleyini isə düşünmürsünüz. Gedin, mənim əmrimi gözləyin...

X i d m ə t ç i. Bu xatunun sizə sözü var, böyük hökmdar...

G ü n ə ş a n a və i k i q ı z ı daxil olurlar.

C a v a n ş i r. Buyursunlar.

C ü n ə ş a n a. Mən tacir Altuntacın zövcəsiyəm. Bunlar da mənim oğlanlarımdır... Hökmdarımıza iki hədiyyə gətirmişəm... Bu sandıqda yüz min dinar bahasında daş-qaş, cavahirat vardır.

S a r a n. Yüz min dinar...

S ö h r a b. Afərin, Günəş ana... Afərin...

G ü n ə ş a n a. Ərimdən mənə miras qalmışdır... Dedilər ki, Cavanşir Muğanı yadlardan qurtarmağa gedir. Böyük sərkərdə, məndən bu hədiyyələri qəbul et. Müqəddəs günəş qollarına qüvvət versin. Vuran əllərin titrəməsin, oğlanlarımı da sənə cəngavər verirəm. Onlar vuruşmada aman bilməyəcəklər.

C a v a n ş i r. Bahar günəşinə and içirəm ki, mən onları da öz balam kimi sevəcəyəm...

G ü n ə ş a n a. Ərimi Sasanilər tikə-tikə doğradılar. Sən indi mənim də intiqamımı almağa gedirsən... İzn ver o müqəddəs qılıncdan öpüm...

C a v a n ş i r. Ağvan analarının xeyir-duası mənimlədir. Lakin siz... Siz bu qadına baxın və utanın... Siz hələ uşaqsınız, övladlarım...

F ə r i d. Mən bilən gərək Altuntacın oğlu yoxdur, xala. Böyük hökmdar, and içirəm ki, bu gənclər Altuntacın qızlarıdır.

C a v a n ş i r. Doğrudanmı?

G ü n ə ş a n a. Qorxub qaçsalar mən onlara aman verməræm.

C a v a n ş i r. İnanıram, Günəş ana. Lakin mən bu körpələri müharibə meydanına apara bilmərəm...

Q ı v r ı m t e l. Nə üçün, böyük ata? Biz at çapmağı da, qılınc oynatmağı da bacarırıq. Bizim yalnız bircə diləyimiz var. Vətənimizin yaşıl zəmiləri düşmən atlarının ayaqları altında tapdalanmasın... Analarımız övlad dağı görməsin... Namusumuza ləkə toxunmasın... İntiqam... İntiqam...

C a v a n ş i r. Bu cəsur aslanlardan utanırsınızmı?

P ə r d ə

## ON İKİNCİ ŞƏKİL

Cavanşirin sarayı. Ordu başçıları və məsləhətçilər Cavanşirin başına toplaşmışlar. Cavanşir xəritədə nə isə göstərir, hamının diqqəti ondadır.

C a v a n ş i r. Demək sabah gün doğmamış biz yolda olmalıyıq.

S ö h r a b. Məni əfv edin, böyük hökmdar... Biz bir qədər səbr edib daha yaxşı hazırlaşa bilmərikmi? Kayan sərkərdəsi Bəhramın qoşunu bizimkindən üç dəfə çoxdur.

Q ı l ı n c. Cananvar sürüsünə bir aslan kifayətdir.

C a v a n ş i r. Cəngavər Ozan doğru deyir. Düşmənin sayı heç də qorxulu deyil. Ağvan cəngavərlərinin hər biri bir ordudur... Qartal, nə olmuşdur?.. Sən nə üçün kədərlisən?

Q a r t a l. Mən ən müdhiş müharibələrdən belə qorxmuram. Mən Ağvan üçün, əziz anamın namusunu qorumaq üçün doğulmuşam... Amma indi ürəyim yaralıdır.

C a v a n ş i r. Nə olmuşdur, söylə...

Q a r t a l. Bizansa gedən dəvə karvanları hələ qayıtmamışdır. Böyük sərkərdə, Bəhram onları tutub əsir aparmışdır. Kim bilir, bəlkə də biz şəhəri alana kimi onları edam edəcəkdir...

C a v a n ş i r. Qurbansız qələbə yoxdur, Qartal.

Q a r t a l. Lakin mən hər şeydən əvvəl namuslu bir atanın oğluyam... Mənim atam o karvanın sarvanıdır...

C a v a n ş i r. Aha... Bu heç yaxşı olmadı...

S ö h r a b. Məncə gözləmək yaxşıdır... Biz onlar gəlib çıxandan sonra hücuma başlarıq...

C a v a n ş i r. Yox... yox... hücum sübh tezdən başlanacaqdır. Nə bir gün tez, nə bir gün gec...

Q ı l ı n c. Müharibədə hər bir dəqiqənin öz hökmü vardır. Hücumu vaxtında başlamaq, qələbənin yarısını əldə etmək deməkdir...

Q a r t a l. İzn versəniz mən öz tədbirlərimi söylərəm.

C a v a n ş i r. Söylə, Qartal...

Q a r t a l. Mənim süvarilərimə özgə bir adam başçılıq etsin, mən gecə ikən Muğan şəhərinə basqın edib əsirlər Bəhramın pəncəsindən qurtarım...

F ə r i d. Bu çox gözəl fikirdir...

S ö h r a b. Mən də Qartalın cəsarətinə inanıram...

F ə r i d. Lakin hücum gözlənilmədən, çevik və ildırım sürətilə edilməlidir.

S ö h r a b. Əvvəlcədən Bəhram xəbər tutmazsa, şəksiz sən qələbə çalarsan...

S ə s l ə r. Doğrudur... Doğrudur...

Q a r t a l. Böyük sərkərdə, sizdən cavab gözləyirəm...

C a v a n ş i r. Yox, Qartal... Bu tədbir yaramaz. Hücum zamanı cəsarət azdır. Düşmənin gücünü nəzərdən qaçırmaq olmaz. Bir də Girdmanın özündə düşmən casusu olmadığını haradan bilirsən?

Q a r t a l. Elə isə, öz əmrinizi söyləyin, böyük sərkərdə...

C a v a n ş i r. Sənin atlıların Ceyran düzündən hücuma keçib bir neçə əsir tutsun. Bu şərtlə ki, ordu başçılarından birini də ələ keçirtsin. Bax burda hücum həm sürətli, həm də gözlənilmədən olsun. Aydındırmı? Yenə təkrar edirəm... Ceyran düzündən...

Q a r t a l. Çox gözəl... Sonra?

C a v a n ş i r. Sonra Bəhrama elçi göndər, qoy bu elçi sənin adından düşmənə bildirsin ki, əgər bizim karvanla getmiş adamlardan birinin başına bir iş gəlsə, tutulmuş əsirlərin hamısı qılıncdan keçiriləcəkdir. O, tacirlərin qızıllarını mənimsəsə də, özlərini sağ-salamat buraxmağa məcbur olacaqdır... Aydındırmı?..

Q a r t a l. Of... Elə bil üstümdən böyük bir dağ götürüldü...

S ö h r a b. Ancaq nədənsə mənim ürəyim yenə də rahat olmadı...

C a v a n ş i r. Fikrini açıq söylə, Söhrab...

S ö h r a b. Əgər düşmən bu tədbirlərimizdən xəbər tutarsa...

Q ı l ı n c. İnsanın dili yalnız fikir söyləmək üçün deyil... Həm də bu fikri gizlətmək üçündür...

S ö h r a b. Məncə sən yalnız şerini deyib müharibə məsələlərinə qarışmasan biz daha çox qazanarıq...

Q ı l ı n c. Unutma ki, mən şerimi öz qılıncımla yazıram...

C a v a n ş i r. Qılınc haqlıdır, Söhrab, qoy bütün sirlərimiz burada, bu dilsiz divarlar arasında qalsın...

S ö h r a b (*öz-özünə*). Yox, qalmayacaqdır... Bu xəbəri Bəhrama yetirmək mənim borcumdur... Ah... Böyük hökmdar... Böyük hökmdar...

Elçin yaralı halda çox ölgün daxil olur.

C a v a n ş i r. Nə olmuşdur?

E l ç i n. Ah, atacan, fəlakət, bu dərdə dözmək üçün insanın ürəyi gərək daşdan, dəmirdən olsun...

C a v a n ş i r. Söylə, oğlum, söylə...

E l ç i n. Biz hələ Firuzabada çatmamış böyük xiyabandan keçərkən heç gözlənilmədən birbaş üstümüzə saysız-hesabsız Kayan əsgəri bulud kimi axdı. Düşmən anamı, karvanı, bütün keşikçilərimizi də üzük qaşı kimi ortaya aldı...

S ö h r a b. Ah... Hiyləgər xain...

E l ç i n. Bir də gördüm ki, anam qılınc çəkib qızmış aslan kimi vuruşa atıldı... Mən də qılınca sarıldım... İrəliyə doğru şığıdım... Bilmirəm necə baş bədəndən ayrıldı. Lakin heyhat, çox çəkmədi ki, mən ağır bir zərbədən şüurumu itirib yıxıldım... Gözümü açanda hər tərəfdə zülmət kimi qaranlıq, qorxunc bir sükut gördüm... Anamı, dostlarımı harayladım. Ancaq mənim səsimi eşidən, mənə hay verən olmadı. Ölənlər arasında anamı axtardım. Tapa bilmədim... Ah, atacan, mən gördüklərimə hələ də inana bilmirəm... Bəlkə də bunlar müdhiş bir röyadır...

F ə r i d. Aha... Vəfadan dəm vuran namərd Bəhram...

E l ç i n. Mənim əziz hökmdarım, düşmən bu hiyləyə yalnız bir məqsədlə əl ata bilər. O bizi sarsıtmaq, yanlış hərəkətə məcbur etmək istəyir... Lakin Bəhram öz canını belə qurtarmaq istəsə, qoy əmin olsun. Odlu qılıncımızın hər zərbəsindən qopan qəzəb alovları namus oğrusunu yandıracaqdır.

Q a r t a l. İzin ver, hökmdar, elə bu gecə mən öz dəstəmlə Muğana hücum çəkim... Anamız Zibeydə xatunu düşmənin pəncəsindən qurtarım. Mən and içirəm, dostlar, anamız Zibeydə xatun naminə, namus naminə, şərəf naminə son damla qanımı belə əsirgəsəm mənə ar olsun.

F ə r i d. Böyük hökmdar, şərəfli ölüm səadət qapılarının açarıdır. Anamız Zibeydə xatun üçün mən də ölümə hazıram... İzin ver mən də hücuma keçim...

H a m ı. İzin ver, böyük sərkərdə...

C a v a n ş i r. Yox, övladlarım. Qartal, sən dediyim kimi gecə ikən hücuma keçərsən... Ceyran düzündən. Aydındırmı? Yenə təkrar edirəm... Qoy sirlərimiz bu divarlar arasında qalsın. Hücuma dediyim kimi hamımız birdən, sabah alatorandan başlayarıq... Nə tez, nə də gec...

P ə r d ə

## ON ÜÇÜNCÜ ŞƏKİL

Bəhramın sarayında Reyhanın otağı, Reyhan və Qaratel çox qəmgindirlər. Qaratel udda çalır və oxuyur.

Q a r a t e l

Ay bu dağların Reyhanı,
Bəs sənin yarın de hanı?
Gözləri yolda qalan yar,
Yar həsrətilə solan yar.

Mənim sevdiyim yar gələr,
Könlüm onunla dincələr.
Qonaq gələndə bizə yar.
Güllər-çiçəklər açılar.

Mahnı oxunanda mənim könlüm həmişə sınıq bir ney kimi inildəyir. Sən nə üçün belə kədərlisən?

R e y h a n. Bax, ay da doğur, amma o hələ də gəlib çıxmadı... Hər gün, hər gecə gözlə dedi... Məni intizar oduna yandırdı. Bax, budur, gözləyirəm... O isə gəlmir...

Q a r a t e l. Hamı yatır, hər tərəf səssizlik içində boğulur.

R e y h a n. O nə üçün gəlməsin? O, əhdi-peymanını unuda bilərmi?

Q a r a t e l. Kim bilir, bəlkə də bir fəlakət üz vermişdir.

R e y h a n. Yox... Yox, Qaratel, Elçinə bir şey olsa, mən özümü Arazın dalğalarına ataram...

Q a r a t e l. Ah... Reyhan, əzizim, bu fikirləri başından çıxart. Oğlan üçün özünü öldürən qızlara mən heç ağıllı deməndən... O olmasın, bir başqası olsun... Nə çoxdur gözəl qamətli oğlanlar. Mən birini sevirdim, xasiyyətini bəyənmədim, dedim bir daha gözümə görünmə. İndi bir başaqasını sevirəm... O da xoşuma gəlməsə, üçüncü bir namizədim var... Oğlan nədir ki, onun üçün özümü öldürüm...

R e y h a n. Sən nə danışırsan, əzizim. Mən ona vəfasızlıq edə bilərəmmi? Yox, Qaratel, yox... Vəfalı ürəklər yalnız bir dəfə, yalnız birini sevə bilər...

Q a r a t e l. Yalnız birini? Bu nə sözdür? Sevgi iştahadır. Gündə bir növ xörək istəyir. Mən öz iştahamı küsdürə bilmərəm...

R e y h a n. O gəlmədi...

Q a r a t e l. Axı, onlar birdən gəlməsə...

R e y h a n. Sən nəyi isə məndən gizlədirsən... Söylə görüm ürəyini belə rahatsız edən nədir?

Q a r a t e l. Heç... heç...

R e y h a n. Səni and verirəm ulu göylərə, əgər bir şey bilirsənsə, məndən gizlətmə... Onsuz da mənim taleyim küskündür...

Q a r a t e l. İnan ki, bu xəbəri eşidəndə elə bil ürəyim yerindən qopdu... Mən səhərdən bəri hər şeyi səndən gizlədirdim... Atanla anan mənə tapşırıblar ki, sənə bir kəlmə deməyim...

R e y h a n. Aman Allah, yoxsa Elçinin başında bir bəla var...

Q a r a t e l. Yox, mənim ondan xəbərim yoxdur... Sərkərdə Cavanşirin atlıları üstümüzə axışıb gəlir. Bu saat o yanlarda bərk vuruşmadır. Atan bütün əsgərlərini davaya göndərdi. Dedi, ölərəm, bir addım geri çəkilmərəm...

R e y h a n. Demək hər şey... Hər şey alt-üst oldu... Nə üçün? Yer üzü insan qanı ilə ləkələnməsəydi nə olardı? Elçin... Elçin, indi sən nə qədər uzaqdasan... Yox, o gələcək... mütləq gələcək. Bax elə bil bu anda mən onun xəfif təbəssümünü, məhəbbətlə titrəyən dodaqlarını görürəm. O gələcək. Qaratel, o mənim bu kimsəsiz könlümü sevindirəcək.

Q a r a t e l. İndi nizələr, qılınclar yer üzünü qara bir bulud kimi sarmışdır. Oralarda insan canavardan belə yırtıcıdır. Onları yarıb keçməyə Elçinin gücü çatarmı? Minlərcə insan üz-üzə gələn yerdən insan nədir, şir də, pələng də sağ-salamat keçə bilməz, Reyhan...

R e y h a n. Şir də keçə bilməz, pələng də, amma mənim Elçinim keçər...

Q a r a t e l. Eh... Mənim də ürəyim od tutub yanır... Səni istədiyimdən bu sözləri deyirəm...

R e y h a n. Yox... Yox... Gözəllik timsalı olan ayın üzü ləkə götürsə də, Elçin öz qəlbini vəfasızlıq damğası ilə ləkələməz. Onun şirin sözləri, mehriban baxışları bir duman olub havaya uçmaz... O mənə yazmışdı ki, məni səndən yalnız ölüm ayıra bilər... Sən də məndən köməyini əsirgəmə, Qaratel...

Q a r a t e l. Mən nə edə bilərəm? Yollar tutulmuş, şəhərin qapıları hər tərəfdən bağlanmışdır. İndi onu sənin yanına kim buraxar. Hər tərəfə keşikçilər qoyulmuşdur...

R e y h a n. Nə üçün? Məgər Elçinin buraya gəlməsini bilirlər?

Q a r a t e l. Yox, bilmirlər... Bu gün axşam Zibeydə xatunu əsir tutub gətirdilər... Keşikçilər də görünür onu qoruyurlar. Deyirlər ki, birdən Cavanşirin adamları basqın edər. Onu əsirlikdən qurtarıb geri aparar.

R e y h a n. Kimi dedin, kimi?

Q a r a t e l. Elçinin anası, sərkərdə Cavanşirin istəkli arvadı...

R e y h a n. Yox, bu ola bilməz. Atam bu rəzalətə heç vaxt razı ola bilməz... Yəqin bu işdən onun xəbəri yoxdur... Əzizim, sən nəyi isə dolaşıq salırsan.

Q a r a t e l. Atanı o qədər də rəhmdil bilmə... Zibeydə xatunu o özü oğurlatdırmışdır... Keçən gecə bizim adamlar Firuzəabada hücum edib Cavanşirin yay sarayını halqa içərisinə almış, keşikçiləri bir-bir qılıncdan keçirmişlər... Özünü diri tutub gətirmişlər.

R e y h a n. İndi o haradadır?

Q a r a t e l. Neçə adamdan xəbər aldımsa, yerini deyən olmadı...

R e y h a n. Elçinin anası, köməksiz bir qadın zindanlarda dustaq olsun...

Q a r a t e l. Onun yerini öyrən, Reyhan, sən Elçinin xatirinə ona kömək et...

R e y h a n. Ah, ata... Sən necə zalımsan...

Q a r a t e l. O, Cavanşirdən qisas alır. İstəyir ki, Cavanşir qorxub hücum fikrindən daşınsın. Amma o daha da qəzəblənib, qabağına keçən adamları ot kimi biçib tökür... Hələ qorxuram bu gecə Cavanşirin qoşunları şəhərə dolsun...

R e y h a n. Gedək, Qaratel, səbr edə bilmirəm...

Q a r a t e l. Hara gedirsən, ehtiyatlı ol. Qaş düzəltdiyin yerdə vurub göz çıxardarsan...

R e y h a n. Yox, atam məni tikə-tikə doğrasa da, onu tapıb dustaqdan buraxdıracağam...

Q a r a t e l. Onun yerini sənə deməzlər. Atan Bəhramın qorxusundan göydə quşlar belə qanad salar...

R e y h a n. Mən atama yalvaracağam, insafa gəlməsə, mən ondan üz döndərəcəyəm...

Q a r a t e l. O burada deyildir, əzizim. İndi onun nərəsindən yer-göy titrəyir. Get bir az dincəl, axşamın xeyrindən sabahın şəri yaxşıdır...

R e y h a n. Ulu Tanrım, nədir mənim günahım, sevən ürəklərin həmdəmi olmaqdan nə üçün düşməni olursan?

Elçin daxil olur. Qaratel yan otağa keçir.

E l ç i n. Ah... Reyhan, mənim əzizim...

R e y h a n. Elçin, sən buraya necə gəldin?

E l ç i n. Qılıncların, nizələrin ucsuz-bucaqsız dənizlərindən keçərək gəldim...

R e y h a n. Səni tutsaydılar öldürə bilərdilər, Elçin...

E l ç i n. Məni parça-parça doğrasalar da, son nəfəsimdə yenə Reyhan... Reyhan deyə inləməyə qüvvətim çatar...

R e y h a n. Of... Elçin, bu fəlakət səni də, məni də məhv edəcək...

E l ç i n. Ağlama, Reyhan... Ağlama... Məni də, atam Cavanşiri də bu qanlı müharibələrə sövq edən saf bir məhəbbətdir... Odlu qılınclar yer üzünü qan dəryasına qərq etsə də, bu məhəbbət heç bir zaman məhv olmayacaqdır... Odlar yurdunun səadəti sənin, mənim səadətimdir...

R e y h a n. Get... Səni and verirəm eşqimizin qüdsiyyətinə, get...

E l ç i n. Əgər sən bu eşqin ən ağır əzablarına belə qatlaşa bilərsənsə, söylə... Hardadır mənim anam?

R e y h a n. Mən özüm də onun yerini bilmirəm... Onu haradasa gizlədib yerini heç kəsə demirlər...

Bəhram gizlindən pərdənin dalında söhbətə qulaq asır.

E l ç i n. Reyhan, mən onu tapacağam... Anamın namusunu tapdalamaq istəyən o cəlladdan bir intiqam alacağam... Əgər onun üçün həyatımı qurban vermək lazım gəlsə də, bir an belə tərəddüd etmərəm... Söylə, haradadır mənim anam?

R e y h a n. Eşidirsənmi, sənin gəlişindən xəbər tutdular.

E l ç i n. Demək, bilmirsən? Sən ürəyini sıxma, əzizim... Bu qanlı vuruşmalar tezliklə qurtaracaq, insanların əbədi səadəti, bizim taleyimiz güləcək... İntiqam alovu ilə yanan ürəklərimizdə yalnız məhəbbət duyğuları çırpınacaq...

R e y h a n. İnan, Elçin, mən onu səbirsizliklə axtaracağam.

S ö h r a b. Elçin... Elçin, tez ol, gələn var...

E l ç i n. Gəlirəm, Söhrab, gəlirəm... Reyhan, Zibeydə xatunun oğurlanması bütün Ağvanı ayağa qaldırmışdır. Qoy bilsinlər ki, Zibeydə xatuna toxunan əlləri dibindən kəsib atmaq üçün Ceyran düzündən Qartal kimi atlılarımız üstünə şığıyıb gəlir... Əlvida, əzizim... Gün doğanda məni də, atam Cavanşiri də burada gözlə (*Elçin gedir*)

R e y h a n. Ata... Ata... Sən onu – ipək ürəkli Elçini də qəzəbləndirdin... Nə üçün?

Bəhram daxil olur.

B ə h r a m. Sənə nə olmuşdur, qızım, niyə çığırdın?

R e y h a n. Nə üçün ata, nə üçün?

B ə h r a m. Səndəki bu həyəcanın səbəbi nədir, qızım? Əgər düşmənin hücumundan qorxursansa, arxayın ol, mən vuruşma meydanından gəlirəm... Cavanşir məğlub olur, geri çəkilir. Kayan ordularının qələbə bayrağı Ağvan dağlarının zirvəsində dalğalanır...

R e y h a n. Onun anası, yox... yox bu rəzalətdir ata...

B ə h r a m. Rəzalət, bu nə sözdür? Söylə görüm səni qəzəbləndirən nədir?

R e y h a n. Elçin... Elçin...

B ə h r a m. O kimdir, qızım?

R e y h a n. Atacan, yalvarıram sənə, onu məndən soruşma...

B ə h r a m. Bu sirmidir, Reyhan? Sən heç bir şeyi öz doğma atandan gizlətmə, qızım. Mən səni kiçik yaşlarından qollarımın üstündə böyütmüşəm. Sənə özüm lay-lay demişəm. Mən sənin səadətin üçün hər bir fədakarlığa hazıram. De, qızım, nə olmuşdur?

R e y h a n. Əgər səndə zərrə qədər məhəbbət varsa söylə ata, Zibeydə xatun hanı?

B ə h r a m. Zibeydə xatun? Sən hara, Zibeydə xatun hara?..

R e y h a n. Mən Cavanşirin oğlunu...

B ə h r a m. Susma, qızım, söylə, nədən qorxursan? De qızım, mən sənə – bir balamın qara gözlərinə and içirəm ki, sənin hər bir arzuna əməl edəcəyəm. De qızım, dərdin, istəyin nədir?

R e y h a n. Mən onu... Elçini sevirəm...

B ə h r a m. Sevirsən?

R e y h a n. Dünyalar qədər...

B ə h r a m. Mənim qızım, mənim qan düşmənimin oğlunu sevir... Bəlkə mən yanlış eşitdim. Bəlkə qulaqlarım məni aldadır...

R e y h a n. Yox, atacan, Elçini sevirəm, ölüm belə onun məhəbbətini mənim qəlbimdən çıxarda bilməz. Yalvarıram sənə, ata, Zibeydə xatunun yerini mənə de, Elçin kimi bir oğulun anası bu rəftara layiq deyil...

B ə h r a m. Yoxsa səni o quduz canavarların balası yoldan çıxarmışdır?

R e y h a n. Ona toxunma, ata. Onun qəlbi büllurdan belə safdır. Onun anası Zibeydə xatun...

B ə h r a m. Mən Zibeydə xatunun qanını içməyə belə hazıram... Mən...

R e y h a n. Qadından intiqam almaq? Yox, ata, bu sənin, bütün nəslimizin şəninə ləkə vurar. Yalnız düşmənlərimiz deyil, dostlarımız da, elimiz-obamız da sənə nifrət edər. Hamı sənə lənət oxuyar. Ulu Hürmüzə and olsun ki, Zibeydə xatunun başından bir tük belə əskik olarsa, mən özümü həlak edərəm...

B ə h r a m. Bəlkə sən düşmənə satılmısan? Mən Zibeydə xatunu odlara atıb külə döndərəcəyəm...

R e y h a n. Yox, yox, heç vaxt. Sən yalnız mənim cənazəm üstündən keçib bu cinayətə əl ata bilərsən... Ah... ata...

B ə h r a m. Suss... Mən şüurumu itirirəm...

R e y h a n. Vur... öldür...

B ə h r a m. Rədd ol qəlbimdən, bala məhəbbəti...

R e y h a n. Vur...

B ə h r a m. Bəsdir, daha mənim səbrim tükəndi...

R e y h a n. Nə üçün dayandın, vur...

B ə h r a m. Rədd ol...

R e y h a n. Vur, cəllad ata...

B ə h r a m. Reyhan...

P ə r d ə

## ON DÖRDÜNCÜ ŞƏKİL

Bəhramın sarayı

B ə h r a m. Əsirlər haradadırlar?

Q a s i d. Sizin əmrinizi gözləyirlər, böyük sərkərdə... Məşhur Girdman sarbanı Şahin ölümünü çoxdan gözləyir...

B ə h r a m. Onun oğlu Qartal Ceyran düzündən hücuma keçib cəbhəni yarmaq istəyirmiş. Lakin qorxmaz igidlərimiz onun dəstəsini tar-mar edib özünü də əsir almışlar...

K a b u s. Qartal dedikləri o əfsanəvi qəhrəman budur.

Qartalı qolları bağlı gətirirlər.

B ə h r a m. Qartal, bir zaman xəyanətlə qaçıb mənim əlimdən yaxa qurtarmışdın. İndi yenə mənim əlimdəsən... Bəhramın üstünə qılınc çəkən hər kəsin şərəfsiz sonu belədir.

Q a r t a l. Xəyanət ən böyük ordunu belə yıxa bilər...

B ə h r a m. Sənin bircə qurtuluş yolun vardır. Söylə, söylə görüm o böyük sərkərdəniz Cavanşir özü hansı tərəfdən bizə hücum edir?

Q a r t a l. Onun sirrini yalnız özü bilər...

B ə h r a m. Bax, qoca atan da mənim əlimdədir...

Şahini əsgərlər gətirirlər.

Q a r t a l. Atacan...

Ş a h i n. Oğlum...

B ə h r a m. Görürəm ki, bir-birinizi həddsiz sevirsiniz... Qartal, əgər özünü də, onu da, ölümdən xilas etmək istəyirsənsə, Cavanşirin yerini söylə. Nə üçün susursan? Namusuma and içirəm ki, onun yerini söyləsən, sizin başınızdan bir tük əskik olmayacaqdır.

Q a r t a l. Axtardığınız xain mən deyiləm... Ey sərkərdə... Ağvan cəngavərini heç bir şeylə satın ala bilməzsiniz...

Ş a h i n. Afərin. Mənim cəsur Qartalım... Ananın südü sənə halal olsun...

C ə n g a v ə r. Suss... Qoca, öz əlinlə özünə qəbir qazma...

Ş a h i n. Mərd ölənlər, dünyanın ən xoşbəxt adamlarıdır...

Q a r t a l. Ax, ata, sirlərimizi açıb düşmənə söyləyən o xaini öyrənə bilsəydim... Ölümümə zərrə qədər də təəssüf etməzdim...

B ə h r a m. Hamınız bilin... Bu sirri mənə söyləyən Cavanşirin doğma balası Elçindir...

Q a r t a l. Ox, cəllad ürəkli xain... Böyük sərkərdədən, Cavanşirdən belə xain övlad törəyə bilməz...

B ə h r a m. İnanmırsan?

Q a r t a l. Xeyr, əsla...

B ə h r a m. Atanla bərabər oda atılandan sonra inanarsan.

Q a r t a l. Mən öz odlu qılıncımla yüzə qədər süvari biçib tökmüşəm, artıq mənim oddan da qorxum yoxdur...

B ə h r a m. Aha... Cəsarətə bax... O, yenə də qürurundan əl çəkmək istəmir... Aparın, hər iki qollarını bağlayın, atasını isə yanan tonqallara atın...

Qartalı və atasını gözətçilər aparırlar.

P o l a d. Bu ölüm hamımıza baha otura bilər, igid sərkərdə...

B ə h r a m. Görürəm ki, sənin ürəyin mum kimi yumşaqdır. Boğ, öldür bu mərhəmət hissini, sən hələ bundan da müdhiş cəzalar görə-

cəksən... Cavanşirin yalnız Qartalı deyil, o gözəl qadını – Zibeydə xatunu da mənim əlimdədir.

Zibeydə xatun daxil olur.

Polad, mənim igid cəngavərim, Cavanşirin qollarına qüvvət verən bu dünya gözəlini sənə bağışlayıram... Qoy Zibeydə xatun sənin arvadın olsun...

P o l a d. Yox, yox, mən belə namussuzluğa razı olmaram...

B ə h r a m. O mənim kələmdir, istədiyim qiymətə, istədiyim müştəriyə sata bilərəm. Lakin sənə bağışlayıram.

P o l a d. Xeyr, igid sərkərdə, sən doğrudan da o böyük insan adını daşımaq istəyirsənsə, adi nəzakət qanunlarını ayaqlamağa haqlı deyilsən...

B ə h r a m. Sənə dediyim o müdhiş cəza budur...

P o l a d. Əfv edərsiniz, böyük sərkərdə. Mən qılınc, qalxan götürüb Cavanşirlə vuruşacağam, mən öz sədaqətimi qanlı vuruşma meydanında göstərəcəyəm, Zibeydə xatunu isə yox, yox... (*Polad gedir*)

B ə h r a m. Ey Kabus, yaxın gəl... Onu sən alacaqsan...

K a b u s. Razıyam, böyük sərkərdə. Sənin iradən bunu tələb edirsə, mən bu təklifdən boyun qaçırmaqda bir məna görmürəm...

Q a s i d. Demək Cavanşirin ölüm qərarı yazıldı...

Z i b e y d ə. Mən Cavanşirin taleyinə acıyıram... O nahaq yerə sənin üstünə qılınc qaldırmışdır...

B ə h r a m. Nə demək istəyirsən?

Z i b e y d ə. Mən qadın ola-ola sənə qılınc çəkməzdim...

B ə h r a m. Nə üçün?

Z i b e y d ə. Alçalmamaq üçün...

B ə h r a m. Aparın bu kənizi. Mən kənizlə danışmağa tənəzzül etmərəm...

Z i b e y d ə. Cavanşir qalib gələndə şeypurlar həmişə belə səslənir.

P o l a d təlaş içində daxil olur.

P o l a d. Böyük sərkərdə Cavanşirin qoşunları cəbhəni yardı. Onlar bizim arxamıza keçib qara bir zülmət kimi üstümüzə yeridi. Bütün yollar tutuldu. Heç bir yana qaçmağa imkanımız qalmadı...

B ə h r a m. Sən nə üçün yalnız qaçmağa yol axtarırsan, qorxaq.

P o l a d. Əfv edərsiniz böyük sərkərdə. Ağvan süvariləri üstümüzə müdhiş bir ildırım kimi şığıyırlar. Onların qarşısından sağ-salamat qaçmaq da böyük igidlikdir.

B ə h r a m. Get, ehtiyatda saxladığım qüvvələri apar. (*Polad gedir*) Mən hələ ölməmişəm. Bir daha ağır xəbər gətirsən, ətini boz itlərə yem etdirəcəyəm... Gedin qəzəbinizə kin, iradənizə güc verin... İnsan öz kədərini yalnız qanla azalda bilər. Vurun, öldürün. Qoy Ağvan torpağı Cavanşirin qanına boyansın...

Kabus daxil olur.

K a b u s. Əsgərlərimiz qaçışır, böyük sərkərdə... Bütün ordumuz pərakəndə düşüb düzlərə səpələndi... Hamısı qaçıb dağılır...

B ə h r a m. Mən onlara göstərəcəyəm ki, insanın ayaqları yalnız qaçıb qurtarmaq üçün deyil...

Z i b e y d ə. Odur, odur...

B ə h r a m. Ardımca gəlin...

Cavanşir qabaqda olmaqla ordu daxil olur.

C a v a n ş i r. At yerə qılıncı...

B ə h r a m. Mən hələ ölməmişəm...

C a v a n ş i r. Cavanşir aslanlarla vuruşur. (*Vuruşurlar. Bəhramın qılıncı düşür*) Götür qılıncını get... (*Yenidən vuruşurlar, Cavanşir Bəhramı öldürür*)

B ə h r a m. Ah...

C a v a n ş i r. Qartal hanı? Gedin onu axtarın...

C a v a n ş i r. O salamatdırmı?.. Hanı Söhrab, o nə üçün görünmür?

F ə r i d. Onun dəstəsi şəhərə çoxdan girmişdir...

C a v a n ş i r. Sizcə Bəhrama bizim sirlərimizi kim açmışdır?

F ə r i d. Hamımızdan ağır zərbə alan Qartaldır. Ondan soruşun, böyük sərkərdə...

Qartalı gətirirlər.

Q a r t a l. Mənim böyük sərkərdəm. Xəyanət, mənim süvarilərim hamısı sədaqətlə vuruşurdu. Lakin hamısı qara bir xəyanətin qurbanı oldu...

Ş a h i n. Mənim əziz balam... Səni belə məşəqqətlə yandıranlardan özüm hayıf alacağam...

F ə r i d. Bəhram artıq yoxdur, əmi... Sərkərdəmiz sənin intiqamını çoxdan almışdır...

Q a r t a l. Məni Bəhramın alovları qorxutmadı. Odlar yurdunun uca dağları, büllur çeşmələri, ucsuz-bucaqsız meşələri durduqca Girdman

cəngavərinə ölüm yoxdur. Lakin ulu hökmdarımdan yalnız bir xahişim var... Xainin dili kəsilsin... Sirrimizi qarı düşmənə açıb söyləyən o dil Girdmanın ən böyük düşmənidir.

C a v a n ş i r. Bu xəyanətdən bütün Ağvana ziyan toxundu. Övladlarım, xain bizim sirrimizi düşmənə açdı. Yüzlərlə Girdman cəngavərlərinin qanına bais oldu.

Ş a h i n. Hökmdar, Qartalın qanadları Bəhramın acıqlı odlarında yanıb külə döndü... O səadət naminə əsl igid kimi ölümə sinə gərdi... Al onun intiqamını, hökmdar...

Q a r t a l. Əlvida, dostlar... Əlvida, mənim odlu qılıncım. Əlvida, böyük ata... (*Ölür*)

C a v a n ş i r. Mən and içirəm ki, Qartal, sirrimizi açmış o xain doğma balam da olsa mən ona aman verməyəcəyəm...

P ə r d ə

## ON BEŞİNCİ ŞƏKİL

Bəhramın sarayı. Cavanşir çox məyus gəzişir, Söhrab daxil olur.

S ö h r a b. Muğan torpağı böyük hökmdarımızı gül-çiçəklə qarşılayır. Hamının gözlərində sevinc yaşları parıldayır. Bəhramın ölümündən xəbər tutanlar üçün toy-bayramdır. Böyük hökmdarımız nə üçün belə kədərlidir? Məgər qələbəmiz onu sevindirmirmi?

C a v a n ş i r. Söhrab, Ağvan cəngavərlərini ölüm qucağına atan o xain göstər... O satqın kim ola bilər?

S ö h r a b. Satqın?

C a v a n ş i r. Mən heç bir vuruşmada bu qədər cəngavər itirməmişdim...

S ö h r a b. Sasani ordusu qüvvətli idi. Biz qurbansız qalib gələ bilməzdik...

C a v a n ş i r. Xatirindədirmi? Mən dedim ki, sirlərimiz dilsiz divarlar arasında qalsın. Lakin divarlar dilə gəlib hər şeyi Bəhrama xəbər vermişdir...

S ö h r a b. Qartalın ölümü doğrudan da böyük zərbədir, ulu hökmdar...

C a v a n ş i r. Ağvanın namusunu tapdalayan o xain tapılmadıqca mənim qəlbim rahat olmayacaqdır... Söylə... Söylə görüm o kim ola bilər...

S ö h r a b. Ən böyük günah məhəbbətdədir, hökmdar... İnsanı ən alçaq xəyanətlərə sövq edən bir qüvvət varsa, o da yalnız məhəbbətdir.

C a v a n ş i r. Sən həmişə ikibaşlı sözlər deməkdən həzz alırsan... Fikrini açıq söylə...

S ö h r a b. Anamız Zibeydə xatunun Firuzəabada getdiyini, bizim haralardan hücuma keçdiyimizi, qoşunlarımızın yerini Bəhrama xəbər verən də məhəbbət olmuşdur... Böyük sərkərdə, mən bu sirri özümlə bərabər qəbirə aparmaq xəyalında idim. Lakin...

C a v a n ş i r. O xain kimdir?

S ö h r a b. O sizin dünyalar qədər istədiyiniz bir adamdır. Onun ölümü də xəyanəti qədər sizi yandıracaqdır. Ulu göylərə and içirəm ki, sözləri mənə dedirdən yalnız ürəyimdə Cavanşirə bəslədiyim sonsuz məhəbbətdir.

C a v a n ş i r. Mən də müqəddəs göylərə and içirəm ki, o ürəyimin bir parçası da olsa kəsib atarkən uf deməyəcəyəm...

S ö h r a b. O xain... yox... yox... Bunu deməyə dilim gəlmir.

C a v a n ş i r. Sinirlərimlə oynama, Söhrab... Onsuz da mən iztirab içərisində boğuluram...

S ö h r a b. O xain sənin öz doğma balan Elçindir...

C a v a n ş i r. Necə? Sən onun ölümünümü istəyirsən, alçaq?..

S ö h r a b. Təəssüf ki, mənim ölümüm də onun vicdanındakı qara ləkəni yuyub təmizləyə bilməz...

C a v a n ş i r. Yalandır... Yalan..

S ö h r a b. İnanın ki, göydə ayı, ulduzu danmaq mümkün olsa da, bu sözlərimi yalansıtmaq mümkün deyildir. Elçin bütün Ağvanı satdı... Anasının namusunu, atasının şərəfini, Odlar yurdunun igid cəngavərlərini bir qaşı kamana qurban verdi...

C a v a n ş i r. Əgər sən qəlbinin iniltilərini duymaq istedadından məhrum deyilsənsə, etiraf et ki, bu dediyin sözlərin hamısı yalandır...

S ö h r a b. Nə edim ki, mənim sözlərimdə zərrənin mində biri qədər yalan yoxdur...

C a v a n ş i r. Söhrab, oğlum Elçinin xəyanətini sübut edə bilməsən sən yaşamayacaqsan...

S ö h r a b. Böyük hökmdarımız məni əfv etsin. Qadın tayfası nə qədər zərif məxluq olsa da, iradəsiz kişiləri özünə qul etməyə qadirdir. Yer üzündəki bütün xəyanətlərə bais onlardır. Oğlunuz Elçin dünən gecə Bəhramın sarayına gəlib bütün sirlərimizi öz sevgilisinə xəbər

vermişdir. O şeytan mənim əziz qardaşım Elçinin könlünü ovlamış, atasına casusluq edib hər şeyi ona söyləmişdir.

C a v a n ş i r. O ifritə indi haradadır?

S ö h r a b. Baxın, Bəhramın mənfur cənazəsi önündə diz çöküb qanlı göz yaşı axıdan o aybənizli Kayan gözəlini görürsünüzmü?

C a v a n ş i r. Hanı Elçin? Bəlkə də o öz xəyanətinin böyüklüyünü hiss etdiyi üçün mənim gözümə görünməkdən çəkinir.

S ö h r a b. O uzaqda deyildir... Reyhan adlanan o dünya gözəlinin göz yaşları oğlunuz Elçini də ağladır. O kənarda durub həsrətlə baxa-baxa qayınatasının ölümünə yas saxlayır...

C a v a n ş i r. Gedin o fitnəkar afəti mənim yanıma gətirin.

F ə r i d. Baş üstə...

Z i b e y d ə. Bu böhtanlara uyma, Cavanşir...

S ö h r a b. Oğul məhəbbəti gözlərinizi pərdələməsin, böyük ana. Bu günə qədər mən Elçini səndən az sevmirdim. Hökmdarımız bilməsə də sən ki, Elçinin Reyhana vurulduğunu məndən yaxşı bilirsən... Reyhan bu dediklərimi təsdiq etməzsə, mən indidən öz əlimlə ölüm qərarını yazmağa hazıram...

C a v a n ş i r. Aha... Oğlum gözəllik ilahəsinə vurulmuşdur... Sən Elçini tanıyırsanmı?

R e y h a n. Bəli, tanıyıram...

C a v a n ş i r. Sən hara, o hara? Cavab ver... Artıq hər bir şey bəllidir... Elçin dünən gecə sənin yanında olmuşdur? Oğlun sirrini atadan gizlətmək mənasızdır. Cavab ver... Elçin sənin yanına gəlmişdirmi?

R e y h a n. Məni əfv edin, böyük atadan oğlun sirrini gizlətmərəm... Bəli, o dünən gecə burada idi.

C a v a n ş i r. Aha, demək xain mənim öz ciyərparamdır... Gedin bu dəqiqə onu mənim hüzuruma gətirin...

Q ı l ı n c. Səbir edin, hökmdar... hələ kimin müqəssir olduğu aydın deyildir...

Ş a h i n. Böyük hökmdar, Bəhram da belə deyirdi, lakin heç birimiz buna inanmadıq...

C a v a n ş i r. Artıq hər şey mənə aydın oldu... Fərid, Elçini özün gətir...

F ə r i d. Baş üstə...

C a v a n ş i r. Sən öz füsunkar gözəlliyinlə neçə gənci yoldan çıxarmışsan?

R e y h a n. Vəfalı ürəklər yalnız bir dəfə... Yalnız birini sevərlər... Böyük hökmdar...

C a v a n ş i r. Mən Elçinin gözlərini ovub, dilini kəsəcəyəm...

Bu anda Elçin daxil olur.

E l ç i n. Atacan, Qartalın ölümü mənim ürəyimə od saldı.

C a v a n ş i r. Onun ölümünə bais sənsən...

E l ç i n. Bu nə sözdür, atacan... Mən Qartal kimi bir igidin ölümünü istərəmmi?

C a v a n ş i r. Ömrüm uzunu aldığım ölümcül yaraların hamısından bu yara daha müdhiş, daha sağalmazdır... Bu xaini nə üçün qolları bağlı gətirmədiniz?

E l ç i n. Nə üçün hamı mənə düşmən gözü ilə baxır... Bəlkə siz Qartalın ölümünü məndən görürsünüz? Yox... yox, mənim əllərim günahsız insan qanı ilə ləkələnməmişdir...

C a v a n ş i r. Bir qızın ala gözləri üçün sən bütün Ağvanı satdın...

E l ç i n. Mavi göylərə and içirəm ki, mənim məhəbbətim anamın südü qədər saf, atamın namusu qədər təmizdir...

C a v a n ş i r. Cavab ver, Söhrab... Mən onun ürəyindən qopub gələn bu sözlərə "yalandır" deyə bilərəmmi?..

S ö h r a b. Övlad məhəbbəti gözlərinə pərdə çəkmişdir, böyük hökmdar...

E l ç i n. Söhrab...

C a v a n ş i r. Tutaq ki, böhtan deyil... Sən həqiqəti söylə... Dünən gecə Bəhramın sarayında olmuşsanmı?

E l ç i n. O sənin düşmənin idi, ata... Əgər məni bunda təqsirləndirirsənsə, etiraf edirəm... Mən Reyhandan anamın yerini soruşmağa gəlmişdim...

C a v a n ş i r. Gəlmişdin...

E l ç i n. Əgər mənim günahım budursa, Söhrab haqlıdır.

S ö h r a b. Həqiqəti gizlətmə, Elçin... Sən Reyhana demədinmi ki, Ceyran düzündən Qartal kimi atlılarımız üstünüzə şığıyıb gəlirlər?

E l ç i n. Doğrudur, demişəm...

C a v a n ş i r. Necə... demişsən ?

E l ç i n. Bəli, atacan, məgər bizim cəngavərlərimizin hamısı Qartal deyildirmi?

C a v a n ş i r. Amma mənim igid Qartalım da Ceyran düzündən hücuma keçdi. Onu Ceyran düzündə əsir aldılar. Atanın sirrini beləmi gizli saxladın...

E l ç i n. Aman dilim qurusun, atacan mən öz əlimlə Qartala məzar qazmışam...

C a v a n ş i r. Aydındır... Anasının yerini bilməyə gedən oğul, atasının sirrini düşmənə açmışdır... Artıq buna mənim zərrə qədər şübhəm qalmadı... Aparın bunu: ciyərimin, ürəyimin bu xəstə parçasını kəsib qurdlara, quşlara atın... Mən Qartalın müqəddəs cənazəsi önündə and içdim ki, andına sadiq olmayan cəngavər dünyanın ən namussuz adamıdır.

Z i b e y d ə. Ah... Kor ol gözlərim, gör nələr görürsən. Yox... yox... sən mənim ömür çiçəyimi belə tez xəzana döndərmə, Cavanşir... Mən gecə-gündüz bilməyib oğul böyütmüşəm. Mənim göz yaşımdan qorx, ona toxunma. Onun gül kimi təmiz dodaqlarından yalan söz çıxmaz...

C a v a n ş i r. Yüzlərcə Ağvan igidlərinin qanına bais olan, atasını, anasını, doğma yurdunu bir qızın ala gözlərinə qurban edən oğuldan mən üz döndərirəm. Sən də öz südünü ona haram et, Zibeydə... O xain balanı lənətlə. Aparın hamıya bildirin ki, Cavanşir özü belə Ağvana xain çıxarsa ölümdən yaxa qurtara bilməyəcəkdir.

R e y h a n. Onun heç bir günahı yoxdur. Əgər ölümdən həzz almaq istəyirsənsə, onun yerinə məni öldür. Qoy bütün el-oba şahid olsun ki, mən Elçinin məhəbbəti üçün ölümdən qorxmuram...

C a v a n ş i r. Aparın...

R e y h a n. Ana nəvazişi qədər təmiz məhəbbətimizə and içirəm ki, Elçin mənə heç bir sirri deməmişdir... Daş ürəkli ata... O qana boyanmış əllərinlə günahsız oğlunun ölümünə fərman yazma.

Q ı l ı n c. Böyük sərkərdə, Girdman qılıncının günahsız qana boyanmasına razı olmayın... Elçin hələ gəncdir... Onun səhvini əfv edin...

C a v a n ş i r. Bu yalvarışlar mənim iradəmi sarsıda bilməz. Mənim ürəyim xəyanət üçün döyünməyəcəkdir... Aparın...

E l ç i n. Atacan, görünür mənim taleyim belə imiş. Əgər anamız Odlar yurdu bu ölümdən xeyir görəcəksə, qoy o qılınclar mənim sövdalı başımı bədənimdən ayırsın... Lakin yadında saxla, ata... Mənim günahsız olduğum gec-tez aydınlaşacaq. O zaman anam Zibeydə xatuna, sevgilim Reyhanın qanlı göz yaşlarına polad ürəkli atam dözməyəcəkdir...

C a v a n ş i r. Mən onunla vidalaşdım...

Z i b e y d ə. Dayanın, onu yox, məni öldürün, mənəm günahkar. Əgər Elçin xaindirsə, günah mənim südümdədir.

C a v a n ş i r. Nə üçün dayandınız, aparın...

Z i b e y d ə. Cəllad ata, sən nə üçün ananı sağ saxlayırsan?

C a v a n ş i r. Niyə dayandınız?

Z i b e y d ə. Ah... Aman...

C a v a n ş i r. Aparın...

R e y h a n. Ah...

H a m ı. Hökmdar... hökmdar... hökmdar...

P ə r d ə

Cavanşirin sarayı

C a v a n ş i r. Ah, Elçin... Elçin... Bir günün bir il qədər ağır keçir. Oğlum, daha mən nə üçün yaşayıram, nə üçün?

Elçinin xəyalı görünür.

Bu sənsən, atandan intiqam almağa gəlmişsən, haqqın var. Gəl öldür məni, mən özüm də yaşamaqda bir məna görmürəm...

E l ç i n. Yadında saxla, atacan... Mənim günahsız olduğum gec-tez aydınlaşacaq...

C a v a n ş i r. Ey məşum xəyal, hanı sənin qılıncın? Gəl yar sinəmi, qəlbimi qopart, qurdlara, quşlara at. Nə üçün dayanmışsan?

E l ç i n. Ah, ata... Görünür, mənim taleyim belə imiş...

C a v a n ş i r. Ah, oğlum... (*üzü üstə yıxılır*)

S a r a n (*gəlir*). Böyük ixtişaş qalxdı, hökmdar... Şəhər əhli cəngavərlərə qarışdı. Dost düşmənlə əlbir olub üstümüzə yeridi. Hamısının da narazılığı səndəndir.

C a v a n ş i r. Məndən? Bu nə sözdür, qoca? Dünən hamı bizi təntənə ilə qarşılamadımı?..

S a r a n. Dünən başqa, bu gün başqa... Böyük hökmdar... dünən onlar sənin ədalətini görürdülər, bu gün isə...

C a v a n ş i r. Bu gün nə?

S a r a n. Mən onların sözünü dilimə gətirməkdən belə qorxuram...

C a v a n ş i r. Söylə, qoca, neçə vaxtdır ki, mən acı xəbərlər eşitməyə adət etmişəm...

S a r a n. Deyirlər ki, ac qaldıq, susuz qaldıq, düşmənlə vuruşmada heç nəyimizi əsirgəmədik. Amma Cavanşir bizi nahaq qırğına verdi.

C a v a n ş i r. Nahaq qırğına?

S a r a n. Bir də deyirlər ki, o, əsl xaini gizlədib, günahsız oğlunu ölümə göndərdi...

C a v a n ş i r. Əsl xain kimdir?

S a r a n. Əsl xain?

Bu anda yenə də Elçinin xəyalı görünür.

C a v a n ş i r. Yenə odur...

S a r a n. Kim, hökmdar?

C a v a n ş i r. Elçin...

E l ç i n. Gördünmü, ata... Vəfalı ürəklər yalnız bir dəfə, yalnız birini sevə bilər...

C a v a n ş i r. Getmə, oğlum, getmə dayan...

S a r a n. Hökmdar, özünü ələ al... Qara xəyallardan əl çək...

R e y h a n. Elçini hara apardılar? Yox... yox, o qayıdacaq. O, heç bir yana getmədi. Hər səhər, hər axşam mənimlə görüşməyə gələcək...

S a r a n. Qızım, Reyhan, artıq o yoxdur... Amansız ölüm onu bizdən ayırdı... Xainlər onu Ağvana çox gördülər...

R e y h a n. O yoxdur? Bax, o buradadır... Ölümə gedən yalnız onun xəyalı idi. Əsl Elçin mənim ürəyimdədir. Əlindəki bu qan nədir? Bilirəm Elçinin qanıdır... Bir-birinə qovuşmaq istəyən iki ürəkdən biri susdu. Mənim ürəyim isə hələ də döyünür... Nə üçün? Qoy o da sussun... (*Xəncərlə özünü vurur*)

C a v a n ş i r. Qızım, sən nə etdin, nə? Yoxsa mənim iztirablarım azlıq edirdi?

R e y h a n. Sən mənə qızım dedin? Ata, Elçin günahkar deyildi. Elçinin məhəbbətinə, ulu göylərin qüdsiyyətinə and içirəm ki, əsil xain sənin vəzirin Söhrab idi.

C a v a n ş i r. Ah, qızım, artıq ölüm ruzigarı əsdi. Mənim ömür gülüstanımı xəzana döndərdi. Nə üçün sən bunu mənə vaxtında demədin...

R e y h a n. Bunu mənə atamın cəngavəri Polad yalnız indicə söylədi. Sənin sirlərini atama bildirən Söhrabdır. O xaindir...

Söhrab təngnəfəs halda özünü içəri salır.

S ö h r a b. Böyük hökmdar, ordu başçınız Qılınc sizə qarşı üsyan edərək buraya hücum çəkir. Gizlənin.

C a v a n ş i r. Reyhanın o məsum dodaqlarından çıxan sözləri eşitdinmi?

S ö h r a b (*qılınca sarılaraq*). Demək, belə...

C a v a n ş i r. At yerə qılıncı... Sənin dilini dibindən kəsdirəcəyəm...

S ö h r a b. Bilirəm... Qoca köpək, ayağımın altından sən quyu qazmışsan... Vaxtında səni öldürsəydim...

Cavanşir onu öldürür.

S a r a n. Hamıya quyu qazan sən oldun, xain... Qazdığın quyuya axırda özün düşdün... Günah məndədir... Günahkar mən qocayam, mən səni vaxtında inandıra bilmədim. Məni bağışla... (*Bayırda izdiham*)

Q ı l ı n c. Biz ədalət istəyirik. Yüzlərcə igidin günahsız qanına bais olmuş xainə ölüm...

S ə s l ə r. Ölüm...

Q ı l ı n c. Kəndləri, obaları xarabaya çevirən, aclıq, fəlakət törədən satqına ölüm...

C a v a n ş i r (*qılıncını yerə ataraq*). Gəlin, nə üçün dayandınız? Gəlin öldürün. Mənəm günahkar...

F ə r i d. Böyük hökmdar, qılınca sarınan bu nankorların qiyamı odla, alovla söndürülməlidir.

C a v a n ş i r. Yox, Fərid, yox, mən bütün ömrüm boyu elin iradəsinə qarşı durmamışam. İndi də ona qılınc qaldırmaram. Daha mənim taleyimin gözləri qapandı... İndi ətrafımdakı bu böyük dağlarda, dərələrdə, göylərdə parıldayan o günəş – hər şey, hər şey gözlərimin önündə zülmət kimi qaraldı. (*Qılıncını yerdən götürür*) Bax, bu da mənim odlu qılıncım. Bir zamanlar o şər qüvvələri biçib tökərdi. O vaxt mənim arxamda bütün Ağvan dayanmışdı, qollarımda bütün ölkənin qüvvəti vardı. Lakin indi. Yox, indi mən gücsüzəm. Bir uşaqdan belə gücsüzəm. Babalardan bizə miras qalmış gözəl bir misal var. Ağac əyiləndə sınar, igid utananda ölər. Mən utanmamaq üçün ölümü intixab edirəm. (*Öz qılıncı ilə özünü vurur*)

Q ı l ı n c. Ağvanın müqəddəs torpağına and içirəm ki, mən böyük sərkərdəyə əl qaldırmaq fikrində deyildim. Mən yalnız onun ədalətsiz

hökmünə etiraz səsimi ucaltmaq, əsil xainin ölümünü tələb etmək istəyirdim. Qoy bütün el, oba bilsin ki, mən Cavanşirin önündə ehtiramla baş əyib, göz yaşlarımla yazdığım bu qəmli dastanımı ona ithaf edirəm...

Qorxmaz igid, cəsur aslan
Qüvvət verdin bizə hər an
Sənin bu mərd ölümünə
Ağlar könül, ağlar ürək
Yanan günəş, əsən külək
Ey insanlar, ey insanlar
Unutmayın heç bir zaman
Eli üçün qəlbi yanan
Cavanşirin şöhrətini
Siz də çəkin onun kimi
Yurdunuzun qeyrətini...

Cavanşirin meyitini aparırlar.

P ə r d ə

# A L O V

*Doğruya zaval yoxdur,*
*Çəksələr min divana.*

***Atalar sözü***

Səhnəmizin böyük sənətkarı, dostum
Ələsgər Ələkbərova ithaf edirəm

## İŞTİRAK EDƏNLƏR

F ə r h a d  Ka m a l o v – müstəntiq
K ə r i m  R ə h i m l i – fabrik müdiri
R ə f i q ə  R ə h i m l i – onun qızı, cərrah
C ə l a l  Q a ş q a y – mühəndis
Ə s m ə r  Z i y a d q ı z ı – toxucu qız
Ə m i n  B əx t i y a r o v – mühəndis
B ə d ə l  S a d a y e v – baş mühasib
F ə r m a n – kassir
G ü m r a h  Ə m r a h o v – fəhlə
S ə r i y y ə – ev qulluqçusu

Epizodlarda m ü s t ə n t i q  k ö m ə k ç i s i,  t i b b  b a c ı s ı,  a m b a r d a r,  f ə h l ə l ə r,  u s t a l a r  və  q o n a q l a r

Hadisə uzaq rayon şəhərindən birində cərəyan edir.

## BİRİNCİ PƏRDƏ

### BİRİNCİ ŞƏKİL

Kərim Rəhimlinin evində böyük qonaq otağı. Açıq pəncərələrdən yeni çiçəklənmiş meyvə ağacları görünür. Uzun yemək stolunun üstündə büllur qədəhlər, çəngəl-bıçaq, boşqablar. Evin qulluqçusu Səriyyə tez-tez mətbəxə gedib-gəlir, hər dəfə də kiçik boşqablarda cürbəcür yemək şeyləri və göyərti gətirir. Kərim Rəhimli otaqda fikirli-fikirli var-gəl edərək, papirosunu tüstülədir. Divar saatı axşam saat yeddini vurur. Birdən Rəfiqə gəlir, sağ tərəfdəki qapıdan o biri otağa keçmək istəyəndə Kərim Rəhimli onu görür, sevincək, papirosunu külqabına basaraq, qızının qabağına sarı yönəlir.

K ə r i m. Qızım, axır ki, gəlib çıxdın!
R ə f i q ə (*könülsüz*). Axşamın xeyir, atacan.
K ə r i m. Bu nədir, rəngin-rufun niyə qaçıb?
R ə f i q ə. Yorğunam, ayaq üstə dura bilmirəm.

K ə r i m. Azı on yol zəng elədim, səni telefona çağırmadılar.

R ə f i q ə. Ağır operasiyam vardı.

K ə r i m. Altı saat operasiya?

R ə f i q ə. Altı saat mən ölümlə əlbəyaxa vuruşdum.

K ə r i m. Axırı xeyirdimi barı? Yoxsa...

Pauza

R ə f i q ə. Üzü bəriyədir. (*Dərindən köksünü ötürür*) Elə ki, mən onu qurtardım.

K ə r i m. Çox şükür, qızım, çox şükür... (*Rəfiqəni qucaqlayıb, alnından öpür*) Amma sənin cərrahlığın mənə yaman baha oturur, yaman... Hər dəfə ürəyinin bir parçasını xəstəxanada qoyub gələndə, elə bil qoca atanın ömründən bir il azalır...

R ə f i q ə. Neyləyim, ata? İnsan həyatına cavabdehəm. Əməliyyat vaxtı əziyyətə dözməsəm, sonrakı peşmançılığa heç dözə bilmərəm.

Pauza

İstəyirəm, yenə xəstəxanaya qayıdam...

K ə r i m. Yox, yox, mənim balam. Gərək sən burda olasan.

R ə f i q ə. Bəs xəstə?

K ə r i m. Özün dedin üzü bəriyədir. Telefonla tez-tez halını xəbər alarıq. Köməyinə ehtiyacı olsa, nə eybi var, gedərsən, baş çəkərsən...

R ə f i q ə. Əlbəttə, yaxşı olardı, sənin bu şad günündə qonaqlarına mən özüm qulluq eləyəydim. Amma...

K ə r i m. Əlbəttə, yaxşı olardı. Axı, onların bəzisi yalnız məni yox, həm də səni görmək üçün gəlir.

R ə f i q ə ( *təəccüblə*). Məni görmək üçün?

K ə r i m (*az qala yalvararaq*). Qızım, canım-ciyərim, mənim də arzu-kamım var... İstəyirəm ki...

R ə f i q ə (onun fikrini anlayaraq). Sən istəyirsən ki, qonaqlar mənim barmağıma nişan üzüyü taxsınlar, eləmi? (*İncik*) Köhnə adamlar demişkən, həm ziyarət, həm ticarət?

K ə r i m (*onun sərt və durğun baxışlarına dözə bilməyərək, gözlərini aşağı dikir*). Mənim arzum budur ki...

R ə f i q ə. Qızın Rəfiqə xoşbəxt olsun, eləmi?

K ə r i m (*cəsarətlənərək*). Əlbəttə, mənim balam, əlbəttə. Buna şübhən var?

R ə f i q ə. Əsla!..

K ə r i m. Bu axşam səni heç yana buraxan deyiləm. Bir də, axı, sənsiz nə qonaqlıq?.. (*Ata ilə qızın söhbətini dinləməyə başlayan Səriyyə bu sözləri eşidərkən Rəhimlinin üzünə baxır*) Hə, düz demirəm?

S ə r i y y ə. Lap düz deyirsən, Kərim dayı... Arvadlar da gələcək?

K ə r i m. Qızım istəsə, əlbəttə!.. (*Rəfiqəyə*) Elə fikir eləmə ki, bu qoca atan diqqətsizdir, bu gün səhərdən ac olduğunu da bilmir... Səriyyə, tez ol!

R ə f i q ə. Ac deyiləm, yorğunam. Çox yorğunam. Bir az dincəlim. (*O biri otağa keçir*)

K ə r i m. Bu qızın dərdi məni lap vaxtsız qocaltdı.

S ə r i y y ə. Məni demirsən!.. Qorxuram o da mənim kimi qarıyıb un çuvalına tay olsun.

K ə r i m. Sən heç, buğdanı yeyib cənnətdən çıxmısan. Sənə oğlan bəyəndirmək olmur.

S ə r i y y ə. Eh, qadam onların ürəyinə!..

K ə r i m. Ay qız, niyə uşağı ac qoymusan? Niyə xəstəxanaya xörək aparmamısan?

S ə r i y y ə. Aparmışdım. Özü istəmədi. Dedi iştaham küsüb... Mən də geri qaytardım. Bu günəcən mən onu heç belə qəmgin görməmişdim...

K ə r i m. Ağır xəstəsi varmış. Düz altı saat əlləşib. Zarafatdır?

S ə r i y y ə. Yox, Kərim dayı. Ona həmişə ağır xəstələri tapşırırlar, amma bu gün nədənsə...

K ə r i m. Axı, nə olub ona?

S ə r i y y ə. Ha qılığına girib soruşdum, demədi ki, demədi.

K ə r i m. Qəribədir... Bəlkə məndən gizlədir? Bəlkə xəstəni qurtara bilməyib?

S ə r i y y ə. Yox, yox, yaxşı qurtarıb; xəstəxanada duran, duran, hamı onu tərifləyirdi... Orda bir tibb bacısı var ha, adı da dilimə yatmır, Şəmsi Qəmər bəyimdir, nədir, o, Rəfiqənin yanından çıxanda dili ağzına sığmırdı.

K ə r i m. Nə deyirdi o?

S ə r i y y ə. Deyirdi ki, Topçubaşovun şagirdidi ey, ölünü qaldırıb ayaq üstə qoydu... Bir azdan Rəfiqə özü operasiya otağından çıxdı. Üzündən maskanı götürəndə matım-qutum qurudu. Sir-sifəti ölü rəngində...

K ə r i m. Eh, yazıq uşaq gözümün qabağında şam kimi əriyib gedir.

Telefon zəngi, Rəfiqə sürətlə gəlir. Cəld dəstəyi götürür.

R ə f i q ə. Bəli, Rəhimlinin evi... Bu saat... Ata!

K ə r i m (*Səriyyəyə*). Sən işində ol, qız... (*Rəfiqəyə*) Sən də get dincəl, mənim balam. Bir şey olsa xəbər verərəm. (*Dəstəyi qızından alır*) Bəli, mənəm. Kərim Rəhimli... Danışan kimdir? Kim?

Pauza

Xeyr, gələ bilməyəcəyəm. Bu axşam qonaqlarım var. Buyurun siz də gəlin... Nə vaxt istəsəniz... (*Dəstəyi asır*)

R ə f i q ə. Kimdir?

K ə r i m. Mənim belə tanışım yoxdur... (*Fikirli*) Fərhad Kamalov? Bəs o məni hardan tanıyır? Görünür bizim nazirlikdən gəlib... Daha yaxşı... Siz gedin. Ay qız, Səriyyə, əlli-ayaqlı tərpən!

Rəfiqə ilə Səriyyə gedir. Kərim yenə papiros yandırır. Nə isə ürəyinə dammış kimi, tutqun halda, ağır və könülsüz addımlarla bir-iki dəfə o baş-bu başa gedib dayanır. Açıq nərdtaxtaya yapışır. Zərləri atır. Qəmgin-qəmgin başını bulayır, deyəsən bəxtinə çıxan rəqəmdən narazı qalır. Bir də atır. Bu anda ayaq səsləri eşidib, səksənmiş kimi qapıya sarı boylanır. Əmin Bəxtiyarov əlində iri bir buket, şad və məmnun görkəmlə daxil olur.

Ə m i n. Axşamınız xeyir, Kərim dayı! Sizi səmimi qəlbdən təbrik edirəm. Fədakar insanlara eşq olsun!

K ə r i m. Çox razıyam, oğul, buyur, buyur...

Ə m i n (*saatına baxaraq*). Deyəsən mən tələsmişəm.

K ə r i m. Yox, yox, lap vaxtında gəlmisən, oğul... İstəyirsən bir nərd ataq, hə?

Ə m i n. Bacarmıram. Təəssüf... Bilirəm, siz həmişə bu nərdin icad eləyənini axtarırsınız... (*Gözlərini ora-bura zilləyərək baxır*) Mən daha mürəkkəb oyunları xoşlayıram. Məsələn, şahmatı...

K ə r i m. Elədir, elədir. Şəhərimizdə udmadığın adam qalmayıb...

Ə m i n (*elə bil sözarası*). Bəs Rəfiqə xanım hanı?

K ə r i m. Ağır əməliyyatı varmış. Çox yorğun qayıdıb.

Ə m i n. Təəssüf, çox təəssüf. Mən bu gülləri onun üçün gətirmişdim. (*Buketi pianonun üstünə qoyur*) Rəfiqə xanımın istedadını hamı tərifləyir. İkicə illik təcrübədən sonra belə mahir cərrah olmaq – yalnız fitri istedadın nəticəsidir.

Pauza

K ə r i m. Bilmirəm, o başqa evə köçəndən sonra mən yalqızlığa dözə biləcəyəmmi?

Ə m i n. Böyük alman filosofu Kantın transendental fəlsəfəsinə görə insanlar arasındakı məsafənin uzunluğu məhəbbətin gücünü heç vaxt azalda bilməz. Bir də ki, bizim evlərimiz o qədər də uzaqda deyil.

K ə r i m (*onun təmtəraqlı cümləsindən heyrətə gələrək*). Əgər o filosof belə sözlər deyibsə, əhsən ona! Eşq olsun! Ancaq məsələ burasındadır ki... (*Telefon zəngi. Rəfiqə həyəcanla gəlir, lakin telefonun dəstəyini Kərim özü götürür*) Bəli... Gözləyirəm, yoldaş Kamalov... Xeyr, xeyr, qətiyyən mane olmazsınız. Əksinə. Nə vaxt gəlsəniz, gözlərim üstə yeriniz var. (*Dəstəyi asır*)

Ə m i n (*Rəfiqəyə təzim edərək*). Axşamınız xeyir, Rəfiqə xanım.

R ə f i q ə. Salam, yoldaş Bəxtiyarov.

Ə m i n. Təəssüf ki, məni sadəcə olaraq Əmin yox, yoldaş Bəxtiyarov deyə çağırırsınız. Böyük alman mütəfəkkiri İmmanuil Kantın transendental fəlsəfəsinə görə insanlar arasındakı rəsmiyyət – soyuqluq əlamətidir.

R ə f i q ə. Kimdir, ata?

K ə r i m. Yenə Kamalov. Bir neçə dəqiqəliyə məni görmək istəyir. Özü də təcili. (*Rəfiqə gedir*) Əmin, oğlum, sən onu tanımırsan ki?

Ə m i n (*Rəfiqənin dalınca baxa-baxa)*. Təəssüf ki, tanımıram. Necə məgər?

K ə r i m. Dedi ki, mühüm bir iş barəsində danışmalıyam. Bizim nazirlikdə elə bir adam var?

Ə m i n. Bilmirəm. Görünür təzə işçilərdəndir.

K ə r i m. Gəlsin, tanış olaq. Mən ki, görməmişəm... Təəccüblüdür. Nə ola bilər?

Səriyyə boşqablarda pendir, yağ, soyutma gətirib süfrəyə düzür. Kərim Rəhimli daha da tutqun və düşüncəli, o biri otağa keçir. Rəfiqə geyinib küçə qapısına doğru getmək istərkən, Əmin Bəxtiyarov onun qabağını kəsir. Səriyyə mətbəxə gedir.

Ə m i n. Siz gedirsiniz?

R ə f i q ə. Bəli.

Ə m i n. Təəssüf, çox təəssüf. Məncə bu axşam siz mütləq burada olmalı, hamıdan çox sevinməli, deyib-gülməlisiniz. Heç olmasa pianonun dillərini o incə barmaqlarınızla ehtizaza gətirsəydiniz...

R ə f i q ə (*onun sözünü kəsərək*). Sevinib gülmək üçün elə bir səbəb görmürəm, vətəndaş Bəxtiyarov.

Ə m i n. Məni indi də yoldaşlıqdan vətəndaşlığa keçirtdiniz. Sevinmək üçün də, deyib gülmək üçün də səbəb var, Rəfiqə xanım.

Zarafat deyil, atanıza yüksək mükafat verilmişdir: Lenin ordeni!.. Mən bu mükafatın qüdsiyyətinə qəlbən iman gətirmişəm.

R ə f i q ə. İndi mən neyləməliyəm?

Ə m i n. Sevinməli, bizi də sevindirməlisiniz. Heç olmasa, zərif libaslarınızdan birini geyib, qonaqları qarşılar, “buyurun” deyə bilərsiniz... Həyat insana bir dəfə verilir, Rəfiqə xanım, incə bir təbəssüm...

R ə f i q ə (*işgüzar əda ilə*). Mən işə qayıtmalıyam!

Kərim (*qapı ağzında qızının son sözlərini eşidərək*). Rəfiqə, mən səni buraxmayacağam. Sən heç dincəlmədin də!

R ə f i q ə. Gözümə yuxu getmir... Məni bağışla, ata. Bilirəm, qonaqlığın mənsiz də şən keçəcək.

K ə r i m. Axı, sən xəstəni ölümdən qurtarmısan. Demək, mahir cərrah olduğunu bir də sübut eləmisən...

R ə f i q ə. Müvəffəqiyyətli əməliyyat – işin yalnız bir hissəsidir. Əsl həkim ona deyərlər ki, xəstəni ayağa qaldıranacan gözü üstündə olsun.

K ə r i m. Əlbəttə, əlbəttə, gözümün işığı...

R ə f i q ə. Ona görə də mən getməliyəm!

S ə r i y y ə (*gəlir*). Kərim dayı, gəl özün bax, gör düyünü korlamamışam ki: o dəfəki kimi olmasın.

K ə r i m (*Rəfiqəyə*). Bir hovur məni gözlə. Bu dəqiqə gəlirəm. (*Səriyyə ilə gedir*)

Ə m i n. Bayaq bir söz eşitdim. Nə üçünsə Bakıdan buraya gətirilmiş bir dustağı ölümcül vəziyyətdə sizin xəstəxanaya aparıblar... Sizin yardığınız adam odur?

R ə f i q ə (*sanki acıq verərək*). Özüdür ki, var!

Ə m i n. Doğrudanmı? Kimdir, tanıyırsınızmı?

R ə f i q ə. Bəli, tanıyıram.

Ə m i n. Çoxdan?

R ə f i q ə. Çoxdan!

Əm i n. Əgər sirr deyilsə, deyin görüm kimdir, bəlkə mən də tanıyıram.

R ə f i q ə. Siz buraya sevinib-gülmək üçün toplaşırsınız. Atamı təbrik eləyəcəksiniz, bir-birindən gurultulu sağlıqlar deyəcəksiniz, dostluqdan, sədaqətdən danışacaqsınız. Xəstənin kim olduğunu desəm, tək sizin yox, atamın da qanı qaralacaq. Bilməsəniz yaxşıdır.

Ə m i n. Demək sirrdir? (*Ağır pauzadan sonra*) Nə deyirəm ki? Hər halda xəstəyə belə qayğı göstərməniz xoşuma gəlir. Lakin...

R ə f i q ə. Lakin nə?

Ə m i n. Lakin bilmirəm, nə üçün mənə qarşı buz kimi soyuqsunuz? (*Rəfiqə getmək istəyir*) Dayanın, Rəfiqə xanım. Yalnız bir dəqiqə.

R ə f i q ə. Buyurun.

Ə m i n. Bəlkə... yox, deyəcəyəm.

R ə f i q ə. Buyurun, deyin.

Ə m i n. Mən istərdim ki, bundan qat-qat zəngin bir süfrə bizim fərəhli günümüzdə açılaydı...

R ə f i q ə. Ah... Məni görmək istəyən qonaq sizsiniz?

Ə m i n. Bəli, mənəm, Rəfiqə xanım. Mən bu görüşə gələrkən, "Olum, ya ölüm!" sözlərini xatırladım.

R ə f i q ə. Əgər atam bunu əvvəldən desəydi, xəstəxanaya daha tez qayıdardım.

Ə m i n. Nə üçün? Axı, nə üçün bu qədər rəhmsizsiniz? Sizdən fərəhli bir cavab gözləyirdim. Düşünürdüm ki, "hə" deyəcəksiniz, mənə qol-qanad verəcəksiniz!..

R ə f i q ə. Çətin. Gecikmişəm. Yaşım ötüb!

Ə m i n. Siz məni ələ salırsınız?

R ə f i q ə. Tamamilə ciddi deyirəm. İndi məni yalnız bircə şey maraqlandırır; xəstələrin müalicəsi. Başqa həvəslərim çoxdan sönüb.

Ə m i n (*az qala kövrələrək*). Bu mümkün deyil, Rəfiqə xanım. Siz istəsəniz də, istəməsəniz də ən təbii bir insan arzusunu boğub öldürə bilməzsiniz. Kimi isə sevməli, kiminlə isə ailə həyatı qurmalısınız.

Pauza

İnanın ki, illərin həsrəti mənim qəlbimi yandırıb yaxır. Sizin yolunuzda hər növ fədakarlığa hazıram.

R ə f i q ə. Üzr istəyirəm. Xəstənin vəziyyətini bir an belə unuda bilmirəm.

Ə m i n. Təəssüf, çox təəssüf... (*Məyus səslə*) Ah, Rəfiqə xanım, sizin diliniz cərrah bıçağından da itidir!

R ə f i q ə (*o biri otağın qapısına yanaşaraq*). Atacan, mən qaçdım... (*Mənalı-mənalı*) Bu qədər də düyüyə baxmaq olar? (*Gedir*)

Ə m i n. Buz ki, buz! Onun qəlbi üçün qışla baharın fərqi yoxdur.

Kərim (*gəlir və Rəfiqənin dalınca qışqırır*). Qızım, hara?.. Yəqin xəstəyə baş çəkməyə getdi. Yoxsa, mənim şad günümdə... (*Kədərli*) Deyəsən bu xəstə o birilərinə heç bənzəmir...

Ə m i n. Düz buyurursunuz, Kərim dayı. Bu gün işdən çıxanda xəstəxananın yanında dayanıb, Rəfiqə xanımın yolunu gözləyirdim. Bir həkimə rast gəldim. Dedi ki, Rəfiqə xanımın başı bərk qarışıqdır. Cərrahiyyə otağına bir nəfər məhbus gətiriblər, onu operasiya eləyir. Siz eşitməmisiniz?

K ə r i m. Məhbus?

Ə m i n. Bəli.

K ə r i m. O kimdir, elə?

Qonaqlar dəstə-dəstə gəlir və əl verib görüşürlər.

K ə r i m (*həyəcanlı fikirlərdən ayrılmağa çalışaraq*). Buyurun, hər kəs bəyəndiyi yerdə əyləşsin.

B ə d ə l (*yarımsərxoş halda, azca səndirləyərək*). Mən bu gün üçüncü dəfədir qonaqlığa çağrılıram. Ancaq düzünü deyim ki, hələ də yemək-içməkdən gözüm doymayıb. Bu fani dünyada Əfqanıstanınsa padşahı ola bilmədik.

F ə r m a n. Bədəl dayı, tutaq ki, oldun, neylərdin?

B ə d ə l. Çox şey. Vacib işlər o qədərdir ki...

F ə r m a n. Məsələn?

B ə d ə l. Əvvəlcə, bu içkidə bir qayda-qanun qoyardım.

F ə r m a n. Axı, necə, nə sayaq?

B ə d ə l. Bax, sizin heç biriniz içməyin qaydasını bilmirsiniz. Mən padşah olsaydım, fərman verərdim ki, bir səhər içsinlər, bir günorta, bir axşam, bir də hər vaxt...

F ə r m a n. Lap gecələr də?

B ə d ə l. Dedim hər vaxt!.. Gecə də vaxtdır, ya yox?

F ə r m a n. Ay Bədəl, bundan ötrü Əfqanıstanın padşahı olmağa dəyməz.

B ə d ə l. Niyə dəymir?

F ə r m a n. Ona görə ki, səni bircə günün içində taxtdan salarlar.

Ə m i n. Böyük alman filosofu Kantın transendental fəlsəfəsinə görə padşahlıq – absolyut ideya məfhumuna ziddir. Hakimiyyət müvəqqətidir. Müvəqqəti hakimiyyətdən nə çıxar?

B ə d ə l. De gəlsin, qardaş oğlu, bu cür kəmsavadlara bir filosof lazımdır ki, hamısını cəhalət yuxusundan oyatsın.

Ə m i n. Yox, Bədəl dayı, indi hər yerdə axmaq padşahların qopa-rağını götürürlər.

B ə d ə l. Qulaq asın, axmaq padşah barəsində sizə bir əhvalat danışım.

S ə s l ə r. Danış... Danış... (*Hamı Bədəlin başına yığılır*)

Ə m i n (*telefonun dəstəyini götürür*). Xəstəxananı verin... Gözləyirəm... Kimdir danışan?.. Növbətçi həkim? Əgər mümkündürsə, bir sualıma cavab verin. Bu gün Rəfiqə Rəhimlinin yardığı xəstə kimdir?.. Məhbus olduğunu bilirəm. Məni adı, familiyası maraqlandırır. Bəli, bəli...

Kərim Rəhimli həyəcanla dinləməyə başlayır. Qonaqların səs-küyü sözlərin aydın eşidilməyinə mane olur.

K ə r i m. Bir az sakit!..

Pauza

Ə m i n. Necə, necə? (*Məyus*) Çox sağ olun.

K ə r i m. Kimdir?

Ə m i n. Cəlal Qaşqay... İlk məhəbbət heç zaman unudulmur.

K ə r i m. Doğrudan odur?

Ə m i n. Bəli, sizin keçmiş mühəndisiniz Cəlal Qaşqay!

B ə d ə l. Əgər mən Əfqanıstanın padşahı olsaydım... Yaxşı, kimi

gözləyirik, Kərim qağa? Deyirəm başlayaq. Onsuz da bilirəm ki, tamada məni seçəcəksiniz... Oturun, əziz qonaqlar! Xahiş eləyirəm qədəhlərinizi doldurasınız... Buraya yığışmaqdan məqsədimiz yəqin ki, hamınıza məlumdur. Bu gün hörmətli müdirimiz Kərim Rəhimli yüksək mükafat almışdır. Onun görkəmli xidmətlərinə verilən bu qiymət hamımımzı hədsiz dərəcədə sevindirir. Sağ ol, Kərim qağa.

U s t a  Ə l i ş. Biz çox gözəl bilirik ki, ipək fabrikimizin yaranmağında Kərim dayının fədakar zəhməti doğrudan da təqdirəlayiqdir.

F ə r m a n. O, saçlarını da fabrikdə ağardıb.

B ə d ə l. Vətən və xalq yolunda canını və qanını əsirgəməyən insanlara eşq olsun!

Ə m i n. Əlavəm var. Onu da deyim ki, əlli dördüncü ilin yanğını... (*Bu anda qapı ağzında Fərhad Kamalov görünür. Əmin Bəxtiyarov sükut edərək, onun üzünə baxır. Tədricən hamının gözü Kamalova zillənir. Aralığa uzun bir sükut çökür*)

F ə r h a d. Üzr istəyirəm, qapınız açıq olduğu üçün zəngi basmadım. Mənə vətəndaş Rəhimli lazımdır.

K ə r i m. Rəhimli mənəm. Buyurun, əyləşin.

F ə r h a d. Heç kimin sevincinə mane olmaq fikrində deyiləm. Mən sonra da gələ bilərəm.

K ə r i m. Yox, yox, əyləşin, qonağım olun.

F ə r h a d. Mən sizə zəng eləmişdim.

K ə r i m. Bilirəm, Fərhad...

F ə r h a d. Bəli, bəli, Fərhad Kamalov.

K ə r i m. Bağışlayın. Mənimlə təcili görüşməkdən məqsədiniz nədir?

F ə r h a d. Mən respublika prokurorluğundan gəlmişəm.

K ə r i m. Axı, mən...

F ə r h a d. Siz yeni şəhər Nərimanabadın ipək fabrikində müdir vəzifəsində çalışırsınız, deyilmi?

K ə r i m. Bəli.

F ə r h a d. Deməli, mən yanılmamışam.

K ə r i m. Xeyr, yanılmamısınız...

F ə r h a d. Sizdən bəzi suallara cavab almalıyam.

Pauza

K ə r i m (*pərtliyini gizlətmək üçün Kamalova yaxın gələrək, onun qolundan tutur*). Buyurun, əyləşin... Yəqin bugünkü qəzetləri oxumusunuz.

F ə r h a d. Bəli, oxumuşam. Sizin haqqınızda Ali Sovetin Rəyasət Heyəti fərman verib.

K ə r i m. Bu münasibətlə yığışıb, bir-iki saat şadlıq eləmək istəyirik. Buyurun, siz də bəyəndiyiniz yerdə əyləşin. Kasıbın olanından...

F ə r h a d. Təşəkkür eləyirəm. Bu mümkün deyil. (*Qonaqları göstərərək*) Belə bilsəydim gəlməzdim. Hələlik. (*Getmək istəyir*)

K ə r i m. Əgər mümkünsə, dayanın... Oxu atıb yayı gizlətmək nahaqdır. Bilmək istəyirəm ki, hansı suallara cavab verməliyəm.

F ə r h a d. Mən sizi tələsdirmirəm. Sabaha qədər gözləyə bilərəm. (*Gedir*)

K ə r i m. Qonaqlardan üzr istəyirəm... (*Kamalovun dalınca gedir*)

A m b a r d a r. Zalım oğlu keyfimizə soğan doğradı... Deyilənə görə Bakıdan Cəlal Qaşqayı gətiriblər. Yolda onu bərk ağrı tutub, xəstəxanaya aparıblar... Fabrikin həngaməsi təzədən başlanacaq.

Ə m i n. Həyəcanınız yersizdir. Burada nəyi isə dolaşıq salıblar. Kərim dayı büllurdan da saf adamdır. (*Çıxır*)

U s t a Ə l i ş. Fərhad Kamalovu yaxşı tanısaydınız, bu sözləri deməzdiniz. Respublika prokurorluğunda mühüm işlər üzrə müstəntiqdir. O, heç nəyi dolaşıq salmır. Əksinə, ən dolaşıq düyünləri açmaqda mahirdir.

B ə d ə l. Bu fani dünyanın bütün işləri dolaşıqdır. Deyirəm, gedək. Bu cür qan qaraltısından sonra boğazımızdan heç nə ötməz... Eh, Əfqanıstanın padşahı ola bilmədik.

Qonaqlardan bəzisi durub getməyə hazırlaşır.

Ə m i n. Tələsməyin. Kərim dayı qayıdır.

U s t a Ə l i ş. Düzdür, qayıdır, amma rəngi-rufu özündə deyil.

K ə r i m (*çox məyus bir görkəmlə gəlir. Məclisin dağılmağa başladığını görüncə özünü ələ almağa çalışaraq*). Hara, dostlar? Əyləşin! Kim məni istəyirsə, bu halal süfrəmizi öz süfrəsi bilsin.

F ə r m a n. Kərim dayı, axı, o nə istəyir?

K ə r i m. Deyir ki, mən ondan xəbərsiz heç yana getməməliyəm.

F ə r m a n. Nə üçün?

Ə m i n (*tutularaq*). Sual-cavab sonraya qalsın. Götürün qədəhləri!..

B ə d ə l (*narahatlığını gizlədə bilməyərək*). Kərim qağa, ucdan-qulaqdan bir söz demədi?

K ə r i m. Bu barədə sonra danışarıq...

B ə d ə l. Əvvəlcədən bilsək pis olar?

Hamı Rəhimliyə baxıb cavab gözləyir.

K ə r i m. Fabrikdəki yanğın əhvalatını təzədən yoxlayacaq. Belə görünür ki, Cəlal Qaşqay ərizə verib.

Ə m i n. Necə yəni təzədən? İl yarım bundan əvvəl məhkəmə olub, hökm çıxıb. Cani həbsdədir!.. İndi nəyi yoxlayacaq? Niyə yoxlayacaq? Necə yoxlayacaq?

## İKİNCİ ŞƏKİL

Kiçik bir otaq. Tək stol. Üç stul. Otağın həyətə açılan pəncərəsindən meyvə ağaclarının çiçəkli budaqları görünür. Kamalov və Rəhimli. Çoxdan başlanmış sual-cavab davam edir.

K ə r i m. Siz elə danışırsınız ki, guya fabrikin yanmağında müqəssir mənəm.

F ə r h a d. Xeyr, sizi təqsirləndirmək üçün əlimdə əsas yoxdur.

K ə r i m. Canım-gözüm, bəs niyə mənimlə belə tünd danışırsınız? Axı, bilmək olmazmı bu həngamə nədən ötrüdür?

F ə r h a d. Vətəndaş, Rəhimli, sualları mən verirəm. İstintaqın qaydasını pozmayın. Belə getsə, tək mənim yox, elə sizin də vəziyyətiniz ağırlaşa bilər. Sizdən yalnız bir tələbim var.

K ə r i m. Mənim də sizdən bir xahişim var: qızımı bu işə qarışdırmayın.

F ə r h a d. Bu mümkün deyil.

K ə r i m. Nə üçün?

F ə r h a d. Dedim ki, sualı mən verəcəyəm! Siz Rəfiqə xanımın Cəlal Qaşqayı sevdiyini bilmirdiniz?

Pauza

K ə r i m. Xeyr, bilmirdim. Bunu sizdən eşidirəm.

F ə r h a d. Fikirləşin. Bəlkə yadınıza düşdü. Mən tələsmirəm

Pauza.

Nahaq əyləşmirsiniz. Sizə əziyyət olar.

K ə r i m. Yorulmamışam. Lazım deyil... Yenə təkrar eləyirəm: mənim bundan xəbərim yoxdur. Siz yanılırsınız. Rəfiqə, Qaşqayı hansı məziyyətlərinə görə sevməli idi? Dövlətə bu qədər ziyan vurmuş adamı mənim qızım – Kərim Rəhimlinin qızı necə sevə bilərdi?

F ə r h a d. Demək, qızınızdan Cəlal Qaşqay barədə heç bir söz eşitməmisiniz?

K ə r i m. Xeyr, Rəfiqə indi də ürəyini mənə açıb söyləməyə utanır. Bizim aramızda hələ pərdə var.

F ə r h a d. Bəlkə sizdən qorxur?

K ə r i m. Niyə qorxur? Cin deyiləm, şeytan deyiləm. Mən ona neyləyirəm ki? Utanır. Çünki ismətlidir, həyalıdır... Əgər doğrusunu bilmək istəyirsinizsə, mən ondan qorxuram.

F ə r h a d. Niyə ki, axı o da cin deyil, şeytan deyil. Nə üçün qorxursunuz?

K ə r i m. O mənada qorxuram ki, Rəfiqə səndən də, məndən də ağıllıdır. Ona hər sözümü yüz yol ölçüb-biçəndən sonra deyirəm.

F ə r h a d. Bu başqa məsələ. Deməli, aranızda pərdə yox, uçurum var.

K ə r i m. Eh, yoldaş Kamalov, siz mənimlə söz güləşdirirsiniz. O mənim yeganə balamdır. Hələ iki yaşında ikən anası rəhmətə gedib.

Mən ona həm ata, həm ana olmuşam. Hansı qonşumuzdan xəbər alsanız, bunu təsdiq eləyə bilər... Bakıda, Tibb İnstitutunda oxuduğu zaman, bir gün də onu korluq çəkməyə qoymamışam... İnsafən o qədər tələbkarlığı da yoxdur. Artıq bəzək-düzəkdən də xoşu gəlməz. Ona hər ay müntəzəm pul göndərərdim. Meyvələrin nübarını özümdən qabaq ona yedirərdim. Hər ay da olmasa, iki aydan bir yanına gedib halını-əhvalını öyrənərdim. Onu bura təyin elətmək üçün, səhiyyə nazirinə düz bir saat dil çıxarıb yalvarmışam. Axı, insaf da dinin yarısıdır. Aramızda niyə uçurum olsun?.. Uçurum... Qəribə sözdür...

F ə r h a d. Mən dediklərinizin hamısına inanıram. Amma yenə də sualımı cavabsız qoydunuz. Rəfiqə xanımla Qaşqayı heç vaxt bir yerdə görməmisiniz?

K ə r i m. Xeyr,

F ə r h a d. Bax, bu sözün doğruluğuna inana bilmirəm.

K ə r i m. Niyə inanmırsınız? Yoxsa mən boyda kişi saçının bu ağ vaxtında yalan danışır?

F ə r h a d. Vətəndaş Rəhimli, mən sizə yalançı demədim. Bircə dəqiqə bundan qabaq siz özünüz Rəfiqə xanımı necə böyüdüb, boya-başa çatdırdığınızı yanıqlı-yanıqlı danışdınız. Məlum oldu ki, siz onun hər addımına göz qoymusunuz, onun əhvali-ruhiyyəsində əmələ gələn ən xırda dəyişikliyə diqqət yetirmisiniz. Elədirmi?

K ə r i m. Elədir.

F ə r h a d. Bəs onda necə ola bilər ki, qızınızın məhəbbət macərası sizdən gizli qalsın?.. Mən bir hadisəni sizin yadınıza salmaq istərdim...

K ə r i m. Nəyi?

F ə r h a d. Cəlal Qaşqay təzə çeşidləri sizə göstərəndə Rəfiqə xanım ordaydı, ya yox?

K ə r i m (*başını aşağı salıb susur*). Ola bilsin ki, ordaydı... Yaxşı xatirimdə deyil.

F ə r h a d. Rəfiqə xanım, yəqin ki, bu hadisəni çox gözəl xatırlayır. Bu dəqiqə onu çağırım, gəlsin.

K ə r i m. Yox, yox! Qızımla məni üzləşdirmək? Qəti etiraz eləyirəm!..

F ə r h a d. Sakit, vətəndaş Rəhimli, sakit! Sizə də, Rəfiqə xanıma da bir nöqtə qədər ziyan toxunmayacaq. (*Qapıya sarı gedir, birdən Rəhimliyə üz tutaraq*) Lakin şərtim var.

K ə r i m. Nə şərt?

F ə r h a d. Ona təzyiq göstərməməlisiniz! (*Qapını açaraq*) Rəfiqə xanım, bura zəhmət çəkin.

R ə f i q ə (*gəlir*). Buyurun.

F ə r h a d. Bilirəm ki, xəstəniz ağır vəziyyətdədir. Getməyə tələsirsiniz. Mən sizi çox saxlamayacağam. Əyləşin! Hələlik məni bir məsələ maraqlandırır: Cəlal Qaşqayla nə vaxt tanış olmusunuz?

R ə f i q ə. Yoldaş Kamalov, fabrikin yanmasının buna nə dəxli var?

F ə r h a d. Bəli, bunun yanğına bilavasitə dəxli yoxdur. Ancaq vətəndaş Qaşqayın taleyini aydınlaşdırmaq üçün mən bu faktı mütləq öyrənməliyəm. Axı siz onu sevmisiniz...

K ə r i m. Sevmisən, qızım?

F ə r h a d. Şərtimizi unutmayın, vətəndaş Rəhimli. (*Rəfiqəyə*) Sualıma cavab verin.

K ə r i m. Gördünüzmü o dinmir?

F ə r h a d. Rəfiqə xanım, buyurun cavab verin.

Pauza

K ə r i m. Yoldaş Kamalov, şahid suala cavab vermək istəmirsə...

F ə r h a d. Buna onun ixtiyarı yoxdur, vətəndaş Rəhimli.

K ə r i m. Canım-gözüm siz nə danışırsınız? İndi hansı dövrdür ki, hədə-qorxu ilə ifadə alasınız? Mənim qızımı nə üçün qısma-boğmaya salırsınız?

F ə r h a d. Hədə-qorxu yolu ilə iş görmək adətim deyil. Əgər belə olsaydı, mən ən böyük nailiyyətimi də adi bir zəiflik nişanəsi sayardım... Mənim buna heç vaxt ehtiyacım olmayıb. Hətta şəxsiyyətə pərəstiş dövründə də... Məni yalnız həqiqət maraqlandırır. (*Rəfiqəyə*) Vətəndaş Qaşqayı xilas üçün göstərdiyiniz fədakarlıqdan mənə müfəssəl danışdılar. Siz onu operasiya eləyəndə, qeyri-adi bir həyəcan keçirmisiniz, deyilmi?

R ə f i q ə. Doğrudur.

F ə r h a d. Yəqin ki, bu həyəcan səbəbsiz deyildi.

R ə f i q ə. Vətəndaş Qaşqayın vəziyyəti çox ağırdı. Ürək zirvəsində ilişib qalmış qəlpəni çıxarmaq sizə zarafat gəlməsin. Mənim cüzi bir səhvim nəticəsində xəstə cərrahiyyə stolundan qalxmaya da bilərdi.

F ə r h a d. Elədir. Siz gecəli-gündüzlü işə can yandırırsınız. Yoldaşlarınız sizinlə ürəkdən fəxr eləyir. İstedadlı bir cərrah kimi mən

də sizə hörmət eləməyi özümə borc bilirəm. Ancaq siz həqiqəti gizlətməməlisiniz.

K ə r i m. Bax, bax, indi də başqa üsula əl atır. Əvvəlcə hədə-qorxu gəldi, gördü bir şey çıxmır. O saat yağlı dilini işə salıb, qızın qoltuğuna qarpız verməyə başladı. Canım-gözüm, axı mən sizə dedim ki, onun Qaşqay adında sevgilisi olmayıb. Mən sizə tamam rəsmi deyirəm!

R ə f i q ə. Ata, nahaq əsəbiləşirsən. Səbr elə!

K ə r i m. Belə müsibət olar? Qızım, bu bizə nə verib, ala bilmir?.. Səhərdən bəri fabrikin işi qalıb bir yanda, siz də başlamısınız caninin birini mənim qızıma calamağa... Dünən xidmətinə görə Lenin ordeni al, bu gün səni salsınlar çək-çevirə... (*Əllərini dizinə çırparaq*) Pay atonnan, mən bilmirəm niyə bu adam qır-saqqız olub yapışıb yaxamızdan?

F ə r h a d. Vətəndaş Rəhimli, mən qızınızı ayrılıqda da dindirə bilərdim. Sizə hörmət etdiyim üçün bayıra çıxarmadım. Mənə belə sözlər demək nə dərəcədə ədəb-ərkana uyğundur?

K ə r i m. Mən mərkəzə protest göndərəcəyəm!..

F ə r h a d (*qrafindən stəkana su töküb, Kərimə uzadır*). Buyurun, için.

K ə r i m. Mən çiy su içmirəm. (*Əlini ağzına tutaraq*) Yaxşı, mən kiridim.

R ə f i q ə. Mən getməliyəm, yoldaş Kamalov. Əgər Cəlal Qaşqayın taleyi sizi bu qədər maraqlandırırsa, izin verin gedim, kömək eləyim. Onun vəziyyəti indi də ağırdır.

F ə r h a d. Yaxşı, buyurun.

R ə f i q ə. Atacan, mən inanıram ki, müstəntiq yoldaşı yalnız həqiqət maraqlandırır. Hələlik... (*Gedir*)

F ə r h a d (*Rəfiqənin ardınca baxa-baxa, fikirli*). Qızınız doğrudan da tərifəlayiqdir. Xoşbəxt olsun!.. İndi siz... (*Bu anda pəncərədən içəriyə daş atırlar. Fərhad Kamalov cəld addımlarla o tərəfə yönəlir, amma heç kəsi görə bilmir. Daşı götürür. Ona sapla bir kağız parçası bağlanmışdır. Fərhad kağızı açıb, səssizcə gözdən keçirir. Son dərəcə təmkinlə Kərim Rəhimliyə müraciət edir*) Deyin görüm, məni hədələyən kim ola bilər, hə?

K ə r i m (*təhqirdən incimiş kimi*). Küçədəki avaralarla yaxınlığım yoxdur.

F ə r h a d. Mən indi həqiqəti daha inadla axtarmağa çalışacağam.

K ə r i m. O sizin öz işinizdir.

F ə r h a d. İstəyirsiniz alın, oxuyun, bəlkə xəttini tanıdınız. Bəlkə dostlarınızdandır?

K ə r i m. Mənim dostlarım belə sarsaq iş tutmaz.

F ə r h a d. Bilirsinizmi nə yazır?

K ə r i m. Bilmirəm, bilmək də istəmirəm!

F ə r h a d. Hər halda xəbəriniz olsa yaxşıdır. (*Oxuyur*) "Hələlik gec deyil. Meyitin yerə sərilməmiş, çıxıb getməyin məsləhətdir".

K ə r i m (*qeyri-ixtiyarı maraqlanaraq*). Sizcə bunu kim yaza bilər?

F ə r h a d (*acı-acı gülümsəyərək*). Məni hədələyən, görünür o qədər də ağıllı adam deyil. Onun səbirsizliyi mənim şübhəmi daha da artırdı. Günahsız adam istintaqdan nə üçün qorxsun?

K ə r i m. Doğrudan da, "Qarğa, məndə qoz var" buna deyiblər.

F ə r h a d (*qapını açaraq*). Əmin Bəxtiyarov kimdirsə, buyursun! (*Kərimə*) Baş mühəndisiniz necə işləyir?

K ə r i m. Bacardığı qədər.

F ə r h a d. Bir az da dəqiq desəniz?

K ə r i m. Narazı deyiləm.

F ə r h a d. Dostsunuz, eləmi?

K ə r i m. Vicdanla çalışan adamların hamısını özümə dost bilirəm.

F ə r h a d. Əmin Bəxtiyarovu da?

K ə r i m. Bəli. Sualınızın ahəngində nə isə bir istehza duyulur. Bunun mənasını başa düşmədim.

F ə r h a d. Tələsməyin.

Ə m i n (*gəlir*). Mən hazır, yoldaş Kamalov.

F ə r h a d. Buyurun, əyləşin.

Ə m i n. Təşəkkür eləyirəm. mən ayaq üstə də dura bilərəm.

F ə r h a d. Fabrikdəki yanğına dair izahatınızı oxudum. Qələminiz pis deyil. Əlbəttə daha müfəssəl yazmaq olardı... Müdiriniz sizdən razılıq eləyir... Bunlar öz yerində... Siz, vətəndaş Bəxtiyarov, nədən bilirsiniz ki, Rəfiqə xanım Nərimanabad ipək fabrikinin sabiq baş mühəndisi Cəlal Qaşqayı sevirmiş?

Ə m i n. Mən bunu harda, kimin yanında demişəm?

F ə r h a d. Sizə təəccüblü görünməsin. Zahirən baxanda, bu sualın əsil mətləbə dəxli yoxdur. Sizdən əvvəl də şahidlərdən biri məni günahlandırdı. Amma bir düyünü açmaq üçün bu, mənə hava, su qədər lazımdır... Hə, bu barədə nə deyə bilərsiniz?

Ə m i n. Heç bir şey, yoldaş Kamalov... Əslinə baxsanız, Cəlal Qaşqayın məhəbbət macərası mənə çox gülməli görünür.

F ə r h a d. Necə məgər?

Ə m i n (*gülə-gülə*). Qaşqay sir-sifətdən o qədər eybəcərdir ki, ona vurulan qızın səmimiyyətinə inanmaq çətindir.

F ə r h a d. Deyilənə görə, siz fəlsəfə ilə məşğul olmağı sevirsiniz.

K ə r i m. Əmin alman filosofu Kantdan hər gün təzə-təzə misallar gətirir. Yaxşı da yaddaşı var, mən ona qibtə eləyirəm.

F ə r h a d (*Əminə*). Əgər fəlsəfədən başınız çıxırsa, gərək sadə bir həqiqəti biləsiniz: gözəllik də nisbidir. Çox ola bilər ki, Cəlal Qaşqay sizə çirkin görünsün, amma bir başqasına gözəl. Bu mümkündürmü?

Ə m i n. Bəlkə də... Ancaq mən inana bilmirəm ki, Cəlal Qaşqaya gözəl deyən əcayib bir insan tapılsın. Kantın transendental fəlsəfəsinə görə, gözəllik məfhumu obyektiv kateqoriyadır!..

F ə r h a d (*Kərimə*). Baş mühəndisinizin hər gün Kantdan gətirdiyi misallar da belədirsə, mən onun fəlsəfi biliyinə qibtə eləmirəm.

Pauza

Bu barədə mübahisə eləmək fikrində deyiləm... Dünən axşam sizin qapınızın ağzında dayanmışdım. İçəri girməyə tərəddüd eləyirdim. İstər-istəməz sizin söhbətinizi eşitdim. Əlbəttə, vətəndaş Bəxtiyarov, siz bilsəydiniz ki, bu gün həmin sözləri yadınıza salacağam, şübhəsiz bir az ehtiyatlı tərpənərdiniz, deməzdiniz ki, "ilk məhəbbət heç bir vaxt unudulmur".

Ə m i n. Bəlkə də demişəm. Bundan o nəticə çıxır ki, mən Qaşqayı, Rəfiqə xanımı nəzərdə tuturdum?

F ə r h a d. Siz elə o dəqiqə Cəlal Qaşqayın adını çəkdiniz. Deyək bu da o qədər böyük sübut deyil... Siz bu barədə yazmısınız da.

Ə m i n. Harda, nə vaxt?

F ə r h a d (*kağız qovluğundan zərf çıxardır*). Siz buna sevgi məktubu deyəcəksiniz, ancaq mən müstəntiq olduğum üçün, mənim nəzərimdə bu adi bir sənəddir. (*Kağızı Əminə göstərir*) Xəttinizə söz ola bilməz. Aydın. Səliqəli. Siz yazmısınız, yox?

Ə m i n (*təəccüb içində donub qalır*). Düzdür, mən yazmışam.

F ə r h a d. Elə isə etiraf eləyin ki, mənim sualıma doğru cavab verməlisiniz.

Ə m i n. Bu məktub hardan əlinizə düşüb? Mən onu sizə yox, Rəfiqə xanıma yazmışam.

F ə r h a d. Tamamilə doğrudur.

Ə m i n. Nə üçün mənim zərfimi açıb oxumusunuz? Sizin bu hərəkətiniz sovet adamının mənəvi prinsiplərinə ziddir.

F ə r h a d (*gülümsəyərək*). Məktubu mən açmamışam. Hardan aldığımı isə deyəcəyəm. Tələsməyin. Cavab verin.

Ə m i n. Axı nə cavab verim? Rəfiqə xanım hara, Qaşqay hara? Bu mənfur simanın adını dilimə gətirəndə qəzəbimdən titrəyirəm. Doğma dövlətimizin iqtisadi qüdrətini zəiflətmək üçün fabrikimizi yandıran bir xəbislə Rəfiqə xanımın adını yanaşı çəkmək? Sizdə insaf yoxdurmu? Mənim nəzərimdə Qaşqay xəyanət mücəssəməsi, Rəfiqə isə gözəllik və səadət nümunəsidir!

K ə r i m (*özünü saxlaya bilməyərək*). Sağ ol, Əmin. Əhsən! (*Fərhada*) Yoldaş Kamalov, mən tamamilə rəsmi deyirəm: qızım Rəfiqə Qaşqayı nəinki sevmir, hətta ona nifrət eləyir!

F ə r h a d. Vətəndaş Rəhimli! Rəfiqə xanım heç birinizi vəkil eləməyib.

K ə r i m. Canım-gözüm, bu nə danışır! Olmaya sizi vəkil eləyib?

F ə r h a d. Məni də yox. Amma bu zərfi mənə verən odur!

K ə r i m. Necə?!.

F ə r h a d. Bəli, bəli. Qızınız öz məhəbbətini sizdən gizlədir, amma məndən gizlətmir! (*Əminə*) Mənim fikrimcə sevgi məktubu yazmaq qəbahət deyil... Elə düşünməyin ki, hüquqşünaslar ülvi duyğulardan məhrum, kobud, daşürəkli insanlardır. Xeyr. Mən istərdim ki, Rəfiqə xanım kimi nadir təbiətli qızlarımız sevib bəyəndiyi adamlara qovuşsunlar... Amma sizin bu məktubunuzdan görünür ki, o sizi sevmir. Bəli, bəli, sevmir, vətəndaş Bəxtiyarov. Alın, oxuyun!..

Ə m i n. Lazım deyil. Mən öz sözlərimi yaxşı xatırlayıram.

F ə r h a d. Elə isə qoy Rəhimli eşitsin. (*Məktubu oxuyur*) "Rəfiqə, əzizim, mən bu soyuqluğunuzu görəndə, Cəlal Qaşqaya lənət yağdırıram. O hələ də bizim aramızda bitmiş tikan koluna bənzəyir". Eşidirsinizmi? Doğrudur, bu sözlər o qədər orijinal deyil, siz bunları "Əsli və Kərəm" dastanından iqtibas eləmisiniz, amma fikrinizi anlamaq mümkündür: Rəfiqə xanım sizi yox, Qaşqayı sevirmiş!

Ə m i n. Siz bu məktubu alıb oxuyanda heç utanmadınızmı? Başqasının sirləri ilə maraqlanmaq... Bu dövrümüzün etikasına uyğundurmu?

F ə r h a d. Dövrümüz... Etika... Nə qədər mənalı sözlərdir. Amma siz, vətəndaş Bəxtiyarov, unutmayın ki, müstəntiq həqiqət naminə hər bir sirlə maraqlanmalıdır. O bəzən xirtdəyəcən çamurluğa da batmağa məcbur olur. Lənətə gəlmiş xüsusi mülkiyyət hissi cinayət də törədir, cani də... Müstəntiq, caninin keçdiyi yolları gərək addım-addım, qarış-qarış gəzsin. Budur onun müqəddəs devizi!.. O, qan izinə rast gələndə, hədədən, ölüm təhlükəsindən çəkinib, yolundan geri dönə bilməz! Mərdlik və səadət – budur onun ən böyük tanrısı!..

K ə r i m. Tutaq ki, mənim qızım Cəlal Qaşqayı sevirmiş. Sonra? İndi ki, sevmir...

F ə r h a d. Siz nə qədər səbirsizsiniz, vətəndaş Rəhimli. Təsadüfən, ananız sizi yeddi aylığınızda doğmayıb? (*Gülür*)

K ə r i m. Zarafatın yeri deyil!.. Hələ bir gülürsünüz də!

K ə r i m. Yox, yox!.. O mənim alın tərimlə, qanımla, illər boyu, gecəli-gündüzlü, istirahət bilmədən yaratdığım fabriki yandıran qəddar bir canini sevə bilməz!

F ə r h a d. Siz ata da olsanız, bu ixtiyarı qızınızdan ala bilməzsiniz... Özünüzü nə üçün aldadırsınız?

K ə r i m. Ah, bu qızlar... Atalar yaxşı deyib: "Qız yükü, duz yükü".

F ə r h a d. Mən olub-keçmiş hadisələri yadınıza salmaq üçün, hamınızı 1954-cü ilə qaytarmalıyam. Qulaq asın, sizi bu ərizənin məzmunu ilə tanış eləyim. (*Kağız qovluğundan əllə yazılmış bir material çıxardır, aramla oxumağa başlayır*) Mən atalar sözü ilə başlamaq istəyirəm: "Doğruya zaval yoxdur, çəksələr min divana". O vaxt mən ipək fabrikində baş mühəndis idim. Əmin Bəxtiyarovla mənim aramda ciddi münaqişə başlanmışdı. Təsadüfən, bir hadisə bu toqquşmanı daha da şiddətləndirdi. Bəxtiyarov Əsmər adlı bir qızla görüşürdü...

## İKİNCİ PƏRDƏ

### ÜÇÜNCÜ ŞƏKİL

Yarımqaranlıq küçə. Əmin Bəxtiyarov təkdənbir arxasına baxa-baxa gedir, Əsmər onun ardınca gəlir.

F ə r h a d (*səhnə qabağında*). Elə zənn eləməyin ki, mən o vaxt burdaydım. Yox. Mən də sizinlə bərabər indi 54-cü ilə qayıtmışam. Yanğından bir neçə gün əvvəl onlar fabrikdən xeyli aralı, hücrə və qaranlıq bir küçədə görüşdülər.

Ə s m ə r. Əmin, dayan!

F ə r h a d. Əsmər, ucadan çağır. Qoy başqaları da eşitsin. Bəxtiyarov utandığından yox, qorxusundan dayanacaq.

Ə s m ə r. Dayan deyirəm, Əmin!..

F ə r h a d. Bax, belə. Görürsünüzmü, mən haqlıyammış. O dayandı.

Ə m i n (*Əsməri yalnız indicə tanıyırmış kimi*). Hə, sənsən? Qaranlıq küçədə tək neyləyirsən? Sən ki, konsertdən fəhlələrlə bir çıxdın. Səni niyə evinizə ötürmədilər?

Ə s m ə r. Mən özüm onlardan ayrıldım. Burda dayanıb səni gözləmək istədim.

Ə m i n. Məni nə üçün gözləyirsən?

Ə s m ə r. Sözüm var. Üz-gözünü nahaq əyirsən. Mən səndən qorxmuram. Yaxşı qulaq as, Əmin. Sən alçaqsan!..

Ə m i n. Yavaş... Fəhlə ki, fəhlə. Ədəb yox, mədəniyyət yox!

Ə s m ə r. Sənin kimi "mədəni" olmaqdansa, çöldə heyvan kimi ot otlamaq yaxşıdır.

Ə m i n. Vay, sənin dilin nə yaman açılıb?.. Böyük alman filosofu İmmanuil Kantın transendental fəlsəfəsinə görə, heyvanla insanın fərqi...

Ə s m ə r. Kant da başına dəysin, onu fəlsəfəsi də!

Ə m i n. Avamlığa bax... Yaxşı, gələrsən evə, orda danışarıq.

Ə s m ə r. Mən bir də sənin evinə getməyəcəyəm.

Ə m i n. Səbəb?

Ə s m ə r. Hələ soruşursan da?.. İkinci dəfə təhqir olunmaq istəmirəm.

Ə m i n. Təhqir? Ən qəddar düşmənim belə sənin bu sözünə inanmaz.

Ə s m ə r. İnanmaz, çünki səni tanımaq çətindir. Sən sifətdən göyçəksən, ürəkdən çirkin.

Ə m i n. Dedim ki, gəl evə, orda danışaq.

Ə s m ə r. Dünən gəlmişdim. Kaş ayaqlarım sınaydı... Qapını döydüm, açmadın.

Ə m i n. Evdə yoxdum.

Ə s m ə r. Yalan deyirsən.

Ə m i n. Mən – yalançı? Belə ağır yükün altına heç vaxt girməmişəm.

Ə s m ə r. Bu yükü üstündən götürsələr, bir adın qalar, bir də familin!

Ə m i n. Vay, bu sözləri hardan öyrənmisən?

Ə s m ə r. Sənin alman filosofundan. Onun hər barədə sözü var. Amma səni yaddan çıxardıb...

Ə m i n. Uzatma. Dedim ki, evdə yoxdum.

Ə s m ə r. Qapın içəridən bağlı idi. Dedim, bəlkə yorulub yatmısan. Küçədə bir saatdan çox gözlədim. Soyuqda, qaranlıqda...

Ə m i n. Bax, bu doğrudur. Sonra?

Ə s m ə r. Elə bildim yuxudayam, məni qara basır. Gözlərimə inanmaq istəmədim. Gördüm sənin evindən çıxan qadın...

Ə m i n (*sanki dəhşətə gələrək*). Qadın?

Ə s m ə r. Bəli, bəli, qadın!..

Ə m i n. Sən dəli olmusan?

Ə s m ə r. Əgər bunu başqası desəydi, inanmazdım. Mən özüm o qadınla üz-üzə gəldim. Ömrümdə birinci dəfə kobud söz də işlətdim.

Ə m i n. Doğrudan da, səni qara basıb, Əsmər.

Ə s m ə r. Mən o qadına dedim...

Ə m i n. Yuxuda?

Ə s m ə r (*çılğın*). Yox!..

Ə m i n. Sus!.. Aləmi bura yığmaq istəyirsən?

Ə s m ə r. İndi mən öz doğma anamın da üzünə baxa bilmirəm. (*Ağlayır*)

F ə r h a d (*səhnə qabağında*). Ağlayırsan, Əsmər?

Ə s m ə r (*özünü ələ alaraq*). Yox, ağlamayacağam! Səndən ötrü göz yaşı?.. Dəyməz... Əxlaqsız!

Ə m i n. Qışqırma deyirəm. Özün cəhənnəm, məni rüsvay eləyirsən...

Əsmər. Nə dedin? Özün cəhənnəm? Kaş insanda elə hünər olaydı ki, başqasının üzünə baxan kimi necə adam olduğunu biləydi. Özü də dərhal. Əgər mən bunu bacarsaydım, sənin yalan dillərinə aldanmazdım.

F ə r h a d. Elə bu? Sən deməyə söz tapmırsansa, əlin var. Heç olmasa Əminə tərs bir şillə çək. Vəd eləyirəm ki, bunun üçün sənə cəza verilməyəcək. (*Əsmər Əminə şillə vurur*) Bax belə!

Ə s m ə r. Alçaq!.. Mən səni bax, bundan ötrü görmək istəyirdim! (*Sürətlə gedir*)

F ə r h a d. Sizə elə gəlməsin ki, onu mən öyrətdim. Yox, Əsmər mənim səsimi eşidə bilməzdi... O, ürəyinin qəzəbini yalnız bu cür soyuda bilərdi... Bu hadisədən bir neçə gün keçdi. Əsmər daha fabrikə qayıtmaq fikrində deyildi. Əmin Bəxtiyarova rast gəlmək istəmirdi. Amma fabrikin baş mühəndisi Cəlal Qaşqayı görməyə ehtiyac duyurdu. Əsmər dərdini yalnız ona açıb deyə bilərdi. Qaşqaya ürəkdən inanırdı...

## DÖRDÜNCÜ ŞƏKİL

İpək fabrikində bir-birilə yanaşı iki otaq. Solda müdirin, sağda isə baş mühəndisin kabineti. Cəlal Qaşqay stolun dalında oturub, nə isə yazır. O, içəri girən Əsmərin ayaq səslərini eşidib başını qaldırır. Üzü yanmış, iri qara gözləri mərd və aydın bir ifadə ilə baxan, otuz beş-otuz altı yaşlarında, iri taxtalı bir kişidir.

C ə l a l. Əsmər, sən xəstə deyildin?

Ə s m ə r. İndi də xəstəyəm, Cəlal qardaş.

C ə l a l (*ayağa qalxıb ona tərəf gedir, əl verir, gətirib stolunun qabağındakı kürsüdə oturdur*). Həkim gəlmişdimi?

Ə s m ə r. Mənim xəstəliyimə həkimin köməyi dəyməz. Mən bədbəxt olmuşam.

C ə l a l. Bu nə sözdür, qız? Bədbəxt o adamdır ki, özündən başqa heç kimə xeyri dəymir. Sən hər gün toxuduğun ipəklə yüzlərcə insana fərəh gətirirsən. Bir azdan ali məktəbə gedəcəksən. Oxuyub mühəndis olacaqsan... Nə üçün özünü bədbəxt sayırsan?

Ə s m ə r. Bunu sənə deyirəm, Cəlal qardaş, sirrimi təkcə sənə açıram. Bəxtiyarov məni aldatdı... Mən rüsvay oldum... (*Ağlayır*)

C ə l a l (*donub qalır. Əsmərin sözlərini düz eşitdiyinə inanmır*) Rüsvay? Mühəndis Bəxtiyarov?

Ə s m ə r (*hıçqırığını güclə boğaraq*). Mən bəlkə də sənin yanına gəlməzdim, şikayət də eləməzdim... Ancaq istəmirəm ki, o sizi də aldatsın. Kərim dayı da, sən də onu yaxşı tanımamısınız... Ehtiyatlı olun. Mən onu xeyirxah, nəcib adam bilirdim. Amma onun sözü bir, əməli başqadır. (*Ayağa qalxır*) Nahaq ağlayıram. Mən doğrudan acizəmmiş...

C ə l a l. Bax, bunu düz deyirsən... Əyləş, əyləş. Gözləri qızarıb; belə getsən, hamı görəcək, hamı maraqlanacaq.

Ə s m ə r. Ərizə yazıb katibəyə vermişəm. Xahiş edirəm məni... Mən Bəxtiyarovla üz-üzə gəlmək istəmirəm. (*Bu vaxt Əmin müdirin kabinetinə girir. Əsmər aradakı qapıdan onu görür*)

C ə l a l. Fabrik onun deyil, sən heç yana getməyəcəksən!

Ə s m ə r. Yox, daha mən fabrikdə qala bilmərəm. Sağ ol, Cəlal qardaş. Mən səndən razı gedirəm. (*Gedir. Cəlal onun ardınca baxıb sükut edir. Əmin diqqətlə dinləyir*)

F ə r h a d (*səhnə qabağında*). Qaşqay, Əmin Bəxtiyarovun hərəkətlərindən onsuz da şübhələnməyə başlamışdı. Lakin onun bu dərə-

cədə pozulduğunu ağlına belə gətirmirdi. Güman eləmirdi ki, məsum qızların ismətini tapdalamağa cəsarəti çatar.

Ə m i n (*Cəlalın yanına keçir*). Sənə nə olub, Cəlal, niyə belə tutqunsan?

C ə l a l (*onun sözlərini dərk etməyərək, ağır bir nəzərlə baxa-baxa*). Sən namuslu adamsanmı, Əmin?

Ə m i n. Söhbətinizi eşidirdim. Hər şey üçün əsəblərini korlama.

C ə l a l. Doğma qardaşım da olsan, belə rəzil hərəkətin üçün səni bağışlamaram.

Ə m i n. O dedi, sən də inandın?

C ə l a l. Əsmər kimi ismətli bir qız heç kimə böhtan ata bilməz, xüsusən özünə!

Ə m i n. Mən sənin yanına daha mühüm bir iş üçün gəlmişəm.

C ə l a l. Bu saat mənim nəzərimdə Əsmərin taleyindən mühüm iş yoxdur.

Ə m i n (*kinayəli*). Doğrudanmı?

C ə l a l. Kənddən-kəsəkdən min əziyyətlə topladığımız qızları işdən qaçırdan bu cür ədəbsiz rəftar deyilmi?

Ə m i n. Bilirsən nə var? Sən nə qədər klassik demaqoq olsan da, mənim gözümə kül üfürə bilməzsən!.. Mənə bata bilməyəcəksən. Kərim dayı mənim xətrimi dünyalar qədər istəyir. Rəfiqə xanım geci-tezi mənə "hə" deyəcək, sənin planların alt-üst olacaq.

C ə l a l. Bu söhbətləri burax!

Ə m i n. Kərim dayı dünyasında sənə qız verməz.

C ə l a l. Bu fitnəni uydurmaqda məqsədin nədir? Mən Rəfiqə üçün elçi göndərmək fikrində olmamışam.

Ə m i n. Bəs nə üçün ayağımın altını qazıyırsan?

C ə l a l. Ayrı sözün yoxdursa, gedə bilərsən.

Ə m i n. Var. Araya söz qatdın, deməyə imkan vermədin... Fəhlələr protest eləyəcəklər.

C ə l a l. Nə üçün?

Ə m i n. Əmr verib şablonları dəyişdirmisən.

C ə l a l. Bəli. Peşman da deyiləm. İndi biz eksport üçün işləyəcəyik.

Ə m i n. Qədim bir məsəl var. Mən onu bir az müasirləşdirmişəm: "Allah birini cəzalandırmaq istəyəndə, əvvəlcə onu ağıldan məhrum eləyir". Sənə bu əmri kim verib?

C ə l a l. Heç kim. Mən hər barədə yuxarıdan əmr gözləmirəm. Arzum budur ki, mallarımız hansı ölkəyə göndərilsə, şöhrəti dillərə düşsün!

Ə m i n. Aha, belə söylə... Demək, Moskvadan buraya gələndə qarşına məqsəd qoymusan. Cəbhədə aldığın ordenlər azlıq edir. Görünür, iki cəbhənin qəhrəmanı olmaq fikrindəsən.

C ə l a l. Bəs insan nə üçün yaşayır? Elə bircə yeyib-yatmaq üçün?

Ə m i n. Fəhlələrə özün cavab ver. Kərim dayını da, məni də bu həngaməyə qarışdırma.

C ə l a l. Əgər məsuliyyətdən qorxursansa, ərizə yaz gətir, əvəzinə adam tapılar. Ərizə yazmasan, mən özüm əmr verəcəyəm!

Ə m i n. Əmini işdən çıxardan hələ anasından olmayıb!.. (*Müdirin kabinetinə keçir*)

C ə l a l. İliyinə qədər pozulub. Onu daha fabrikdə saxlamaq mümkün deyil!.. (*Gedir*)

F ə r h a d (*səhnə qabağında*). Qaşqay, Əmin Bəxtiyarovun çox şübhəli bir haqq-hesabla məşğul olduğunu hiss eləyirdi. Onun əliəyri adamlarla xosunlaşdığını az görməmişdi. Lakin bu xüsusda danışa bilmirdi. Çünki əlində tutarlı bir dəlil yox idi. Əmin Bəxtiyarov isə onun şübhələndiyini duymamış deyildi. Buna görə də Rəfiqə əhvalatını uydurmuşdu ki, Cəlalın guya qərəzli olduğunu sübut edə bilsin.

Ə m i n (*öz-özünə*). Cəlal Qaşqay canıma lərzə salır. Bəlkə parçaları satdırmağımdan xəbəri var? Bu tərəfdən də tərs kimi Əsmər məni qılınclayacaq. Yox, bir gün belə gecikmək olmaz. Bütün izləri itirmək lazımdır. Mən Cəlalı qabaqlayıb Əsməri Kərim dayının gözündən salmalıyam... Nə deyəcəyəm?

Pauza

Qısa bir cümlə. "Üzdən həyalı görünməyinə baxmayın, çoxdanın əxlaqsızıdır, indi də özünü mənə calamaq istəyir!".

F ə r h a d (*səhnə qabağında*). Əmin Bəxtiyarov! Məsum bir xilqətə böhtan atmaq? Hanı sizin vicdanınız?

Ə m i n (*öz-özünə*). Vicdan?! Nədir vicdan? Köhnə, çürük bir məfhum. Ancaq Əsmər üzümə dursa, məni vicdansızlıqda təqsirləndirsə? Hər halda Kərim dayı mənə inanacaq. Belə sadəlövhləri aldatmaq üçün böyük hiyləyə ehtiyac yoxdur.

R ə f i q ə (*gəlir*). Yoldaş Bəxtiyarov, atam hanı?

Ə m i n. Şəhər komitəsində.

R ə f i q ə. Dünəndən evə gəlməyib. Nigaranıq.

Pauza

Ə m i n. Rəfiqə xanım, deməliyəm ki, başa düşmədim.

R ə f i q ə. Nəyi, yoldaş Bəxtiyarov?

Ə m i n. Mənə salam vermədiniz. Niyə belə kəmiltifatsınız?

R ə f i q ə (*qeyri-müəyyən bir ifadə ilə*). Sizi görəndə hər şey yadımdan çıxır.

Ə m i n. Mənə qarşı qəzəbinizin çoxluğundan?

R ə f i q ə. Səbəbini soruşmayın.

Ə m i n. Soruşmağa məcburam. Əgər bayırdan gələn mən olsaydım, bunu tələb etməyə haqqım yox idi.

Pauza

R ə f i q ə. Cəlal Qaşqay buradadırmı? (*Baş mühəndisin kabinetinə baxıb qayıdır*) Yoxdur. Hara gedib görəsən?

Ə m i n. Özünüz baldan şirin, cavabınız zəhərdən acı.

R ə f i q ə. Mənim nəzərimdə kompliment kəsərsiz silahdır. Pas atmış mətbəx bıçağı kimi.

Ə m i n. Düz deyirsiniz. Acı söz qızları daha çox cəzb eləyir. Təəssüf ki, mən belə sözləri deməyə alışmamışam.

R ə f i q ə. Cəlal Qaşqay hara gedib görəsən?

Ə m i n. Qaşqay dilinizdən düşmür. Siz – mələk, Qaşqay – meymun. Yoxsa ona vurulmusunuz?

R ə f i q ə. Bilmək istəyirəm: siz nə üçün həmişə atamın kabinetində olursunuz? Burda nəyin keşiyini çəkirsiniz?

Ə m i n. Birdəfəlik deyin ki, meymuna tamaşa eləmək sizə daha çox zövq verir.

R ə f i q ə. Belə olsaydı, onda bütün günü sizə tamaşa edərdim.

Ə m i n. Oğlanların kobudluğuna birtəhər dözmək olar, amma zərif qızlar belə sözləri deyəndə...

R ə f i q ə. Dözə bilmirsiniz, eləmi?

Əm i n. Mən sizi sevirəm, Rəfiqə xanım.

R ə f i q ə. Nə üçün?

Ə m i n. Qəribə sualdır. Sevirəm, çünki gözəlsiniz.

R ə f i q ə. Mən sizi sevmirəm.

Ə m i n. Nə üçün?

R ə f i q ə. Çünki gözəl deyilsiniz.

Ə m i n. Bu sözü ilk dəfə sizdən eşidirəm. Mən çirkinəm?

R ə f i q ə. Bəli, təəccübünüz yersizdir. Siz meymundan da çirkin- siniz. (*Sürətlə gedir*)

F ə r h a d (səhnə qabağında). Bu cavab Əsmərin şilləsindən də bərk dəydi, lakin Əmin heç bir ağrı duymadı.

Ə m i n (*öz-özünə. İnamla*). And içərəm ki, onun Cəlala məhəbbəti kitabdan gəlmədir. O, Dezdemonaya təqlid eləyir. Orijinal görünmək istəyir... (*Düşüncəli*) Yoxsa doğrudan Cəlalı sevir? Şübhəm var... (*Cibindən çıxardığı boyunbağını gün işığına tutub parıldadır*) Mən əminəm ki, Rəfiqə bunu görsəydi, o acı sözlərin birini də mənə deməzdi. Bəs nə üçün mən bunu ona göstərmədim! (*Rəfiqənin dalınca çıxır*)

C ə l a l (*gəlir*). Bu müdir harda qaldı? (*Telefonun dəstəyini götürüb hara isə zəng etmək istərkən Gümrah gəlir*) Buyur, mənə görə qulluğun?

C ü m r a h. Yoldaş Qaşqay, sizə şikayətim var.

C ə l a l. Kimdən?

G ü m r a h. Bədəl dayıdan. Mühəndis Bəxtiyarovdan. Sizin özünüzdən. Belə də zülm olar? Niyə donluğumdan ayda iki yüz manat tutulsun? Mənim qazancım nədir ki, onun da üçdən birini verməsinlər?

C ə l a l (*zəngi basır*). Əyləş, əyləş, bu dəqiqə öyrənərəm.

G ü m r a h (*kövrələrək*). Atam naxoş, anam da ki, savadsız. Mən onları nə ilə dolandırım?

C ə l a l. Uşaq deyilsən ki? Kövrəlmək nədir? Yekə kişisən. Sənin yaşıdların qəhrəmanlıq eləyib, aləmdə məşhur olurlar. Ayıb deyil?

G ü m r a h. Elələri də var, mənim kimi biveclərі də. Hamı qəhrəman olmaz ki?

Katibə gəlir.

C ə l a l. Baş mühasibi çağırın. Maaş cədvəlini də gətirsin.

K a t i b ə. Baş üstə. (*Gedir*)

G ü m r a h. Belə insafsızlığı görəndə, adamın ürəyi dözmür. Axı, tək mən olsaydım, yenə dərd yarı idi. Bütün sex narazılıq eləyir.

Bədəl Sadayev gəlir.

C ə l a l. Maaş cədvəlini gətirmədin?

B ə d ə l. Xeyr.

C ə l a l. Niyə?

B ə d ə l. Camaata maaş verilir.

C ə l a l. Nə üçün bu oğlanın maaşından iki yüz manat tutmusunuz?

B ə d ə l. Brakı var.

G ü m r a h. Yoldaş Qaşqay, bu nə deyir? Hələ mənim əlimdən brak mal çıxmayıb. Doğrudur, mən özüm bivecəm, qəhrəmanlıq əlimdən gəlmir, amma dünyasında brakım olmaz.

C ə l a l. Malları özüm yoxlayacağam. (*Gümraha*) Sən get, qanunsuz bir qəpiyin də tutulmayacaq.

B ə d ə l. Adın nədir?

G ü m r a h. Mənim?

B ə d ə l. Bəli, sənin.

G ü m r a h. Gümrah.

B ə d ə l. Sənin nəyin gümrahdır? Bu boyda-buxunda da Gümrah olar? Ada bax. Gümrah!..

G ü m r a h. Əşi, atam-anam qoyan addır, mən neyləyim?

C ə l a l (*hər ikisinə*). Gedin. (*Bədələ*) Camaatı bizdən narazı salmaq da təzə metoddur?

Gümrah gedir.

B ə d ə l. Heç bilmirəm, neçə ağamız var. Bu fani dünyada Əfqanıstanınsa padşahı ola bilmədik. Hər yerindən qalxan bizi qapazlayır.

C ə l a l. Necə, necə? Əfqanıstan hara, sən hara?

B ə d ə l. Əşi, bir sözdür deyirəm də. Elə o saat padşah olmadım ki?

C ə l a l. Sən iş vaxtı da içirsən?

B ə d ə l. Yox içməmişəm... Hafiz Şirazi deyir ki, mən ömrümdə bir dəfə möhkəm içmişəm, yəni lül-qəmbər olub yıxılanacan. Amma hər gün içməyim paxmel üçündür.

C ə l a l. Səni bir də bu halda görsəm, öz bəxtindən küs.

B ə d ə l. Əgər məndə bəxt olsaydı, buxalter yox, padşah olardım də. (*Gedir*)

C ə l a l. Hiyləgər tülkülər!.. İndi də bu yolla fəhlələri narazı salmaq istəyirlər! (*Telefonla zəng eləyir*) Şəhər komitəsidir? Yoldaş Rəhimlin istəyirəm. Getdi? Çox sağ olun. (*Dəstəyi yerindən asır*)

R ə f i q ə (*gəlir*). Xoş gördük, Cəlal. (*Hərarətlə əl verir*) Atam dünəndən evə gəlməyib. Bura zəng eləməkdən yorulmuşuq. Cavab da vermir...

C ə l a l. Məruzəyə hazırlaşırdı... Bütün gecəni tək o yox, mən də yatmamışam... Bir qədər gözləyin, bu saat gəlir.

R ə f i q ə. Bəs siz... Mənə nə isə göstərmək istəyirdiniz...

C ə l a l. Hə... Xahiş eləyirəm, dayanın... Vaxtınız varsa...

R ə f i q ə. İşdən yenicə gəlmişəm, heç yana tələsmirəm.

Pauza.

Əsməri gördüm. Məndən iş istəyirdi. Ona neyləmisiniz?

C ə l a l (*tutularaq*). Ərizə verib... Mən onun fabrikdən getməyinə razı deyiləm. Ən mahir toxucumuzdur.

R ə f i q ə. Dedim ki, atam da səni buraxmaz. Uşaq kimi ağladı... Kim isə xətrinə dəyib... Nə varsa, siz də əsəbiləşmisiniz...

C ə l a l (*papiros yandırır. Qəzəbdən əli titrəyir*). Adamları tanımaqda olmur. Üzlərinə baxanda deyirsən, dünyada belə mədəni, belə nəzakətli insanlar az tapılar, amma əslində...

R ə f i q ə. Kimi deyirsiniz? Əsməri?

C ə l a l. Yox, Əsmər barədə belə sözləri deməyə mənim dilim varmaz. Mən özgə adamları deyirəm. Atanızı da, məni də aldadanlar var. Əvvəllər düşünürdüm ki, bəlkə yanılıram, ancaq bu gün hər şey mənə aydın oldu... Əmin Bəxtiyarovu yaxşı tanyırsınızmı?

R ə f i q ə. Şəhərimizdə onu tanımayan yoxdur.

C ə l a l. O mənada soruşmuram. Necə adamdır?

R ə f i q ə. Nə deyim, Cəlal? Mənə elə gəlir ki, Bəxtiyarovu tanımaq o qədər də asan deyil. Hər halda onunla ehtiyatlı dolanın. Bu saat fabrikin bağçasında gəzinirdim. Yandan çıxıb, ordan-burdan danışdı. Sonra mənə bir boyunbağı göstərdi. Deyir ki, nişan üçün alıb... Əlli min manata... Sizcə bu pullar hardandır?

Pauza.

Deyəsən atam gəldi.

K ə r i m (*gəlir*). Aha, qızım da burdadır... İclaslar məni lap həkdən saldı. Gəl otur, qızım.

C ə l a l. Yoldaş Rəhimli, bağışlayın... Qızınızla söhbətinizə mane oluram. Sizə bir sualım var.

K ə r i m. Buyur, Cəlal, buyur.

C ə l a l. Maaşların tutulmağından xəbəriniz varmı?

K ə r i m. Bəxtiyarov məlumat vermişdi. Brakların cəriməsi...

C ə l a l. Məni bağışlayın. Əmin Bəxtiyarov mənim tapşırığımla görülən hər bir işə mane olur, hər dəfə də sizin adınızdan danışır.

K ə r i m. Məsələn, nə deyir?

C ə l a l. Guya siz də təzə çeşidləri bəyənmirsiniz. Guya onların yarıdan çoxunu brak sayırsınız.

K ə r i m (*təəccüblə*). Mən?.. Görmədiyim bir şeyi necə bəyənməyə bilərəm? Hanı o mallar?

C ə l a l. Doğrudur, Əmin Bəxtiyarov fabrikdə çoxdan işləyir, ali məktəbi də məndən əvvəl qurtarıb, amma bu heç də meyar ola bilməz. O, fabrikin geridə qalmış, mühafizəkar adamlarını başına toplayıb, hər addımda işə əngəl törədir.

K ə r i m. Yoldaş Qaşqay, düzünü deyim ki, bu cür ikitirəlikdən xoşum gəlmir. Ümumi işin xətrinə adamlarla dil tapıb, bir-birimizə kömək eləsək, daha yaxşı olmazmı?

C ə l a l. Üzr istəyirəm, kollektivə qəsdən ikitirəlik salan adamlarla dil tapmaq çətindir. Əgər şüursuzluqdan belə eləsəydi, buna birtəhər dözmək olardı. Ancaq məsələ burasındadır ki, Bəxtiyarov bilə-bilə, qəsdən aləmi qarışdırır. O bunsuz yaşaya bilmir... Mən onun fabrikdə qalmağına razı deyiləm!

K ə r i m. Demisən ərizə verib getsin?

C ə l a l. Bəli, demişəm. Sözümün də üstündə möhkəm dururam.

K ə r i m. Məsləhət deyil, yoldaş Qaşqay.

C ə l a l. Elə isə, mən gedirəm!

Pauza

K ə r i m (*gülümsəyir*). Yəqin sən də əsəbiləşmisən, o da. Bu barədə daha arxayın bir vaxtda danışarıq... Bəs təzə çeşidli mallar hanı?

C ə l a l. Bu saat gətirəcəklər.

K ə r i m (*incə bir kinayə ilə*). Deməк indi eksport üçün işləyirik, hə?

C ə l a l. Bunu sizə kim dedi?

K ə r i m. Əmin Bəxtiyarov. Həyətdə rastlaşdıq.

C ə l a l. Simsiz teleqraf da belə işləmir.

K ə r i m. Bəs parçalar niyə gecikdi?

C ə l a l. Boyaları yaxşı qurumamışdı. Gözləməli olduq.

Fəhlələr və ustalar ipək parçaları gətirib stolun üstünə sərirlər. Əmin Bəxtiyarov hamıdan sonra gəlir.

K ə r i m. Bax, indi fikir demək olar.

C ə l a l. Rəfiqə xanım, mən sizin zövqünüzə inanıram. Buyurun, siz də baxın.

K ə r i m (*parçaları diqqətlə gözdən keçirərək*). Keyfiyyətinə heç bir sözüm yoxdur. Əhsən, əhsən!.. Əvvəlki növlərlə heç müqayisə eləmək olmaz. Bircə şeyə təəssüflənirəm.

R ə f i q ə (*təəccüblə*). Nəyə ata?

K ə r i m. Bu çeşidlər əvvəlkilərə nisbətən çax baha başa gəlir, qızım.

R ə f i q ə. Yəqin ki, baha da satılacaq, elə deyilmi?

C ə l a l. Yoldaş müdir, əgər etirazınız yoxdursa, əvvəlcə Rəfiqə xanımın rəyini dinləyək. Bir neçə anlığa onu gələcək müştərilərimizin nümayəndəsi hesab eləyək.

K ə r i m. Hə, necədir, qızım?

R ə f i q ə (*parçaların birini götürüb işığa tutur və bədəninə dolayır*). Atacan, əgər sən də mənim zövqümə inanırsansa, bu mallar bizim fabrikimizə dünya şöhrəti qazandıra bilər. Həm sadə, həm də yaraşıqlı!

Ə m i n (*Rəfiqənin sözlərinin səmimiliyinə inanmadığını bildirən kinayəli bir ifadə ilə*). Siz bunları doğrudanmı bəyənirsiniz?

R ə f i q ə. Bəyənmək azdır, yoldaş Bəxtiyarov. Bu xəsis boyaların gözəl ahəngini yaratmış rəssam qarşısında mən ehtiramla baş əyməyə hazıram.

Ə m i n. Mən sizin incə zövqlü bir xanım olduğunuzu güman eləyirdim. Bu boyaları xəsis deyil, yoxsul adlandırmaq daha düzgün olardı. Bir də, bu parçalar modda deyil.

R ə f i q ə. Ola bilər... Ancaq bizim fabrikimiz insanların zövqünü yüksəldən mallar buraxırsa, biz bunu yalnız alqışlaya bilərik... Unutmayın ki, rəngin çoxluğu şərt deyil. Əsil məharət – az rənglə zəngin hisslər oyatmaqdır. Bu parçaların gözəlliyi də elə bundadır.

K ə r i m (*qızının dərrakəsindən vəcdə gəldiyini gizlətməyərək*). Əmin, oğlum, Rəfiqəyə dil yetirə bilməzsən.

Ə m i n. Görürəm, görürəm, o, təzə çeşidlərə bərk vurulub.

R ə f i q ə. Biz həmvətənlərimizə nəfis geyinməyi də öyrətməliyik!

K ə r i m (*daha da ruhlanaraq*). Haqlısan, qızım. Gözəl parçalardır. Adam gərək vicdanla danışsın. (*Fəhlələr və ustalara*) Hə, siz nə deyirsiniz, uşaqlar? Ay usta, sən niyə dinmirsən?

U s t a  Ə l i ş. Yoldaş Rəhimli, hamımız həvəslə işləmişik. Bizdən soruşsanız "əla" qiymət verərik. Siz deyin, bəyənirsiniz, ya yox?

K ə r i m. Mənim də fikrimcə əladır! Sağ olun! (*Ustaların əlini bərk-bərk çıxır*)

U s t a  S ə m ə d. İki-üç aya maya dəyəri əvvəlkindən də az olacaq. (*Fəhlələrə üz tutaraq*) Elədir, elə deyil, yoldaşlar?

S ə s l ə r. Doğrudur, düz deyirsən!..

C ə l a l. Əgər doğrudursa, bəs nə üçün sizin adınızdan mənə ultimatum verirlər?

U s t a Ə l i ş. Bu nə sözdür, yoldaş Qaşqay?

C ə l a l. Guya siz narazısınız, hətta protest eləmək fikrindəsiniz!

U s t a S ə m ə d. Onu hansı köpək oğlu deyir, yoldaş Qaşqay?

Ə m i n. Eyy, bura küçə deyil. Heç olmasa, qadınlardan utanın!

G ü m r a h. Düz buyurursan. Səməd ədəbsizlik elədi. Ancaq, düzü, mən də bilmək istəyirəm ki, onu hansı donuz oğlu deyir?

C ə l a l. Eşidirsənmi, yoldaş Bəxtiyarov?

Ə m i n. Eşidirəm, eşidirəm. İki-üç nəfər kollektiv deyil.

C ə l a l. Kollektivdən də soruşarıq.

Ə m i n (*Gümraha*). Bəs sən demirdin sexin hamısı narazıdır?

G ü m r a h. Deyirdim.

Ə m i n. Bəs indi niyə tüpürdüyünü yalayırsan?

G ü m r a h. Biz maaş cədvəlindən narazıyıq, bu gözəl çeşidlərin nə günahı var? (*Kərimə*) Yoldaş müdir, bu parçalara brak demək olar?

K ə r i m. Yox, oğul, yox.

G ü m r a h. Elə isə qoy mühəndis Əmin Bəxtiyarov tüpürdüyünü yalasın!

Fəhlələr gülüşürlər.

C ə l a l. Eşidirsinizmi, yoldaş Bəxtiyarov?

Pauza

Mən sözarası demişdim ki, bu malları eksport üçün hazırlayırıq. Əslində, öz vətəndaşlarımızı nəzərdə tutmuşdum.

U s t a Ə l i ş. Yoldaş Rəhimli, Qoy bu malları cəsarətlə eksporta da göndərsinlər. Xarici bazarda fəhlələrimizin, ustalarımızın məharətini görsələr pis olar?

K ə r i m. Düz deyirsən, usta Əliş... Qızım, gedək evə... İclaslar məni lap həkdən salıb...

R ə f i q ə. Cəlal yoldaşa bir neçə sözüm var, ata. Sən get, mən də bu dəqiqə gəlirəm.

K ə r i m (*təəccüblə*). Cəlala?

R ə f i q ə. Bəli, ata...

Ə m i n. Cəlala? Gizlin söz?

## BEŞİNCİ ŞƏKİL

Ay işığına qərq olmuş ucqar bir küçə. Tək şabalıd ağacı. Cəlal Qaşqay ağaca söykənib papiros çəkir. Əmin Bəxtiyarov arxa tərəfdə gah görünür, gah da gözdən itir, sanki Qaşqayı öldürməyə fürsət axtarır.

F ə r h a d (*səhnə qabağında*). Yox, Bəxtiyarov Cəlalı öldürmək fikrində deyildi. O, insan qanı tökmək istəmirdi, o, düşmənini ölümdən də dəhşətli bir məğlubiyyətə uğratmaq istəyirdi

Ə m i n (*Cəlala yaxınlaşaraq*). Görüş yerinizi o qədər də bəyənmirəm. Burdan gəlib-gedən çox olur.

C ə l a l. Burda heç kəs yoxdur. Məni kölgə kimi izləyən təkcə sənsən. (*Hirsli*) De görüm fikrin nədir?

Ə m i n. Fikrim – səni izləmək deyil. Mən buraya təsadüfi gəlib çıxmışam. Gəl, barışaq. Etiraf eləyirəm: mən məğlub oldum. Sən güclüsənmiş.

C ə l a l. Fabrik nə müharibə cəbhəsidir, nə də sirk meydanı.

Ə m i n. Müdirimiz də, fəhlələr də sənə tərəfdar çıxdılar. Belə görünür ki, mən haqsızammış.

C ə l a l. Bu azdır. sən fabrikdə nə isə bir cinayət törətmək istəyirsən, yaxud artıq törətmisən.

Ə m i n (*gülərək*). Mən cani deyiləm, fabriki də səndən az sevmirəm.

C ə l a l. Yalandır. Sənin nəfsin cinayət törətməyə bilməz... Düzünü de, nə üçün fəhlələri mənim əleyhimə qaldırmaq istəyirdin?

Ə m i n. Düzünü? Bu saat deyim. Səni yalnız bir adama tanıtmaq istəyirdim.

C ə l a l. Kimə?

Ə m i n. Müdirimiz Kərim Rəhimliyə.

C ə l a l. O məni yaxşı tanıyır.

Ə m i n. Tanısaydı, təzə çeşidləri bəyənib təbrik eləməzdi. Bayaq o, hamıdan çox sevindi. Bilirsənmi nə üçün?

C ə l a l. Sevindi, ona görə ki, xeyirxahdır. İnsan əli ilə yaranan hər nemət ona zövq verir!

Ə m i n. Yox, yanılırsan. Başqa səbəb var... Rəhimli hər şeyə üzdən baxır. İşin məzmunundan çox formasına fikir verir. Təzə çeşidlərin rəngi onun gözlərini qamaşdırdı. Düşündü ki, sən bu uzaq rayon şəhərindəki fabrikə doğrudan da, dünya şöhrəti qazandırmaq fikrindəsən. Amma o səni tanımır. Sözümü kəsmə, gör nə deyirəm. Sən ən cüzi bir iş görəndə də ancaq öz xeyrini fikirləşirsən. Bir arzun üçün

minlərcə Rəhimlini qurban verərsən. Mən çox gözəl bilirəm ki, o bahalı parçalar sənin özünə gərək olub. Axı, sən toya hazırlaşırsan...

C ə l a l. Nə fabrik mənimdir, nə də parçalar.

Ə m i n. Doğrudur, sənin deyil. Əsil məharətin ondadır ki, o parçaları öz xüsusi malına çevirmək fikrindəsən.

C ə l a l. Sən artıq sayıqlayırsan.

Ə m i n (*boyunbağını cibindən çıxardaraq*). Görürsənmi, ay işığında da parıldayır... Ancaq nə olsun ki? Rəfiqə bunu görəndə, nifrətlə məndən üz döndərib getdi. Sən bunu yəqin ki, artıq bilməmiş deyilsən.

C ə l a l. Bilirəm. Rəfiqə dedi. Lakin onu Əsmər kimi kəməndə salmaq sən düşünən qədər də asan deyil. O yaxşı bilir ki, var-dövlət insana zinət vermir!

Ə m i n. Bu sözlərində də zərrə qədər səmimiyyət görmürəm. Sən Rəfiqəni ələ gətirmək üçün bundan on qat, on beş qat bahalı nişan hədiyyəsi almaq fikrindəsən. Elə bir hədiyyə ki, sənin eybəcər sifətini unutdursun.

C ə l a l. Mən sənə alçaq demirəm. Bu sözə heyifim gəlir. Əgər həyatından bezikməmisənsə, rədd ol, get.

Ə m i n. Gəl barışaq, Cəlal Qaşqay. Yox? Demək sülh baş tutmadı. Təəssüf, çox təəssüf. Peşman olacaqsan. Özü də lap tez!.. Eşidirsənmi, Cəlal Qaşqay?.. (*Gedir*)

F ə r h a d (səhnə qabağında). Onları yalnız rəqib adlandırmaq səhv olardı, deyilmi? Aralarındakı uçurum, doğrudan da, həm dərin, həm də qorxulu idi... Bəs Rəfiqə nə üçün gəlib çıxmır? Cəlal! Şərtiniz nə idi?

C ə l a l (*öz-özünə*). Rəfiqə özü məni çağırdı. Bu yeri də o nişan verdi... Aylı-ulduzlu gecə... Tək şabalıt ağacı. Nə isə bir sözü vardı... Əmin Bəxtiyarov məndən intiqam almaq istəyir. Mən onun çirkin əməllərinə mane oluram... İndiyəcən yalnız şübhəm vardı. Boyunbağını görəndən sonra hər şey mənə aydın oldu... Bunlar hamısı fabrikdəki şübhəli haqq-hesabların üzərinə işıq salır.

Pauza.

Yox, Rəfiqə məni sevə bilməz. Bəlkə Əminin hiylələrindən məni xəbərdar eləmək istəyir. Çox ola bilər ki, mənim görmədiyim bir cinayətdən onun xəbəri var... Gəlmədi. Ay bulutlar arasında gizlənir... (*Saatına baxaraq*) Beş dəqiqə gecikir. Mənə nə isə demək istəyirdi. Amma nə? Bu sual mənə rahatlıq vermir. Yox, sevə bilməz. Bu sifət hansı qızın xoşuna gələr? Yox, yox.

F ə r h a d (*səhnə qabağında*). Rəfiqə gəlir. O, ətrafına baxmır. Bəxtiyarovu görmür. Əmin isə, kepkasını gözlərinin üstünə basıb, Rəfiqənin hərəkətlərini oğrun-oğrun müşahidə eləyir. İntiqam hissi onun qəlbini didib-parçalayır.

R ə f i q ə (*gəlir*). Cəlal, çoxdan burdasan?

C ə l a l. Çoxdan.

R ə f i q ə. Səni evimizə aparmaq istəyirdim. Atamı iclasa çağırdılar. Ona görə fikrimdən daşındım.

C ə l a l. Ucadan danışma, Rəfiqə.

R ə f i q ə. O niyə?

C ə l a l. Eşidən var.

R ə f i q ə. Mən elə söz demədim ki, utanım da.

Pauza

Bu gecə ay yaman işıqlıdır.

C ə l a l. Gözəl gecədir.

R ə f i q ə. Gözəl gecədir.

C ə l a l. Demək təzə çeşidlər xoşuna gəldi?

R ə f i q ə. Çox... Amma mən sənə ayrı söz demək istəyirdim.

C ə l a l. Nə söz?

Pauza

R ə f i q ə. Müharibədə tankın yanan zaman ürəyin zədələnməyib ki?

C ə l a l (*onun fikrini başa düşməyərək*). Necə məgər?

R ə f i q ə (*gülümsünür*). Heç, özün bilirsən, mən həkiməm; bu məni tibbi nöqteyi-nəzərdən maraqlandırır.

C ə l a l (*sözləri müstəqil mənada anlayaraq*). Yox, zədələnməyib... Sinəmdə çoxlu qəlpə qalmışdı. Hamısını cərrah çıxartdı. Yalnız biri ürək zirvəsində ilişib... Təkdənbir əziyyət verir. Amma ürəyim sağlamdır. (*Rəfiqənin mənalı-mənalı baxdığını duyaraq*) Görürəm, nə isə kinayəli bir söz deməyə hazırlaşırsan.

R ə f i q ə. Kinayəli?

C ə l a l. Bəlkə demək istəyirsən ki, insan üçün, həm də xoşbəxt olmaq istəyən bir gənc üçün sağlam ürək azdır. Adama sir-sifət də, yaraşıq da lazımdır.

R ə f i q ə. Gözəl, yaraşıqlı, cazibədar bir sifət, eləmi ?

C ə l a l. Əlbəttə. Mən bu məziyyətdən məhrumam. (*Köksünü ötürür*)

Pauza.

R ə f i q ə. Nekrasovun “Rus qadınları” əsərini xatırlayırsanmı?

C ə l a l. Bir zaman oxumuşdum.

R ə f i q ə. Bəyənmişdin, yox?

C ə l a l. Bəyənmişdim... Bunu niyə soruşursan?

R ə f i q ə. Danışmağa söz tapmadığıma görə.

C ə l a l. İnanmıram.

R ə f i q ə. İnan, Cəlal.

Pauza

C ə l a l. Bəxtiyarovun boyunbağısını bəyənmədin, hə?

R ə f i q ə. Sən də deməyə söz tapmırsan?

C ə l a l. Doğrudur, tapmıram.

R ə f i q ə. Yox, inanmıram.

C ə l a l. İnan, Rəfiqə.

Pauza

R ə f i q ə. Bu gecə ay yaman işıqlıdır.

C ə l a l. Səncə bu pisdir, yaxşı?

R ə f i q ə. Yaxşı.

C ə l a l. Məncə pisdir.

R ə f i q ə. Nə üçün?

C ə l a l. Mənim sifətim aydın göründüyü üçün.

R ə f i q ə. Cəlal, əzizim...

C ə l a l. Nə dedin, “Əzizim?”

R ə f i q ə. Nekrasovun qəhrəmanı Sibirin cəhənnəmdən müdhiş şaxtalarında əri ilə görüşəndə neylədiyi yadındadırmı?

C ə l a l. Yadımdadır. Knyaginya Volkonskaya ilk dəfə əri ilə qarşılaşanda, əvvəlcə üzü üstə qapanır, onun qıçlarında kilidlənmiş ağır qandalı öpür... Sən buna inanırsanmı?

R ə f i q ə. İnanıram, Cəlal, inanıram. Məhəbbəti ideal kimi ilahiləşdirən insanların bu hərəkətində təəccüblü bir şey yoxdur.

C ə l a l. Gözlərin yaşarıb... Ağlama. Göz yaşı zəiflik əlamətidir.

R ə f i q ə. Mən də o gözəlin yerində olsaydım, əvvəlcə qandalları öpərdim. Qüvvətli insanlar mənim də idealımdır. Amma sənin ayaqlarında qandal yoxdur.

C ə l a l. Yoxsa buna təəssüf eləyirsən?

R ə f i q ə. Yox, Cəlal. Fikrimi deyə bilmədim. Sənin üzündəki yanıqlar müharibədən yadigar qalmış əsl qəhrəmanlıq rəmzidir. Məgər bu, xoşbəxtlik deyilmi?

C ə l a l. Xoşbəxtlik!.. Yoxsa sən mənə acıyırsan?

R ə f i q ə. Yox, yox!.. Mən səni heç vaxt alçaltmaq fikrində olmamışam! Ürəyində sönməz bir məşəl gəzdirən insan belə təhqirə layiq deyil! Başını qürurlu tut, Cəlal. (*Əlilə onun çənəsini yuxarı qaldırır*) Bax, belə!.. (*Birdən Cəlalın boynunu hərarətlə qucaqlayıb, üzündən öpür və dərhal da yüyürüb gözdən itir*)

Ə m i n (*arxa tərəfdən görünərək*). Əgər Allah varsa, ona min lənət! Rəfiqə kimi dünya gözəli gör bir kimə qismət oldu!

C ə l a l (*heyrətlə*). Sevir?! Mən yuxu görürəm!

Ə m i n. İntiqam dəqiqələri gəlib çatdı. İndi qoy Cəlal Qaşqay tab gətirsin!.. (*Gedir*)

Göy üzünü alov rəngli qüvvətli bir işıq çulğalayır.

C ə l a l. Bu nədir? Hardasa yanğın var? Ah, ürəyim... Elə bil yanan mənim ürəyimdir... Mən kimi gözləyirəm? Ora, ora getmək lazımdır. (*Gedir*)

F ə r h a d (*səhnə qabağında*). Sən haqlısan, Cəlal, sənin ürəyin də od tutub yanır, yanağın da. Sən eşitmədin. Əmin Bəxtiyarov “intiqam dəqiqələri gəlib çatdı” dedi. Fabriki yandırıblar!..

## ALTINCI ŞƏKİL

Səhnə qabağında. Kərim Rəhimli, Əmin Bəxtiyarov və ambardar.

K ə r i m. Fabriki yandırdıqları bəs deyil, təzə çeşidli malları da aparıblar. Yüz ton ipək!.. Milyon yarım qiyməti var. Adam dəli ola bilər. Sən neyləmisən, hə?

A n b a r d a r. Kərim dayı, bu nə sözdür? Gəldilər, order verdilər, vəkalətlərini göstərdilər. (*Kağız qovluğunu açaraq*) Budur, baxın, möhür yerində, imza da ki, öz qaydası ilə.

K ə r i m. Mən orderə qol çəkməmişəm! Nə imza, nə möhür?

A n b a r d a r. Orderi Cəlal Qaşqay imzalamışdı.

K ə r i m. Şükür Allaha, deməli malları oğurlamayıblar. Bəs bu Qaşqay özü hanı?

C ə l a l (*məyus halda gəlir*). Mən burdayam, yoldaş Rəhimli. Yolda sinəmdən ağrı qalxdı. Bərk incidir.

K ə r i m. Orderi nə vaxt imzalamısan?

C ə l a l. Hansı orderi?

K ə r i m. Necə yəni hansı? Təzə malları sən buraxdırmamısan? Hamısını aparıblar!

C ə l a l. Yox, mənim bu işdən xəbərim yoxdur... İmza göstərin.

Ə m i n. Necə göstərsin? Bütün idarə yanıb. Görmürsən?

C ə l a l (*kinayəli*). Görürəm. Yaxşı görürəm.

Ə m i n. Şəxsən mənə hər şey aydındır.

K ə r i m. Aydın olan nədir?

Ə m i n. Kor-kor, gör-gör... Cəlal Qaşqay asanlıqla dövlətlənmək üçün malları kimə isə verib, indi də imzasını danır. Sadə, asan bir yol. (*Cəlala*) İdarəni yandırıb, cinayətini ört-basdır eləmək istəyirdin? Kələyin baş tutmadı, hə? Yaxşı ki, anbardar malı buraxanda yanında çox adam varmış... Hamısı da Qaşqayın imzasını görüb... Müqəssir əlimizdən yaxasını qurtara bilməz!

Hamının gözü Qaşqaya zillənir.

C ə l a l (*Əminə*). Müqəssir mənəm?

Pauza

Səndən soruşuram: mənəm müqəssir?.. Bayaq səni öldürmədiyimə peşmanam, xain! (*Əminin boğazından ikiəlli yapışıb boğmaq istəyir*)

K ə r i m. Cəlal, dayan! Sən neyləyirsən?

C ə l a l (*Kərim Rəhimliyə*). Yoldaş müdir, eşitdinizmi Bəxtiyarov nə dedi?

Pauza

Nə üçün cavab vermirsiniz?

K ə r i m. İnsanları tanımaq olmur. Mən nə deyə bilərəm?

Ümumi sükut.

F ə r h a d (*səhnə qabağında*). Yanğın yerinə gələn müstəntiq də Cəlal Qaşqaydan şübhələnməyə başladı. Onun səhvi, Qaşqayın yalnız bu axşam gülümsəyən böyük səadətini əlindən aldı.

## ÜÇÜNCÜ PƏRDƏ

### YEDDİNCİ ŞƏKİL

İkinci şəkildə gördüyümüz otaq. Axşamüstü. Fərhad, Əmin və Kərim.

F ə r h a d (*əlindəki məktubu oxumaqda davam edir*). "Beləliklə də məni günahlandırdılar. Yalançı şahidlərin hamısı bir ağızdan eyni ittihamı üzümə oxudu. Lakin hansı günahı işlədiyim hələ də mənə bəlli deyildir. Cəlal Qaşqay". (*Kağızı qatlayıb qovluğa qoyur*) Hə, indi nə deyə bilərsiniz?

Pauza

Ə m i n. O, ayrı cür yaza bilməzdi. Heç bir cani öz xoşu ilə təqsirini boynuna almır.

F ə r h a d. Siz nəyə əsasən Cəlal Qaşqayın orderi imzaladığını iddia eləyirdiniz?

Ə m i n. Bunun iddia eləyən, Cəlal Qaşqaydan şübhələnən bir mən deyildim ki? Şahidlərin çoxusu bu fikirdə idi... Kərim dayı, nə üçün ağzınıza su alıb dinmirsiniz? Axı, siz ki, hər şeyi yaxşı xatırlayırsınız...

K ə r i m (*tutqun*). Mən təkcə müstəntiqin suallarına cavab verəcəyəm.

Ə m i n (*məyus halda başını bulayır, nırçıldayır*). Adamları tanımaq nə çətinmiş!.. Heç bilmirəm bu gün sizə nə olub? Özgə vaxtı haqdan, ədalətdən dəm vurardınız. Bəs indi həqiqəti deməyə nə üçün kişiliyiniz çatmır?

K ə r i m. Bura bax, Əmin, belə söhbətlərin yeri deyil. Burda mənim kişiliyim müzakirə olunmur. Bildin?

F ə r h a d. Mətləbdən uzaq düşdünüz, Vətəndaş Bəxtiyarov.

Ə m i n (*nəfəsi darıxmış kimi, köynəyinin yaxalığını dartışdırır*). Ax, bu insanlar!..

F ə r h a d. Deyəsən yorulmusunuz. Tənəffüs verə bilərəm.

Ə m i n. Xeyr, mən yorulmamışam. İnsanların vəfasızlığı mənə təsir eləyir.

F ə r h a d. Bəlkə acmısınız, nahar vaxtınızdır?

Ə m i n. Bu cür çək-çevirdən sonra adamda iştaha qalar? (*Əlləri əsə-əsə papiros çıxardır, qutunu Fərhada tərəf uzadır*) İcazə verin!

F ə r h a d. Buyurun, görürəm, yorulmusunuz. Bir qədər istirahət edin. (*Gedir. Qapıda səs-küy qalxır. "Olmaz, olmaz!" səsləri eşidilir. Bədəl və Fərman içəri təpilir. Bədəlin azca səndirlədiyi hiss olunur*)

B ə d ə l. Kərim qağa, qaş-qabağını sallamısan! Yəni elə ciddi bir şey var?

K ə r i m (*istehza ilə*). Yox, burda kos-kos oynayırıq.

B ə d ə l. Əmin, bu nə deyir, oğul?

Əmin dinmir.

B ə d ə l (*Fərmana tərəf dönür*). Deyəsən, axı, işlər fırıqdır... Eh, bu fani dünyada padşahdan-zaddansa olmadıq ki, belə dar gündə kara gəlsin.

F ə r m a n. Mən ki, işləri belə görürəm, padşah da olsaydın, heç nə eləyə bilməzdin.

B ə d ə l. Eləyərdim. Əvvəl başdan bu silisti kökündən ləğv eləyərdim.

F ə r m a n. Nə qədər ki, bu dünya var, silist də var. İnsan çiy süd əmib, heç vaxt yerində farağat oturmayacaq.

B ə d ə l. Baxma, əgər mən padşah olsaydım...

K ə r i m (*əsəbi*). Siz də içməyə vaxt tapmısınız. Balam, görmürsünüz, nə vur-çatlasındır?

B ə d ə l. Kərim qağa, vallah içməmişik, sizin dərdinizi çəkməkdən bir balaca paxmel olmuşuq.

F ə r m a n. Hafiz Şirazi kimi...

B ə d ə l. Füzuli dərd əlindən dağa çıxdı, dedilər bəxtəvər yaylağa çıxdı... Kərim qağa, özün bilirsən, bir çətən külfət sahibiyəm. Elə danışın ki, güdaza getməyim. Axı, mən yazıq siz deyəni eləmişəm.

F ə r m a n. Hə də. Kim eşşək olubsa, sən ona palan olubsan. Sənin nə təqsirin var ki?

B ə d ə l. Adə, mərifətsiz-mərifətsiz danışma, Atan yerində kişidir. (*Kərimdən xəlvət, Əminə*) Ümidim sənədir, ha.

Ə m i n. Mən sizin direktorunuz kimi vəzifəmdən qorxub dostlarımı meydanda tək qoymaram!

B ə d ə l. Bəs necə? Ölsək də gərək bir yerdə ölək. (*Fərmana*) Bax, əsil dost belə olar. Qorxma, adə, bizə heç nə eləyə bilməzlər.

F ə r m a n. Bura bax, Bədəl dayı, məni bu hangaməyə qatma. Mən içəndə sənə yoldaşlıq eləmişəm, ayrı şeydən xəbərim yoxdur!..

M ü s t ə n t i q k ö m ə k ç i s i (*gəlir*). Ay yoldaş, sizə kim lazımdır? Nə üçün icazəsiz bura girmisiniz?

F ə r m a n. Biz elə bildik sorğu-sualı qurtarmısınız.

M ü s t ə n t i q k ö m ə k ç i s i. Axı, sizə kim lazımdır?

B ə d ə l. Bağışlayın, dedilər ki, gözləyin, sizi də çağıracaqlar, amma ha gözləyirik, səs-soraq çıxmır. Dedik xəbər bilək.

M ü s t ə n t i q k ö m ə k ç i s i. Zəhmət olsa da, gərək gözləyəsiniz. Çıxın, orda gözləyin.

B ə d ə l. Baş üstə. Gedək, Fərman. Gözlə deyirlər, gözləyək. Əlacımız nədir? Eh bu fani dünyada... (*Gedirlər*)

F ə r h a d (*gəlir*). Baş mühasibdir, eləmi?

Pauza.

O da az aşın duzu deyil, ha. (*Əminə üz tutaraq*) Beləliklə iki məsələ bizə aydın oldu. Əvvəla, siz Rəfiqə xanımı sevmisiniz. Əgər bir az da dəqiq desək, onunla evlənmək istəmisiniz.

Ə m i n. Bəli sevmişəm, yenə sevirəm.

F ə r h a d. Bu faktı inkar eləmirsiniz?

Ə m i n. Xeyr.

F ə r h a d. İkincisi, Rəfiqə xanımın Cəlal Qaşqaya vurulduğunu biləndən sonra fitnəyə əl atmısınız, hər cür vasitə ilə Cəlalın ayağının altını qazmısınız. Ondan şəxsi intiqam almaq üçün yanğın hadisəsindən məharətlə istifadə eləmisiniz.

Ə m i n. Bunu siz deyirsiniz, mən demirəm. Bunu intiqam adlandırmaq nə dərəcədə doğrudur, özü də şəxsi intiqam? Fabrik – dövlət əmlakıdır. Ona kəc baxanları, öz xeyri üçün onu yandıranları...

F ə r h a d (*sərt*). Vətəndaş Bəxtiyarov!.. Siz suala cavab verin. Mühazirə oxumağın yeri deyil!

Ə m i n. Fabriki yandıran...

F ə r h a d. Biz yanğının səbəbkarı haqqında ayrıca danışacağıq. Hələlik boynunuza alın ki, Rəfiqə xanımla Qaşqayın məhəbbət macərasından xəbər tutduqda, rəqibinizi nə yolla olur-olsun ləkələmək istəmisiniz...

Ə m i n. Xeyr, mən bu ittihamı qəti rədd eləyirəm!

K ə r i m. Yoldaş Kamalov, izn versəniz, bir şey soruşardım.

F ə r h a d. Buyurun.

K ə r i m (*Əminə*). Fəhlələrin ayağına yalandan brak yazmaqda məqsədin nə idi?

F ə r h a d. Bu mənə aydındır.

K ə r i m. Əgər mümkünsə, qoyun cavab versin. Fikirləşdikcə, bəzi-bəzi şeylər yadıma düşür. Qoyun görək nə deyəcək.

Ə m i n. Kərim dayı, siz də müstəntiqsiniz? Biri azlıq eləyir? Kənardan baxana elə gələ bilər ki, mən müqəssirlər skamyasında oturmuşam.

K ə r i m. Bunu öyrənməsəm, bağrım çatlar. Əgər sənin Cəlalla qərəzliyin vardısa, heyfini fəhlələrdən niyə çıxırdın?

F ə r h a d. O, fəhlələrdən heyf çıxmırdı. Brakı iki səbəbə görə yazdırırdı. Əvvələn, fəhlələri Qaşqayın əleyhinə qaldırmaq istəyirdi, ikinci də, brak adlandırdığı malları hesabdan çıxardıb, xüsusi bazarda satdırırdı.

K ə r i m. Necə, necə?

F ə r h a d. Bəli, vətəndaş Rəhimli. Hələ sizin çox şeydən xəbəriniz yoxdur.

K ə r i m (*Əminə qanlı baxaraq*). Sən nə qədər çirkin adamsanmış!..

Ə m i n. Yaxşı, yaxşı, özünü büllur kimi göstərmə... Sən özün Cəlal Qaşqaydan xirtdəyəcən narazı idin. Qorxurdun ki, səni müdirlikdən götürüb, yerinə onu təyin eləyərlər.

F ə r h a d. Vətəndaş Rəhimli, Bəxtiyarovu çox gec tanımısınız. O indi də xəşil qazanına çömçə salmış bir qarı kimi fabriki qarışdırır. O, ayrı cür yaşaya bilmir.

Ə m i n. Siz məni açıqdan-açığa təhqir eləyirsiniz, yoldaş müstəntiq. Heç bir vətəndaşın heysiyyətini tapdalamağa sizin haqqınız yoxdur.

F ə r h a d. Yalnız bir şərtlə.

Ə m i n. O nə şərtdir?

F ə r h a d. Əgər vətəndaşın, doğrudan da, heysiyyəti varsa... Həyatda əfsus ki, belələri hələ var. Bu məni kədərləndirir. Bəli, kədərləndirir. Çünki hüquqşünas cinayətin azalmağını, hətta tamam yox olmağını arzulayır. Biz bunun üçün çalışırıq. Bu bizim həyat idealımızdır. Sizin kimi adamlar isə...

Ə m i n. Bu, mənim də idealımdır!

F ə r h a d. İnanmıram, inana bilmirəm, vətəndaş Bəxtiyarov!

Ə m i n. Siz hamıya şübhə ilə baxırsınız. Bu professional vərdişinizdir!

F ə r h a d. Nə etmək? Hələ də cani ilə cinayət olan yerdə belə vərdişlər zəruridir. Sizin kimiləri, ciddi bir səbəb olmadan da fitnə törətməyi sevirlər. Qurmaq, yaratmaq həvəsi ilə alışıb-yanan insanları bir-birinin üzərinə salışdıranda qəribə bir zövq alırlar. Sakit dostluq şəraitində çalışanları görərkən, gözlərinə yuxu getmir. Şair gözəl deyib:

O, aşkarda girər qına,
Qıfıl vurar öz ağzına.
Xəlvətdəsə ona-buna
Ləkə yaxar asta-asta

Nə yaradar, nə də qurar,
Yaradana ağız burar,
Quyu qazıb, tələ qurar,
Ev də yıxar, asta-asta...

Ə m i n. Bu şerin mənə dəxli yoxdur!

F ə r h a d. Əgər diqqətlə qulaq assaydınız, burda öz portretinizi də görə bilərdiniz. (*Qapıya yanaşaraq*) Əsmər Ziyad qızı gəlsin! (*Əsmər gəlir. O, il yarım müddətində xeyli dəyişmiş, qocalmışdır! Onu görərkən Əmin üzünü gizlətməyə çalışır*) Bu qadını tanıyırsınız, vətəndaş Bəxtiyarov?

Ə m i n (*ağır sükutdan sonra*). Bir vaxt bizim fabrikdə işlərdi. Öz xoşu ilə ərizə verib getdi.

K ə r i m (*qəddi bükülmüş halda*). Eh, yoldaş Kamalov. Əsmər fabrikin fəxri idi. Mükafat almadığı bir ay olmazdı. (*Əsmərə*) Günahkar mənəm, qızım.

Pauza

F ə r h a d (*Əminə*). O, doğrudanmı öz xoşu ilə getdi?

Ə m i n. Bəli.

F ə r h a d. Mən istərdim ki, vicdanınız qarşısında (*hərçənd sizin belə vicdan sahibi olduğunuza inanmıram*) bir həqiqəti etiraf eləyəsiniz. Axı, onun fabrikdən çıxıb getməyinə siz səbəb olmusunuz. Düzmü deyirəm, qızım? (*Əsmər dinmir*) Bilirəm, utanırsan. Amma həqiqəti üzə çıxarmaq xətrinə suallarıma cavab verməlisən. Fabrikdən getməyə səni nə vadar elədi?

Əsmər susur.

F ə r h a d. Görürsünüzmü, vətəndaş Bəxtiyarov, o, xəcalətdən qıpqırmızı oldu.

Ə s m ə r (*yalnız Fərhada, güclə eşidilən kövrək bir səslə*). Mən Əmindən utanmıram. Əgər mümkünsə, Kərim dayı burda olmasın.

K ə r i m (*onun arzusunu duyaraq*). Mən çıxa bilərəm.

Ə s m ə r (*yalvarır kimi*). Sizdən üzr istəyirəm, Kərim dayı. Siz mənə həmişə atam kimi mehriban olmusunuz, bəlkə atamdan da çox.

K ə r i m. Yaxşı, qızım, yaxşı. Mən getdim...

Ə s m ə r. Məni bağışlayın. Atam öləndən sonra anamla sahibsiz qalmışdıq. Siz olmasaydınız, mən həm oxuyub, həm də işləyə bilməzdim.

K ə r i m. Sən də gərək mənim günahımdan keçəsən. İclaslara başım qarışdı, sənin niyə ərizə verdiyini öyrənməyə macal tapmadım. (*Gedir*)

Ə s m ə r. Kərim dayı qızıl kimi adamdır. Əgər ondan şübhələnirsinizsə, nahaq yerə. Bir az ürəyi yumşaqdır. Heç kimin xətrinə dəymək istəmir. (*Əmini göstərərək*) Belələrinə inandığı üçün özünü bəlaya salıb.

F ə r h a d. Mən səndən ayrı söz xəbər alacağam. Əmin Bəxtiyarovla tanışlığın necə başlandı?

Ə s m ə r. Tez-tez seximizə gəlirdi... Bir neçə yol işdən sonra məni evimizə ötürdü. Hey dedim nahaq zəhmət çəkirsiniz, olmadı... Dedim, yoldaş Bəxtiyarov, şəhərimiz balaca, adamlar söz gəzdirən, mənə yaxın durmayın... Bir gün belə, iki gün belə... Axırda başladı ki, sənsiz yaşaya bilmirəm, gecələr də sənin xəyalın məni yatmağa qoymur... Nə bilim, bir kitab söz... Mən də inandım... Başım daşdan-daşa dəydi... İndi gecdir...

F ə r h a d. Qızım, Bəxtiyarov sənə hədiyyə vəd eləmişdi?

Ə s m ə r. Təkcə hədiyyə yox, çox şey...

F ə r h a d. Məsələn, nə?

Ə s m ə r. Axır günlərdə deyirdi ki, səni ZAQS-a aparmaq istəyirəm, gedək, anandan razılıq alaq, səni də, onu da öz mənzilimə köçürdəcəyəm, iki-üç il işləyəndən sonra Bakıya gedərik, ali təhsil alarsan.

Ə m i n. Mən bu sözləri kimin yanında demişəm? Özünü çox da həyalı göstərmə. Məndən savayı iyirmisi ilə gəzmisən.

F ə r h a d. Vətəndaş Bəxtiyarov, özünüzü ələ alın. İstintaqa cəlb olunan Əsmər deyil, sizsiniz!

Ə s m ə r. Mənim şahidim yoxdur. Əmin Bəxtiyarov məni göz qabağında, camaat yanında aldatmırdı, xəlvətdə aldadırdı.

F ə r h a d. Ona yox, mənə cavab ver, qızım. De görüm o sənə boyunbağı təklif eləyəndə, niyə götürmədin?

Ə s ə m r. Çünki mən onun hər sözünə inanırdım. Fikir eləyirdim ki, o məni doğrudan da istəyir, adıma aldığı hədiyyəni saxlayıb, toy günündə verəcək. Sən demə bu boyunbağını tək mənə yox, çoxlarına göstərirmiş.

Ə m i n. Mən heç kəsə boyunbağı göstərməmişəm. Bu, Cəlal Qaşqayın, bir də sənin uydurmandır!

Ə s m ə r (*sanki birdən cəsarətlənərək*). Utan! Sənin aldatdığın o biri qızlar hələ ölməyib. Onlar da mən deyəni təsdiq eləyə bilər... Yoldaş Kamalov, sizin xahişinizlə...

F ə r h a d. Mənim xahişimlə Əsmər onların adını, familiyasını kağıza yazıb gətirib.

Ə s m ə r (*siyahını Kamalova verir*). Buyurun!..

F ə r h a d. Boyunbağının neçəyə alındığı sənə məlum idimi?

Ə s m ə r. Bəxtiyarov mənə demişdi ki, əlli min manata. Doğrumu, yalanmı dediyini bilmirəm.

F ə r h a d (*Əminə*). O boyunbağı indi hardadır?

Ə m i n. Eşitmədiniz? Məndə boyunbağı olmayıb!

F ə r h a d. Hələlik üç adam şahidlik verir.

Ə m i n. Onlar kimdir?

F ə r h a d. Cəlal Qaşqay, Əsmər Ziyad qızı, bir də Rəfiqə Rəhimli.

Ə m i n. Hər üçünün mənimlə qərəzliyi var... Məqsədinizi başa düşürəm, yoldaş Kamalov, fikriniz budur ki, boyunbağını boynuma qoyandan sonra məndən belə bir suala da cavab istəyəsiniz: mən bu qədər pulu hardan almışdım? (*Gülür*) Siz o qədər mahir müstəntiq deyilsiniz. Siz bu yolla yalnız körpə uşaqları tələyə sala bilərsiniz.

F ə r h a d. Nəzərə alın ki, hələ əlimdə uzun bir siyahı var. (*Əsmərin verdiyi kağızı göstərərək*) Bunları da sizinlə üzləşdirsəm...

Ə m i n (*yenə gülərək*). Onları da Əsmər tovlaşdırıb mənim əleyhimə qaldırır. Bunu yalançının şahidi deyərlər.

F ə r h a d (*nəfəsi darıxmış halda kürsüyə yıxılır, dərindən nəfəs alır*). Yaxşı, olsun. (*Ayağa qalxır, tərəddüd içində gəzinərək, fikrini toplamağa çalışır, hiss olunur ki, əmələ gəlmiş düyünü açmaq o qədər də asan deyil. Telefonla zəng eləyir*) Şərqiyə Gülbalayeva burdadırmı?.. Onu mənim yanıma!.. (*Dəstəyi yerindən asır. Bəxtiyarova və Əsmərə*) Siz bu otağa keçin, gözləyin! (*Onlar çıxırlar. Fərhad təkrar gəzinir. Tanımadığımız bir qadın gəlir*) Əyləşin. (*Qadın oturur. Fərhad iş qovluqlarından birini açır*) İlk istintaqda dediyiniz sözlər yadınızdadırmı, vətəndaş Gülbalayeva? Bəxtiyarov haqqındakı ifadənizi nəzərdə tuturam.

Q a d ı n. Bəli.

F ə r h a d. O sizə boyunbağı göstərmişdimi?

Q a d ı q. Bəli.

F ə r h a d (*qapıya tərəf gedərək*). Əmin Bəxtiyarov və Əsmər Ziyad qızı gəlsin! (*Əvvəlcə Əmin məğrur və qalib bir görkəmlə gəlir. Gülbalayevanı görərkən tutulur. Əsmər sonradan-sonraya məyus halda gəlir*) Vətəndaş Bəxtiyarov, vətəndaş Gülbalayevanı tanıyırsınızmı?

Ə m i n (*tərəddüdlə*). Necə məgər?

F ə r h a d. Soruşuram.

Ə m i n (*Fərhadın sakit və təmkinli vəziyyətindən nə isə hiylə işlədəcəyini duyaraq, narahatlıqla*). Bəli, tanıyıram.

F ə r h a d. Necə adamdır?

Ə m i n (*yenə tərəddüdlə*). Pisliyinə heç nə deyə bilmərəm. Axı, onun bu məsələyə nə dəxli var?

F ə r h a d (*zəhmlə*). Sualı mən verirəm. O sizə qarşı qərəzlik eləməz, deyilmi?

Ə m i n (*Gülbalayevanın gözlərindən nə isə oxumaq istərkən, qadın başını yana tərəf çəkir*). Hesabla gərək o məni ləkələmək istəməsin.

F ə r h a d (*Gülbalayevaya*). Boyunbağı barədə dediklərinizi təkrar eləyin.

Q a d ı n. Mən Bəxtiyarovun əlində boyunbağı görmüşəm. Məndən soruşurdu ki, necədir, xoşuma gəlirmi?

F ə r h a d (*Əsmərə*). Bu qadını tanıyırsanmı, qızım?

Ə s m ə r. Bəli, Əmin Bəxtiyarovun evindən çıxanda mən onu...

Q a d ı n. Bəli, bəli, söydünüz, biabır elədiniz. Amma nahaq! Mən Əmini çoxdan sevirəm!

F ə r h a d (*Gülbalayevaya*). Siz gedə bilərsiniz... Ancaq sevgi ilə əxlaq pozğunluğu ayrı-ayrı məfhumlardır, vətəndaş Gülbalayeva.

Q a d ı n. Azad məhəbbət olan yerdə bu danışıqların nə mənası var? (*Gedir*)

F ə r h a d. İndi sözünüz nədir, vətəndaş Bəxtiyarov?

Pauza

Ə m i n. Məndə boyunbağı olmayıb!

F ə r h a d. Yenə inkar edirsiniz? Siz az qalmışdı Əsməri necə aldadıb bədbəxt elədiyinizi də yerli-dibli danasınız.

Ə m i n (*inad göstərməyin faydasız olduğunu görərək*). Hər bir gəncin həyatında bir dəfə belə səhv ola bilər. Bunu da mənim səhvim hesab eləyin.

F ə r h a d. Səhvlə günahın fərqi çoxdur, vətəndaş Bəxtiyarov. Siz, həyata yeni qədəm basmış məsum bir azərbaycanlı qızını yağlı vədlərlə aldadıb, fəlakətə sürükləmisiniz.

Ə m i n. Düzdür. Doğrudur. Bunu mənim ayağıma günah kimi yazın. Birinci və axırıncı günahım kimi.

F ə r h a d. Yox, birinci deyil. Sizin həyat yolunuz belə hadisələrlə doludur!

Ə m i n. Yoldaş Kamalov, siz artıq müstəntiqdən çox prokuror kimi danışırsınız. Mən hələ müqəssirlər skamyasında oturmamışam!

F ə r h a d. Mən əminəm ki, oturacaqsınız. Əslinə baxsanız mən özüm də buna təəccüb eləyirəm ki, nə üçün indiyəcən oturmamısınız? (*Kağız qovluğundan qəzet çıxardır*) Bu kimin barəsindədir, hə?

Ə m i n (*tanış məqaləni görüb, daha da tutqunlaşır*). Görürəm tərcümeyi-halımı çox müfəssəl öyrənmisiniz. Yəqin uşaqlıqda kiminlə savaşdığımı, kimi döydüyümü də bilirsiniz. Şübhə eləmirəm ki, babamın sümüklərini də qəbirdən çıxardıb yoxlamısınız.

F ə r h a d. İstehzanız yersizdir. Həyatın mənfi hadisələrini diqqətlə öyrənəndə, mənim gücüm artır... Qoy Əsmər də bilsin, hələ üç-dörd il əvvəl, ali məktəbdə oxuyarkən, sizin ucbatınızdan bir neçə qız bədbəxt olub... Xatırlayırsınızmı? Bu məqalədə həmin əhvalat yazılıb. Oxuyummu?

Ə m i n. Siz cəlladsınız! Nə yolla olur-olsun məni məhv eləmək istəyirsiniz!

F ə r h a d (*öldürücü bir təmkinlə*). Sizi dəhşətə gətirən mən deyiləm, öz əməllərinizidir. (*Əsmərə*) Qızım, sən də bunun hiylə toruna düşəndən sonra özünü zəhərləyib öldürmək istəmisən. Amma nahaq, çox nahaq!..

Ə s m ə r. Xeyr, yoldaş Kamalov, mən bunun üçün yox, dostlarım, tanışlarım yanında rüsvay olmaq istəmədiyim üçün... (*Ağlayır*)

F ə r h a d. Bax, bu olmadı, qızım... Sən yenə fabrikə qayıtmalısan. İpək toxuyan maşınlar səni gözləyir. Həyatda büdrəmək, hələ yıxılmaq deyil. Ağlama, qızım, ağlama! (*Yaylıqla onun gözünün yaşını silir*)

Ə s m ə r. Məni bağışlayın, Fərhad dayı... Dözə bilmədim...

F ə r h a d (*qapıya sarı gedərək*). Buyurun, yoldaş Rəhimli. (*Kərim Rəhimli gəlir*) Əsmər Ziyad qızı fabrikə qayıdır. Yəqin ki, onun üçün iş tapılar, deyilmi? (*Əsmərə*) Qayıdacaqsanmı, qızım?

Əsmər dinmir.

K ə r i m. Gözüm üstə yerin var, qızım... Niyə cavab vermirsən?

Ə s m ə r. Bəli, qayıdacağam!

F ə r h a d (*Əsmərin boynunu qucaqlayıb, qapıya kimi ötürür*). Gec də olsa, səhvini düzəltdin. Uğurlu yol!..

Ə m i n. Fabriki yandıranlar, dövlətə ziyan vuranlar bir tərəfdə qalıb, mənim tərcümeyi-halım istintaq olunur... Nahaq özünüzü yorursunuz, zəhmətinizə heyfim gəlir.

F ə r h a d. Mənim qeydimə qaldığınız üçün təşəkkür eləmirəm, vətəndaş Bəxtiyarov. Mən öz vicdani vəzifəmi yerinə yetirəndə, həmişə mənəvi zövq alıram. Bu mənə bəsdir!.. Siz bəzəkli bir pərdə arxasında daldalanıb, əsl simanızı məharətlə gizlətmisiniz. İndi bu pərdə yoxdur!..

Bu anda pəncərədən kağıza bükülmüş bir şey atırlar.

K ə r i m. Xuliqanları görürsünüz? Nə isə atdılar.

F ə r h a d (*cəld pəncərəyə yanaşır. Baxır*). Heç kəs yoxdur. (*Şeyi yerdən götürüb, kağızını açır*) Deyəsən məni yenə hədələyirlər... Yox, burda qutu var. (*Qutunu açır. Bizim tanıdığımız boyunbağı çıxır*) Eyni xətlə bir sətir yazıblar. Oxuyummu?

Ə m i n. Mənə dəxli yoxdur.

F ə r h a d (*kağızı səssizcə gözdən keçirir*). Yox, mən yanılmışam. İndi hədələmirlər, rüşvət verirlər... Qəribədir, deyilmi? (*Kağızı oxuyur*) "Özünə bu qədər əziyyət vermə. Fabriki yandıran həbsdədir. Boyunbağını götür, üzüsulu ikən rədd ol!..". (*Əlbəyaxa vuruşda qalib gəlmiş bir bahadır kimi ucadan qəhqəhə ilə gülür*) Hara rədd olum, hə? Düz yolumdan dönüb hara rədd olum, vətəndaş Bəxtiyarov? (*Boyunbağının üstünü oxuyur*) "Victoria"! Bu, latın sözüdür, azərbaycanca qələbə deməkdir. Mən qələbə çalandan sonra nə üçün rədd olum?

Ə m i n. Görürsünüzmü? Amma siz boyunbağını məndən istəyirdiniz. Bütün ittihamlarınızı rədd edirəm, vətəndaş müstəntiq!

F ə r h a d. Tələsməyin. (*Rəhimliyə*) Xahiş edirəm, telefonla öyrənin görün qızınız xəstəxanadan qayıtdımı?

K ə r i m. Gərək ki, o bu axşam evə gəlməyəcək.

F ə r h a d. Nə eybi var? Mən xəstəxanaya gedərəm. Mən getməliyəm!

## SƏKKİZİNCİ ŞƏKİL

Şəhər xəstəxanasında kiçik və işıqlı bir palata. Pəncərənin bərabərində görünən meyvə ağaclarının nazik budaqlarından palatanın ikinci mərtəbədə yerləşdiyi bilinir. Dibdə tək çarpayı. Çarpayıda uzanmış Cəlalı saqqal basmış, qeyri-adi bir ziya ilə parıldayan iri gözlərindən hələ də yüksək hərarət içində yandığı hiss olunur. İlk baxışda onu tanımaq çətindir. Çarpayının ayaq tərəfində dayanmış Rəfiqə termometrə baxır. O nə qədər sakitdirsə, Cəlal bir o qədər həyəcanlıdır.

R ə f i q ə. Sən bunu kimdən bildin?

C ə l a l. Adını soruşma. Mən ona söz vermişəm, xəbər alan olsa deməyim... Amma sən nahaq məndən gizlədirsən. Bu günü mən düz il yarım gözləmişəm. Özü də böyük səbirsizliklə. Nəhayət, mənim də səsimi eşidiblər.

R ə f i q ə. Bunu sənə deyən adam yaxşılıq eləmək istəyib, amma pislik eləyib. Bax, hərarətin bir xal da artıb.

C ə l a l. Yox, artmayıb. Mən özümü çox gümrah hiss eləyirəm. Rəfiqə, əgər mənim taleyimlə az-çox maraqlanırsansa...

R ə f i q ə (*inciyərək*). Çox sağ ol... Bu da yəqin hərarətin artmağındandır.

C ə l a l. Mən elə demək istəmirdim. Sən bir şahid kimi orda olmalısan. Müstəntiqə əsil həqiqəti deməlisən!

R ə f i q ə. Bu saat nə mən şahidəm, nə də sən dustaq. Bura xəstəxanadır!

C ə l a l. Daha mənmi qorxum yoxdur. Ölümdən belə qorxmuram! (*Ağrıdan üz-gözü əyilir*) Mən artıq kəfəni yırtıb çıxmışam. Görünür bu dəfə də ölüm mənə yaxın düşə bilmədi... Yəqin ki, eşitmisən, qədim, çox qədim bir əfsanə var...

R ə f i q ə. Cəlal, əzizim...

C ə l a l. Rəfiqə... Bu sözü sənin dilindən eşitdiyim o aylı-ulduzlu axşamı heç bir zaman unutmayacağam. (*Sükut edərək, nəfəsini dərir*) Qulaq as, o qədim əfsanəyə görə Səməndər adlanan bir quş var. O daim alov içində yanır, amma yenə də ölmür. Hey yanır, yanır, amma əbədi odlara təslim olmur... Bəlkə onun canı dəmirdəndir, hə?

R ə f i q ə. Yox, dəmirdən də olsa, yanıb külə dönərdi.

C ə l a l. Doğru deyirsən, dəmirlə Səməndərin fərqi çoxdur. Mənim tankım da dəmirdəndi, o məhv olub getdi, ancaq mən...

R ə f i q ə (*qəmgin bir təbəssümlə*). Adam özünü bu qədər tərifləməz, Cəlal.

C ə l a l. Bax, bunu düz deyirsən. İnsan gərək özünü tərifləməsin... Sən getməlisən, mütləq getməlisən!.. O vaxt mən ölsəydim, yad bir ölkədə, tənha bir guşədə basdırardılar. Bu mənə şərəf gətirərdi, deyərdilər ki, bu adsız-sansız əsgər ülvi bir məqsəd yolunda həlak olub... Amma həbsxanada bir cani adı ilə ömrü başa vurmaq?.. Yox, bu ölüm mənim həyatımın ağ vərəqində qapqara bir ləkə olardı... Yoxsa sən də bu ittihama inanırdın, hə?

R ə f i q ə (*daha da inciyərək*). Cəlal!.. Səni yaxşı tanımasaydım... Sən nələr düşünürsən, Cəlal?

C ə l a l. İndi gedib hər şeyi müstəntiqə deyəcəksən, eləmi?

R ə f i q ə. Yox, getməyəcəyəm, Mən inanıram ki, gec də olsa, əsil müqəssir tapılacaq.

C ə l a l (*qəhərlə*). Əsl müqəssir... əsl müqəssiri o zaman da tapa bilərdilər... Yalançı şahidlərə inandılar, lakin mənə inanmadılar.

R ə f i q ə. Cəlal, əzizim, bəsdir. Axı, sən həyəcanlandıqca, özünə ziyan verirsən.

Tibb bacısı gəlir.

T i b b  b a c ı s ı. Doktor Rəhimli, atanız zəng eləmişdi.

R ə f i q ə (*Cəlala, rəsmi*). Vətəndaş Qaşqay! Bir kəlmə də danışmaq olmaz. (*Tibb bacısına*) Bir söz demədi ki?

T i b b  b a c ı s ı. (*Rəfiqəni kənara çəkir*). Xəstənin halını soruşurdu. Çox köyrək danışırdı. Deyəsən ağlayırdı.

R ə f i q ə (*həyəcanlanaraq*). Ağlayırdı? Atam? Ola bilməz!

T i b b  b a c ı s ı. Nə deyim, bəlkə mənə belə gəldi? Hə, bir nəfər də orda sizi gözləyir. Deyir vacib işim var.

R ə f i q ə (*tələsik addımlarla gedə-gedə*). Xəstənin yanında ol. Mən bu dəqiqə gəlirəm.

C ə l a l (*son dərəcə məyus*). Doktoru hara çağırdılar?

T i b b  b a c ı s ı. Evlərindən zəng eləmişdilər.

C ə l a l. Evlərindən? Yaxşı ki, getdi. Səhərdən ac-susuzdur.

T i b b  b a c ı s ı. Yox, getməz. Siz onu tanımırsınız. Doktor Rəhimlinin nəzərində naxoş, ya bacı-qardaş, təfavütü yoxdur. Üzünə baxanda deyirsən, nə yaman hirslidir, amma bir ürəyi var, brilyant kimi. Sizi operasiya eləyəndən sonra otağına qapanıb uşaq kimi ağlayırdı.

C ə l a l (*həyəcanını boğmağa çalışaraq*). Niyə ki?

T i b b  b a c ı s ı. Nə bilim? Yəqin sizə yazığı gəlirmiş... Həmişə belədir. Xəstə ağır olanda, ölüb-ölümdən qayıdır... Cavan qız olasan, dünyanın hər nemətinə göz yumasan. Elə bil zəmanə uşağı deyil. Teatr bilməz, kino bilməz. Bir yol qaş-qabağı açılıb, üzü gülməz. Boş vaxtı olanda bir kitabdır, bir də o... Deyirlər istəklisi varmış, tutub qəzəmətə salıblar... Mən buraya keçən ay gəlmişəm. Özüm buralı deyiləm... Nə bilim, vallah, bəlkə ara söhbətidir, mənim də ki, bu cür söhbətlərdən xoşum gəlməz.

C ə l a l (*yerində dirsəklənərək*). Yəqin günahı varmış ki, tutublar də.

T i b b  b a c ı s ı. Nə bilim, vallah? Deyirlər ki, böhtana düşüb. Doktorun özündən soruşmağa cürət eləməmişəm. Mən də elə ondan-bundan eşitmişəm. Bəlkə ara söhbətidir, mənim də ki, belə söhbətlərdən xoşum gəlməz.

Pauza

Soruşmaq ayıb olmasın, sizin üz-gözünüzə nə olub?

C ə l a l. Demək istəyirsən ki, niyə belə eybəcərəm, hə?

T i b b  b a c ı s ı. Yox, eybəcər niyə? Deyirəm yəni harda yandırıbsınız?

C ə l a l. Əhvalat uzundur... Yerimdən tərpəndim, yaram məni incidir... Ufff!..

T i b b  b a c ı s ı (*tələşla*). Günah məndə oldu. Deyəsən çox danışdım... Doktoru çağırım?

C ə l a l. Lazım deyil. Qoy getsin, nahar eləsin. Yazıq səhərdən acsusuzdur.

Fərhad Kamalov və Rəfiqə gəlirlər.

R ə f i q ə. Amma şərtim var, yoldaş Kamalov. Gərək çox incitməyəsiniz.

F ə r h a d. Yalnız iki sual. (*Cəlala yaxınlaşaraq*) Vətəndaş Qaşqay, sizdən çox rica eləyirəm ki, suallarıma mümkün qədər sakit cavab verəsiniz. Rəfiqə xanımla mən şərt bağlamışam: sizə əziyyət verməməliyəm.

C ə l a l. Axı siz kimsiniz?

F ə r h a d. Müstəntiq.

C ə l a l. Mən sizi hər gün gözləmişəm. Heç vaxt ümidimi itirməmişəm. Ən ağır dəqiqələrimdə belə inanmışam ki, ədaləti məhv eləmək Səməndər quşunu öldürmək qədər çətindir!

F ə r h a d. İpək fabrikinin yanmağında sizi günahlandırıblar.

C ə l a l (*tutqun*). Bu təzə xəbər deyil.

F ə r h a d. Bilirəm. Soruşmaq istəyirdim ki, Bəxtiyarovun sizə göstərdiyi boyunbağı yadınızdadırmı?

C ə l a l. Mən bu xüsusda ərizəmdə yazmışam. Oxumamısınız?

F ə r h a d. Oxumuşam. Onu təsvir eləyə bilərsinizmi? Qısaca. İki sözlə. Əsas nişanələrini.

C ə l a l (*xatırlamağa çalışaraq*). Beş parça brilyantı var. Ortadakı hamısından böyük idi.

F ə r h a d. Platindən, yoxsa qızıldan?

C ə l a l. Platindən... Elə deyilmi, Rəfiqə? Mən ay işığında görmüşdüm, amma sənə gün işığında göstərib.

R ə f i q ə. Cavab verim, yoldaş Kamalov?

F ə r h a d. Buna ehtiyac qalmadı. (*Cibindən qutunu çıxardaraq*) Bu qutunu necə, tanıyırsınızmı?

C ə l a l. Xeyr, görməmişəm. Əmin Bəxtiyarov mənə qutu göstərmədi.

F ə r h a d (*boyunbağını çıxardır*). Budurmu?

C ə l a l. Özüdür ki,var.

F ə r h a d (*Rəfiqəyə*). Siz də təsdiq edirsinizmi?

R ə f i q ə. Bəli.

F ə r h a d. İkinci sualıma lüzum qalmadı, vətəndaş Qaşqay. Üzr istəyirəm. Sizə əziyyət verdim. Sağalın, qalxın. (*Cəld addımlarla qapıya sarı yönəlir*)

DOQQUZUNCU ŞƏKİL

Kərim Rəhimlinin evi. Bir ay sonra. Axşam. Yemək stoluna çay dəstgahı düzülmüşdür. Rəfiqə pianoda "Rast" çalır. Əmin Bəxtiyarov səssiz addımlarla, sanki oğrunca gəlir. Rəfiqə onun gəlişindən xəbər tutmayaraq, daha da ilhamla, bərkdən çalmağa başlayır. Son akkordu vurub qurtarır, bəriyə dönəndə Əmini görür, üzünün ifadəsi dəyişir.

Ə m i n. Məni gözləmirdiniz, eləmi?

R ə f i q ə. Gözləmirdim. Mən elə bilirdim siz tutulmusunuz.

Ə m i n (*acı-acı gülümsəyərək*). Bu qədər tələsmək nə üçün? Tələsməyin. Kamalovun qeyri-qanuni istintaqı özünə baha başa oturacaq. Bakıya qayıdalı bir ay olur. Elə o gedəndir. Qoyun gəlsin. Hər dəqiqənin bir hökmü var. Bəlkə onun özünü damladılar. Mıxı mismar eləyən tale barədə xalq əfsanəsini yəqin ki, eşitmisiniz. Böyük alman filosofu İmmanuil Kantın transendental fəlsəfəsinə görə...

R ə f i q ə (*onun dediklərindən təngə gəlib, kəskin bir tərzdə sözünü kəsərək*). Mən yaxşı bilirəm ki, siz buraya nə əfsanə söyləməyə gəlmisiniz, nə də Kantdan danışmağa... Sizə nə lazımdır?

Ə m i n (*sanki Rəfiqənin dediyini eşitməyərək*). Sizi görmək, sizinlə danışmaq, bəlkə də vidalaşmaq...Bayaqdan küçədə şabalıt ağacının dibində dayanıb pəncərənizdən içəri baxırdım. Qiyamət çalırdınız... Bu qədər fasilədən sonra belə məharətlə çalmaq üçün doğrudan da gərək böyük istedad sahibi olasan. Bir az əvvəl üzünüzdən sevinc yağırdı. Axı, məni görəndə nə üçün belə qəzəblənirsiniz?

R ə f i q ə. Səbəbini özünüz bilirsiniz.

Ə m i n. Başa düşürəm. Ancaq yenə də sizdən bir xahişim var. Mənim səmimiyyətimə inanın... Bu vaxta qədər mən heç kimi sevməmişəm. Mənim ilk və son məhəbbətim siz olmusunuz. Bircə dəqiqə səbr eləyin. Sizə indi də vəfalı olduğumu sübut etmək istəyirəm.

R ə f i q ə. Vəfa... Siz vəfadan, sədaqətdən dəm vuranda mən özümü təhqir olunmuş sayıram. (*Telefona yanaşır, dəstəyi götürür*).

Ə m i n. Milis çağırmaq artıqdır. Mən onsuz da bu dəqiqə gedirəm. (*Rəfiqə dəstəyi yerinə qoyur*) Diqqətlə qulaq asın, Rəfiqə xanım.

Telefon zəngi

R ə f i q ə (*dəstəyi götürür*). Bəli, Rəhimlinin evi. Xeyr, yoxdur. İclasa gedib. Danışan qızıdır. Axşamınız xeyir. Aha, xoş gəlmisiniz, yoldaş Kamalov. Çox sağ olun. Yaxşıyam. Cəlal? Sağalıb... Həyətdə gəzinməyə izn vermişik. (*Dinləyir, birdən rəngi tutulur, qeyri-ixtiyari Əminə baxır və səhvini tezcə də başa düşüb üzünü başqa səmtə çevirir*)

Bəli, burdadır... Atam bir azdan gələcək. Buyurun, gəlin. Evdə olacağıq. (*Dəstəyi asır*)

Ə m i n. Məni axtarır, eləmi? Gərək ona deyəydiniz ki, qaçmaq fikrində olsaydım, bir yol tapardım. Kamalova mənim burda olduğumu dediniz? (*Rəfiqə dinmir*) Məhəbbət belə şeydir. Axırda sizi casusluğa da vadar elədi. Təəssüf, çox təəssüf. İndi yaxşı qulaq asın. Madam ki, Kamalovla dostsunuz, onu yola gətirin. Ondan çox şey asılıdır. Deyin, məni intihara məcbur eləməsin. Heç olmasa özünə yazığı gəlsin. Mənimki onsuz da gətirmədi. Yəqin ki, azı on-on beş il həbsdə çürüyəcəyəm. Beli bükülmüş bir qocadan seçilməyəcəyəm. Ondan sonra yaşamağın nə mənası var? Kamalov yəqin sizin məsləhətinizdən çıxmaz. Deyin, yola gəlsin. bu sizin də xeyrinizədir. Hələlik. (*Gedir*)

R ə f i q ə (*özünü itirmiş kimi ora-bura vurnuxur*). Səriyyə, ay qız, hardasan?

S ə r i y y ə (*gəlir*). O burada nə eləyirdi? Səni hədələyirdi? Adını da kişi qoyub...

R ə f i q ə. Yox, özünü öldürmək istəyir. Deyir yaşamağımda məna görmürəm. Ancaq mən buna inanmıram. Qorxuram ki, Kamalova əl qaldırsın.

S ə r i y y ə. Kim? Əmin? Mən arvadlığımla ondan qorxmuram. O ki, Kamalov ola. Kamalov yaman adamdır, ha. Elə bil dalda da iki gözü var. Çayı gətirim, yoxsa Kərim dayını gözləyək?

R ə f i q ə. Gözləyək. Mən də bu axşam heç yana getməyəcəyəm. Axı, Kamalov bizə gələcək. Mənə nə isə vacib bir söz demək istəyirdi. O mənim nəzərimdə indi əziz bir qardaş kimi olub.

S ə r i y y ə. Yəqin ona görə ki, Cəlalı böhtanlardan qurtarıb, hə?

R ə f i q ə. Yox, indi Kamalovu sevən çoxdur. Atam da, fəhlələr də, mühəndislər də... Elə bil hamının çiynindən bir yük götürülüb. Məndən olsaydı, deyərdim ki, insanlara şəfa verən mahir bir həkimlə ədalətli bir müstəntiqin heç bir fərqi yoxdur. Əgər könlün varsa, get teatra. Demirdin Bakı artistləri gəlib?

S ə r iy y ə. Qulyabanı kimi tək necə gedim?

R ə f i q ə. Günah özündədir. Vaxtında ərə getsəydin, indi təklikdən şikayət eləməzdin.

S ə r i y y ə. Eh, sən də söz tapdın danışmağa. Qadam kişilərin ürəyinə! Ər nədir? Bütün günü evdə oturub xörək bişirəcəyəm. Ev-eşik süpürəcəyəm. Gecələr gözümü yola dikib mürgü döyə-döyə gözləyəcəyəm. Nə var, iş bilmişəm, üzlərdən iraq, ərə getmişəm.

R ə f i q ə. Ürəyim belə narahatdır ki...

S ə r i y y ə. Niyə, nə olub?

R ə f i q ə. Heç. Teatra gedirsən, pul verim.

S ə r i y y ə. Özümün puluma nə gəlib? Yoxsa elə fikir eləyirsən ki, ərə getməyənin pulu da olmaz... Ər... ər... nə olsun yəni?

R ə f i q ə. Atalar sözüdür: "Ər arvadın tacıdır".

S ə r i y y ə. Bu məsəli kişilər uydurub. Nə tacbazlıqdır? Bəs niyə onu demirsən ki, qız qaldıqca qızıla dönər? Zarafat-zarafat, toxuculuq texnikumunu qurtarıram. Deməli, sabahda-birigündə keçirəm fabrikə. Dəzgahda işləyəcəyəm. Əvvəl birində, sonra ikisində, sonra da...

R ə f i q ə. Gözlə ha, birdən qəhrəman olarsan.

S ə r i y y ə. Olanlar məndən artıqdır?

R ə f i q ə (*pəncərəyə yanaşaraq*). Bu saat onun əlindən hər nə desən gələr. Bəlkə Kamalovu tapıb xəbərdarlıq eləyək, hə?

S ə r i y y ə. Sənə deyirəm Bəxtiyarovda o kişilik yoxdur.

Bədəl və Fərman gəlirlər.

B ə d ə l. Əssalaməleyküm, qızım.

R ə f i q ə. Bədəl dayı, xoş gəlmisən. Çoxdandır görünmürsən.

B ə d ə l. Əşi, o zalım oğlu Kamalov bizə bir toy tutub ki, Allahın arağını da içməyə macal tapmırıq. Ay qız, Səriyyə, bir bax gör o bufetdə heç nə qalmayıb?

S ə r i y y ə. Bu saat. (*Gedir*)

R ə f i q ə. Məni bağışlayın, bircə dəqiqə... (*Həyəcanlı halda küçəyə çıxır*)

B ə d ə l. Bura bax, Fərman, o zalım oğlu Kamalov bizdən əl çəkənə oxşamır axı.

F ə r m a n. Necə məgər?

B ə d ə l. Deyirlər bu gün səhər yenə gəlib. Cəlal da ki, sağalıb ayağa qalxır. İşimiz lap mütəğəlğəldir.

F ə r m a n. Deyirsən yəni Əmin Bəxtiyarov səni satar?

B ə d ə l. Öz canını qurtarmaq üçün satar da, hələ bir o yana da keçər. Vallah, bu bir ayda anamdan əmdiyim burnumdan gəlib. Baş götürüb bir yana qaçsaq, necə olar, hə?

F ə r m a n. Səndən başqa da qaçmaq istəyən var?

B ə d ə l. Bəs sən? Səni deyirəm də.

F ə r m a n. Daha mən niyə? Yeyəndə yox, içəndə yox, qaçanda ortaq qardaş?

S ə r i y y ə (*əlində qrafin gəlir*). Araq var. Amma lap dibində. (*Qrafini stolun üstünə qoyur*) Buyurun!

B ə d ə l (*qrafini işığa tutaraq*). Mənə bu da bəs edər. (*Fərmana*) Bir yol getməklə necəsən?

F ə r m a n. Pis olmaz.

Bədəl qədəhlərə araq tökür. Bu anda Rəfiqə qayıdır. O hələ də bərk həyəcanlıdır.

B ə d ə l. Deyirəm bunu içək Rəfiqə qızımızın sağlığına. Gün o gün olsun ki, sənin toyunda düb deyənəcən vuraq. Sağ ol, qızım. (*Onun həyəcanlı olduğunu sezərək*) Qanın niyə qaradır? Belə görürəm ki, toya da çox qalmayıb...

R ə f i q ə. Mən bu barədə heç nə bilmirəm. Məsəl var: "Qız evində toydur, oğlan evinin xəbəri yox".

B ə d ə l. Toy barədə bir qucaq məsəl məndə: iyirmi yaşından bu günəcən düz iyirmi min məsəl yığmışam. Bir başqası olsaydı, kitab düzəldib verərdi çapa, bir filan qədər də pul alardı. Amma mən məsəllərimi akademiyaya hədiyyə göndərəcəyəm.

R ə f i q ə. Bədəl dayı, bir de görək hansı məsəlləri bilirsən?

B ə d ə l. Toy barədə? Bu saat. Deyir: "Toy da olsa toyuğun vayıdır, vay da olsa". Bu bir. "Toy gününü qoyub vay gününü oynayır". Bu iki. "Toy mənim, xeyrat babamın". Bu üç. "Toy töhfəsiz, gəlin yengəsiz olmaz". Bu dörd. "Toyda oynamaz, vayda ağlamaz". Bu beş. "Toydan sonra nağara". Bu da altı. Bəs elər, yoxsa yenə deyim?

R ə f i q ə. Bəsdir, bəsdir, Bədəl dayı. Kitabın çıxar, oxuyarıq.

B ə d ə l. Amma elə eləmə ki, toydan sonra nağara gələk, ha! Cəlal Qaşqay sağalıb qalxır ayağa. Daha nə vaxtacan gözlədəcəksən? (*Qədəhlərə yenə araq tökür*) Deyirəm ki, bunu da içək sənin nişanlının sağlığına! (*İçir*) Düzünü de görüm, çıxır, ya yox? Toyun nə vaxtdır, hə?

R ə f i q ə (*darıxmış kimi*). Eh, Bədəl dayı, bu söhbətin vaxtı deyil.

B ə d ə l. Niyə ki, qızım?.. Eh, bu fani dünyada padşahdan-zaddansa ola bilmədik.

F ə r m a n. Öz aramızdır, həmişə ikinci rumkanı içən kimi padşahlıq xülyasına düşürsən. (*Bu anda Fərhad Kamalov gəlir, Bədəl onu görən kimi başlayır əli ilə gözünü ovxalayır, röyada olduğunu güman eləyir*)

F ə r h a d (*Rəfiqə ilə görüşür*). Axşamınız xeyir. Cəlal Qaşqay hələ gəlməyib?

R ə f i q ə. Xeyr, gəlməyib. Axı, ona kim izn verib ki, gəlsin də?

F ə r h a d. Artıq o, bəraət aldı. İndi Cəlal Qaşqay məhbus deyil. Mən istərdim ki, onu öz əlimlə sizə təhvil verim. Gəlin, bir yerdə xəstəxanaya gedək.

R ə f i q ə. Yox, yox. Mən özüm gedib onu gətirərəm. Xahiş edirəm, heç yerə çıxmayın. Bizi burda gözləyin. Mənim sizə vacib sözüm var.

B ə d ə l. İstədiyi yar idi, yetirdi pərvərdigar. Axşamınız xeyir. Xoş gördük.

F ə r h a d (*Bədələ*). Hə, vətəndaş Sadayev, deyəsən biz yenə görüşəsi olduq.

B ə d ə l. Bəli, görürəm ki, bu istintaq acı bağırsaq kimi uzanacaq. qurtar bunu də. Qurtar getsin, yoldaş Kamalov.

F ə r h a d. Darıxmayın. Sabah hər şey qurtarır. Qaşqayın sağalıb çıxmağını gözləyirdik. (*Bədəl getmək istəyir*) Kələfin bir ucu da sizə gedib çıxır. İpək malların orderini siz yazmısınız.

B ə d ə l. Əstəğfürullah. Düşmədik kələyə! Bu fani dünyada padşahdan-zaddansa olmadıq ki...

F ə r h a d. Padşah? Padşah olsaydın neylərdin? Heç kəs sənə cəza verə bilməzdi, eləmi?

B ə d ə l. Yox, qardaş. Mən ki, səni belə görürəm, padşah nədir, lap prezidenti də yerindən dəbərdərsən.

Kərim Rəhimli gəlir. Fərhadla görüşür.

K ə r i m. Xoş gördük, yoldaş Kamalov, həmişə sən gələsən. Bu iclaslar məni lap həkdən saldı. (*Səriyyəyə*) Ay qız, bir tez ol, çay gətir.

S ə r i y y ə. Bu dəqiqə. (*Gedir*)

B ə d ə l. Bu çayda nə görmüsən? Rəhmətliyin nəvəsi, belə əziz qonağa layiq bir içki tapılmır içək, arada səmimiyyət olsun. Söz-söhbət qurtarsın. Mən də deyirəm, qocalıb əldən düşmüşəm. Pensiyalıq vaxtımdır. Azad eləyin, gedim. Daha neyləyək? Hə, yoldaş Kamalov? Bu fani dünyada padşahdan-zaddan...

F ə r h a d (*Bədələ*). Özünüzü nahaq Əhmədi-biqəm kimi göstərirsiniz. İndi mənə çox şey bəllidir. Əmin Bəxtiyarovun inadı özünə də, sizə də fayda vermədi.

B ə d ə l. Cavan adamsan, gəl bu qoca vaxtımda mənə sataşma. Xeyir görməzsən. Bizə Sadaylılar deyərlər. Bizim ocağımıza sataşan ömründə xoşbəxt olmayıb.

F ə r h a d. Bax, bunu düz deyirsən. Yalnız öz xeyrini düşünən adamlardan xalq həmişə ziyan görüb.

B ə d ə l. Kərim qağa, bu nə deyir? Bəs mənim qırx illik zəhmətim?

K ə r i m. Bura bax, gəl məni cin atına mindirmə. Sənə də lənət, sənin zəhmətinə də!

B ə d ə l. A kişi, bu saç-saqqalından utanmırsan?

K ə r i m. Yox, daha utanmıram. İndiyəcən utandığım üçün də həm camaata, həm də özümə ziyan vurmuşam. Adamların şirin dilinə aldanıb, acı niyyətlərini başa düşməmişəm. Bilməmişəm ki, bəzən acı sözlərin dalında saf, yüksək bir arzu, böyük bir xeyirxahlıq gizlənirmiş. Mən çox səhv eləmişəm. Adamları tanımamışam. Əmin Bəxtiyarov kimilərinin yağlı dillərinə aldanıb, öz doğma balamın təmiz məhəbbətini tapdalamışam.

B ə d ə l (*Fərmana*). Deməli, bizi güdaza verirlər. Bu da sənin vicdanlı direktorun. Yaxşı, olsun. Bizim də səsimizi eşidən tapılar. Gedək, Fərman!

F ə r m a n. Məni hara aparırsan? Mənə güldən ağır söz deyən olmadı. Sən öz dərdini çək.

B ə d ə l (*heyrətlə*). Fərman, sən də belə?! Adə, bəlkə məni elə sən şeytanlamısan? Nə eybi var? Bədəl Sadayevi yıxmaq o qədər də asan deyil. Açacağam sandığı, tökəcəyəm pambığı!

F ə r h a d. Bunlar hamısı öz yerində. Amma sabah səhər saat doqquzda hər ikiniz rayon prokurorluğunda olmalısınız.

Bədəllə Fərman gedirlər.

K ə r i m. Buyurun, çay için.

F ə r h a d. Bəs bu Qaşqay nə üçün gəlmədi?

K ə r i m. Qaşqay?

F ə r h a d. Bəli. Bu gündən o, azad vətəndaşdır. Məhkəmədə yalnız şahid sifəti ilə çıxış edəcək. Qızınız onu gətirməyə getdi. Amma nə üçünsə mənə həyəcanlı göründü.

K ə r i m. Yəqin sevindiyindəndir. (*Səriyyə çay gətirir, stol üstünə düzüb gedir, bu anda qapı döyülür*) Buyurun!

Ə m i n (*gəlir*). Axşamınız xeyir, yoldaş Kamalov. Təklikdə sizə bir neçə sözüm var. Bəlkə sonra gəlim, hə?

K ə r i m. Mən sizi tək buraxa bilərəm (*Gedir*)

F ə r h a d. Nə istəyirsiniz?

Ə m i n. Məni çox sorğu-suala tutdunuz. İndi də siz mənə cavab verməlisiniz. Məndən əl çəkəcəksiniz, ya yox?

F ə r h a d. Bu sualın mənası mənə aydın deyil.

Ə m i n. Aydın deyil? Gəlin açıq danışaq. Ərənlər üçəcən deyiblər. Gərək ki, belə bir məsəl də var. Mən iki dəfə xəbərdarlıq eləmişəm. Pəncərədən atılan daşa bağlanmış kağız parçası birinci xəbərdarlıq idi. Xatırlayırsınızmı?

F ə r h a d. Sonra?

Ə m i n. Boyunbağını necə? O da ikinci xəbərdarlıq idi. Unutmamısınız ki?

F ə r h a d. Elə qiymətli rüşvəti hansı müstəntiq unuda bilər?

Ə m i n. Üçüncü dəfə də indi özüm xəbərdarlıq eləyirəm. Müqəssir Cəlal Qaşqaydır. Elə deyilmi?

F ə r h a d. Xeyr, elə deyil! Fabriki sən yandırtmısan. Əlbəttə, tək yox. O biri dostlarını da tapmışam.

Ə m i n. Hələ də gec deyil, vətəndaş Kamalov. Ziyanın yarısından qayıtmağınız məsləhətdir. Boyunbağı azdırsa, ondan da qiymətli şey əlavə eləyə bilərəm.

F ə r h a d. Mən həqiqəti böyük bir xəzinəyə dəyişmərəm. Gedin, gedin, Bəxtiyarov.

Ə m i n. Elə isə öz bəxtinizdən küsün. (*Gedir*)

F ə r h a d (*telefonla*). Kimdir? Axşamınız xeyir. Xahiş edirəm Əmin Bəxtiyarov haqqında qəti tədbir qəbul olunsun. Təcili. Bəli, sərəncam vardır.

K ə r i m (*gəlir*). Hə, nə deyirdi? Yəqin peşman olub. Bağışlanmasını xahiş edir?

F ə r h a d. Xeyr. Bəxtiyarov, təəssüf ki, başqa təbiətli adamdır. Belələrinin həyat yolu dərin, müdhiş bir burulğanı xatırladır. Ora düşdülərmi, çıxa bilmirlər. Sizcə, müqəssir kimdir?

K ə r i m Kim olacaq, canım-gözüm? Özləri!

F ə r h a d. Heç kim onların namusla yaşamağına mane olmur. Milyonlardan seçilməyə çalışanlar, yalnız öz xeyrini güdənlər, həyata dar gözlə baxanlar xoşbəxt ola bilməzlər! (*Pəncərəyə yanaşır*) Gözəl hava var... Küçənin başından bir dəstə adam bura döndü.

K ə r i m Bəlkə onlardır? Oxşayır bu tərəfə gəlirlər...

F ə r h a d. Bu axşam şəhəriniz mənə xüsusilə qəşəng görünür. Musiqi...gülüş səsləri... Elə bil işıqlar da güclənib. Adamın gözləri qamaşır...

K ə r i m Dünəndən bəri Mingəçevirdən işıq alırıq. Nərimanabadın böyük gələcəyi var. Tək elə bizim fabrik bir neçə ildən sonra dönüb kombinat olacaq. Mən indidən təzə fəhlələr barədə fikirləşirəm... Belə görünür ki, toxuculuq məktəbini də ona nisbət böyütmək lazım gələcək.

F ə r h a d (*birdən xatırlayır*). Hə, yoldaş Rəhimli, Əsmər fabrikə qayıtdı, qayıtmadı?

K ə r i m Bəli, qayıtdı. Onu payızdan ali məktəbə mühəndislik oxumağa göndərirəm.

F ə r h a d. Lap yaxşı. İnsanların xoşbəxtliyini görəndə daha böyük həvəslə, yorulmaq bilmədən çalışmaq, gələcəyi daha sürətlə insanlara yaxınlaşdırmaq istəyirsən. Eşitmisinizmi, bir əfsanə var...

Bu anda pəncərədən içəriyə iki güllə açılır. Fərhad yıxılır, güllə səsinə Səriyyə yüyürüb gəlir. Kərim onunla köməkləşib Fərhadı divana uzadır.

S ə r i y y ə. Vay, vay!.. Kərim dayı, yəqin o ciyəri yanmış Əmin atdı.

Rəfiqə ilə Qaşqay gəlirlər.

C ə l a l. Yoldaş Kamalov, siz neyləyirsiniz? Nə üçün ehtiyatsız dolanırsınız?

F ə r h a d. Daha keçib, Qaşqay.

C ə l a l. O məni də vurmaq istədi. Ancaq üstünə atılıb onu yaxaladılar, silahını əlindən aldılar. (*Rəfiqəyə*) Doktor, onu qurtarın! Bizə səadət gətirən bu insanın ölümünə dözmək çətindir.

R ə f i q ə (*cəld Fərhada yanaşır, diqqətlə müayinədən keçirir, öz-özünə danışırmış kimi*). Ah...

C ə l a l. Nə oldu, əzizim?

R ə f i q ə (*böyük bir çətinliklə, yavaşcadan*). Ümid yoxdur...

F ə r h a d. Bilirəm, ümid yoxdur... (*Son gücünü toplayaraq*) Məni öldürə bilərlər. Onların lənətə gəlmiş nəfsi yalnız cinayət törətməyə qadirdir... Eh, mən nə danışıram? Qədim, çox qədim bir əfsanə var. Səməndər adlı quş əbədi odlar-alovlar içində yanır, amma heç bir zaman ölmür... İnsan bu əfsanəni yaradanda özünün böyük əməllərini nəzərdə tutub. İnsan ölsə də, bu əməllər yaşayır, yaşayacaq da!.. (*Ölür. Ümumi və qəmli bir sükut*)

## SABİR – NOVATOR

Deyilənə görə XIX əsrdə Azərbaycan ədəbiyyatı meydanına yüzdən artıq “şair” gəlmişdir. Bunların da çoxusu tamamilə unudulmuşdur. Bunda xalqı taqsırlandırmaq olarmı? Yox. Müqəssir yalnız şairlərin özüdür. Xalqımız gözəl şairlərini sevməyi bacarır. Buna bir neçə misal da göstərə bilərik. Budur, dindarların, molla və axundların tələbi ilə böyük bir insan, dərin bir filosof, gözəl bir şair işgəncə ilə öldürüldü. Onu ölümlə xatirələrdən silmək istədilər, lakin xalq, avamlıq dünyasının qatı qaranlığı içində parlayan bu məşəli sönməyə qoymadı, bəlkə, tərsinə, onu günəş kimi daha da yüksəklərə qaldırdı, onun nurunu içdi, lakin yenə də yuxulu gözlərini aça bilmədi, yalnız aşıqların qəmli səsi ilə uzun əsrlər boyu dərdli-dərdli inlədi:

Nəsimini dabanından soydular!..

Daha sonra Azərbaycan xalqının bağrından qopub gələn incə bir ürək təranəsini vəhşicəsinə boğdular, onu bülbül kimi şaqramağa qoymadılar. Xalq isə bu böyük insana əbədi xatirə yaratdı, ona sözdən heykəl yüksəltdi:

Hər oxuyan Molla Pənah olmaz!..

Yenəmi misal istəyirsiniz? Azərbaycanın qanla yazılmış tarixində belə faciələr azmı olmuşdur?

Bədbəxt bir gündə əski Tiflisin tozlu küçələri ilə qəbristana bir cənazə aparırdılar. Ona Nikolay kazaklarından başqa heç kim yaxın durmayırdı. Dükanların qarşısından keçərkən söyüşlər, nifrinlər eşidilirdi. Nə üçün? Çünki bu insan böyük idi, xalq üçün saç ağartmışdı, bütün mədəni Avropada məşhur olmuşdu. Çünki bu bədbəxt gündə ağzı köpüklənə-köpüklənə onun ardınca lənət oxuyanlar, “Hacı qara”larda “Müsyö Jordan”larda, “Kimyagər”lərdə, “Aldanmış kəvakib”lərdə əkslərini görüb özlərindən çıxmışdılar.

Lakin azad olmuş xalq, ona öz paytaxtında tuncdan heykəl qoydu, əsərlərini sevə-sevə oxudu, dinlədi. Onun adı çəkiləndə nifrət deyil, iftixar hissi duydu.

Sonralar şair, xalqın öz içindən çıxdı. O, xalqın doğma həyatından yazdı. Onun iniltilərini, acı fəryadını şerinin ahənginə hopdurdu. Sənətinin inciləri ilə böyük Azərbaycan ədəbiyyatı sarayını bəzədi. Lakin “millət qəhrəmanları” bunu görə bilmədilər. Şair ac-susuz qaldı, xəstəliyini müalicə etdirməyə pul tapa bilmədi. O hələ gənc ikən böyük xalq

sənətinə vida etdi. Xalq isə yaratdığı böyük inqilabın ilk günlərində şairini xatırladı, məktəblərdən, kitabxanalardan bir çoxunu onun adına yazdı, heykəlini gözəl bir bağçada güllər və çiçəklərlə bəzədi: Sabirin adı və əsərləri ən yeni nəslimizin belə dilində əzbər oldu. Sabirin xatirəsi getdikcə daha da yüksəldi. "Hop-hop" quşu neft mədənlərinə, pambıq tarlalarına, məktəblərə doğru uçub, yorulmadan əski həyatın nəğmələrini, şikayətlərini, acı naləsini oxudu. Böyük xalq onun mahnılarını eşitdi, sevdi, sonra da gur səslə oxudu:

Artdıqca həyasızlıq, olur el mütəhəmmil,
Hər zülmə dözən canları neylərdin, ilahi?

Bir dövrdə kim sidq səfa qalmayacaqmış,
Bilməm belə dövranları neylərdin, ilahi?

Məzlumların göz yaşı dərya olacaqmış,
Dəryaları, ümmanları neylərdin, ilahi?

Səyyadi-cəfakardə rəhm olmayacaqmış,
Ahuləri, ceyranları neylərdin, ilahi?

Bağın, əkinin xeyrini bəylər görəcəkmiş,
Toxm əkməyə dehqanları neylərdin, ilahi?

İş rəncbərin, güc öküzün, yer özününkü,
Bəyzadələri, xanları neylərdin, ilahi?

Sabirdəki bu qətilik təsadüfi bir mahiyyət daşımırdı. O, "Füyuzat" səhifələrini dolduran mistik şeirləri, mücərrəd "romantikanı" görmək belə istəmirdi. O, vaxtilə Nekrasovun dediyi kimi, "şair olmaya da bilərsən, lakin vətəndaş olmağa məcbursan" fikrinin şüurlu tərəfdarlarından biri idi. Sabirin yaradıcılığı vətəndaşlıq motivləri ilə nəfəs alırdı. Onu yüksəldən, onu həqiqi ictimai bir ürək kimi çırpınmağa məcbur edən böyük vətəndaşlıq məsuliyyəti idi! Bu səbəbdən də Sabir inqilabın şairi idi. O, irticaın şiddətli illərində, dövrünün bütün şairlərindən fərqli olaraq, öz ictimai satirasının hər cür silahdan tez, qüvvətli təsir edən qiymətli – dərin misraları ilə mülkədar-kapitalist cəmiyyətinə sarsıdıcı ölüm zərbələri endirirdi. Sabir qəmgin olsa da, ağlasa da, yenə

zəifləmirdi, yenə sağalmaz yara vururdu, yenə şiddətli qəhqəhə ilə gülməyi bacarırdı. Ona görə də əsl, həqiqi sənət zirvələrinə yüksələ bilirdi. O, aldatmırdı. Onun şeirləri həyatın həqiqətini göstərirdi. Sabir realist idi. Onun realizmi aktiv və yıxıcı bir xarakter daşıyırdı. Dediyimiz kimi, onda həqiqi bir ictimai ürək çırpınırdı:

Neyləməli, göz görür, əqlim kəsir,
Mən günəşi göydə dana bilmirəm.

Eyni zamanda Sabir öz yaradıcılıq prinsiplərini oxucularından gizlədə bilmirdi. Onun epiqramları, səhnəcikləri, "nəzirələri" Sabiri həqiqi siyasi bir şair kimi tanıtdırırdı. Azərbaycan ədəbiyyatında az yazıçı bu qədər məharətlə zamanın siyasi məsələlərini əks etdirmişdir. Sabir ona görə böyük və ölməzdir ki, o, gündəlik məsələləri yüksək bədii səviyyədə həll etməyi bacaran bir sənətkar olmuşdur. Bu sahədə onu Fransanın məşhur şərqi sənətkarı Beranje ilə müqayisə etmək olar. Sabir həqiqətən gözü açıq, diribaş, mübariz, düşməni ustalıqla döyəcləyən bir satirikdi. Qoy Sabirin oxucuları bir daha onun dialoqlarını, səhnəciklərini diqqətlə oxusunlar, bu əsərlərdə Sabirin böyük bir məharətlə tamam bir epoxanın Çirkin cizgilərini necə qavradığını, xalqın düşmənlərini acı qəhqəhələrlə necə döyüb taqətdən saldığını görəcəklər.

Aydındır ki, bu parçalar hər cəhətdən yeni bədii əsərlərdir. Bəzən Sabir belə kiçik ədəbi formalarda yaxşı bir komediyanın verdiyi effekti vermişdir. Bu səbəbə görə də biz Sabiri, heç bir mübaliğəyə yol verməDən Azərbaycan ədəbiyyatının ən böyük klassikləri sırasına daxil edirik.

Sabir heç bir zaman forma xatirinə yazan bir şair olmamışdır. O, şeirə hər şeydən əvvəl yeni tematika, yeni mündəricə gətirmişdir. O, Azərbaycan şerinə vətəndaşlıq mərdliyi gətirmişdir. O, "bülbülə, eşqə, gülə dair yalan fırladan" şairləri inkar etmiş, "cəridəsini doldurmaq üçün mətləbi uzadan" qəzetçiləri döymüş və bununla kifayətlənməyərək, "nəzirələr" adı ilə köhnə şeir formalarını öz məhdud cığırından çıxmağa və yeni məzmuna xidmət etməyə məcbur etmişdir. Bu səbəbə görə də Sabir həqiqi bir novator kimi parlamışdır.

*1936*

## BÖYÜK AŞIQ

Azərbaycan aşıqları içərisində ən görkəmli yeri Göyçə mahalının xalq aşıqı Ələsgər tutur. Bir əsrdən artıq yaşamış bu böyük aşıq, elə bir bədii səviyyəyə yüksəlmişdir ki, bu gün biz onu Vaqif, Vidadi kimi şairlərimizlə yanaşı tədqiq edib öyrənsək, ona ədəbiyyat tariximizdə olduqca fəxri bir yer versək, məktəblərimizin ədəbiyyat dərsi proqramlarına belə salsaq heç yanılmarıq. Çünki Aşıq Ələsgərin qoşmaları, təcnisləri, dodaqdəyməzləri, həcvləri yüksək məndəricə ilə yanaşı ən zəngin şeir formalarını da qavrayır. Aşıq Ələsgər böyük bir talantdır. Heç də təsadüfi deyildir ki, bu günkü aşıqlarının çoxu onu öz müəllimi hesab edir.

Ələsgər şüurlu olaraq öz yaradıcılığı qarşısında müəyyən vəzifələr qoyur. Dünya filosoflarının estetik görüşlərindən tamamilə xəbərsiz olan bu böyük sənətkarın özünə məxsus müəyyən ədəbi kodeksləri də vardır. Görün o, aşıqdan nə tələb edir:

Xalqa həqiqətdən mətləb qandıra,
Şeytanı öldürüb nəfsin yandıra,
El içində pak otura, pak dura,
Dalısınca xoş sədalı gərəkdir.

Onun fikrincə aşıq hər cəhətdən nümunə olmalıdır. O, aşıqlardan ağıl, kamal tələb edir. Onun nöqteyi-nəzərincə aşıq "mərifət elmində dolu gərəkdir", aşıq, dediyi sözlərin qədrini bilməlidir. Bu o deməkdir ki, aşıq xalqı öyrədəndə, onun nöqsanlarını göstərəndə birinci növbədə özünü düzəltməli, özünü tərbiyə etməlidir. Müasir dildə söyləyəcək olsaq Ələsgər, aşıqdan yüksək bir şəxsiyyət olmağı tələb edir.

Ələsgərin əsas yaradıcılıq xüsusiyyətləri nədən ibarətdir? O, hər şeydən əvvəl lirikdir. Onun lirikası dərin bir məhəbbətlə çırpınır. O, sevgidən, gözəllərdən, vəfadan bəhs edərkən hər yerdə optimistdir. Ələsgər ən qoca yaşlarında belə həyatı sevmiş, dünyanın iztirablarından bədbin olmamışdır. Yüz ildən çox yaşamış bu qoca, ömrünün axırına kimi "hər könül özünə bir padşahdır" demişdir. Azad sevgi, azad məhəbbət böyük aşığın ən başlıca motivlərindən biri olmuşdur. O, azad sevgini tərənnüm edərkən öz arvadının pis cəhətlərini belə həcv etməkdən çəkinməmişdir:

O vaxt ki, gəlin oldun,
Qabırğası qalın oldun,
Qaynanana zalım oldun,
Dilindən xəbərin varmı?

Ələsgərin lirikası qüvvətlidir, dərindir, çünki realistikdir. O həyatdan uzaqlaşmağa, bədbinliyə, nihilizmə deyil, həyata, sevgiyə çağırmışdır.

Bəzən eyni motivləri, eyni əhval-ruhiyyəni bir-birindən gözəl misralarda ifadə edən aşıq Ələsgər, dediyimiz kimi, lirikanın yüksək nümunələrini vermişdir. Bu lirika həyati sevgidən, real məhəbbətdən bəhs edir. O, hətta bəzən konkret gözəlləri nəzərdə tutaraq, onların haqqında canlı, təsirli və dərin qoşmalar söyləyir. Burada bəzən cəngavərliyə məxsus olan sədaqətdən, sevgidən bəhs olunur:

Öldürsələr qorxum yoxdur qanımdan,
Yolunda keçmişəm şirin canımdan.
Tərk oldum vətəndən, xanimanımdan,
İnsaf deyil, gəzmə məndən aralı.

Aşıq Ələsgərəm, söylənir adım,
Budur ürəyimdə mətləb, muradım:
Sənin ərin ölsün, mənim arvadım,
Gəzək hər ikimiz yaslı, yaralı.

Göründüyü kimi, Ələsgər ilk nəzərdə qəmgin görünən bu misralarında belə oxucusunu, daha doğrusu dinləyicisini güldürür, sevindirir. Burada aşığın kəskin ağlı, səmimiliyi və sənətkarlığı özünü tam mənası ilə göstərir. Ələsgər sevgi haqqında danışarkən təsvir və tərənnüm etdiyi gözəlləri real müqayisələrlə vermişdir:

Tarlan tamaşalı, maral baxışlı,
Qədəm qoyub asta-asta xoş gəldin!
Yolun sadağası can ilə başdır,
Qurban sənin kimi dosta, xoş gəldin!..

Ələsgər lirik əsərlərində bir tərənnümçü olaraq qalmayıb, epik səhnələri də böyük sənətkarlıqla yaradır. Az kəlmə ilə çox fikir söyləmək, canlı və təsirli şairanə səhnələr təsvir etmək istedadı Ələsgərin lirikasını daha da zənginləşdirir:

Gedirdim, güzarım düşdü bulağa,
Ovçu bərəsində maralı gördüm.
Yatıb inildəyir, durub boylanır,
Bir neçə yerindən yaralı gördüm.

Zalım ovçu onu qoyub nişana,
Dəlib ürəyini boyayıb qana,
Yıxılıb çevrilir, o yan-bu yana,
Kəsilibdir səbri, qərarı, gördüm.

Təbib olsam yaraların bağlaram,
Sinəm üstün düyünlərəm, dağlaram.
Ələsgərəm, çaylar kimi çağlaram,
Ananı baladan aralı gördüm.

Hər şeydən əvvəl nəzərimizi cəlb edən böyük müqayisə, maralla ovçu müqayisəsidir. Şairin təsvirini oxuyanlar, dərhal bunların kim olduqlarını anlayırlar. Ələsgərin məharəti, sənətkarlığı, xalqın canlı təsəvvürünə, obrazlı ifadələrinə və müqayisələrinə əsaslanır. Buradakı xəlqiliyin dərin ictimai kökü vardır. Müasir şairlərimizin bəzisi şeirdə xəlqiliyi yanlış anladığı üçün, onların əsərləri sadə dildə yazılmış olsa da kütlə tərəfindən anlaşılmamış qalır. Burada kütlə deyil, şair özü müqəssirdir. Bu gün hamıya məlumdur ki, milli forma deyildiyi zaman müəyyən xalqın dil xüsusiyyətləri təfəkkür xüsusiyyətləri nəzərdən qaçırıla bilməz.

Ələsgərin lirikası xalq şerinin qızıl fonduna daxil olur. Çünki o, bədii üslubu cəhətindən xalqa bağlıdır, onun yaradıcılığı Azərbaycan poeziyasının ənənələri üzərində yüksəlmişdir. Xalq dilinin ən gözəl xüsusiyyətlərini bilən, bu dili bəzən olduqca yüksək bir şeir səviyyəsinə qaldıran aşıq Ələsgərdə müəyyən bir fikir ifadə etməyən süni misralara rast gələ bilməzsiniz. Bu, əlbəttə aşıq Ələsgərin çox bilikli, bacarıqlı, xalqı ilə yaxından bağlı bir ədəbi şəxsiyyət olduğunu aydın göstərir. O, qorxmayır, düşmənləri cəsarətlə qırmaclayır, bəzən kəskin satiraya qədər yüksəlir, din nümayəndələrini, bəyləri döyəcləyir:

Ələsgər elmində olmaz nabələd,
Doğru söylə, sözün çıxmasın qələt,
Şahiddə insaf yox, bəydə ədalət,
Qazıların düz bazarın görmədim,

deyə şikayətdən artıq dərin bir qəzəb ifadə edən misralarını söyləyir. Xüsusən mollalar haqqındakı həcvində Ələsgərin qüvvətini daha aydın hiss edə bilərik:

Söyütdür zatınız, billəm, mollalar,
Çəkib boy verərsiz, barınız olmaz;
Dildən dost olarsız, könüldən uzaq,
Doğru, dürüst etibarınız olmaz.

Yoxsulun malını halal bilərsiz,
Şeytani-ləindən mətləb dilərsiz,
Əskik danışarsız, artıq gülərsiz,
Namus, qeyrətiniz, arınız olmaz.

Bütün bu faktlar göstərir ki, aşıq Ələsgərin bədii yaradıcılığı dərin ictimai köklərə əsaslanır.

Sənətkarın sazında təkcə gözəllər təriflənməmiş, bəlkə-bununla yanaşı olaraq, xalqın canına daraşan parazitlər, ikiüzlülər, namussuzlar, bəylər və mollalar döyülmüşdür. Ələsgərin sənəti eyni qüvvətini, eyni səmimiliyini və koloritini bu sahədə də mühafizə edir. O, götürdüyü bütün mövzularda sənətkardır. Onun misraları möhkəm, yürütdüyü fikirlər aydındır.

Ələsgər el qəhrəmanlarından da az bəhs eləməmişdir. Onun bütün yaradıcılığında biz hər zaman xalqın ən namuslu oğlu kimi meydana çıxan bir şair görürük. Onun bəzi əsərlərindəki bədii zəiflik isə, bu şeirləri müəyyən təsadüfi əhval-ruhiyyə təsirində söyləməsindən irəli gəlmişdir. Biz bu əsərlərin çoxunda aşığın həqiqi səsini eşitmirik. Burada sənət azdır. Çünki aşıq, dediyimiz kimi, müəyyən dərəcədə öz yaradıcılıq xəttindən ayrılmışdır.

Bu da, şübhəsiz, onun zəif cəhətlərini görmək üçün bizə imkan verir. Ələsgərin şeir formaları zəngindir, çoxtərəflidir.

Ələsgərdən öyrənmək olarmı? Əlbəttə olar və bu son dərəcə zəruridir. Dövrümüzün şairi, Ələsgər kimi səmimi, xalqa bağlı olan, onun yüksək ənənələrini ifadə edən və yalnız bu xətt üzərində irəliləyən bir sənət, yeni məzmunlu, bir sənət yaradır. Bu günün şairi əsrimizin insanlarını, onların zəngin mənəviyyatını, yüksək sevgisini, yoldaşlıq sədaqətini, qəhrəmanlığını tərənnüm edərkən bu şairin yolu ilə getməli və onu dövrümüzün səviyyəsinə qaldırmalıdır. Əlbəttə, belə olsa şair müstəqil, tam və orijinal ədəbi bir şəxsiyyət kimi meydana çıxacaqdır. Bu günkü şairlərimiz içərisində beləlləri vardır. Bu günkü şerimiz əsasən bu yolla inkişaf edir və bu, əlbəttə, nöqsan deyil, məziyyətdir!..

*1938*

# M.F.AXUNDOVUN DRAMATURGİYASI HAQQINDA BƏZİ QEYDLƏR

Deni Didro "Dramatik poeziya haqqında"kı kitabında yazır: "Əsər barəsində düzgün mühakimə yürütmək üçün onu başqa əsərlərlə müqayisə etmək lazım deyildir".

Bu fikir müəyyən dərəcədə doğrudur. Müəyyən dərəcədə deyirik, çünki bəzən yerli müqayisə xeyir verə bilər. Lakin Didro bu fikri söylərkən bitkin sənət əsərlərini nəzərdə tutur. Xüsusən dramlardan bəhs edildiyi zaman, müqayisə, tədqiqatçıdan böyük risq tələb edir.

Puşkin deyir ki, hər bir dramaturqu öz xüsusi qanunlarına əsaslanaraq mühakimə etmək lazımdır. Didronun qeyd edilən fikri ilə Puşkinin dediyi arasında prinsip etibarilə heç bir fərq yoxdur.

Mirzə Fətəli Axundov dramaturgiyası ölməz klassik nümunələr vermişdir. Buna görə də, biz – onun həqiqi varisləri, birinci növbədə onun özünə məxsus olan dramaturgiya qanunlarını, özünün spesifik xüsusiyyətlərini arayıb ortaya çıxarmalıyıq.

Bu vaxta qədər ənənə üzrə Mirzə Fətəli Axundovu "Azərbaycan Molyeri" adlandırmaqdadırlar. Bizə elə gəlir ki, bu titul onun ədəbiyyatımız tarixindəki əhəmiyyətini düzgün qiymətləndirməyə mane olur. Çünki M.F.Axundov bütün Şərq ədəbiyyatının ilk dramaturqu olmaq etibarilə və öz xüsusiyyətləri cəhətindən Molyerə o qədər yaxın deyildir. Bu sonuncu qeydə daha artıq diqqət yetirmək lazımdır: Mirzə Fətəli Axundov öz dünyagörüşü və dramaturgiya qanunları nöqteyi-nəzərindən olduqca müstəqil bir sənətkar kimi meydana çıxmışdır.

Onun əsərləri Molyer üçün xeyli səciyyəvi olan yalançı klassisizmdən uzaqdır, onun realizmi böyük və dərin ictimai əhatə qüvvəsinə malikdir.

M.F.Axundovun tarixi rolu doğrudan-doğruya son dərəcə böyükdür: Şərq ədəbiyyatı ənənələrini tənqid süzgəcindən keçirərək, yeni bir üslub yaratmış sənətkar, əsərlərində də filosof kimi, mütəfəkkir kimi dövrü üçün həddindən artıq aktual olan məsələləri qaldırmış, həll etməyi bacarmışdır. Bu səbəbə görədir ki, o, Azərbaycan ədəbiyyatı tarixində get-gedə daha artıq qiymətləndirilən, daha çox sevimli və daha yaxşı anlaşılan bir ustadır. Aydındır ki, əsrlər də keçsə, xalqımızın gələcək nəsilləri onu ehtiramla yad edəcək və ona öz teatrının repertuarında daha fəxri bir yer verəcəkdir.

Axundov tənqidi qeydlərinin bir yerində yazırdı: “Dramaya dair əsərlərin şərti və xüsusən komediyanın təqazası xəlayiqin eyblərini və əxlaqi-zəminələrini eynilə göstərməkdir. Drama sənətinin məqsədi – insanların əxlaqlarını yaxşılaşdırmaq, oxucu və qulaq asanları ibrətləndirməkdir”.

M.F.Axundov dramaturgiyasında əks olunan eyblər, insan əxlaqındakı nöqsanlar, olsun ki, bizim müasirlərimizdə yox dərəcəsindədir. Hətta belə də olsa, Axundov dramaturgiyası öz tərbiyəvi qiymətini heç bir zaman itirməyəcəkdir. Zira o, bədii lövhələri üçün əsas aldığı həyat lövhələrini o qədər yüksək bədii bir səviyyədə vermişdir ki, biz hacı qaraları, heydərbəyləri, müsyö jordanları, hatəmxan ağaları, hacı kərimləri gözümüzün qarşısından keçirərkən, xalqımızın tarixini, onun böyük bir dövrünü aydın görür və bu insan tiplərini yaradana ürək dolusu iftixarla baxıb öz-özümüzə deyirik: “Belə sənətkar ölməz”.

Bizə bu iftixar hissini aşılayan nədir? Heç bir söykənəcəyi olmayan dar nasionalizmmi? Dünya ədəbiyyatını bilməməkdən irəli gələn məhdudluqmu? Yoxsa öz milli yazıçısının böyüklüyünü layiqi ilə anlayan həqiqi vətəndaş duyğusumu?

Əlbəttə, bizdə bütün bəşəriyyətin yaratdığı mədəni irsə qarşı odlu bir məhəbbət hissi vardır. Bunu sübut eləməyə qətiyyən ehtiyac yoxdur. Biz onunla fəxr edirik ki, insanlığın azadlığı, köləlik zəncirindən qurtulması yolunda çarpışmış bir mübariz, bir sənətkar yaratmışıq. Azərbaycan xalqı Mirzə Fətəlinin adını böyük bəşər mədəniyyəti yaradıcıları sırasında görməklə fəxr edir. Bu iftixar hissi həm qanuni, həm də yerlidir.

Mirzə Fətəli Axundov, arzuları ilə gördüyü işlər arasında heç bir ziddiyyətə yol verməmiş yazıçılardan biridir. Onun xəyalları ilə işləri arasında son dərəcə möhkəm, ayrılmaz bir əlaqə olmuşdur. Bəzən tənqidimiz çox yüngül üsullardan istifadə edərək Mirzə Fətəlini az qala çar quruluşunun adi bir çinovniki kimi qələmə verməyə çalışmışdır. Bu, əlbəttə, çar paqonları altında daim xalq üçün hərarətlə çırpınan böyük ürəyi görməməkdən və ya görmək istəməməkdən irəli gələn bir haldır. Biz bütün bu incikliyi bir tərəfə atırıq. Bu cür tənqidlə münaqişəyə girmək lazımdırmı?

Bizcə Mirzə Fətəli Axundov dramaturgiyasının üç böyük xüsusiyyəti vardır: 1) bu dramaturgiya epoxialdır, 2) ideyalıdır, 3) sintetik xarakterə malikdir.

Bu cəhətləri qısaca aydınlaşdıraq.

## I. M.F.AXUNDOV DRAMATURGİYASI ÖZ DÖVRÜNÜN AYNASI KİMİ

Molla Nəsrəddin "Ölülər" kimi klassik bir əsərin müəllifidir. Haqverdiyev "Dağılan tifaq" kimi ölməz bir dram yaratmışdır. Cəfər Cabbarlı yüksək bədii dəyərlərə malik pyeslərin müəllifidir. Bu yazıçıların hamısı Axundov realizminin ən yüksək ənənələrini davam etdirmişdir. Lakin Mirzə Fətəli bunların hamısından fərqli olaraq dövrünün bütün sinif və qruplarını əks etdirmişdir. Axundov mülkədarları, bəyləri, çar çinovniklərini, kəndliləri, ziyalıları, xanları, hətta advokatları vermiş və bütün bunların bitkin bədii obrazlarını yaratmışdır. Axundovun böyüklüyü yalnız bununla məhdudlaşmır. Bu xarakterlər müəyyən tarixi epoxada, müəyyən bir dövrün məhsulu kimi geniş ictimai münasibətlər fonunda verilmişdir. Axundovun altı komediyasını diqqətlə oxuyan hər kəs, burada tam bir əsri göstərən qüdrətli bir dramaturqu və eyni zamanda geniş müşahidələrinə məharətlə bədii forma verən bir sənətkarı görə bilər.

Bizi ən çox maraqlandıran bir cəhət vardır ki, o da Mirzə Fətəlinin əks etdirdiyi xarakterlərin müxtəlifliyidir. Hatəmxan ağa ilə Heydər bəyi bir-birinə oxşatmağa təşəbbüs edən hər kəs, artıq əmək çəkib özünü yormasın, bunların arasında heç bir yaxınlıq yoxdur və yaxud Səfər bəylə Şahbaz bəy arasında heç bir bənzəyiş tapa bilməzsiniz. Bunu nə ilə izah etmək olar? Hər şeydən əvvəl Mirzə Fətəlinin bioqrafiyası burada bizə kömək edə bilər. Məlumdur ki, o, canişin dəftərxanasında işlərkən rəsmi vəzifəsi üzrə bütün bu qrupların müxtəlif nümayəndələri ilə hər zaman üz-üzə gəlirdi, onları incədən-incəyə müşahidə edirdi. Mirzə Fətəli bu ictimai qrupların həyatı ilə çox sıx əlaqədar olduğu üçün, onların şikayətlərini duyurdu. Bu dərin müşahidələrin nəticəsində bütün bir xalqın canlı həyatı onun sənətkar gözləri qarşısında canlanırdı.

Dahi rus dramaturqu Ostrovski əsas etibarilə rus tüccarlığı həyatını yaxşı bildiyi üçün onları bütün incə təfərrüatı ilə əks etdirdiyi halda, Mirzə Fətəli Axundov bütün bir xalqın məişətini göstərmişdir.

Mirzə Fətəlinin, şübhəsiz, müəyyən simpatiyası və antipatiyası olmuşdur (bu xüsusda aşağıda bəhs edəcəyik). Lakin Axundov o qədər böyük realistdir ki, hadisə və insanları o qədər obyektiv təsvir dərəcəsinə yüksəltmişdir ki, bunların dalında gizlənən ideyaları təşrih edib

göstərmək o qədər də asan bir iş deyildir. Daha doğrusu Mirzə Fətəli döymək və qamçılamaq üçün birinci vasitəni, tiplərin öz daxili ziddiyyətlərində, öz çirkin simalarında, öz yırtıcı psixologiyasında görmüşdür və yaxud müsbət insanların eyblərindən, nöqsanlarından təmizlənməsini öz daxili inkişaflarında görmüşdür. Əgər "Müsyö Jordan" komediyasındakı Şahbaz bəy nəbabatçı Jordanın təsiri ilə Qərb mədəniyyətini mənimsəməyə meyl edirsə, bu, Mirzə Fətəlinin öz xüsusi ideyası kimi quru və sönük deklarasiya kimi deyil, bəlkə müəyyən bir dvoryan gəncliyi qrupunun real meylləri kimi, arzuları kimi verilir. Burada Mirzə Fətəlinin ustalığı doğrudan da heyrətamiz bir səviyyəyə yüksəlir. Biz müəllifi, demək olar ki, unuduruq. Gözümüzün qarşısında canlı insan obrazı və onun çırpıntıları qabarıq bir şəkildə özünü göstərir.

Şahbaz bəy son dərəcə fərdiləşdirilmiş bir obrazdır. Yəni onun bütün hərəkətlərində olduqca konkret bir insanın fərdi xüsusiyyətləri vardır, lakin o, müəllif tərəfindən o qədər dürüst və tipik formada verilmişdir ki, Şahbaz bəy artıq bir fərd olmaqla qalmayıb xarakter dərəcəsinə yüksəlir, yəni özü kimi bir çox gənclərin də xüsusiyyətlərini özündə toplayır. Biz onun şəxsi arzuları ilə tanış olduğumuz zaman, fransız dilini öyrənməyə çalışan, vəzifə sahibi olmaq istəyən, xoşbəxt həyat arzulayan bir gənci deyil, tamam bir nəsli görürük və eyni zamanda təmiz ürəkli, məhdud, sadə, nişanlısından, ibtidai məişətindən ayrılarkən dərin bir ağrı duyan, sızlayan şahbaz bəyləri görürük. Bu gənc bəylər nəslinin Azərbaycan tarixində Mirzə Fətəlinin təsvir etdiyi kimi olduğunu sübuta ehtiyac vardırmı? Əlbəttə yoxdur. Mirzə Fətəli kimi sənətkarlara biz canlı həyat qədər inanırıq. Onun bədii ümumiləşdirmələrinə tarixi həqiqətin bədii inikası kimi baxırıq.

Bizə etiraz edə bilərlər ki, M.F.Axundov, komediyalarının çoxusunda müəyyən anekdotik hadisələri almışdır. Biz də bu etiraza belə cavab verə bilərik ki, Mirzə Fətəli bu anekdotik hadisələri bir vasitə kimi götürmüş, sujet xətti kimi almış və tanıdığı, bildiyi, dərindəndərinə tədqiq etdiyi insanları ilk plana çəkərək, canlı xarakterlər yaratmışdır. O, zahiri effektin ən qəddar düşməni olmuşdur. Onun komediyaları, hər şeydən əvvəl geniş həyatın canlı realistik lövhələrini vermişdir.

Bu iddiamızı sübut üçün ilk komediyalarından birini götürək. Məsələn: "Molla İbrahim Xəlil kimyagər" bu dediyimiz anekdotik hadisə üzərində qurulmuş əsərlərdən biridir. Komediya on altı səhifədən

ibarətdir və bəlkə də Axundovun ən təcrübəsiz dövründə yazılmışdır. Lakin biz əsəri oxuyarkən, bütün bu şeyləri unuduruq. Çünki bu əsərdə də canlı insanları görürük, onların mübahisəsini eşidirik, canlı, real konfliktlərin şahidi oluruq. Komediyanın ekspozisiyası birinci sətirdən başlayır və müəllif kimyagərin fırıldaqlarına aldanan adamları səhnəyə çıxardıb bizimlə tanış edir. Hadisə özü maraqlıdır. Lakin əsər üçün bu hadisə əsas deyildir. Yəni buradakı insanlar özü özlüyündə o qədər canlı göstərilir ki, biz bəlkə də hadisəni unudub insanların real ziddiyyətləri ilə maraqlanmağa başlayırıq. Axundov olduqca qısa, lakin mənalı dialoqlarda adamların simasını məharətlə işıqlandırır.

Ağa Zamanı götürək. Bu adam, köhnə bir dəllək oğludur. Onun atası öz sənəti ilə dövlətlənmiş, lakin o özü, əsərdəki Hacı Nurunun dediyi kimi, bu dövləti xərcləmişdir. Onun atası oğluna dəllək sənətini öyrətdiyi halda, bu hərif təbiblikdə şöhrət qazanmaq istəmiş, lakin bu sahədə büsbütün avam olduğundan müalicə əvəzinə insanları qırıb çatmışdır.

Yaxud Molla Səlmanı götürək. Şair Hacı Nurunun dediyinə görə bu adamdan yaxşı odunçu olarmış. Lakin Molla Səlman atasının yolu ilə gedib mollalığa qurşanmışdır. Onun atası elmləri öyrənmiş, zəhmət çəkmiş, lakin bu hərif avam və biliksiz olduğu üçün hətta mollalığı belə bacarmır... və i. a. və sairə.

Bu əsərdə ən maraqlı obrazlardan biri də şair Hacı Nurudur. Bu adamın simasında M.F.Axundov müəyyən müsbət ideallarını təcəssüm etdirməyə çalışmışdır. Bu şair namuslu, xalqının xoşbəxtliyinə çalışan, doğru sözü üzə deyən, cəsarətli bir adamdır. Onun əsərlərində olduqca mühüm hadisələrdən bəhs edilir. Məsələn, o, şeirlərinin birində özündən altmış il əvvəl avar ləzgilərinin Xanbutayın təhti-idarəsində Nuxaya olan hucumunu təsvir etmişdir.

Hacı Nuru vətənpərvərdir. Xalqının taleyi ilə maraqlanan bir şəxsdir. Ancaq o, vətənində heç bir istinadgaha malik deyildir. Yaşadığı mühitdə onu anlayan, onun faydalı əsərlərini dinləyən yoxdur. Çünki dövlətlənmək istəyən, hər növ vasitə ilə pullanmağa çalışan ağa zamanların, hacı kərimlərin şeir dinləməyə və öz vətəninin taleyi ilə məşğul olmağa vaxtı yoxdur.

Hacı Nuru isə mübarizdir. O, talantlı insandır. Ağıllı bir şairdir. O, həmşəhərlilərinin cəhalət və nadanlığını görəndə, kədərlənib məyus olur. O bunu qorxmadan, çəkinmədən söyləyə də bilir və eyni zamanda

yazdığı şeirlərin bu cür şəraitdə heç kimə bir fayda vermədiyini anlayıb, etiraf etməyə məcbur olur.

Lakin Hacı Nuru bu avamlar və yekəbaşlar mühitində yeganə müsbət insandır, bu qaranlıq aləmdə parıldayıb sönən zəif bir işıqdır. O, savadlıdır, biliklidir. Onun mühakimələrində ciddi bir məntiq vardır. Yalnız onun poeziyası deyil, dediyi xeyirli sözlər də, doğru fikirlər də vətəndaşlarının acığına, kin və qəzəbinə səbəb olur. Hacı Kərim, Səfər bəy, Ağa Zaman, – şairin gözəl xarakterizə etdiyi bu tiplər, – onu söyürlər, hörmətdən salırlar. Lakin o yenə də öz fikrindən əl çəkmir, molla xəlillərin fırıldaqlarını ifşa edib vətəndaşlarının gözünü açmağa çalışır. Nuxalılar onu dinləməyib kimyagərin kələklərinə aldanırlar. Molla Xəlil topladığı pulları götürüb müştərilərindən gizlənməyə hazırlaşdığı zaman, biz yenə Hacı Nurunu xatırlayırıq...

Əlbəttə, bu əsərin həm məzmunu, həm də dramatik quruluşu Mirzə Fətəli komediyaları üçün tam mənası ilə səciyyəvi deyildir. Yəni bu əsər bitkin bir pyes kimi qiymətləndirilə bilməz. Burada gənc və az təcrübəli bir dramaturqu görməmək olmaz. Lakin "Kimyagər" komediyası da, Axundov dramaturgiyasının inkişafında olduqca mühüm bir mərhələdir. Burada da parlaq obrazlar və tiplər verilmişdir. Burada Axundov öz müsbət ideallarını irəli sürmüşdür. İnsanı varlandıran, ona gözəl həyat verən ibrahim xəlillərin eleksiri deyil, din və sxolastikaya əsaslanan uydurma dərmanlar deyil, bəlkə insanların ağlı, talantıdır. Mirzə Fətəli göstərir ki, hər bir insan özünün namuslu əməyinə, peşəsinə arxalanıb gözəl həyat qurmağa çalışmalıdır.

Axundov bu komediyasında da xalqı savadlanmağa, cəhalət yuxusundan oyanmağa, elmlərini artırmağa çağırır. Burada biz gələcək mübariz maarifpərvərin ilk addımlarının səsini eşidirik.

Lakin yenə də təkrar edirik ki, Axundovun əsərləri təkcə bu idealları təbliğ etdiyi üçün deyil, bəlkə eyni zamanda və xüsusən öz dövrünü təsvir etdiyi üçün, müəyyən bir zamanın insanlarını ümumiləşmiş obrazlarda göstərdiyi üçün qiymətlidir.

"Müsyö Jordan və Dərviş Məstəli şah" komediyası bu nöqteyinəzərdən daha maraqlıdır. Dramatik bir əsər olaraq götürülərsə, bu komediya Axundovun və ümumiyyətlə Azərbaycan ədəbiyyatının ən klassik nümunələrində biridir.

Burada iki bir-birinə zidd dünya görüşünün mübarizəsi əks etdirilmişdir. Bir tərəfdən proqressiv Qərb mədəniyyətinin nümayəndəsi

Müsyö Jordan, o biri tərəfdən isə Şərq cəhalətinin və fanatizminin ən mahir fırıldaqçısı Məstəli şah göstərilmişdir. Lakin konflikt yalnız bu iki adam arasında deyil, iki aləm arasında gedir.

Axundov bu dərin ictimai mübarizəni komediya planında verirsə də, biz eyni zamanda müəllifin "Kimyagər" əsəri üçün çox səciyyəvi olan satiraya əl atdığını və burada da eyni yolu dərinləşdirib yalnız "mənfi" tipləri deyil, bəlkə eyni zamanda "müsbət" tipləri də kəskin tənqid etdiyini görürük. Bu tənqid özü də hadisələrin gedişindən, obrazların hərəkətindən doğur, yəni müəllif elə bil hər kəsin öz istədiyi kimi hərəkət eləməsinə yol verir və onların əxlaqını, dünyagörüşünü, düşüncəsini realistcəsinə əks edərək, bizə tanıdır.

Bu əsərdə də zəngin tiplər silsiləsi vardır. Bu tiplər həm fərdi, həm də ümumiləşmiş bədii obrazlardır.

Axundovun qadın surətləri daha canlı və daha koloritlidir. Elə bil müəllif bunların təsvirində daha parlaq və daha ifadəli boyalar işlətmişdir.

Yuxarıda dediyimiz kimi, Axundovun əsas xüsusiyyətlərindən biri hər zaman ictimai şəraiti və obrazların şərhində çox böyük rol oynayan ictimai fonu çox aydın göstərməsidir.

"Müsyö Jordan" əsərindəki bu fon, əlbəttə, feodal-patriarxal mühitidir. Şahbaz bəyin obrazlı ifadəsini işlədib desək, bu fon, onun yaşadığı boz, yoxsul, heç bir şeylə insanı cəlb etməyən qamışlıqdır. Bu bəlkə də o qədər müdhiş deyildir. Axundovun nöqteyi-nəzərincə bu mühitdəki ən dəhşətli şey, öz daxili imkanları cəhətindən müsbət olan insanları geriyə çəkən fanatizmdir, cəhalətdir, məstəli şahların təmsil etdiyi xürafat və mövhumatdır.

Əsərdəki Şəhrəbanu xanım olduqca diribaş, bacarıqlı, ağıllı bir qadındır. Lakin o sadəlövhdür. Məstəli şahın fırıldaqlarına inanır, divlərin və cinlərin həqiqətən Parisi uçura biləcəklərini düşünür və hətta Şahbaz bəyin toyu üçün saxladığı pulları əsirgəməyib Məstəli şaha muzd olaraq verir.

Axundov öz komediyasında bu qadını taqsırlandırmır, bəlkə ona ürəkdən acıyır, sadəlövhlüyünə, mövhumatçılığına, təmiz ürəkli olması nəticəsində hiylə və kələklərə asanlıqla inandığına təəssüf edir. Mirzə Fətəlinin əsas zərbəsi Məstəli şaha dəyir və onun fırıldaqlarına inanan sadəlövh insanları tərbiyə etmiş, yetirmiş ictimai mühitə dəyir. Axundov bəzən bu nöqtədə kəskin satiraya qədər yüksəlir. Onun xəfif lirizmi ictimai satira ilə əvəz edilir.

"Müsyö Jordan" komediyası əlbəttə onun ən müsbət ideyalı əsərlərindən biridir. Lakin bu heç də o demək deyildir ki, bəzi tənqidçilər Müsyö Jordanı Axundov ideyalarını təcəssüm etdirən bir obraz kimi qiymətləndirərkən tamamilə haqlıdırlar. Burada ciddi bir yanlışlıq vardır. Müsyö Jordan özü qabaqcıl burjua elmi nümayəndəsi olmaq etibarilə Mirzə Fətəli tərəfindən müəyyən dərəcədə rəğbətlə əks etdirilir. Lakin o, heç bir vəchlə Axundovun idealı deyildir. Çünki Müsyö Jordan monarxistdir. 1848-ci il inqilabına bütün varlığı ilə düşməndir. O, inqilabçıları şeytan, cin adlandırır. Əlbəttə, Axundov bu fikirdə deyildir və olmamışdır. Onun bioqrafiyasından və fəlsəfi əsərlərindən məlumdur ki, o hər cür despotizmə qarşı mübarizə etmişdir. Lakin Axundov Müsyö Jordanın şəxsiyyətində müəyyən müsbət cəhətlər görür. Bu cəhətlər birinci növbədə onun təmsil etdiyi Qərb mədəniyyəti ilə əlaqədardır. Mirzə Fətəli Axundov sağlam elmlərin tərəfindədir. Onun qərbçiliyi, heç də Qərbin hər cür adət və ənənələrini tənqidsiz qəbul etmək mənasında anlaşılmamalıdır. Axundov böyük mədəniyyət yaradan Qərbi təbliğ edir. Onun qəhrəmanı Şahbaz bəy Parisdəki çirkin adətləri öyrənməyə deyil, fransız dilini mənimsəməyə gedir, daha doğrusu getmək istəyir.

Məsələnin bu cəhətinə xüsusi diqqət yetirmək lazımdır. Çünki Axundov məsələyə həqiqi bir realist kimi yanaşır. Onun nəzərincə Qərbə də gözü yumulu yanaşmaq olmaz. Oranın "mədəniyyəti" başdan-başa tərifli deyildir. Müsyö Jordanla Hatəmxan ağanın söhbətindən aydın görünür ki, Axundov Qərbdəki, xüsusən Parisdəki əxlaq normalarını o qədər də bəyənmir, bəlkə, tərsinə, özünəməxsus bir ustalıqla o normaları da tənqid edir.

Bizi maraqlandıran başlıca məsələlərdən biri "Müsyö Jordan" komediyasında əks edilən dövrdür.

Bəzi tədqiqatçıların yazdığına görə Müsyö Jordan kimi bir botanik həyatda olmuşdur və Hatəmxan ağa adı da müəllif tərəfindən uydurulmamışdır. Amma bizi maraqlandıran bu deyildir. Bizi ən çox Axundovun bəlkə də həyatdan aldığı bu hadisədən istifadə edərək müəyyən dövrü və dövrün insanlarını necə təsvir etməsi maraqlandırır. Bu əsərdə müəllif hadisənin cərəyan etdiyi ili, yeri çox aydın göstərir. Hətta kəndin də adını oxucudan gizlətmir. Bu çox əhəmiyyətli cəhətlərdən biridir. Axundov öz komediyalarında bu sözün geniş və həqiqi mənasında çox konkretdir. Onun sənətkar fantaziyası, həqiqi varlıqdakı

hadisələrin doğrudan-doğruya real inkişaf meyllərini görməyə kömək edir. Axundov hadisələrin zahiri effektinə deyil, daxili dinamikasına fikir verir və bu dinamikanı müəyyən bir nöqtəyə qədər izləyib, obrazları tamamladıqdan sonra, götürdüyü hadisəni də, bu hadisənin hərəkətini də dayandırır. Onun əsərindəki kompozisiya bütün böyük realist dramaturqlarda (Qoqolda, Qriboyedovda və başqalarında) olduğu kimi qəhrəmanların taleyi ilə müəyyən edilir.

Bu konkretlik əsərin tarixiliyinə, müəyyən dövrü, müəyyən ili və hətta müəyyən yeri ümumiləşmiş halda əks etməsinə kömək edir. Axundovdakı konkretlik hər cəhətdən bizə nümunə ola bilər. Bu cəhət realist dramaturgiyanın ömrünü uzadır. Sənətkardan dərin müşahidə ilə həyatı tədqiq edib öyrənməyi və bununla yanaşı təsadüfi hadisələri əsas hadisələrdən ayıra bilmək istedadına malik olmağı tələb edir. Mirzə Fətəli Axundov "Müsyö Jordan" əsəri ilə həqiqi mənada xarakterlər komediyası yaratmışdır. Bu xarakterləri müəyyən tarixi dövrün məhsulu kimi göstərməyə müvəffəq olmuşdur.

Məsələn, Hatəmxan ağanı götürsək, bu heç də, Əbdürrəhim Haqverdiyevin "Dağılan tifaq" dramasında verdiyi iflas etmiş bəy surətinə bənzəmir. Məlumdur ki, "Dağılan tifaq" ticarətin inkişaf etdiyi dövrü göstərdiyi halda, Mirzə Fətəli Axundov zəngin həyatdan hələ də uzaqlaşmamış mülkədarı və onun durğun, tox həyatını təsvir edir. Bu iki realist əsərin fərqi yalnız janrında deyil, bəlkə ayrı-ayrı dövrləri verməsindədir. M.F.Axundov bundan sonra Azərbaycan həyatının dəyişdiyini, bəy və mülkədarlar məişətində əmələ gələn mühüm təbəddülatı, yeni bir qüvvənin – tacirlərin meydana çıxdığını göstərəcək və bizim gözlərimizin qarşısında ac bəylər, taleyindən şikayət edən müftəxorlar canlanacaqdır. "Müsyö Jordan" isə hələ sarsılmamış mülkədarlığın həyatını təsvir edir. Burada hələ faciə üçün material yoxdur. Bu həyat komediyaya daha çox uyğun gəlir. Burada müəllif üçün kəskin satira sahəsi vardır. Xüsusən avam, cahil və geridə qalmış zümrələri döyüb, onların üzərinə gülmək üçün istər Məstəli şah kimi fırıldaqçı, ikiüzlü, tamahkar adamlar, istərsə də Qərb mədəniyyətində yalnız zahiri şeyləri görən, onun ən çox pozucu xüsusiyyətlərini dərk edən Hatəmxan ağa kimi məhdud, cahil və hər şeyi sərvətlə izah edən adamlar Axundovun qələmindən inandırıcı, real bir şəkildə meydana çıxır.

Mirzə Fətəli Axundov, yuxarıda qeyd etdiyimiz kimi, Molyerdən çox fərqlidir. Bu fərqi ən çox onların insan surətləri yaratmaq xüsusiy-

yətlərində daha aydın görmək olar. Puşkin Molyerdən bəhs edərkən çox haqlı olaraq deyir ki, o, müəyyən insan qüsurlarının obrazını verir. Bu tiplər doğrudan da öz psixoloji məzmunu etibarilə çox statikdir. Molyerin klassisizmi, ən ziyadə, bu xarakterləri məhdudlaşdırmasında, xəsisi yalnız xəsis olaraq, qorxağı yalnız qorxaq olaraq birtərəfli və hərəkətsiz verməsində təzahür edir. Molyer obrazlarının əksəriyyəti birtərəfli və birkeyfiyyətlidir. Bu obrazlar Şekspirdə olan kimi rəngarəng, dinamik deyil, bəlkə daxili zənginlikdən və müxtəliflikdən məhrumdur. Bundan başqa bəzən Molyer, vəzifələri yalnız mühakimələr yürütməkdən ibarət olan rezonyorlar yaradır. Bunlar hərəkət etmir, dramatik mübarizə xətti ilə üzvi surətdə bağlanmır, bəlkə müəllifin bu və ya başqa fikirlərini söyləməklə kifayətlənirlər.

Bizcə Mirzə Fətəli Axundov bu nöqtədə Molyerdən ziyadə Şekspirə yaxındır. Çünki o, komediyalarında Şekspir kimi hərtərəfliliyə, daxili zənginliyə və müxtəlif keyfiyyətliliyə böyük diqqət yetirir. Mirzə Fətəlinin obrazları Molyerin rasionalist komediyalarındakı obrazların əksinə olaraq, qüsurları deyil, insan xarakterindəki əsas və canlı nişanələri alır. Bu səbəbə görə də Mirzə Fətəlidə, Molyerdə olan mücərrəd məntiqi sistemləşdirmə yoxdur.

Məsələn, "Hacı Qara" komediyasını götürək. Hacı Qara müəllif tərəfindən "Mərdi-xəsis" adlandırılmışdır. Aydındır ki, əsərdə bu xüsusiyyət ilk plana çəkilmişdir. Müəllif hər addımda Hacı Qaranın xəsisliyini daha bariz şəkildə göstərməyə meyl etmişdir. Lakin Hacı Qara eyni zamanda canlı insandır. Yalnız bir insan qüsurunun simvolu və yaxud təcəssümü deyil, bəlkə eyni zamanda adi bir insandır. Hacı Qara xəsis olmaqla bərabər qorxaqdır, rəzildir, ailədə despotdur və sairə...

Mirzə Fətəli Axundov, yenə Molyerdən fərqli olaraq, keçmiş ədəbiyyatın köhnəlmiş qanunlarını, ənənələrini öz xüsusi qanunları ilə əvəz edərək yeni bir komediya janrı yaratmağa müvəffəq olmuşdur. Bu sahədə biz Axundovu tamamilə müstəqil bir sənətkar hesab edirik. Heç də təsadüfi deyildir ki, Axundovun komediyalarında çox aydın gözə çarpan məişət xətti vardır. İctimai ümumiləşdirmələrinə heç də mane olmayan, bəlkə bunu daha da möhkəmlədən həmin xətt, şərti-klassik dramaturgiyada yoxdur və ola da bilməz. Mirzə Fətəli Axundov öz tematik prinsiplərinə, özünün təsvir obyektlərinə daha uyğun gələn bir komediya janrı yaratmışdır.

Bu cəhətdən də Axundov öz dövrünün xüsusiyyətlərini göstərən, bəzən hətta bu dövrün xüsusiyyətlərini əsas çıxış nöqtəsi kimi alan bir

sənətkar kimi meydana çıxmışdır. Bu, o deməkdir ki, Axundov realistdir və bu realizm formada da özünü göstərə bilmişdir.

Dediklərimizi yekunlaşdırmaq üçün, "Hacı Qara" əsəri üzərində mütləq dayanmağı lazım bilirik.

Öz zamanını təsvir etmək nöqteyi-nəzərindən (və ümumiyyətlə Axundovu yaxşı anlamaq üçün) bu pyes böyük və mühüm tarixi əhəmiyyəti olan dərin məzmunu, yüksək bədii məziyyətləri ilə fərqlənən bir əsərdir. Axundov burada, o biri komediyalarından fərqli olaraq, bir sıra ictimai qrup və zümrəni əks etdirmişdir. Bəylər, kəndlilər, çinovniklər və tacirlər həyatı – "Hacı Qara"nın tematik vüsəti belədir. Bu, müəllifin bədii talantındakı qüvvəti göstərən bir cəhətdir.

"Hacı Qara" əsəri Azərbaycan həyatındakı müəyyən bir dönüşü göstərən klassik bir komediya olmaq etibarilə hər zaman teatr işçilərinin nəzərini cəlb edə bilmişdir və demək olar ki, uzun illər boyu bir sıra aktyorlar nəslinin tərbiyəsində son dərəcə böyük rol oynamışdır.

"Hacı Qara", bir zamanlar tox həyat sürən bəyləri, Azərbaycan rus çarizmi tərəfindən istila edildikdən sonra onların iflasa uğradığını və əldən-ayaqdan düşdüyünü təsvir edir. Bu əsərdəki bəylərin simasında Axundov o zamankı mülkədarlığın vəziyyətini son dərəcə parlaq və realist boyalarla göstərmişdir. Komediyanın əsas qəhrəmanlarından biri – Heydər bəy, İran və Türkiyə ilə müharibə olmadığından, yalnız yoxsul ləzgilər üzərinə hücum etmək məcburiyyətində qaldığından və bu səbəbə görə də bir şey ələ gətirə bilmədiyindən dərin hüznlə bəhs edir. Heydər bəy öz ağalığının məhv olub getdiyini və yoxsul vəziyyətə düşdüyünü ürək ağrısı ilə danışır. O, elə bir vəziyyətə gəlib düşmüşdür ki, öz nişanlısının toyunu edib gətirməyə də pul tapa bilmir. Oğurluq və quldurluqla həyat sürmüş bu adam əkin əkməyi, ipəkçiliklə məşğul olmağı özü üçün böyük təhqir sayır.

Axundov əski adətlərin və ənənələrin pozulduğunu, bəylər həyatındakı təbəddülatın maraqlı lövhələrini göstərməklə, bir tərəfdən müəyyən tarixi dövrü göstərmiş və bununla yanaşı olaraq o zamanın tipik bəy obrazlarını vermişdir, o biri tərəfdən isə bu hadisələrə münasibətini son dərəcə böyük bir sənətkarlıqla ifadə etməyi bacarmışdır.

Heydər bəylər yoxsullaşıb iflasa uğradığı bir zamanda hacı qaralar öz pullarının gücünə cəmiyyətdə daha görkəmli bir yer tuturlar.

Hacı Qara deyir ki:

"Bu zəmanədə çox qoçaqlıqdan isə, adamın cibi pulla dolu yaxşıdır".

Bu sözlər bütün bir dövrü aydın xarakterizə edir.

Axundov dramaturgiyası tənqidi realizm prinsipləri əsasında yüksələn bir dramaturgiyadır. O hər bir əsərində müəyyən bir fikri, müəyyən bir ideyanı ardıcıl olaraq yürütməyə meyl etdiyindən, feodalizmi, despotizmi, dini tənqid və inkar yolu ilə getmişdir. Bu səbəbə görə də Axundov fəlsəfəsi ilə, Axundov dramaturgiyası arasında sədd çəkməyə meyl edənlər çox yanılırlar.

Əsl həqiqətdə bu fərq yoxdur. Bu fərq təkcə ifadə formalarındadır.

Xüsusən Axundovun rus çarizminə qarşı müsbət əlaqə bəslədiyini iddia edənlər heç bir əsasa malik deyillər. Guya M.F.Axundov naçalniki idealizə edir, guya onu müsbət boyalarla verməyə çalışır. Bu, Axundova qara bir böhtandır.

"Ancaq rus adı gələndə bağrım yarılır. Onların qılınc-tüfəngi o qədər məni qorxutmur ki, silisti, apar-gətiri canıma vəlvələ salır".

"Qarabağlıların, gömrükxana qaroullarının və kazakların qorxusundan quş quşluğu ilə Arazın o tayına səkə bilmir".

Bu sözləri "Hacı Qara" pyesinin müxtəlif personajları desə də, Axundovun məqsədi birdir: çar məmurları, çar bürokratizmi o qədər də tərifli bir şey deyildir. Bu idarə üsulundan xalqın yoxsul hissəsi daha çox zülm görmüşdür. Hacı Qaranın ağıllı nökəri Kərəməli görün nə deyir:

– Mən bir yol buradan Səlyana biletsiz getmişdim, murov o qədər döydürdü ki, indi də ağrısı yadımdan çıxmayıbdır.

Axundov çar senzurası şəraitində bundan kəskin nə deyə bilərdi?

Çar məhkəməsinə qarşı çevrilən bu sözləri xatırlayın:

"A kişi, səni görək könlün şad olub üzün gülməsin ki, bizi nahaq yerə müsibətə saldın, kim bilsin indi silistdən havaxt qurtaracağıq! Urusun silisti beş ilə qurtarmaz. Taxılımızı kim yığacaq, xərmənimizi kim döyəcək. Ax, ax..."

M.F.Axundov əsərin, demək olar ki, hər yerində mütləqiyyət idarə üsulunun çirkinliklərini (şübhəsiz öz imkanları daxilində) açıb göstərir.

Xüsusən bəzi tənqidçilərin Axundov tərəfindən müsbət planda göstərilmiş zənn etdikləri naçalnik bu cəhətdən çox maraqlıdır.

M.F.Axundov naçalnik simasında ən qəddar bir zülmkarı və çarın ən qəddar bir tərəfdarını göstərmişdir.

"Tatar tayfası tamam yalançı olar" deyən həmin bu hərifdir. "Padşahın əmrindən çıxan, Allahın əmrindən çıxan kimidir", "Allahın əmrindən çıxana o dünyada qəzəb yetişər, padşahın əmrindən çıxana bu dünyada" sözləri də naçalnik tərəfindən deyilir.

Aydındır ki, Axundov böyük bir məharət və taktla bu müstəmləkəçinin çirkin simasını əks etdirərkən, müəyyən dərəcədə özünün də arzu və diləklərini ifadə etməyə meyl göstərmişdir. Yəni naçalnik sona qədər həyatda olan naçalniklərə bənzəmir. Burada müəllif eyni zamanda "necə olmalıdır" sualına da cavab vermişdir.

Axundov hamını əməyə bir ehtiram göstərməyə çağırır. Zəhmət hər şeyin əsasıdır – Axundovun istər müftəxor bəylərdən və istərsə xəsis Hacı Qaradan tələbi budur.

Axundov dramaturgiyası başdan-başa yüksək ideyaların təbliğinə həsr olunmuşdur. Əgər biz, Plexanov demişkən, ədəbiyyatın ideyalılığına düşmən olsaydıq, Axundovu asanlıqla taqsırlandıra bilərdik. Mirzə Fətəli Axundov məhz ona görə böyük sənətkardır ki, onun ideyaları əsərlərin ətinə, qanına hopmuşdur. Onun fikirləri, qayələri əsərlərdə əks olunan hadisələrin təbii cərəyanından qanuni olaraq doğur. O öz qəhrəmanlarını bu və ya başqa bir müsbət fikrin ruporuna çevirmir. Onun yüksək bədii lövhələri və obrazlarının daxili məntiqi o qədər realistikdir ki, bizim hər birimiz buradan çox aydın fikri nəticələr çıxarda bilərik. Proqressə, mədəniyyətə, zəhmətə, namuslu olmağa çağıran Axundov, bütün əsərlərində zamanının ən proqressiv fikri zirvələrinə yüksələ bilmişdir.

Axundovun realizmindəki ideyalılıq, xüsusən qadın məsələsində özünü daha bariz göstərməkdədir. Siz onun heç bir əsərində "qadınlar azad olmalıdır" sözlərinə təsadüf edə bilməzsiniz. Lakin Axundov elə bədii qadın obrazları yaratmışdır ki, onların təsiri "qadın azadlığı" təbliğatçılarının sözlərindən min qat güclüdür.

Axundovun yaratdığı qadın obrazlarından ən qüvvətlisi bizcə "Mürafiə vəkilləri" komediyasındakı Səkinə xanımdır. Bu, iradəli, ağıllı, sözünün üstündə möhkəm duran bir Azərbaycan qadınıdır. Onun bəzi xüsusiyyətləri "Hacı Qara"dakı Sona xanıma bənzəyir. Lakin Səkinə xanım ondan çox qüvvətlidir. Çünki Səkinə xanım ondan da ağır vəziyyətə düşür, düşmənləri ilə mübarizədə böyük mərdlik göstərir.

Misallar gətirək:

"Z i b e y d ə – Olmaz, əzizim, qardaşım qızı! Təbrizin mötəbər adamlarını bizə düşmən elərsən.

S ə k i n ə x a n ı m – Cəhənnəmə düşmən olsunlar, gora olsunlar. Ağa Həsəndən zəhləm gedir.

Z i b e y d ə – Niyə?

S ə k i n ə x a n ı m – Nadürüst adamdır.

Z i b e y d ə (ikiəlli üzünü cırıb) – Bıy, zəmanəniz çevrilsin, ay qızlar, üzlərində bir tikə həya və şərm qalmayıbdır. Səkinə, mən sənin kimi qızıl-qırmızı qız görməmişəm. Bizim də axı qızlıq zəmanəmiz var idi; həyadan baş qaldırıb böyüyümüzün üzünə baxa bilməzdik. Sizin üzünüzün susuzluğundandır ki, Təbrizdə vəba və taun əskik olmur.

S ə k i n ə x a n ı m – Xeyr, vəba və taun haramzada kişilərin nadürüstlüyündəndir. O nadürüst oğlu altmış min tümən adını eşidib onun üçün məni istəməyə talib olubdur. Yoxsa o məni sevdiyindən ki, almaq istəmir. Əgər o məni alan idi, niyə qardaşım sağlığı heç bir ağız açmadı".

Səkinə xanım öz bibisi ilə belə danışmaqla kifayətlənməyib, onu almaq istəyən Ağa Həsənlə daha qızğın mübarizəyə girişir.

"A ğ a H ə s ə n – Yaxşı, sənə mən bir oyun tutum ki, tamam dastanlarda deyilsin, ölənədək dadı damağından getməsin.

S ə k i n ə x a n ı m – Get, get, səndən qorxan, səndən əskikdir. Əlindən gələni beş qaba çək".

Mirzə Fətəli Axundov bu qızın simasında Azərbaycan qadınlığının ən qüvvətli və cəsur nişanələrini məharətlə toplayıb ümumiləşdirməklə, bir tərəfdən realistik obraz yaratmağa müvəffəq ola bilmişdir, o biri tərəfdən isə arzu və diləklərində azad olan, istədiyi kimi hərəkət edən, bütün maneələri aradan qaldıran, təmiz ürəkli, saf və qoçaq bir qızın zəngin təbiətini əks etdirməklə o biri qadınlara da yol göstərmişdir.

Axundovun ideyalılığı hər şeydən əvvəl yüksək bədiilik yolu ilə ifadə olunmuşdur. Onun əsas dramaturgiya üslubu tənqidi realizm olduğu halda, əski quruluşu, əski münasibətləri uçurmağa çalışdığı halda, eyni zamanda yol da göstərmişdir. Əlbəttə, bizim zəmanəmiz üçün böyük dramaturqun göstərdiyi yol çox ibtidaidir, lakin tarixi planda alınarsa, Axundovun böyüklüyü və inqilabçılığı bizi heyrətə salmaya bilməz.

M.F.Axundov bu nöqtədə həqiqətən zamanının ən qabaqcıl demokratları ilə bir sırada durmuşdur.

## III. M.F.AXUNDOV DRAMATURGİYASININ SİNTETİK SƏCİYYƏSİ

Hər bir böyük sənət sintetikdir. Adətən Puşkinin bədii nəsrini sintetik nəsr adlandırırlar. Böyük realistlərin əsərləri ümumiyyətlə sintetik səciyyə daşıyır.

M.F.Axundov dramaturgiyası bu cəhətdən müstəsna deyildir. Sintetik əsərlərin hər biri özünə görə müəyyən xüsusiyyətlərə malikdir.

Amma bir həqiqət də vardır ki, sintetik sənət dərin ideyalı və epoxial sənətdir. Biz M.F.Axundov dramaturgiyasının bu iki mühüm cəhətindən bəhs etdik və aydın oldu ki, onun altı komediyası bütün bir dövrü əks etdirməklə bərabər, demokratik maarifçilər üçün tipik olan ən yüksək ideyaları ifadə etmişdir.

Axundov sənəti ictimai həyatın başlıca hadisələri üzərində qurulmuşdur. Bu sənət, lazımsız təfərrüatın uzun-uzadı təsvirindən uzaq olub, yalnız tipik, maraqlı, təşrihedici, qarşımızda böyük bir aləm açan hadisələri və insanları təsvir etmişdir. Biz Axundovun pyeslərində elə bir dialoq tapa bilmərik ki, orada müəllif götürdüyü hadisələrin, insanların daxili inkişafını verməsin. Bu onunla izah olunur ki, bizim dahi sənətkarımız formanı və janrı hadisə və insan obrazlarının inkişafına tabe edə bilməyi bacarmışdır.

"Müsyö Jordan" komediyasında, Məstəli şah (əsərin bu ikinci qəhrəmanı) yalnız dördüncü pərdədə meydana çıxır. Adi dramaturgiya qanunları nöqteyi-nəzərindən bu çox təəccüblü görünür. Lakin Axundov sənəti öz xüsusi qanunları ilə yaşayan yüksək bir sənət olduğundandır ki, Məstəli şah o biri qəhrəmanlarından daha bariz bir şəkildə canlanmışdır. Məstəli şah Şahbaz bəylə qadınlar arasındakı ixtilafı həll etmək üçün zəruri olduğu zaman meydana çıxır, öz işini görür və yenə səhnədən çəkilir.

Yaxud "Mürafiə vəkilləri" əsərində vəkillər sonradan-sonraya çıxırlar.

Axundov dramaturgiyası yalnız komediyalardan ibarət olsa da, ciddi və kəskin ictimai konfliktlər dramaturgiyasıdır. Əsərlərdəki hər bir təfərrüat bu əsas konfliktlərlə bağlanır. Komediyaların əsas mehvəri qalan cəhətləri özünə tabe edir və burada Axundovun ustalığı bütün əzəməti ilə bizim qarşımızda canlanır.

M.F.Axundov özündən sonra gələn dramaturqlarımız üçün həqiqi bir müəllim vəzifəsini görmüşdür. Biz çox haqlı olaraq iddia edirik ki, Nəcəf bəy Vəzirov, Əbdürrəhim Haqverdiyev, Cəlil Məmmədquluzadə və Cəfər Cabbarlı kimi böyük dramaturqlarımız birinci növbədə Axundov ənənələrinin əsası üzərində yüksəlmişlər.

Bu ədəbi qələbələr üçün müasir ədəbiyyatımız birinci sırada M.F.Axundov dühasına borcludur.

*1940*

# DAHİ SƏNƏTKAR

1

Molla Nəsrəddinin ölümü günündən on il keçir. Biz bu "ölüm" sözünü şərti olaraq işlədirik çünki o özündən sonra də əsrlər boyu yaşayan ölməz, dahi sənətkarlar qəbilindəndir.

Onu şəxsən tanıyanlar, onu Mirzə Cəlil deyə çağıranlar, onunla bərabər uzun zaman böyük bir ədəbi məktəbi yaradanlar daha yaxşı bilərlər: Molla Nəsrəddin son dərəcə təvəzökar bir insandı. Çox mümkündür ki, bizim bu gün sevə-sevə, dərin bir iftixar hissi ilə oxuduğumuz "Danabaş kəndinin əhvalatları" hekayəsini o, özü bəyənmədiyi üçün nəşr etdirməmişdi. Bəlkə bu əsər doğurdan da nöqsanlıdır? Bəlkə Molla Nəsrəddinin klassik hekayələri üçün xarakterik olan lakonizm burada tam mənası ilə gözlənilmədiyindən, böyük ədib bu hekayəni natamam hesab edirdi?

Ən adi danışıq dili ilə yazdığı bu əsərində Molla Nəsrəddin həqiqətən özünə məxsus böyük bir humanist qəlbi ilə bizə geniş həyat lövhələri, zəngin insan portretləri vermişdir. Onun canlı xalq dili, xalqın özü qədər güclü və yenilməzdir. Demək "Danabaş kəndi" hekayəsinin ölməz ustası heç bir güzəşt istəmədən bu hekayəni də öz külliyyatına daxil edə bilərdi. O, bunu istəməmişdir. O, bunu lazım görməmişdir. Nə üçün?

Biz yenə eyni sözü təkrar etməyə məcburuq: Molla Nəsrəddin son dərəcədə təvəzökar bir insandı.

Lakin o, "Molla Nəsrəddin" jurnalının sonsuz bir məhəbbətlə sevirdi. Bu jurnalın rolunu hamıdan çox özü düzgün anlayırdı və bəlkə də o, "Molla Nəsrəddin"in nömrələrini bütün külliyyatından yüksək tuturdu.

Jurnal, onun nəzərində olduqca müqəddəs bir şey idi. O, "Molla Nəsrəddin" jurnalının hər nömrəsini, deyəsən, bir oğula bərabər tuturdu. Çünki bu jurnal onun həyatının əsl mənasını təşkil edirdi.

Əgər həyatının ən son dəqiqələrində siz ona yanaşıb: "Öləndən sonra ən çox nəyi arzu edirdiniz: sizə heykəl qoyulmasınımı, yoxsa jurnalınızın yenidən nəşr olunmasınımı?" deyə ondan xəbər alsaydınız, o, böyük bir səmimiyyətlə belə cavab verərdi:

– Jurnalın nəşr olunmasını... Mənim heykəlim odur...

Lunaçarski dahi rus yazıçısı Qoqolu "Rus gülüşünün hökmdarı" adlandırır. Biz də Molla Nəsrəddini öz doğma ədəbiyyatımızın tarixində bu adla yad edə bilərik. Molla Nəsrəddin ilk əsərlərində bəzən oxu-

cusunu ağladırsa da, hətta komediyalarındakı lirizmlə gülməkdən çox acımağa çağırırdısa, bu onun zəngin bədii yaradıcılığı üçün əsas bir xüsusiyyət deyildi. Əgər Qoqolun əsərlərində "göz yaşları arasında gülüş" vardısa, Molla Nəsrəddinin gülüşü oxucuda göz yaşları deyil, kin, nifrət və protest hissi doğururdu.

Qoqol yaradıcılığı və onun obyektiv proqressiv mahiyyəti ilə şəxsi dünyagörüşü arasında son dərəcə dərin bir ziddiyyət vardısa, Molla Nəsrəddində biz bunu görməyirik. Onun bədii əsərləri ilə publisistikası arasında ideya cəhətindən ziddiyyət deyil, qırılmaz bir vəhdət vardır. Molla Nəsrəddinin hər bir əsərində canlı həyat, canlı insanlar, yeni mübarizə motivləri əsas yer tutur: onun gülüşü böyük ideallara xidmət edən bir vasitədir.

Lunaçarski deyir ki: "Sevincək Qoqolu təsəvvür etmək çətindir". Yüzlərcə komik vəziyyətlər, gülünc insan karikaturaları yaradan Qoqol, hər zaman qəmgindir. Sanki o, dahiyanə əsərlərində canlandırdığı köləlik cəmiyyətinin sağlamlaşacağına qətiyyən ümid etmir, o bu cəmiyyəti yalnız dinin qüvvəsi ilə, Allahın gücü ilə, kilsə vasitəsilə islah etmək fikrindədir.

Lakin Molla Nəsrəddin belə deyildi. O, bütün yaradıcılığında dahi sənətkar Qoqolun təsirində olmasına baxmayaraq, bütün bu qüvvələrə gülür, özü də son dərəcə nikbin bir yazıçı kimi gülür. O, jurnalını da, hekayələrini də, dramlarını da, felyetonlarını da, patriarxal-feodal mühitin kökündən dəyişilməsi yolunda qüvvətli bir silah kimi işlərdir.

Əlbəttə, bu o demək deyil ki, Molla Nəsrəddinin kədərli anları, qəmgin dəqiqələri yoxdur. O, xalqının avamlığını, mədəniyyətsizliyini, geridə qaldığını, əzildiyini, ikiqat istismara məruz qaldığını görürkən, bu xalqın həqiqi bir oğlu kimi, kədərlənməyi, də bacarır. Belə olmasaydı, biz ondakı dərin lirizmə təsadüf edə bilməzdik.

Ancaq o, Qoqoldan fərqli olaraq, gələcəyə inanır, bu yolda çarpışır, qətiyyən ümidsiz olmur. Molla Nəsrəddin bilir ki, mülkədar, bəy-xan əsarətinə, çar zülmünə əsaslanan bir cəmiyyətin ömrü uzun deyildir. O bilir ki, bu ölkədə hakim olanların ağlı məhkumlarınkından azdır. Yəni, xalq böyük bir zəkaya malikdir, ona yalnız ayılmaq, öz haqqını anlamaq lazımdır. Bu səbəbə görə də Molla Nəsrəddin hakimləri satira atəşinə tutur, əzib həyat səhnəsindən çıxarmağa çalışır, məhkumların isə gözünü açmağa, onların xarakterindəki insanları gülüşlə islah etməyə çalışır. Molla Nəsrəddin gülüşünün ictimai məndərəcəsi və istiqaməti bundan ibarətdir.

Biz yalnız bir misalla kifayətlənəcəyik. Hələ 1906-cı ildə, "Molla Nəsrəddin" jurnalının dördüncü nömrəsində bu sözləri oxuyuruq:

"A mollalar, niyə məni döyürsünüz? Olmaya məndən qorxursunuz? Olmaya qorxursunuz ki, məcmuənin vərəqlərini nökərlər samavar alışığı edə-edə və şəkillərini uşaqlar oynada-oynada axırda camaat gözünü açıb bəzi işlərdən xəbərdar ola?

Olmaya siz başa düşürsünüz ki, bu məmləkətdə iki padşah və bir əsrdə iki molla ola bilməz: ya Molla Xəsrəddin, ya Molla Nəsrəddin. Heç eybi yoxdur. Döyürsünüz döyünüz, amma bunu da biliniz, a mollalar ki, günlər dolanar, sular axar, zamana təzələnər, axırda yetim-yesir və keçəl-küçəl qardaşlarım dostu ilə düşmənini tanıyıb haman yoğun dəyənəkləri sizin əlinizdən alar və başlar... Dəxi dalısını demirəm..."

Bu misaldan aydındır ki, Molla Nəsrəddin bir mütəfəkkir və yazıçı olaraq inqilabi cəbhədə durmuşdu. Onun qarşısına qoyduğu məqsədlərdə günəşə bənzər bir aydınlıq vardır.

Bu məqsədlərə böyük ədib öz hekayələrində də xidmət edir. Hamının yaxşı bildiyi "Poçta qutusu" hekayəsini diqqətlə nəzərdən keçirən hər kəs bu nəticəyə gələcəkdir ki, Molla Nəsrəddin maraqlı bir sərgüzəşti yazıb, oxucusunu güldürmək istəmişdir. Bizim heç birimiz Novruzəliyə sona qədər gülə bilmirik. Bunu biz istəsək də, bacarmarıq. Çünki, Novruzəlinin vəziyyəti yalnız zahirən gülməlidir, əslində isə ağlamalıdır. Biz əvvəlcə ona gülsək də sonra birdən-birə qəhqəhəmizə ara verib düşünməyə başlayacağıq və bu sözləri qaşlarımızı çataraq oxuyacağıq:

"Bu nə sözdür, ay xan, mən ölənə kimi sənə qulam..."

Hər sözarası yalvaran, özünün yazıq vəziyyətini dönə-dönə xatırladan Novruzəli, əlbəttə, gülməli tip deyildir və "Poçta qutusu"nun qüvvətini də bu gülüşdə axtarmaq əbəsdir.

Molla Nəsrəddin incə sənətkardır. Onun hər kəlməsində daxili bir məna vardır. Bu səbəbə görə də biz "gülməli hekayə" sözlərini dırnaq arasına alsaq daha düzgün iş görmüş olarıq. Oxucuda oyanan bu düşüncə, onu mütləq bir nəticəyə gətirib çıxaracaqdır və müəllifin zahirən mehriban bir adam kimi təsvir etdiyi xan, bütün daxili eybəcərliyi və zalımlığı ilə bizim qarşımızda canlanacaqdır. Oxucunun ürəyində coşan qəzəb və kin də ona qarşı çevriləcəkdir.

"Poçta qutusu"nun da əsas qayəsi budur. Molla Nəsrəddinin hədəfi də, şübhəsiz, novruzəliləri bu kökə salan ictimai zümrələrdir. Odur ki, biz beş-altı səhifəlik bir hekayəni dünya ədəbiyyatı inciləri sırasına daxil edirik.

## 2

Tənqidimizdə bir adət vardır. Bu adət hamıdan çox Molla Nəsrəddinə ziyan vurmuşdur. Onun adı çəkiləndə mütləq hansı yazıçının təsiri altında böyüdüyünü qeyd etməyi hər bir tənqidçi özünə borc bilir. Bəzən bu müqayisələr böyük sənətkarı hər növ orijinallıqdan məhrum edir. Adama elə gəlir ki, Molla Nəsrəddin Azərbaycan dilinə tərcümə olunmuş Qoqoldan başqa bir şey deyildir. "Ölülər"i "Revizor"a, "Qurbanəlibəy"i "Kolyaskaya" nəzirə sayanlar da yox deyildir.

Biz yuxarıda bunun tamamilə tərsini iddia etdik. Başqa sənətkarlar kimi Molla Nəsrəddin də özündən qabaqkı böyük yazıçılardan öyrənmişdir. Qoqol özü öyrənməmişdirmi? Məgər o, anadangəlmə dahidir? Bəs nə üçün Qoqoldan danışıldığı zaman onun müəllimlərini bu qədər tez-tez xatırlatmırlar? Bəlkə haqsız iş görürlər?

Bizcə bu, tamamilə doğrudur. Qoqol o qədər böyük bir sənətkardır ki, öz satirasında o qədər yüksək bir səviyyəyə qalxmışdır ki, onun əsərləri təhkimçiliyə, çar istibdadına o qədər ağır və sarsıdıcı bir zərbə endirmişdir ki, artıq müəllimlərindən öz orijinallığı ilə büsbütün fərqlidir və ümumiyyətlə onun bədii istedadı olduqca müstəqil bir mahiyyət qazanmışdır.

Molla Nəsrəddin də belədir. "Ölülər"in "Revizor"a bənzədiyini və Qoqola təqlidən yazıldığını iddia edənlər unudurlar ki, bu iki dahiyanə əsərdə bir-birinə bənzəyən cəhət yalnız zahiri forma xüsusiyyətləridir, Xlestakovla Şeyx Nəsrullahın xarakterinə zərrə qədər də bənzəyiş yoxdur. Qorodniçi ilə Hacı Həsən də belədir. İskəndərlə müqayisə ediləcək bir obrazı "Revizor" əsərində axtarmaq lap əbəsdir. Demək, sənətin ən böyük və ən çətin sahəsində – xarakterlər yaradıcılığında Qoqolla Molla Nəsrəddin arasında çox dərin fərqlər vardır. Bu ədiblərin təsvir etdiyi mühit bir-birindən yerlə göy qədər fərqləndiyi kimi, hər iki komediya ideya və fikri istiqamət cəhətindən heç müqayisə oluna bilməz.

"Ölülər" olduqca orijinal və dahiyanə yazılmış bir komediyadır. Onun qüvvəsi, əlbəttə, müəyyən bir mühiti və dövrü yüksək bədii şəkildə əks etdirməsindədir. "Ölülər" də meşşan mühitinin zülməti göstərilmişdir. Bu zülmət içərisində yaşayan yekəbaşlar, fırıldaqçılar, dələduzlar, Molla Nəsrəddin qələmindən bütöv xarakterlər kimi, dolğun, canlı və inandırıcı bir şəkildə meydana çıxmışdır.

Molla Nəsrəddinin dramaturgiyası böyük fikirlər, canlı xarakterlər dramaturgiyasıdır.

"Ölülər" haqqında danışarkən onun realizmindən tiplərinin canlılığından, dilinin qüvvətindən, hadisələrin yığcamlığından hamı bəhs edir. Amma indiyəcən "Ölülər"in ifadə etdiyi dərin ideyaları açmağa kimsə təşəbbüs göstərmir. Bunun da müəyyən səbəbləri vardır. Çox ola bilsin ki, ədəbiyyatşünaslar Molla Nəsrəddinin mütəfəkkirliyini ikinci və üçüncü dərəcəli bir şey hesab edirlər. İlk baxışda buna bəraət qazandırmaq da mümkündür. Çünki böyük sənətkar, Mirzə Fətəli Axundov kimi fəlsəfi traktat yazmamışdır. Lakin bizcə "Ölülər" eyni zamanda dərin fəlsəfi komediyadır. Biz müasir dram yazanların sevə-sevə işlətdiyi aforizmləri fəlsəfə sayırıqsa, "Ölülər"də bu cür aforizmlər olmadığından, əlbəttə, müəllifin mütəfəkkirliyi bizim yadımıza düşmür.

Ancaq biz bu məsələni tamam başqa cür anlayırıq. Bu və ya başqa bir əsərdə yüzlərcə aforizm ola bilər, hətta bəzən adi insan dili əvəzinə müəllif bütün dramasını bu cür aforistik dildə yaza bilər, amma eyni zamanda meydana çıxan dram əsl fəlsəfədən, dərin fikri əsaslardan, ümumiləşdirmə qüvvəsindən tamamilə məhrum olan bir şəkildə meydana çıxa bilər.

Molla Nəsrəddin belə deyildir. Onun qəhrəmanları müəllifin yerinə filosofluq etmir. Aforizm "Ölülər"də çox nadirdir, amma bütün əsər dərin fəlsəfi konsepsiya əsasında qurulmuşdur.

Ölülərin "dirilməsi" nədir? Real ictimai əlaqələrin amansız təşrihini vermək üçün müəllifin istifadə etdiyi bu üsul adi bir dramatik vəziyyət deyildir. Diqqət edilərsə, Molla Nəsrəddinin köhnə cəmiyyətə necə böyük və ağır bir zərbə vurduğu aydın görünəcəkdir. Bu zərbənin zahirən gülməli görünməsi heç də vacib deyildir. Bizi bunun məna və mahiyyəti düşündürməlidir.

Burada artıq başqa yazıçıların təsirini axtarmaq da lazım gəlməyəcəkdir. Burada Molla Nəsrəddinin bütün dünya ədəbiyyatında ikinci bir rəqibi yoxdur. Hətta bir sənətkar olaraq da, o, möhtəşəm və əzəmətli bir sima kimi bizim qarşımızda canlanırdı. Burada Molla Nəsrəddin fəxrlə deyə bilər: "Dünya ədəbiyyatında mənim də payım var".

## 3

Molla Nəsrəddin irsi, həcm etibarilə dörd-beş cilddən çox deyildir. Ədəbiyyatçının və ya filosofun qiymətini təyin edərkən, biz əlbəttə bunu da əhəmiyyətsiz bir şey saymırıq. Lakin, bizim qarşımızda adi bir məişət yazıçısı durmayır, bəlkə bu dörd-beş cildlik əsəri ilə milli ədəbiyyatımızda böyük bir dövr açmış dahi bir sənətkar durur. Bu sənətkarın əsərləri yarım əsrə yaxın bir zamanın ağır imtahanından keçərək bu gün də yaşayır. Cəsarətlə deyə bilərik ki, onlar sabah da yaşayacaqdır.

Məsələ belədirsə, Molla Nəsrəddin bu gün bizimlə yanaşı duraraq, yeni dünyanın keşiyini çəkir, onun mübarizə səngərində yenə eyni mərdliklə vuruşur.

Biz, onun öz jurnalında Hitlerə və onun quldurlar dəstəsinə necə karikatura verə biləcəyini təsəvvürümüzə gətiririk. Hətta bu karikaturaların altında nə cür sözlər yaza biləcəyini də müəyyən qədər təsəvvür edirik. Çünki Molla Nəsrəddin bu XX əsr quduzlarının babaları ilə jurnalının səhifələrində çox üz-üzə gəlmişdir. İnsan cəlladlarına, dünyanı qanla çalxalayanlara, – xalqların bu mənfur düşmənlərinə qarşı mübarizəyə o öz ömrünün və yaradıcılığının ən parlaq illərini sərf etmişdir. Lakin o, on il bundan əvvəl ölmüşdür. O indi faşizmin törətdiyi dəhşətlərdən xəbərsizdir. Ancaq biz, Molla Nəsrəddinin ölümünü şərti hesab edirik. Çünki onun ənənəsi ölməmişdir. Onun vətənpərvər ürəyi bizim köksümüzdə çırpınır. Onun vətəninə, xalqına olan məhəbbəti bizim böyük işlərimizdə yaşayır. Onun bədii əsərləri xalqın ürəyində yaşayır.

Molla Nəsrəddin həqiqi xalq yazıçısıdır. Populyarlıqda az-az yazıçı onunla rəqabətə girişə bilər. Bu da Molla Nəsrəddin talantının başqa bir nişanəsidir.

Alman imperializminin qanlı müharibə meydanına çevirmək istədiyi İran, uzaq Hindistan, bütün Yaxın Şərq onun jurnalını oxuyub özünün dostunu-düşmənini tanıyırdı.

Şübhə yoxdur ki, xalqlar od içərisindən çıxdıqdan sonra onun əsərləri "Molla Nəsrəddin" jurnalının getdiyi yollarla bütün ölkələrə daha sürətlə yayılacaqdır. O zaman əzilmiş xalqlar, Xəzərin sahilindəki odlar ölkəsində yaşamış və yaratmış Molla Nəsrəddinlə bir də görüşəcəklər.

Xalqların bu bayram günü, eyni zamanda, böyük ədəbiyyatın bayramına çevriləcəkdir.

*1942*

# YAZIÇI VƏ TARİX

*Birinci məqalə*

Bizdə tarixi mövzulara böyük bir meyl oyanmışdır. Bu son dərəcə qanuni bir hadisədir. İndiyə qədər yaranmış əsərlər sayca çox az olsa da, bizim əsas yazıçı kadrlarımızın bədii yaradıcılıq şüurunu son zamanlarda tarix çox məşğul etməkdədir. Dövlət xadimlərinin, şairlərin, böyük xalq hərəkatı rəhbərlərinin həyat və mübarizəsi indi artıq bədii yaradıcılığımız üçün zəngin bir mənbə olmuşdur. Bu hadisənin özü xalqımızın şüurunda həqiqi bir intibah dövrünün başlandığına dəlalət edir. Xalqımız öz keçmişinin həqiqi bir məhəbbətlə əks olunmasını tələb edir. Xalqının mənəvi ehtiyacını az-çox duya bilən bir sənətkar isə, bu tələbə qətiyyən göz yuma bilməz. Yazıçı, hər şeydən əvvəl öz xalqının oğludur.

Tarixdən yazılan bədii əsərlərin oxucular və tamaşaçılar üzərinə təsiri olduqca dərindir. "Vaqif" dramasının müvəffəqiyyəti də bu fikrimizin doğruluğuna ən gözəl bir sübut ola bilər.

Lakin məsələ burasındadır ki, bizdə tarixçi ilə yazıçı arasında müəyyən bir ixtilaf əmələ gəlmişdir. Bəzi tarixçilərimiz, Azərbaycanın elmi-tarixi hələ lazımınca sistemə salınmamış, böyük tələblər irəli sürürlər. Onlar artıq yaranış tarixi-bədii əsərlərin əks etdirdiyi faktlarla elmi-tarixin bildiyi faktları müqayisə edərək, yazıçılarımıza müəyyən ittihamlar belə verməkdədirlər. Burada təəccüb ediləsi bir şey yoxdur. Tarixçinin faktik məlumatı, yazıçının məlumatından, yəni bədii əsərdə göstərdiyi hadisələrdən fərqlənir və gələcəkdə də fərqlənəcəkdir. Bu səbəbə görə də bədii yaradıcılıq süzgəcindən keçmiş tarixi faktları elmi-tarixin faktları ilə müqayisə etmək vəzifəsini öhdəsinə götürən hər bir müəllif, eyni zamanda bədii yaradıcılığın da öz xüsusiyyətlərini bilməyə məcburdur.

Lakin bəzi müəlliflər tarixi az-çox tədqiq etdikləri halda, tarixdən yazılmış bədii əsərləri düzgün anlamaqda çətinlik çəkirlər.

Məsələn, tarixçi bizə deyir ki, Napoleon Bonapart böyük sərkərdə idi. Bu doğrudur. Lakin Lev Tolstoy "Hərb və sülh" əsərində həmin Napoleonun tarixi hadisələrin hərəkətində heç bir həlledici rol oynamadığını göstərir. Sizcə bu nə deməkdir və böyük sənətkar nə dərəcədə

haqlıdır? Unutmaq olmaz ki, Tolstoy, eyni zamanda filosofdur. O, tarixi öz nöqteyi-nəzərindən izah edir və Tolstoyun bu izahı onun bədii şüurunun qanunları cəhətindən doğru və ardıcıldır.

Bu haqqı heç kim yazıçıdan ala bilməz və almağa da ehtiyac yoxdur. Əgər siz, Napoleonun harada və nə zaman qalib gəldiyini, nə cür vuruşmalarda olduğunu öyrənmək istəyirsinizsə, bunun üçün saysız-hesabsız tarix kitabları vardır.

“Vaqif” əsərində gördüyümüz İbrahim xan qəddar və hiyləgərdir. Tarix bizə deyir ki, İbrahim xan ağıllı və tədbirli bir dövlət xadimidir. Tarixçi də bunun əsasında şairi taqsırlandırır.

Tarixçi haqlıdırmı? Tarixçi öz nöqteyi-nəzərindən haqlı olsa da, sənətkar, Vaqifin əzəmətli surətini yaradarkən, onun dövlət işindəki gözəl tədbirlərini göstərmək istərkən və onun faciəsini həqiqi şairanə bir zirvəyə qaldırarkən, tarixin qulu olmağa məcbur deyildir.

Hələ qədim dövrün yazıçısı Lukan demişdir: “Şerin və poetik əsərlərin vəzifələri və qanunları bir başqadır, tarixinki isə, bir başqa. Orada (şeirdə) tam azadlıqdır və yeganə bir qanun vardır: şairin iradəsi. Çünki o ilahi bir qüdrətə malikdir və ilham pərisinin hakimiyyətinə tabedir”.

Yazıçının əsərindən tarixi faktları öyrənmək istəyən bir oxucu, özünə zəhmət vermək istəmir. O, bədii əsərə tarix kitabı kimi baxarkən, ən adi bir qanunu anlamır: bədii əsər tarix elmini əvəz edə bilməz!

Yazıçının vəzifəsi başqadır. Bu gün vətən müharibəsi cəbhələrində vuruşan qəhrəman Azərbaycan oğlu Babək, Koroğlu və Cavanşir adlarını öz qələbə bayrağında böyük bir iftixarla yazır. Müasir tarixçi bu ölməz qəhrəmanların həyatından misallar gətirib həmin yeni qəhrəmanları ruhlandırır. Lakin sənətkar bununla kifayətlənə bilməz. Yazıçının vəzifəsi tamamilə başqadır. O, bu adları bədii söz sənətinin ecazkar qüdrəti sayəsində şairanə bir xəyalla, həqiqi poetik bir ehtirasla əks etdirməli, müasir oxucunun qəlbində oyanmış böyük iftixar hissini daha da alovlandırmalıdır. “Babək kimi vuruş!” demək, ədəbiyyat üçün hələ heç bir şey deməyə bərabərdir. Yazıçı, Babək əsrini müasir fəlsəfi dünyagörüşünün süzgəcindən keçirmədikcə, Babəkin bədii surətini vermədikcə, onu tam bir həyatla yaşatmağı bacarmadıqca “vəzifəmi bitirdim” deməyə haqlı deyildir.

Bu fərq yalnız zahiri formada deyildir. Əgər tarixçi ayrı-ayrı faktlar əsasında müəyyən elmi nəticələr çıxarmaq yolu ilə gedirsə, yazıçının

çıxardığı nəticələr bədii surətdə əks etdirilən hadisələrin ümumi məntiqindən, fərdiləşdirilmiş insan surətlərinin bir-birinə qarşı münasibətindən doğur.

Tarixçi dövrün ümumi ictimai münasibətlərini əks etdirirsə, yazıçı ən çox dövrün psixologiyasını təşrih edir. Tarixçi psixoloq deyildir. Lakin sənətkar psixoloq olmalıdır. Bunsuz tarix elmi yaransa da, tarixi-bədii əsər yarana bilməz!

Bir qədər də sadə desək, tarixçi "nələr olmuşdur?" sualına cavab verirsə, sənətkar "nələr ola bilərdi və necə ola bilərdi?" suallarına da cavab verir. Yazıçının vəzifəsi heç də tarixi şəxsiyyətlərin fəaliyyətini başdan-başa izləyib bədii tərcümeyi-hal yaratmaqdan ibarət deyildir.

Tarixçi, akademik Tarle çox doğru qeyd edir ki, Lev Tolstoy Peterburq salonlarında gedən diplomatik söhbətlər deyil, Nataşa Rostovanın könlündəki həyəcanlar maraqlandırırdı.

Yazıçının tarixi adları və familiyaları, tarixi simaların yaşını, təvəllüd və ölüm illərini nöqtəsi-nöqtəsinə düzgün göstərməsini tələb edənlər, əgər ardıcıl olsalar, dahi Nizaminin bütün tarixi poemalarını, "İskəndərnamə"ni, "Yeddi gözəl"i və yaxud Firdovsinin "Şahnamə" dastanlarını bir heç məqamına endirməlidirlər, çünki bu dahi sənətkarlar öz qarşılarında tarixi hadisələri və şəxsiyyətləri eynilə bədii əsərə keçirmək vəzifəsini qoymamışlar. Onlar əksəriyyətlə tarixi şəxsiyyət və hadisələri böyük şairanə bir qüdrətlə romantikləşdirmişlər. Firdovsinin yaratdığı Rüstəm pəhləvanla tarixi Rüstəm arasında, necə deyərlər, zəmin-asiman fərq vardır. Nizami, tarixi bütün təfərrüatı ilə öyrənmişdi, lakin o da tarix yazmamışdır və buna görə də onun yaratdığı İskəndərlə, bizim tarixdən bildiyimiz makedoniyalı İskəndəri müqayisə edərkən, tarixi az-çox bilən hər bir adam böyük şairi asanlıqla töhmətləndirə bilər. Lakin bədii yaradıcılıq prinsipləri ilə tarix elmi prinsipləri arasındakı fərqi anlayanlar, buna heç də ehtiyac görmürlər, çünki bu adamlar, tarixi-bədii əsərlərdən deyil, tarixdən öyrənməyin tərəfdarıdırlar.

Yazıçının tarixə münasibətində ən başlıca prinsip tarixi həqiqətin mahiyyətini tam mənası ilə mühafizə edib göstərməkdən ibarətdir. Bu həqiqəti təhrif etməyə sənətkarların qətiyyən ehtiyacı yoxdur.

Bəzi tarixçilərin nəzərincə Şirvanşahlar dövləti məhz böyük və qüdrətli dövlət olduğuna görə, bu dövrdə Nizami, Xəqani kimi böyük insanlar yetişmişdir, yəni elmin, sənətin inkişafını müəyyən edən dövlət quruluşudur. Bu metodolojinin marksizimlə heç bir əlaqəsi yoxdur.

Böyük sənətkar, böyük sənət öz inkişafında nə üçün bilavasitə dövlət quruluşu ilə izah edilsin? Dövlət quruluşu fikir inkişafında ciddi rol oynaya bilər, lakin hər yerdə, hər zaman böyük dövlət, böyük mədəniyyətin yaranmasına bilavasitə səbəb olmur. Xüsusən, Şirvanşahların mədəni inkişafımızdakı rolunu həddindən artıq böyütmək nə üçündür? Əgər bu günkü tarixçilərimiz bununla o dövrün tarixi mənasını izah etmək istəyirlərsə, burada şəxsən mən daxili bir məntiq görmürəm. Bəziləri deyirlər ki, Əxsitan öz sarayında rəssamlara, şairlərə böyük ehtiram göstərdiyi üçün, onun dövründə ədəbiyyat və sənət yüksək bir zirvəyə qalxdı. Bu nə dərəcədə doğrudur? Məgər Nizamini yetirən saray olmuşdur? Məgər Füzulini yetirən saray olmuşdur? Məgər Mirzə Fətəli Axundovu yetirən saray olmuşdur?

Tarixçi bu fikir bahadırlarının yaranmasındakı böyük səbəbləri yalnız bu və ya başqa bir hökmdarın şəxsiyyətilə bağlarkən, qətiyyən düz iş görmür.

Aydın məsələdir ki, qüvvətli dövlət yarandıqda, hər zaman, bir qanun olaraq, qüvvətli mədəniyyət yaranmır. Məsələn, rus mədəniyyətinin ən yüksək inkişaf dövrü XIX əsrdən başlayır. Əzəmətli Rusiya dövlətini yaradan I Pyotrun dövründə Tolstoylar, Puşkinlər, Lermontovlar, Çexovlar meydana çıxmadı. İctimai fikir inkişafının zirvəsinə yüksəlmiş Çernışevski o dövrdə yaranmadı. Bu şəxsiyyətlərin hamısı irticanın ən müdhiş zamanlarında parladı.

Şirvanşahlar haqqında yazanlar bir cəhəti unudurlar ki, onların dövləti Xaqani kimi böyük şairi zindanda çürütdü. O dövrdə fikir azadlığı tamamilə boğuldu. Fars dilinin Azərbaycanda hakim dil olması adi bir ənənənin nəticəsi deyildi, bəlkə hökmdarların milli şüurdan məhrum olmalarının nəticəsi idi. Lakin bir çoxları, o cümlədən Şah Xətai isə, İranda hakim olmasına baxmayaraq, bu köhnə ənənəni vurub dağıtdı. Nizami dövrünün ədəbi dili – Azərbaycan dili də ola bilərdi, çünki Nizamiyə qədər xalqımız "Dədə Qorqud" dastanını yaratmışdı. Heç də təsadüfi deyildir ki, Şirvanşahlar hər zaman Kəyan nəslindən olduqlarını iddia edirdilər. Şirvanşahların mənşəyi haqqında rəylər, onların azərbaycanlı olduqlarını təsdiq edir. Lakin yazıçı onların siyasətinə tamamilə haqq verməyə məcbur deyildir, çünki Şirvanşah sarayının Nizamiyə münasibətindən bəhs edən yazıçı, Nizaminin dövlət haqqında görüşləri ilə rəsmi dövlət xadimlərinin görüşündəki fərqi və onların arasındakı ixtilafı pərdələyə bilməz. Bunsuz roman və ya drama yarana bilməz.

Klassiklərin tarixə münasibəti bu cəhətdən bizə ən gözəl nümunədir.

Yazıçının tarixi hadisələrə və şəxsiyyətlərə münasibətindən bəhs edərkən, tarixçi ilə yazıçının mütəqabil əlaqəsini nəzərdən qaçırmaq olmaz. Müasir dramaturq və ya romançı, şübhə yoxdur ki, müasir tarix elminin nailiyyətlərinə əsaslanmaya bilməz. Biz yazıçı ilə tarixçinin fərqini qeyd edərkən, bunları qətiyyən bir-birinə qarşı qoymaq xəyalında deyilik.

Əgər keçmişi xatırlasaq, əvvəllərdə sənətkar tarixə özünün müstəqil nöqteyi-nəzərindən baxmağa çalışsaydı da, tarix elminin təsirindən tamamilə yaxasını qurtara bilmirdi. Mürtəce sənətkar mürtəce tarixçilərin təsiri altında yaradır, tərəqqipərvər sənətkar isə tarixi hadisələrə müstəqil qiymət verir və ya mütərəqqi tarix elminə əsaslanırdı. A.S.Puşkinin "Boris Qodunov" əsəri üzərində necə işlədiyini, burada burjua tarixçilərinin ziddinə olaraq, xalqın tarixi prosesdəki rolunu necə işıqlandırdığını xatırlamaq kifayətdir.

Bütün dövrlərdə olduğu kimi, XVIII əsrin sonlarında, XIX əsrin əvvəllərində yaranan mürtəce tarix elmi ilə mürtəce tarixi romanlar eyni məqsəd izləyirdilər. Bu dövrdəki feodal irticasının nümayəndələri tarix elmindən də, ədəbiyyatdan da ən kəsərli bir silah kimi istifadə edirdilər. İnqilabın dəmir axınını saxlamaq üçün əski dünyanın bütün qüvvələrini öz ətrafında birləşdirən irtica, tarix elmini bu məqsədlərə tabe etməyə çalışırdı.

Məşhur rus ədibi Gertsen "O biri sahildən" adlı oçerklərində belə mürtəce məqsədlərə xidmət edən bu tarix məktəbi haqqında yazırdı ki, bu məktəb "gələcəyi keçmişin köməyi ilə dayandırmaq, yeni doğulan uşağın yolunu atanın meyidi ilə kəsmək xəyalındadır".

Əgər yazıçı tarixi həqiqəti təsvir etmək istəyirsə, o, birinci növbədə obyektiv tarixi həqiqətləri təşrih etməlidir. Buradan da tarixi dərindən və hərtərəfli öyrənmək zərurəti meydana çıxır. Yəni sənətkar zahirən əhəmiyyətsiz və xırda görünən hadisələri belə yaradıcılıq şüurundan kənarda buraxa bilməz.

Demək ki, ictimai inkişafın tarixi, eyni zamanda maddi nemətlər istehsal edənlərin tarixidir: istehsal prosesinin əsas qüvvələrini təşkil edən və cəmiyyətin yaşaması üçün zəruri olan nemətlərin istehsalını yaradan zəhmətkeş kütlələrin tarixidir.

Demək ki, tarix elmi, həqiqi bir elm olmaq istəyirsə, artıq ictimai inkişafın tarixini kralların və sərkərdələrin fəaliyyəti, dövlətləri "fəth

edənlərin” və “itaətə gətirənlərin” tarixinə çevirə bilməz; bu elm, hər şeydən əvvəl, maddi nemətlər istehsal edənlərin tarixi ilə və zəhmətkeş kütlələrin tarixi ilə xalqların tarixi ilə məşğul olmalıdır”.

Yazıçı buradan öz öhdəsinə düşən vəzifəni də müəyyən edə bilər. Yazıçının də ən birinci obyekti insan və onun həyatıdır, ən birinci qəhrəmanı isə xalq və onun mübarizəsidir.

Bizdə son zamanlar tarixi təhrif məsələsindən çox danışılır. Əlbəttə, bu danışıqlarını müəyyən səbəbi vardır. Əgər əvvəllər xanların rolunu yalnız mənfi bir hadisə kimi qiymətləndirmək bir dəb halına gəlmişdisə, indi biz bunun tamam əksini görürük. Bəzi tarixçilər saxta milli iftixar hissinin təsiri ilə bütün xanları və yaxud dövlət xadimlərini milli azadlıq uğrunda vuruşmuş görkəmli şəxsiyyətlər kimi qələmə verməyə çalışırlar. Bunun nə dərəcə də yanlış olduğunu izah etməyə ehtiyac varmıdır?

Aydındır ki, yalnız ölkənin inkişafında tərəqqipərvər rol oynamış və xalqın mübarizəsinə başçılıq etmiş dövlət xadimləri bizim müsbət boyalarımızla yenidən canlanmalı və bütün əzəmətilə göstərilməlidir.

Tarixi təhrif etməyə heç bir ehtiyac yoxdur. Tarixi şahların və yaxud da sərkərdələrin əli ilə yaranan bir hadisəyə çevirməyə çalışmış bəzi tarixçiləri kimi, yazıçı xalqı ikinci plana çəkməyə və sərkərdələrin əlində kor bir alət kimi göstərməyə qətiyyən haqlı deyildir.

Bizim tarixi dramalarımızın və romanlarımızın ən böyük məziyyəti ondan ibarətdir ki, bizim əsərlərimizdə bu köhnəlmiş və saxta baxış hakim deyildir. Məncə, Səməd Vurğun “Vaqif” əsərində xalq nümayəndələrinin və xalq şairi Vaqifin Qacarla mübarizədəki böyük rolunu ilk plana çəkdiyi zaman büsbütün haqlı iş görür. Zira tarixi yaradan və Qacar kimi qəsbkarlarla ölüm-dirim mübarizəsində hamıdan əvvəl qanını axıdan yenə də həmin xalqdır.

Tarixi mövzuda yazan sənətkarlar xalqı və onun nümayəndələrini göstərərkən daha zəngin boyalar işlətməyi bacarırlar.

Böyük rus yazıçısı Lev Tolstoy “Hərb və sülh” əsərində hələ bizdən çox-çox əvvəl məhz belə bir yolla getmişdi. O, sərkərdələrin yalnız öz şəxsi dühası ilə deyil, bəlkə xalqın gücü ilə qalib gəldiklərini göstərmişdi. Tolstoy xalqın gücünü bütün qüvvəti ilə duyan, bu gücün dərin fəlsəfi mənasını anlayan dahi bir sənətkardır. Bu səbəbə görə də onun tarixə baxışında səhv axtaranlar nahaq yerə özlərini yorurlar. Tolstoyun xalq vətənpərvərliyi onun ölməz epopeyasına əbədi bir qüdrət aşılamışdır.

Tolstoy tarix və tarixi şəxsiyyətlərə məhz bu xalq vətənpərvərliyi nöqteyi-nəzərilə baxdığı üçün, 1812-ci ilin vətən müharibəsini bir çox mütəxəssis tarixçilərdən daha gözəl, daha dərin, daha ətraflı izah etmişdir. Sənətkar bu yolla yaradırkən, onun cüzi səhvlərini və əhəmiyyətsiz xronoloji ricətlərini hər zaman əfv etmək mümkündür.

Həqiqi tarixi-bədii əsər tarixi dövrün spesifik qanununu və buradan doğan ixtilafları göstərən bədii əsərdir.

Çox ola bilər ki, tarixi mövzuda yazılmış bədii əsərin süjeti başdan-başa uydurulsun, buna baxmayaraq, əsərdə təsvir olunan tarixi hadisə və tarixi konkretlik şübhə doğurmasın. Burada tələb olunan əsas şey, yenə də həmin dövrün ümumi səciyyəsini dürüst anlamaq və dürüst göstərməkdir.

Son zamanlar tarixi-bədii əsərlərdən bəhs edən bütün müəlliflər Puşkinin "Kapitan qızı" əsərini tez-tez misal çəkirlər. Bunun səbəbi vardır. Puşkin Puqaçov hərəkatını bilavasitə götürüb əvvəldən axıra kimi təsvir etməmişdir. O, bu hərəkatın o zamankı həyatda olan inikasını təsvir etmişdir. Lakin oxucu bu təsvirin sayəsində o dövrü, Puqaçov hərəkatını və onun mahiyyətini də öyrənir.

Belə klassik nümunələr ədəbiyyat tarixində çoxdur. Kapitan qızının macərası tarixin öz süjeti deyildir. Bəlkə də o zaman heç belə bir hadisə olmamışdır. Lakin Puşkin dühası Puqaçov üsyanının inikasını və o zamankı həyata təsirini göstərərkən, oxucuya professional tarixçilərdən az material vermir.

Puşkin öz qarşısında tarixdən məlumat vermək vəzifəsi qoymasa da, dövrü bildiyi və gözəl təsvir etdiyi üçün, istər-istəməz, bizə tarixi məlumat da vermişdir.

Bu qeyddən aydın görünür ki, yazıçı təsvir etdiyi dövrün bütün təfərrüatı ilə öyrənməli və tam mənası ilə duymalıdır. Məsələn, XVIII əsrdən bəhs edərkən, feodal münasibətlərini göstərmək əvəzinə kapitalist əlaqələrindən danışan sənətkar, şübhəsiz tarixi əsər yaratmır. Hər dövrün öz xüsusiyyəti vardır. Bunu göstərmədikcə tarixdən yazan yazıçı sənətkar öz vəzifəsini bitmiş saya bilməz.

Bəzən yazıçı tarixi vəsiqələri bir-birinin dalınca əsərinə köçürməklə əsl tarixi roman yaratdığını zənn edir. Belə vəsiqələr çox vaxt təsvir olunan dövrü birtərəfli göstərir və əsərlər də olduqca sönük çıxır. Bu əsərlərdə ən əsas şey – canlı insanın bədii surəti yaranmır və romançının verdiyi məlumat da quru və cansız bir memuardan başqa bir

şey olmur. Sənətkarın vəzifəsi həmin vəsiqələrə can və qan verməkdir; bu vəsiqələrin arxasından çox zəif görünən insanları ətə-qana doldurmaqdır. Bədii əsərlər yalnız və yalnız bu cür əmək və ilhamla yarana bilər.

Şəxsən mən, tarixi mövzularda yazılmış əsrlərimizdə hamı üçün səciyyəvi olan ümumi bir nöqsan görürəm. Bu nöqsan ən çox dram əsərlərində nəzərə çarpır. Dramaturqlarımız nədənsə, öz qəhrəmanlarını həmişə qalib kimi göstərirlər. Tarixə nikbin münasibət dəyərli və zəruri bir xüsusiyyətdir. Lakin yazıçı təsviri etdiyi tarixi dövrün faciəsini, qəhrəmanların öz əsrləri ilə olan dərin ixtilafını göstərməkdən boyun qaçırırkən, əlbəttə, düzgün iş görmür. Vaqifin, Qaçaq Nəbinin, İbrahim xanın və başqalarının özlərinə məxsus dərin faciələri olmuşdur. Həmin faciələri təsvir etmək yolu ilə dramaturq böyük xarakterlər – ehtiraslar yarada bilər. Bu faciələrin təsviri qətiyyən müəlliflərin nikbin dünyagörüşünü xələldar etməz.

Bu nöqteyi-nəzərdən böyük dramaturqumuz Cəfər Cabbarlının “Od gəlini” faciəsi bizim üçün ən gözəl bir nümunədir. Müəllif, qəhrəmanının yüksək faciəsini göstərməklə bərabər, bizim qarşımızda ərəb istilası dövrünün bütün dəhşətlərini canlandırmağa müvəffəq olmuşdur və eyni zamanda özünün tarixi hadisələrə olan nikbin baxışını ifadə etmişdir.

Bizim indiki əsərlərimizdə isə, qəhrəmanlar həddindən artıq asan yolla qalib gəlirlər. Mürəkkəb insan səciyyələri əvəzinə çox vaxt sxema yaranması da bunun nəticəsidir. Səciyyələrin müstəqim xətt üzrə inkişafı, əsərlərimizin bədii qüvvətini də azaldır.

Məlumdur ki, bu birtərəflilik tarixi həqiqətin təhrifi üçün əlverişli bir zəmin yaradır. Bu təhrif, müəllifin tarixi perspektivi düzgün göstərməsinə də mane olur. Əgər hamı qalib gəlsəydi, ölkəmizin düşmənləri həmişə belə asanlıqla məğlub edilsəydi, o vaxt, şübhəsiz, bu hadisələri yenidən canlandırmağın heç bir mənası qalmazdı.

Mənim dediyim, yalnız bədii əsərin növünə aid deyildir. Mən yalnız faciə növünün zəruriliyini qeyd etməklə kifayətlənmək istəmirəm. Mən eyni zamanda tarixi mübarizəmizi saxtalaşdırmağın nə dərəcədə ziyanlı olduğunu, xalqımızın qəhrəmanlarına münasibətimizdəki səthiliyin bədii əsərlərimizə necə ziyan vurduğunu bir daha xatırlatmaq istəyirəm.

Yazıçı tarixçi deyildir. Yazıçı tarix kitabı yazmır. Yazıçının təsir gücü daha dərin olduğu üçün, onun hadisələrə və şəxsiyyətlərə birtərəfli yanaşmağa qətiyyən haqqı yoxdur. Yalnız böyük həqiqətləri dürüst və hərtərəfli göstərən sənətkar həqiqi təsir gücünə malik ola bilər.

Tarix – elmdir. Bədii ədəbiyyat isə ixtiradır. Bunları bir-birinə qarşı qoymaq lazım deyildir. İxtira edən hər kəs, birinci növbədə elmi öyrənməlidir. Elm isə, ixtiraların mənasını izah etməlidir. Elə isə, qoy tarixçi sənətkara, sənətkar isə tarixçiyə öz qardaşlıq əlini uzatsın.

Biz tariximizi sevirik. Bu sevgi müasir həyatımız və gələcəyimiz üçündür. Tarix həmişə bizim tərəfimizdədir. Əgər bu böyük qüvvətdən daha səmərəli istifadə etmək mümkündürsə, nə üçün geniş lövhələr təsvir edən yeni dastanların yaranmasına, yeni romanların və dramların meydana çıxmasına daha yüksək ilhamla, daha böyük həvəslə çalışmayaq?!

## ZƏNGİN XƏZİNƏLƏR

Bu vaxta qədər nəşr edilmiş ayrı-ayrı bayatı kitabçaları nəzərə alınmazsa, M.H.Təhmasibin tərtib etdiyi “Bayatılar” məcmuəsi* ədəbiyyatımızın zəngin janrlarından birini tədqiq edib öyrənmək işində ilk ciddi addım sayılmalıdır. Bayatıların toplanışı və nəşri çoxdan başlanmış olsa da, bu sahədə görülən iş hələ də böyük bir səmərə verməmişdir. Halbuki, xalq şerinin bu sahəsini tədqiq edib öyrənmək, nisbətən daha maraqlı bir işdir. Elmi qüvvələrimizin səyini müəyyən bir yola salmaqla az bir zaman içərisində biz bu işi müvəffəqiyyətlə başa çatdıra bilərik. Xüsusən, bayatının xalqımız tərəfindən sevildiyi nəzərdə tutularsa, müxtəlif variantları müqayisə etmək, tutuşdurmaq və daha gözəl bir tekst əldə etmək üçün hər bir imkan vardır. Dürüst elmi nəticələr çıxarmaq istəyən hər növ folklorçu üçün bu birinci növbədə lazımdır.

Lakin biz bu qısa qeydlərimizdə yalnız bir cəhəti göstərməklə kifayətlənəcəyik: bu əsərlərə münasibətimizi aydınlaşdıracayıq.

Bayatılar qədər xalq içərisində geniş yayılmış ikinci bir ədəbi janr bəlkə də yoxdur. Azərbaycan folkloru klassik Azərbaycan şerinin doğma qardaşı sayıla bilər. Bu iki qol hər zaman bir-birinə mütaqabil təsir göstərmişdir. Şübhəsiz ki, bunun səbəbi hər şeydən əvvəl folklor şerinin xalqımız üçün daha yaxın, daha anlaşıqlı və daha doğma olmasıdır. Xalqın ürəyinə yol tapmağa çalışan hər bir şair, xalq şerini uzun zamanlardan bəri sevə-sevə işlətdiyi obrazlar sistemindən, təfəkkür tərzindən özünəməxsus bir şəkildə istifadə edəcəkdir. Yeni şeiri yaradan mütləq əski şeiri bilməli, onu sevməlidir.

Bayatı özü də inkişaf edir, tematik vüsətini genişləndirir, yeni-yeni formalara girir; bu da məsələnin ikinci və mühüm cəhətlərindən biridir.

Bayatılar hər zaman Azərbaycan şerinin zəngin xəzinəsində son dərəcə görkəmli bir yer tutmuş və tutacaqdır. Ümumiyyətlə, bayatılar xalq şüurunun dərinliyini, xalq hissinin zənginliyini ən aydın və ən səmimi bir şəkildə ifadə edən sadə bir janr olmaqla bərabər, eyni zamanda əbədi təsir qüvvəsini hifz edən ən dərin şeir formasıdır.

Folklor şeirinin başqa janrları kimi bayatılar da fərdi yaradıcılıq məhsuludur. Belə olmasaydı, şübhəsiz, bu əsərlərin fikri-fəlsəfi məzmunu və emosional təsiri də səviyyəcə müxtəlif olmazdı. Müəlliflərini tanı-

* “Bayatılar” məcmuəsi, Bakı, 1943

madığımız bu həqiqi şeir inciləri, yəqin ki, bir zaman böyük bədii istedada malik olan adamlar tərəfindən yaradılmışdır. Hətta müxtəlif şəkillərdə təkrar edilə-edilə zəmanəmizə qədər gələn eyni bayatını belə müqayisə edəcək olsaq, bunların da müxtəlif bədii zövq sahibləri tərəfindən söyləndiyi dərhal aydınlaşar. Kədərini, sevincini, arzu və əməlini həyəcanlı, bədii formada söyləməyi bacaran bir qadın yaxud bir kişi nə üçün sənətkar adlanmasın? Uzun dastanlar yazmış və bir zaman adlı-sanlı şair sayılmış bəzi adamların əsəri indi artıq unudulduğu halda, dörd misralıq bir əsər yaşayır və kim bilir bundan sonra neçə əsr yaşayacaqdır! Bu əsərlər zamanın ağır imtahanından müvəffəqiyyətlə çıxa bildikləri üçün bunları yaradanlara sənətkar deməmək doğrudan da haqsızlıqdır!

Son zamanlara qədər tədqiqatçılar adət üzrə folkloru bütün xalqın məhsulu sayır, bu və ya başqa bir şairin əsəri kimi təhlil etmirdilər. Aydındır ki, həqiqi mənada xalq həyatı və xalq ruhu bu əsərlərin mahiyyətini təşkil edir. Lakin yazılı ədəbiyyatda olduğu kimi, folklorda da yaradıcının həyat hadisələrinə baxışı, əsas fikrin-ideyanın ifadəsindəki qüvvəti bu və ya başqa bir əsərin müxtəlif səviyyədə meydana çıxmasına səbəb olur; yəni qüvvətli bir sənətkarın əsərləri əbədi yaşadığı kimi, istedadca zəif bir şairin yaratdığı əsərlər uzun müddət yaşaya bilmir. Çox ola bilsin ki, vaxtilə söylənmiş bir sıra bayatı uzun müddət təsir göstərə bilmədiyindən və ifadə etdiyi fikrin məhdudluğu üzündən indi artıq xalqın hafizəsindən silinib getmişdir. Bizim şərti olaraq əbədi adlandırdığımız motivlərdən bəhs etməyən, yüksək fikirdən və gözəl bədii ifadə formalarından məhrum olan bir sıra bayatılar da, ayrı-ayrı yazılı əsərlər kimi, öz vaxtında müəyyən bir rol oynayaraq, öz dövrünü yaşayaraq unudulmuşdur.

Bayatılar folklor şerinin ən aktual növlərindən biridir. Müasir ədəbiyyatda günün məsələlərindən bəhs edən siyasi-təbliği şeirlər nə qədər əhəmiyyətlidirsə, bayatılar da öz zamanında bir o qədər əhəmiyyətli və təsirli olmuşdur. Hadisəyə əlaqəsini tez və qəti bildirmək istəyən müasir şair kimi, bayatıların müəllifləri də əsərlərinin neçə müddət yaşayacağı haqqında düşünmədən gözləri önündə cərəyan edən hadisənin bədii ifadəsini vermişlər. Bunların bəzisi unudulmuşsa, bəziləri klassik irs kimi ədəbiyyat xəzinəsinə daxil olmuşdur. Bu da yenə yaradıcılığın qüvvətindən və bayatının xalq ruhundan dərin bir əks-səda taparaq hiss və həyəcanların həqiqi tərcümanı ola bilməsindən asılı məsələdir.

Bayatıların xalq yaradıcılığı adlanması da bu məsələ ilə əlaqədardır. Xalq tərəfindən qəbul edilən, ictimai zövqün və təsirin imtahanından çıxan bayatı dildən-dilə düşərək yaşayır və öz bədii-tərbiyəvi vəzifəsini yerinə yetirir. Lakin, o, həmişə canlı bir yaradıcılıq prosesi keçirir. Ayrı-ayrı dövrlərdə ayrı-ayrı adamlar tərəfindən, tamamilə başqa bir münasibətlə söylənir və buna görə də onun bədii təsiri də müxtəlif olur. Müəyyən bir münasibətlə çox yerində söylənmiş bir bayatının dərin təsir bağışladığını az görməmişik. Eyni zamanda bayatılar daima dəyişir və yaşayır, əvvəlki mətn çox vaxt gözəlləşir, kəskinləşir, bəzən də əksinə, bədii cəhətdən zəif bir şəkil alır. Bu nöqteyinəzərdən bayatıların, laylaların və mahnıların nə zaman və kimlər tərəfindən yarandığını təyin etmək məsələsi çətinləşir. Buna görədir ki, biz vaxtilə ayrı-ayrı ağıllı, həssas və bədii zövqə malik adamlar tərəfindən yaradılmış bu əsərləri xalq şüurunun bir ifadəsi kimi qiymətləndiririk. Bayatılar xalqın zəngin hissini, bədii təfəkkürünü ifadə edirlər. Nəcib insan hissləri, ən incə təbii ehtiraslar, səmimi və təmiz qəlb çırpıntıları, gözəl və hikmətli sözlər, kim bilir, neçə milyon ürəkləri, fikirləri fəth edərək, zəmanəmizə qədər gəlib çıxmışdır. Bayatıların tarixi yolu onların bədii qüdrəti ilə birləşərək öz əhəmiyyətini daha da artırmışdır.

Bayatıların çoxusu lirik xasiyyət daşıyır. Burada müəllif öz şəxsi həyəcan və iztirablarını ilk plana çəkir; hətta onun bəhs etdiyi bir matəm, çoxlarına aid olsa da, o, bu hadisəni öz şəxsi kədəri kimi ifadə etməyə çalışır. İlham, həm də qüvvətli bir ilham olmadıqca bayatı yarana bilməz. Bayatının müəllifi həqiqi mənada lirik şairdir. O əksəriyyətlə özünün daxili varlığını, özünün şəxsi münasibətini gizlətmir, əksinə, daha da yanıqlı və ürəyinin dərinliyindən gələn bir məftunluq hissi ilə dinləyicini sarsıtmağa çalışır.

Sevgiyə həsr olunmuş bayatıların çoxunda vəfa, həsrət və intizar motivləri böyük bir sənətkarlıqla tərənnüm edilir. Ümumən bayatıların ən qüvvətli nümunələrini sevgi lirikası adlandırmaq daha doğru olar. Burada həmişə incə insan hissləri dərin və səmimi bədii obrazlar vasitəsilə verilir:

Bu dağlar qoşa dağlar,
Verib baş-başa dağlar,
Yarım səndə gəzibdir,
Səni yüz yaşa dağlar!

Yaxud sevgilisini bütün başqa sərvətlərdən üstün tutan bir aşiqin misralarını oxuyun:

Qara at nalı neylər,
Qara qaş xalı neylər,
Sənin tək bir yarı olan
Dövləti, malı neylər?

Bu sadəcə bayatı nəcib insan məhəbbətini nə qədər yüksək və qiymətli bir sərvət kimi tərənnüm edir!.. Burada məhz xalqımıza xas olan sadə, lakin eyni zamanda dərin bir fəlsəfə vardır: insan dövlətdən, maldan müqayisəedilməz dərəcədə yüksəkdə durur!..

Bəzən sənətkarın ecazkar qüdrəti sayəsində bayatı geniş bir əhatə qüvvəsinə malik olur və daha dərin fəlsəfi əhəmiyyət kəsb edir. Buna görədir ki, həyata və dünyaya dərin, fəlsəfi bir baxış ifadə edən bayatıların ömrü daha uzundur:

Su gələr, axar gedər,
Qayalar yıxar gedər.
Dünya bir pəncərədir,
Hər gələn baxar gedər.

– sözlərini oxuyarkən, bizim qarşımızda həqiqi, mütəfəkkir bir şairin xəyalı yüksəlir. Burada müəllif bəlkə də heç adını eşitmədiyi Heraklitlə səsləşir!..

Bayatıların ifadə etdiyi əhval-ruhiyyə olduqca müxtəlifdir. “Ağı” adlanan mahnılarda müəyyən dərəcədə kədər, göz yaşları və dərin həsrət motivləri vardır:

Dağlar dağımdır mənim,
Qəm ovlağımdır mənim,
Dindirmə qan ağlaram,
Yaman çağımdır mənim.

Ağzım aça bilmərəm,
Açsam saça bilmərəm,
Dalımda qəm yükü var,
Salıb qaça bilmərəm.

Səhər tezdən oyandım,
Dərədə, qəmə boyandım,
Daş olsaydım ərirdim,
Torpaq idim, dayandım.

Lakin belə bayatılarda da bədbinlik adlana biləcək bir əhval-ruhiyyənin hakim olduğunu düşünmək yanlış olardı. Folklor üçün bu xüsusiyyət heç də xarakterik deyildir. Çox qəribədir ki, o dünya ümidilə yaşayan adamların dünyagörüşü ilə zəhərlənmiş bayatı, demək olar ki, yox dərəcəsindədir. Nağıllarımızda, dastanlarımızda dini təfəkkürün dərin təsiri duyulmadığı kimi, bayatılarda da bu təsirin izi görünmür. Bayatı yaradan müəlliflərdə həyat eşqi, mübarizə və qələbə meyli son dərəcə qüvvətlidir. Bu xüsusiyyət onların əsas, istiqamətverici xüsusiyyətidir.

Aydındır ki, bayatının tərənnüm etdiyi əhval-ruhiyyə, bayatının yaranmasına səbəb olan hadisənin mahiyyətindən və şairin şəxsi dünyagörüşündən asılıdır. Xüsusən, daha bariz ictimai motivlərə həsr olunmuş bayatıların yarandığı dövr, şairin həyata baxışını müəyyən etməkdə daha böyük rol oynayır:

Mən aşıq şəkər canım,
Hər dərdi çəkər canım,
Nə haqqım var, nə muzdum,
Bəylərə nökər canım.

Yaxud:

Əziziyəm ağa xan,
Ağa soltan, ağa xan,
Bu zülm ilə xan qalmaz,
Əgər göydən yağa xan.

Belə hallarda hər bir oxucu özü bayatının təxminən nə zaman və hansı cəmiyyətdə yarandığını asanlıqla ayırd edə bilər. Belə bayatılarda çox aydın boyalar işlənir. Bunlarda dərin ictimai ehtiras meyli vardır. Müəllif ani bir təəssüratdan artıq, uzun müddət möhkəmlənmiş bir cəmiyyətin həyatından doğan təəssüratı ifadə edir. Sevgi lirikasından fərqli olan bu bayatılar həqiqi siyasi lirikaya çevrilir. Müəllif ədalətsiz mühitə qarşı qəzəblənir, onun kin və nifrəti bəzən zərbülməsəllərimizin müdrik ifadə tərzi qədər kəskin bir forma alır; xüsusən, namərdlərə qarşı çevrilən bayatılarda bunu biz daha aydın görürük:

Əzizim kasa dolmaz,
Mərd əli kasad dolmaz.
Yüz namərdin çörəyin
Doğrasan, kasa dolmaz.

Bu misaldan göründüyü kimi müəllif kəskin mübaliğəyə əl atır, son dərəcə real təzad yaradır. Belə zəngin məzmunlu bayatılarımız

sayca çoxdur. Bunların ən birinci xüsusiyyəti zahiri-forma gözəlliyində deyil, fikir kəskinliyindədir.

Bəzən bayatı ən adi bir məsləhət xarakteri daşıyır. Burada qəzəb və nifrət yox, yoldaş və ya dost qəlbinin çırpıntısı duyulur:

Mən aşıq qəlbi nara,
Ay doğar qəlbi nara,
Dil ilən dost olanın
İş ilən qəlbin ara.

Bəzən də müəllif özünə və özü kimilərə ürək-dirək verir:

Aşıq naçar ağlama,
Gündür, keçər, ağlama,
Qapını bağlayan fələk
Bir gün açar ağlama.

Bu kimi bayatıların tərənnüm etdiyi həyat eşqi həm məzmunca, həm də ifadə tərzi cəhətindən ağılara nisbətən qat-qat güclüdür; bu da, əlbəttə ki, səbəbsiz deyil. Ağılar keçici hallardan bəhs etdiyi halda, belə bayatılar əbədi insan arzularına, yaradan, quran, həyati gözəlləşdirməyə çalışan insanın böyük arzularına həsr olunmuşdur.

***

Bayatıların əsas bir qismi vətən motivlərini əhatə edir. Bu gün vətən eşqilə bütün cəbhələrdə yorulmadan vuruşan və qalib gələn bir xalq üçün belə əsərlərin əhəmiyyəti xüsusilə böyükdür. Bayatının yaradıcıları bir tərəfdən düşmənin namərdliyindən, ikiüzlülüyündən, qəzəb və nifrətlə bəhs etdikləri kimi, o biri tərəfdən vətən obrazını özlərinə məxsus bir səmimiyyətlə yüksəldir, hətta romantikləşdirirlər. Burada da yenə müəlliflərin özlərinə məxsus bir dil işlətdiklərini görürük:

Əziziyəm dilən gəz,
Bağda gülü dilən gəz.
Qürbətdə xan olunca,
Vətənində dilən gəz.

və yaxud:

Əzizim kətan yaxşı,
Geyməyə kətan yaxşı,
Gəzməyə qürbət ölkə,
Ölməyə vətən yaxşı –

kimi bayatılar hələ inqilabdan çox əvvəl yaradılmış və xalqımızın ürəyində öz fəxri yerini tutmuşdur.

Vətən həsrəti ana torpağın eşqi Azərbaycanın dahi şairlərinə – Nizamiyə, Füzuliyə, Vaqifə ilham verdiyi kimi, bu dörd misralı ölməz əsərlərin yaradıcılarını da qanadlandırmış, onların bədii istedadına əbədi bir qida vermişdir. Heç də təsadüfi deyil ki, indi də bayatı yaradanlar bu böyük məhəbbətlə ruhlanaraq məzmunca yeni və qüvvətli əsərlər meydana çıxardırdılar. Burada əski bayatılar hüzn və ələm yoxdur; çünki bayatı müəlliflərini kədərləndirən, onların ürəyində qəzəb və nifrət hissini alovlandıran ədalətsiz ictimai quruluş bizim ölkəmizdə çoxdan tarixin arxivinə verilmişdir. İndiki bayatının baş qəhrəmanı yeni dünya, onun yaradıcılarıdır:

Mən aşiq yaza baxdım,
Açılıb taza baxtım.
Məhv olub köhnə dünya,
Çıxıbdır yaza baxtım.

Xalqın tarixini və əzəmətini duymaq və anlamaq istəyən hər kəs, onun yalnız saf ictimai məzmunlu ədəbiyyatını öyrənməklə kifayətlənə bilməz. Xalqın mənəviyyatını duymaq üçün onun sevgi lirikasını, hətta bəzən müəyyən dərəcədə erotik xarakterdə olan əsərlərini də diqqətlə öyrənmək lazımdır.

Xalqımızın bədii istedadı başqa sənətlər sahəsində olduğu kimi, bayatılarda da bütün parlaqlığı ilə təzahür etmişdir. Yalnız məzmun dərinliyi və fikir zənginliyi cəhətindən deyil, söz sənətkarlığı, obrazlar, müqayisələr və bədii ustalığın bütün başqa ifadə vasitələri cəhətindən də bayatılarda öyrəniləcək xüsusiyyətlər az deyildir. Təqlid və təkrar üçün yox, yeni şerin bədii qüdrətini artırmaq üçün, zəngin fikirləri belə aydın və parlaq ifadə etmək üçün bayatılar mütləq öyrənilməlidir.

Bəzən folklorun epik formalarında (nağıllarda, dastanlarda) xalqın dilək və arzuları müəyyən əfsanəvi ünsürlərlə qarışdığı halda, lirik formalarında (qoşma və bayatılarda) bu dilək və arzular tamamilə real ünsürlərdən ibarətdir; yəni buradakı sevgi də, nifrət də, kədər və ələm də həyatidir. Yaradanın istedadından asılı olaraq bayatılar müxtəlif səviyyədə bu insan duyğularının ifadəsini verir. Müəyyən dərəcədə erotik olan bayatılar bu nöqteyi-nəzərdən, bəzilərini düşündüyü kimi,

heç də ictimai məzmundan uzaq deyildir. Əksinə bu növ bayatıların özündə belə ən canlı və həqiqi insan hissinin tərənnüm edildiyini görürük.

Əgər:

Bu qala bizim olaydı,
Kərpici qızıl olaydı.
Gireydim yar qoynuna,
Gecələr uzun olaydı!

– deyən bir aşiqin arzusu bizə həddindən artıq açıq görünürsə, bu arzuda qeyri-təbii heç bir şey yoxdur; həmçinin:

Əzizim gülüstan,
Şeh düşdü gülüstana,
Qorxuram göz yaşımdan

Qoynunda gül istana – bayatısının incə və zərif işarələri də eyni dərəcədə təbii və gözəldir.

Bayatıların bədii xüsusiyyətlərinə gəldikdə, burada qısaca olaraq bir neçə mühüm cəhəti qeyd etmək faydasız olmaz.

Bu məcmuədə toplanmış əsərlərin bəzisi həqiqi mənada bayatı məfhumunda düz gəlmir. Bayatılar, əksəriyyətlə, təbiət təsviri ilə başlayır. İlk beytdə, deyiləcək əsas fikir üçün bir növ fon yaradılır:

Əzizim ulu dağlar,
Çeşməli, sulu dağlar,
Burda bir qərib ölüb,
Göy kişnər, bulut ağlar.

– bayatısı bu söylədiyimiz fikri təsdiq etmək üçün ən parlaq bir misal ola bilər. Müəllif ifadə etdiyi əhval-ruhiyyəyə uyğun olaraq təbiəti də qəmgin bir şəkildə göstərir. Yaxud başqa bir misal götürək:

Əziziyəm çən gəri dur,
Dağlardan çən gəri dur.
Sənə gələn qadanı
Mən alım, sən gəri dur.

Yenə eyni vəziyyət! Aydındır ki, birinci beytlə ikinci beyt arasında üzvi bir əlaqə vardır; lakin son beyt hər zaman bayatının əsas məğzini təşkil edir.

Yenə də yaradıcının məharətindən asılı olaraq bu xüsusiyyət bəzi bayatılarda son dərəcə sənətkaranə gözlənildiyi halda, bəzilərində yalnız adi bir giriş kimi söylənir. Birinci təsadüfdə:

Əzizim aydın olsun,
Ay doğsun, aydın olsun.
Gəl yardan xəbər verim,
Gözlərin aydın olsun, –

deyilirkən ayın doğması ilə şad xəbər arasındakı əlaqə olduqca üzvi və təbiidir. İkinci təsadüfdə:

Mən aşiqəm ya xannan,
Ya sultannan, ya xannan,
Bir dəstə gül olaydım,
Asılaydım yaxannan. –

– kimi bayatıların birinci hissəsi ilə ikinci hissəsi arasındakı əlaqə çox uzaqdır. Burada müəllifin girişi daxili məntiq cəhətindən əsas nəticə ilə möhkəm bağlı deyildir. Burada yalnız zahiri xüsusiyyət, ahəngdarlıq, qafiyə nəzərdə tutulmuşdur.

Lakin, ümumiyyətlə, ən yaxşı bayatılar üçün birinci təsadüf daha xarakterikdir. Bu məcmuədə toplanmış əsl bayatıların qüvvəti də gözəlliyi də bundadır.

Məcmuəyə daxil edilmiş başqa növ əsərlərə gəldikdə, əlbəttə, bunlar üçün dediyimiz cəhətlər səciyyəvi deyildir. Məsələn, ayrı-ayrı qoşmalardan və aşıq şeirlərindən qoparılmış parçalar, həqiqi mənada bayatı sayıla bilməz. Bunlar məcmuəyə yalnız bir məqsədlə daxil edilmişdir: bu qiymətli parçalar unudulub getməsin!

Bayatıların bədii qiyməti bir də onların dilindəki zənginlikdə və yığcamlıqdadır. Ən dərin həyəcanları, ən qısa bir şəkildə ifadə etmək, yığcam obrazlar, ifadələr tapmaq bayatının ən gözəl bədii xüsusiyyətlərindəndir.

Burada bir məsələni xüsusilə qeyd etməyi lazım görürük: bütün klassik şerimizi başqa xalqların şeirindən fərqləndirən ifadə orjinallığına bizim bayatılarımızda daha sıx-sıx rast gəlirik. Bu cəhəti müasir lirikada nə üçün davam etdirməyək? Şablon nikbinlik bizə nə

dərəcədə yaddırsa, bu səbəbə görə də öz istəkli oğlunu itirmiş bir ananın fəryadı nə dərəcədə təbiidirsə, sevən, öz yarı üçün çırpınan bir gəncin həyati arzuları da o dərəcədə təbii və gözəldir.

Bu səbəblərə görə də biz bayatıların hər növünə, istər ağılara, istər laylalara və istərsə bütün başqa formalarına eyni məhəbbətlə yanaşmalı və onlara həyatımızın, tariximizin, şüur və təfəkkürümüzün bir aynası kimi qiymət verməliyik.

# SƏADƏT VƏ MƏHƏBBƏT MÜĞƏNNİSİ

## I

Nizaminin əsərlərində səkkiz əsrə yaxın uzun bir dövrün ağır imtahanlarından çıxan və köhnəlməyən cəhətlər hansıdır?

Adətən belə zənn edirlər ki, keçmişin böyük klassiklərini yaşadan, onların ifadə etdikləri ümumbəşəri ideallardır. Məlumdur ki, məhz sovet adamları belə ideallların ən səlahiyyətdar varisləridir. Lakin Nizaminin ümumbəşəri ideallar ifadə etmiş bir sənətkar olduğunu söyləməklə kifayətlənmək, hələ bir şey demək deyildir.

Nizaminin elmi və fəlsəfi görüşlərinə dair az yazılmamışdır. Ancaq bizi ilk növbədə şair Nizami maraqlandırır. Çünki onun dühası bu sahədə daha bariz bir şəkildə təzahür etmişdir. Demək, onun poetik aləmini haqqilə başa düşsək, ümumən bədii təfəkkürün sirlərini kəşf etməyə bunun çox köməyi dəyə bilər. Əgər Nizami öz əsrinin bütün elmi həqiqətlərini dərindən bilirdisə, bu da onu göstərir ki, hər bir şair, alim və mütəfəkkir qədər həyat həqiqətinin mahiyyətinə nüfuz etməyi bacarmalıdır. Nizami bunu tam mənasilə bacardığı üçün də bütün müasirlərindən fərqlənir.

Onun bədii lövhələrində ifadə olunmuş ən böyük həqiqətlərdən biri budur ki, Nizaminin yaşadığı feodal-patriarxal cəmiyyətindəki insanlar xoşbəxt deyillər. Bu şəraitdə yaranmış qüdrətli dövlət quruluşu, zəngin maddi və mənəvi mədəniyyət, xalqın ən çalışqan və ən zəhmətkeş təbəqələrinə belə səadət gətirmir.

Nizami bütün ömrü boyu xoşbəxt bir cəmiyyət quruluşu arzulamışdır. Onun əsrlərə nüfuz etməyi bacaran nəzərləri daima irəliyə, daima gələcəyə zillənmişdir. Bu səbəbə görədir ki, onun bəzi əsərlərində eşitdiyimiz ümidsizlik və kədər nidaları heç də böyük şairin bədbinliyinə dəlalət etmir. Nizami, bu sözün həqiqi və dərin mənasında, nikbin bir şair olmuşdur. Nizaminin qüdrətli romantikası da buradan qida alır. O, şeir süzgəcindən keçirib yaratdığı insan surətlərini bir sıra yüksək və ideal məziyyətlərlə bəzəmiş insanın qüdrətini tərənnüm edərkən boyasını əsirgəməmişdir. Onun romantikasındakı əsas məzmun, insana və onun mənəvi qüdrətinə inanmaq meylindən ibarətdir. İnsan zəkası və insanın yaradıcı qüvvəsi, Nizami poemalarının ən parlaq səhifələrinə rövnəq vermişdir. Heç də təsadüfi deyildir ki, onun poemalarının müqəddəməsindəki "İlahiyyat" qismi, əksəriyyətlə şairin bədii konsepsiyala-

rının üzvi hissəsi deyildir. Geniş romantik lövhələrin ilk və son bəzəyi, şairin ilhamını coşduran ən böyük obyekt insan və yenə insandır!

Nizamidən iki əsr sonra yaşayıb yaratmış, "orta əsrlərin son, yeni zəmanənin ilk şairi" Aligeri Dantedə rast gəldiyimiz mistikadan Nizamidə zərrə qədər də nişanə yoxdur. Böyük italyan şairinin tarixi qiymətini azaltmadan deyə bilərik ki, mistika "İlahi komediya"nın ətinə və qanına hopduğundan, ondakı realizm ünsürlərini əhəmiyyətli dərəcədə zəiflətdiyi halda, Nizaminin romantikası Azərbaycan feodalizminin yaralarını daha aydın görməyə və insan surətlərini daha yaxından durmağa kömək edir.

Nizaminin real həyatdan alınmış lövhələrlə yanaşı, büsbütün xəyalında uydurduğu cəmiyyət quruluşunu bizim qəlbimizə yaxınlaşdıran da təkcə şairin bədii ehtirası deyil, eyni zamanda həyata, hadisələrə və insanlara olan nikbin, aydın və inamlı münasibətidir. Nizami ən romantik lövhələri təsvir etdikdə belə, real həyatın ziddiyyətlərinə göz yummur. Buna ən parlaq misal olaraq "İqbalnamə"dəki utopiyanı göstərə bilərik. Nizaminin yaratdığı başqa lövhələrdə olduğu kimi burada da real münasibətlər hökm sürməkdədir. Çox qəribədir ki, Nizaminin təsvir etdiyi şimal həddindəki cəmiyyət, bütün aləmdən təcrid olunmuş bir cəzirə deyildir. Bu cəmiyyətdən uzaqda yəcucların sakin olduğu bir yer də vardır. Oranın sakinləri:

İnsana bənzərlər, divdirlər əslən.
Div tək almazcaynaq və dəmir ürək
Rəng qara, özləri xain qurd tək.

Çox səciyyəvidir ki, bütün "İskəndərnamə"də Nizaminin müsbət boyalarla göstərdiyi İskəndər belə, şimal həddindəki nümunəvi cəmiyyət quruluşunu görərkən öz-özünə belə deyir:

Bütün yığdıqlarım qalsın bir yana,
Burdan öyrəndiyim bəs edər mana.

Bu bir həqiqətdir ki, Nizaminin utopik cəmiyyəti göydən asılmamışdır. Həmin cəmiyyətin üzvləri, yəcucların bir an belə unutmayırlar:

Ara bir bürüyüb basaraq bizi,
Xərabə qoyarlar yerlərimizi.
Qoyun-quzumuzu talayıb onlar,
Yeyərlər nə qədər azuqəmiz var.

deyirlər.

Zəhmətlə sevginin birliyi əsasında falanqalar yaratmağı təklif edən Şarl Furedən düz altı əsr əvvəl, Nizami Gəncəvi "İqbalnamə"sində, xalqın birliyi, bərabərliyi, məhəbbəti və zəhməti əsasında qurulan bir cəmiyyəti idealizmə etmişdirsə də, buradan çıxarılan başlıca nəticə budur ki, böyük şair xalq səadətinin yollarını ömrünün sonuna qədər düşünmüşdür. Onun cəmiyyətində hamı Əkir, hamı biçir, birə yeddi yüz məhsul götürür. Qızıla-gümüşə aldanmırlar. Bu cəmiyyətin üzvləri zorakılığa düşmən olduqları kimi, əldə etdikləri səadəti qorumağa da qadirdilər.

## II

Nizaminin mənəvi aləmində ən böyük yeri dərin ictimai məzmun əsasında yüksələn şeir tutursa, onun şeir aləmində ən görkəmli yeri məhəbbət mövzusu tutur.

Bəlkə bu, dahi şairin məhdudluğundan irəli gəlir? Nə üçün məhəbbət mövzusu belə nəhəng bir şairin ilhamını bu qədər coşdurmuşdur?

Çünki onun nəzərincə, məhəbbət olmayan yerdə səadət də yoxdur. O iddia edir ki, "eşq olmasaydı, yer üzü də abad ola bilməzdi".

Şair, məhəbbət məfhumunu necə başa düşür?

Nizami, məhəbbəti erotik bir hiss kimi tərənnüm etmir. O, məhəbbəti dərin ictimai bir amil kimi təsvir edir.

"İqbalnamə"dən "Arşimedlə çinli qızın hekayəsi"ni yada salmaq istərdim. Bu hekayədə Arşimedin hələ tələbə ikən bir kənizə uyub elmdən və bilikdən üz döndərdiyi təsvir olunur. Buradan aydın görünür ki, Nizami, məhəbbət hissini şəhvət hissindən fərqləndirir.

Bəlkə onun nəzərində məhəbbət platonik bir hissidir?

Yox, Nizami, məhəbbəti canlı insanlara xas olan bir hiss kimi təsvir edir. Onun lövhələrində əbədiləşdirilmiş məhəbbət səhnələri müqəddəs olduğu qədər də realdır.

Qanımda bəslənmiş bir gülümdü o,
Dünyada yeganə sevgilimdi o.
Ondan qur alırdı gözüm ah, nədən
Pis göz uzaq saldı onu gözümdən.

Qəribədir ki, Nizami burada iki böyük dastanının qəhrəmanlarını – Şirin və Leylini də xatırlayaraq sinəsinə dağ çəkildiyinə işarə edir.

Belə məlum olur ki, onu yalnız şəxsi səadətdən məhrum olmağı deyil, qəhrəmanlarından ayrılmağı da kədərləndirir. Görünür, böyük poeziyanın sirri də bundadır. Müəllif öz qəhrəmanlarını nə dərəcədə sevirsə, yeni bir qəhrəmandan bəhs etməyə başlayanda xeyli çətinlik çəkir və Allahdan imdad istəməyə məcbur olur. Nizaminin bu sevgisi təkcə Şirin və Leyliyə münasibətində deyil, bəlkə bütün müsbət qəhrəmanlarına münasibətində də aydın təzahür edir. Tarixdən bizə məlum olan makedoniyalı Aleksandrı konkret tarixi şəraitdən qoparıb ideal bir hökmdar kimi göstərən Nizami, onu da hədsiz bir məhəbbətlə sevir. O, bu məhəbbəti zəngin şair fantaziyasında yaranmış bir şəxsiyyətdən artıq, onun simasında təcəssüm etdirdiyi böyük ideallara bəsləmişdir.

Bu ideallar nədən ibarətdir? İskəndərin simasında Nizami nəyi təcəssüm etdirmişdir? "İqbalnamə"nin ilk misraları insan zəkasının tərənnümilə başlayır. Müəllif öz qəhrəmanlarını elmin və fənnin qədrini bilən bir hökmdar kimi təsvir edir.

Alimdir gözümdə ən böyük olan,
Qüvvət elmdədir, başqa cür heç kəs
Heç kəsə üstünlük eyləyə bilməz,
Hər uca rütbədən, biliniz, fəqət,
Alimin rütbəsi ucadır əlbət!

Elmlə ucaldı dünyada yunan,
Onun tac-taxtı indi yoxsa da,
Elmlə məşhurdur bütün dünyada.

Nizami, İskəndərin vətənpərvərliyini xüsusilə bəyənir. Böyük şairin nəzərində yalnız öz xalqının səadətini düşünən, vətəninin şöhrətini və şöhrətindən uca tutan bir hökmdar tac-taxt sahibi olmağa haqlıdır.

"Yeddi gözəl" dastanındakı Bəhram Gurun məziyyəti isə xalqın səsini, xeyirxah və ağıllı məsləhətlərini dinləməsindədir.

Nizami burada xalq zəkasının qüdrətini özünə xas olan bir cəsarətlə ifadə etmişdir. Vətən xainlərinin hakim olduğu bir məmləkətdə yalnız fəlakət baş verə bilər. Qoca çoban bu həqiqəti padşaha öyrədərkən, biz şair Nizaminin zəhmətkeş xalqa nə qədər böyük bir məhəbbət bəslədiyini aydın dərk edə bilərik. Eyni fikrin "Fitnə" hekayəsində də həqiqi bir sənətkar məharətilə ifadə olunduğunu görürük.

Nizami, Şərq despotizminin ən amansız düşməni kimi qarşımızda canlanmaqdadır. Əlbəttə öz zamanının oğlu olan bir şairdən xalq haki-

miyyəti ideyalarının ifadəsini tələb etmək gülünc olardı. Dahi şair xalqın taleyini məhz adil hökmdara bağlayır. Onun qəhrəmanları adil hökmdarın sayəsində xoşbəxt ola biləcəklərinə inanırlar. Hətta bəziləri:

Müti bir quluyam şahənşahın mən...

deyə itaət də göstərirlər. Lakin məsələ burasındadır ki, Nizami adil hökmdarın sayəsində iş və əmək adamlarının xariqüladə bir qüdrət göstərəcəklərinə inanırdı. Bu nöqteyi-nəzərdən "Yeddi gözəl" dastanındakı məzlumların şikayətini diqqətlə oxumaq kifayətdir. Burada ən maraqlı hekayələrdən biri beşinci məzlumun şikayətidir:

Məşqələm verməkdir ölkəyə ziynət,
Qulağım halqalı, İşim itaət.
Şahın dövlətindən, yaradan Allah
Mənə dövlət vermiş, bir də cəlal, cah...
Məşriq şahı daim yaşasın deyə
Qərq etdim üfüqü tamam şənliyə...

Şəhər, kənd sayəmdə oldu təzə, şad,
Alimlər etdilər mənə etimad.
Əlimlə parladı bütün məmləkət,
Yetişdi sayəmdə hər kəsə nemət.
Yoxsulluq əlimlə qaçdı, yox oldu,
Səyimlə qulların qarnı tox oldu...

Əlbət ki, şairin bu qəhrəmanı ilə özü arasında böyük bir yaxınlıq vardır. Çünki, xain vəzirin cəzayə məhkum etdiyi bu adamı da ölkənin və xalqın taleyi düşündürür... Onun sadə və hikmətli sözlərində məmləkətə və zəhmətkeşlərə səadət gətirməyə çalışan bir insan surəti canlanmaqdadır.

Şübhə yoxdur ki, bütün bunları Nizami, dastanında təsadüfi olaraq göstərmir. Burada artıq son dərəcə həyati hadisələrin təsvir edildiyi aydındır. Romantik dastanlar müəllifi Nizami, məhəbbət romanının səhifələrində də öz böyük ideallarına sadiq qalır və həyatın aşağı mərtəbələrinə enib, özünün sehrkar çırağı ilə bu həyatın qaranlıq bucaqlarını işıqlandırıb bizə göstərir. Burada cinayət həddən aşmışdır. Xalq zülm və işgəncədən cana doymuşdur. Fikirlər və düşüncələr belə buxovlanmışdır. Nizaminin tarix adilə təsvir etdiyi lövhələrdə məhz yaşadığı cəmiyyətə və bu cəmiyyətdəki saysız-hesabsız ədalətsizliyə qarşı çıxdığı dərhal aydın olur. Bizim tanıdığımız Nizami müasirlərindən

Xaqaninin, Fələkinin və Beylaqaninin başına gələn fəlakətlərlə "Yeddi gözəl"dəki məzlumların taleyi bir-birinə nə qədər bənzəyir!..

Nizami, xalq səadətinin yollarını aradığı zaman xam xəyala qapılmayır. O, varlığın islahını zəruri saydığı zaman, əsərlərində bütün dəhşətilə təcəssüm etdirdiyi həyat şəraitinin dözülməz olduğunu da göstərməyi özünə borc bilir.

Buradan çıxarılan əsas nəticə belədir ki, dahi şair, arzuladığı səadəti yalnız adil hökmdardan gözləmir, xalqın özündən və onun intellektual qüvvələrindən gözləyir.

"Yeddi gözəl" dastanının qəhrəmanı Bəhram şah, Nizaminin nəzərində xalqa səadət gətirən bir hökmdardır. Böyük şair bu surəti yaradarkən, şübhəsiz ki, tarixi həqiqətdən artıq öz idealını ifadə etmişdir. Burada müdhiş maddi ehtiyaca məruz qalan xalqın vəziyyətini real boyalarla rəsm edərək, bu vəziyyəti aradan qaldırmağa qadir olan bir şah surəti yaratmışdır.

Bir il getdi bütün əməklər bada
Qəhətlik başladı geniş dünyada.
Qıtlıq yeyintinin yolunu kəsdi,
İnsan ot otladı, titrədi, əsdi.
Dünya bu qıtlıqdan bezikdi, gərçək,
Göhər qiymətinə satıldı çörək.
Bəhrama verdilər bu haldan xəbər
Ki, qıtlıq keçirir cahan sərasər.
Aclıqdan kəsilib vəhşi canavar,
Gah adam yeyirdi, gah leş insanlar.
Dənin qiymətindən olunca agah,
Ambarı açmağa fərman verdi şah,
Harda zəxirə var şah xəbər tutub.
Hakimlər adına göndərdi məktub.
– Yığılsın bir yerə əmin adamlar,
Açılsın anbarlar, dən dolu damlar.
Varlılarla həmən razılıq olsun
Yoxsulluğun torbası havayı dolsun.
Dəndən ödəyəndə o pay alanlar,
Tökülsün quşlara yerdə qalanlar.
Acından ölməsin dövrümdə bir fərd!

Şübhəsiz, Nizami, hökmdarların təsvirini verdiyi zaman xalqın və xüsusən onun yoxsul təbəqələrinin taleyini düşünür. Ağır həyat səhnələri

"Yeddi gözəl"də tez-tez təsvir olunur. Bu onu göstərir ki, şairin yüksək poeziyası təkcə maraqlı sərgüzəştlərin təsvirini deyil, eyni zamanda cəmiyyətin maddi və iqtisadi həyatının da canlı lövhələrini vermişdir. Maraqlı hekayə söyləmək şair üçün əsas məqsəd olmamışdır.

Bu isə Nizaminin dərin ictimai məzmunu şeir üçün əsas məsələ saydığını göstərir və xalq kütlələrinin taleyi ilə nə qədər yaxından maraqlandığını sübut edir.

III

Nizaminin məhəbbət fəlsəfəsi də, onun insan haqqındakı ümumi fəlsəfi görüşlərilə üzvi surətdə bağlıdır. Çox az sənətkar insan şəxsiyyətinin Nizami qədər yüksəldə bilmişdir. Ondakı humanizm qayələri şerinin əsl fikri-bədii qüvvətini təşkil edir. Buradakı romantika gözəl həyat haqqındakı böyük xəyalların ifadəsidir. Bu cür romantiklərə Karl Marksın nə qədər hüsn-rəğbət bəslədiyi bizə məlumdur. Bu məsələdən bəhs edərkən Lunaçarski göstərirdi ki, "Marksın Esxilə bəslədiyi böyük hüsn-rəğbət son dərəcə səciyyəvidir. Halbuki, Esxil (bütün əsərlərində olmasa da) haman belə bir romantik idi. Esxil "Prometey" əsərində göstərmək istəyirdi ki, aristokratiyanın, aristokrat moralının ən böyük düşmənləri, ən nəhayət onun qarşısında diz çökməlidirlər. Lakin o, aristokratiya düşmənlərinin ilk baxışda nəzərə çarpan aciz, zavallı bir düşmən deyil. Bəlkə yüksək mənəvi qüvvəyə malik, böyük bir düşmən olduğunu göstərmək istəyirdi. Hücuma keçən demokratiya ona təhlükəli görünürdü; o, həmin insanların psixologiyasına girmək istəyir; bütün varlığı ilə protest edən, yeni idrak, mərhəmət və hətta texnika anlayışlarını köhnə əsaslara qarşı qoyan Prometeyi bütün varlığı ilə yaratmağa çalışmışdı. Buna görə də Esxil tragediyanın birinci hissəsində Prometeyi çox gözəl əks etdirmişdir. Həyatda belə böyük texnik, atəş ixtiraçısı olan bir adam, öz sinfinə dərin sevgi bəsləyən və baş əyməyən üsyankar-fədakar bir qəhrəman yox idi, fəqət Esxil öz zamanının böyük adamlarında təsadüf edə bildiyi nişanələri toplamış, Prometey surətində, xəyali, mövcud olmayan bir fiqurda birləşdirmişdi".

Nizaminin romantikası heç bir zaman hakim aristokratiyanın əxlaq prinsiplərini demokratiyanın hücumuna qarşı qoymaq əsasında yüksəlməmişdir. Burada o, Esxildən də, qədim dünyanın başqa sənətkarlarından da tamam fərqlənir. Əksinə, Nizami yaradıcılığı, ən fədakar qəhrəmanı xalqdan, xalqın aşağı təbəqələrindən almaqla və bu

qəhrəmanları romantikləşdirməklə xarakterizə oluna bilər. Nizaminin Fərhadı buna ən parlaq bir misaldır. Ümumiyyətlə, o, insanın daxili saflığına. Sədaqətinə və mərdliyinə xüsusi diqqət yetirir.

Nizami əsl böyük məhəbbəti və əsl böyük sədaqəti kimdə tapır?

Bu nöqteyi-nəzərdən "Xosrov və Şirin" dastanı olduqca maraqlıdır.

Xosrov kimdir və o Nizaminin idealıdırmı?

Nizaminin "Leyli və Məcnun" əsəri müstəsna olmaq şərtilə, bütün poemalarında hökmdar surəti yaradılmışdır. Bunların bəzisi (Ənuşirəvan) ədalətsizlik simvolu kimi verildiyi halda, bəzisi nümunəvi padşah kimi təsvir olunmuşdur. İskəndəri və Bəhram Guru bu sonuncular sırasına daxil etmək mümkündür.

Xosrov bir sıra ciddi xüsusiyyətlərilə Nizaminin o biri hökmdar surətlərindən fərqlənir. İskəndərin bədii inkişafında müstəqimlik nəzərimizi cəlb edirsə, Xosrov inkişafında tamamilə onun əksinə olaraq mürəkkəblik vardır. Xosrov son dərəcə çətin bir psixoloji inkişaf yolu keçir. Bu inkişafın səbəbləri müəllif tərəfindən fövqəladə bir məharətlə əks edilmişdir. Burada Nizaminin böyük realizmi bütün əzəmətilə təzahür etmişdir.

Məhəbbət, Xosrovun fikri-psixoloji təkamülündə ən əsas amillərdən biridir.

O, Şirini sevir. Lakin Şirin onu daha odlu bir məhəbbətlə sevir. Romanın süjet xəttini istiqamətləndirən bu məhəbbət. Get-gedə böyük ictimai məsələlərlə bağlanır.

Şirin, Xosrovun yalvarışlarına verdiyin cavabda belə deyir:

" – Əvvəlcə işlərini düzəlt, sonra eşq həvəsinə düş. Hər bir xəzinəni ancaq səbrlə ələ gətirmək olar. Hər bir arzuya səbrlə çatmaq olar... Qızğın hərəkət etməklə ağıllı adamın işi yaxşılaşmaz. Bilirsən ki, keçi qaçmaqla kökəlməz. Sən indi öz taxtından uzaqsan, sözünə qulaq asıb sənə qoşulsam, sən bundan bir fayda görməzsən. Mən həmişəlik səninlə dost olmaq fikrindəyəmsə, çətin işlərdə sənin köməkçin olmalıyam. Sən öz padşahlığını ələ gətir. Tale sənə yardım etsə, mən də səninkiyəm. Başın mənlə keyf çəkməyə qızışsa, qorxuram padşahlıq əlindən çıxa...".

Göründüyü kimi, taxt-tacdan məhrum olmuş Xosrova Şirin çox ağıllı məsləhətlər verir. Bu zəkalı qız, özünün və gələcək ərinin şöhrəti üçün deyil, hökmdarlıq tacını oğurlamış Bəhram Çubindən zərər görmüş ölkənin səadəti üçün çalışır. Onun şəxsi ehtirası və məhəbbəti nə qədər qüvvətlidirsə də, ictimai şüuru da bir o qədər dərindir. Onun məhəbbət

hisslərini cilovlayan bu şüur, Xosrovun doğru yola qayıtmasına çox kömək edir. O, Şirinin iradəsi qarşısında baş əyməyə məcbur olur:

"Mən artın getməliyəm. Qabağımı nə dəniz saxlaya bilər, nə od. Allah bilir ki, nə odda yanmaqdan qorxuram, nə də dənizdə islanmaqdan. Heç bir şey mənim yolumu kəsə bilməz. Yerin böyük dağlarını yerindən qoparacağam...".

Lakin Xosrov bu sözləri deyib Ruma yola düşdükdən sonra eşqinə xəyanət edir. O, Rum hökmdarının qızı Məryəmi alır.

Bu xəyanət, Xosrovun pozğun təbiətinə tamamilə uyğundur. Onun məhəbbət haqqındakı anlayışı da yanlış və zərərlidir. Şirinin nəzərincə, böyük məhəbbət saf, ülvi və ali bir hissdir. Ona ləkə vurmaqla və ona xəyanət qarışdırmaqla Xosrov Şirinin daha amansız hücumlarına məruz qalır. Şirin Xosrovun elçisi Şapura belə deyir:

– O qaniçən, yolkəsən gör mənim başıma nə oyun açdı? Odu alışdırıb canıma çaldı. Mən burada qalmışam, o isə başqa bir yar ilə kef çəkir. Yeni bir məhəbbət bazarı açmışdır. Mənim üzüm daşdan da qayrılmış olsa, onun hərəkətlərini görərkən utandığından dağılıb-tökülər. Tutaq ki. mənə it kimi vəfalı olmağı öyrətmişlər, ancaq məni it südü ilə bəsləmişlər! Bacardığım qədər onun hiylələrini bir iti qovan kimi qapıdan qovacağam. Qovmasam, mən özüm itdən də əskiyəm..."

Böyük məhəbbət qəhrəmanlın tələb edir. Xosrov isə bu xüsusiyyətdən məhrumdur. Lakin Şirin, əksinə, böyük eşqin fədakar bir qəhrəmanıdır. Nizaminin ecazkar qüdrəti və əsrarəngiz sənəti, Şirin simasında, dünya ədəbiyyatından tanıdığımız məşhur qadın surətlərini kölgədə buraxan bir surət yaratmışdır. Şirinin zəngin hissiyyatı və kamalı doğrudan da hüdudsuzdur.

Şirin nəyin məhsuludur? Romantik şair xəyalınınmı, yoxsa qadın ürəyini asanlıqla oxumağı bacaran zəngin müşahidəli bir ruhiyyatçınınmı?

Nizamidə bu iki cəhət üzvi bir vəhdət təşkil edir. Şairin bütün ömrü boyu ürək ağrısı ilə xatırladığı Afaq, şübhəsiz ki, Şirin surətinin belə xariqüladə bir vüsətlə yaranmasına az kömək etməmişdir və ehtimal ki, Nizaminin öz məhəbbəti Şirin surətinə az şey artırmamışdır.

Şairin dastanında Afaqa dair yazdığı misralar da bunu iddia etməyimizə haqq verir:

Bu dastanı oxu, qəlbində kədər,
O gözəl Şirinçin ağla bir qədər.
Çünki tez tərk etdi o bu aləmi,
Soldu cavanlıqda qızıl gül kimi.

Qıpçaq gözəli tək elin gözüydü.
Afaq sevgilimin sanki özüydü.
O, Dərbənd şahının bir töhfəsiydi,
Ağıllı, saf, gözəl kül qönçəsiydi.
Dəmir bir zirehdi əynində paltar,
Bir paltarı vardı, köynəkdən də dar.
Əğyara düşməndi, mənə mehriban,
Könül bağçamdaydı o nazlı tərlan.
Türklər kimi köçə olmuşdu möhtac,
Türklər tək eylədi yurdumu tarac.
O türküm getdisə bir gün çadırdan,
Türkzadəmi saxla, sən, ey yaradan!

Ümumən Şirin surətinin təsvirində Nizaminin subyektiv hallara tez-tez yol verdiyini də görməmək olmaz. Bu, əsərin bədii dəyərini azaltmamış, bundan bütün dastan xüsusi bir şiranəlik və poeziya kəsb etmişdir.

Şirin, böyük məhəbbətin bədii mücəssəməsidir. Onun gücü sonsuz məhəbbətində olduğu kimi, həm də dərin zəkasındadır. Əgər belə olmasaydı, Şirin heç bir zaman Xosrovu öz mənəvi üstünlüyü ilə yanlış yoldan qaytara bilməzdi.

Dastanın birinci yarısında Şirin həyatda öz sevgi idealını tapa bilmir. Xosrov nə onun idealıdır, nə də Nizaminin. Onların hər ikisinin məhəbbət idealı Fərhaddır. Xosrov gözəl Şirinə layiq bir sevgili olmaq istəyirsə, mütləq Fərhad yolu ilə getməyə məcburdur. Bəs Fərhad kimdir?

"O, ağıllı, cavan bir mühəndisdir. Həndəsəni bilməkdə başqalarına örnək ola bilər...

Sənətdəki məharətini göstərmək istəsə, yeri bir quş kimi balığın üstünə qoyar. Öz sənəti ilə qırmızı gülə rəng verir, dəmir tişəsilə daşda çin nəqşi qazır. Bütün Rum əhli sənətkarlığına görə onun əlini öpür. O, öz tişəsilə mərməri muma döndərir. Dünyada belə usta tapılmaz. Onun kimi adama çox rast gəlmək olar. Onun əlində mumla dəmirin heç bir fərqi yoxdur".

Müəllif Fərhadı ilk dəfə bizə belə tanıdır. Aydındır ki, o, qeyri-adi, romantikləşdirilmiş bir insan surətidir. Lakin Nizami heç bir zaman qəhrəmanın ayaqlarını torpaqdan üzmür. Fərhad, eyni zamanda canlı həyat nişanələrinə malik olan real bir insandır.

Böyük dağı gövdəli o dağlar yaran,
Gələndə camaat qalmışdı heyran.
Kürəyi enliydi, boyu çox yüksək,
Qolunun qüvvəti bir qoşa fil tək.

Fərhad yalnız fiziki cəhətdən qüvvətli deyildir. O, həm də mənəviyyatca Şirinin məhəbbət idealına müvafiq gələn bir gəncdir. Bəs nə üçün Şirin onu sevmir? Çünki o, Fərhaddan əvvəl Xosrovun da Fərhad kimi saf və təmiz ürəkli bir insan olduğunu güman edib ona vurulmuşdu. İlk sevgini unutmaq və ondan üz döndərmən üçün heç bir qəhrəmanlıq lazım deyildir. Şirin isə məhz qəhrəman bir məhəbbətin timsalıdır. O, Xosrovu sevdiyi üçün də, onun vəfasızlığını görüb dərin ruhi sarsıntılara məruz qalır, əziyyətlərə qatlaşır, amma Xosrov kimi vəfasız olmaq istəmir. Fərhad meydana çıxdıqda isə onu Xosrova nümunə göstərir:

Bir quru səsimi eşitdi Fərhad,
Əyri baxmamışdı mənə bir saat.
Onu hər bir dərdə qatlaşan gördüm,
Səndə nə bir əsər, nə nişan gördüm.

Doğrudan da, Fərhadın qəlbindəki məhəbbət duyğuları, onun nəhəng gövdəsinə büsbütün uyğundur. Bu duyğulardakı qüvvət və genişlik Fərhadı yalnız Şirinin nəzərində deyil, bu gün bizim də nəzərimizdə yüksəldir:

Eşitdikcə Fərhad onun səsini,
Duydu ki, itirir öz qüvvəsini.
Dərindən ah çəkdi haman bir kərə,
Xəstə adam kimi yıxıldı yerə...
Torpaq üzərində çox yuvarlandı,
İlan tək qıvrıldı, alışdı, yandı.

Nizami də Fərhadın bu xüsusiyyətlərini Xosrova qarşı qoyduğunu oxucudan gizlətmək fikrində deyildir. Şirin Xosrova üz tutaraq:

Bir ürəkdə olmaz iki sevgili,
İki ürəklinin düz olmaz dili.

deyərkən, biz istər-istəməz Fərhadı xatırlayırıq. “Bax, Fərhadın ürəyi bir, sevgisi birdir!” deyirik. Bunu Xosrov da etiraf etməyə məcburdur. Halbuki, o Fərhadın qüvvətli bir rəqib olduğunu bilir. Fərhad:

Xosrovu saymayıb o təmtəraqda,
Şir tək pəncə vurub durdu qabaqda.
Öylə məst olmuşdu Şirin qəmindən,
Əsla xof etmirdi şah görkəmindən,
Şah əmr etdi onu əzizləsinlər.
Səpsinlər başına mirvari, göhər.
O fil gövdəliyə, əyləş deyərək,
Şabaş tulladılar hey ətək-ətək...

Nizami, qəhrəmanının təsvirini həqiqi romantik bir pafosla verir. Mirvarilər də, göhərlər də Fərhad məhəbbətinə xələl gətirə bilməz:

Fərhadın könlündə bir göhər vardı,
Onunçün qızılla daş barabardı!

Onun məhəbbəti yüksək fəlsəfi bir məna daşıyır. Bu məhəbbətin ən dahiyanə himnini yaratmış Nizamini bu nöqtədə heç bir şairlə müqayisə etmək olmaz.

Djiveleqov yazır ki: "Françesko ilə Paolonun epizodu ("Cəhənnəm" V) az qala bütün dünya ədəbiyyatında məhəbbətin ən ehtiraslı himnidir".

Məncə Nizaminin qarşısında "İlahi komediya" müəllifi ehtiramla baş əyməlidir. Çünki Fərhadla Xosrov epizodunun bədii qüvvəti hər cəhətdən dahi italyan şairinin məhəbbət himnindən üstündür:

Xosrov sordu: hardan gəlirsən cavan?
Fərhad cavab verdi: dost diyarından.
Dedi: o diyarda hansı sənət var?
Dedi: qəmi alıb canı satırlar.
Dedi: qəlbdəndirmi çəkdiyin bu qəm?
Dedi: ürək nədir, candan aşiqəm.
Dedi: əzizdirmi eşqi Şirinin?
Dedi: onu candan bilirəm şirin.
Dedi: ay tək onu necə görürsən?
Dedi: yuxum gəlsə, yatarammı mən?!
Dedi: qəlbin onu unudur haçan?
Dedi: torpaqlarda yatdığım zaman.

Ən yüksək dram əsərlərinin mükaliməsini xatırladan bu parçadan aydın görünür ki, Nizami Fərhadın sevgisini adi məişət planından qoparıb ideal səviyyəsinə qaldırmışdır. Bu məhəbbətin gücü ilə Fərhad əmək qəhrəmanlığı göstərir, "ölçüyə gəlməz iri qayaları yerindən qoparırdı. Qranit daşlara külüng vurduqca, dağdan böyük bir burc qoparıb atırdı. Hər vuruşda bir dağı vurub yerə yıxırdı. Camaat onun şücaətinə heyran qalmışdı. Kipriyindən axan almas yaşlarla almas kimi möhkəm dağı deşir və öz halından dağa şikayətlər edirdi:

– Ey dağ, sən nə üçün bu qədər bərksən! Gəl bir kişilik göstər, parçalan! Mənim halıma acı. Bir az üzünü parçala. Ağır zərbələrim qarşısında möhkəmlik göstərmə! Yoxsa sevgilimin canına and içirəm ki, canım bədənimdən çıxana qədər səni incitməkdən əl çəkməyəcəyəm. Özüm incisəm də bütün varlığımla vuruşacağam..."

Budur, Nizaminin qəhrəmanı həm adi bir insan, həm də qeyri-adi bir bahadırdır. O həm dağlar yıxan bir mühəndis, həm də saf qəlblə sevən bir aşiqdir. Adətən Nizamini məhəbbət eposunun böyük yaradıcısı adlandırırlar. Əlbəttə, "Xosrov və Şirin" dastanı təkcə məhəbbətdən bəhs edən bir əsər deyildir. Burada insan əməyinin heç bir zaman köhnəlməyən eposu yaranmışdır.

Əgər məqaləmizin başlanğıcında verdiyimiz suala cavab axtarırıqsa, cəsarətlə deyə bilərik ki, Nizami bu gün belə həqiqi əmək poeziyasının böyük yaradıcısı kimi bizə nümunədir. O, Fərhadı öz şair xəyalında bu qədər yüksəltmişdirsə, müasir şairin buna ehtiyacı yoxdur; çünki indi fərhadların göstərdiyi əmək qəhrəmanlığı bütün dünyanın heyrətinə səbəb olmuşdur. Əsl vəzifə onları epik şerin gücü ili ümumiləşdirmək və tərənnüm etməkdən ibarətdir. Müasir fərhadların məhəbbəti də, əmək qəhrəmanlığı da ədəbiyyatımızdan Nizami dühası tələb edir!

Bəs Nizaminin Fərhadına fiziki və mənəvi qüvvəti verən nədir? Böyük şair bunu izah etməyi lüzumsuz görsə də, biz açıq-aydın duyuruq ki, bu qüvvət xalqdan və torpaqdan gəlir. Nizaminin idealı əlbəttə Xosrov deyildir. Nizami bir tərəfdən öz qürurunu, mərdliyini və ismətini mühafizə etməyi bacaran, dərin daxili mübarizələrə məruz qaldıqdan sonra yenə də eyni qüvvətlə sevən və hətta bu yola özünü qəhrəmanlıqla öldürən Şirini ideal bir qadın surəti kimi yüksəldirsə, digər tərəfin sədaqət, mərdlik və məhəbbət timsalı olan Fərhadı romantikləşdirir, ən gözəl boyalarını, ən kəskin sözlərini onun aydın və parlaq təsvirinə həsr edir. Xalqın aşağı təbəqələrindən çıxmış Fərhad, böyük şairin əsas idealına çevrilir.

Buradan çıxardığımız nəticə budur ki, Nizami ideal sevginin əsl mənbəyini xalqda tapır, xalqın saf ürəyində, qüvvətli qollarında, dağları belə çapmağa qadir olan sonsuz gücündə tapır.

Bu nöqtədə Nizami Gəncəvi bizim müasirimizdir. Ondan bizi ayıran səkkiz əsrlik məsafə "Xəmsə" müəllifini zərrə qədər köhnəltməmişdir"

IV

Əsl yüksək məhəbbətin insan həyatındakı rolunu özünə məxsus bir qüvvətlə göstərən Nizami, "Xosrov və Şirin" dastanında məhəbbəti insan layaqətini artıran bir vasitə sayır. Şirin məğrurdur, o öz ləyaqətini hər şeydən uca tutur, Xosrovu nəhayətsiz bir eşqlə sevsə də, o, məhəbbətinə hiylə qarışdırmaq istəyən Xosrovu məzəmmət etməkdən çəkinməyir:

Sən, bu iş, hiyləylə düzələr, dedin,
Məni məzə kimi yemək istədin.
İstədin sərxoş tək salasan tora,
Gül kimi iyləyib atasan sonra.

deməklə kifayətlənməyərək, onun Məryəmi almasına işarə edir və məhəbbətinin saf olmasında onu taqsırlandırır:

Məndən və eşqimdən sən biniyazsan,
Mənimlə oynayan bir eşqibazsan...

deyir və bu zaman şirinin qəlbində məhəbbətlə ismət vuruşur. O yenə öz ləyaqətini uca tutaraq:

Öz qəmli evimə dönərəm həmən,
Göhər ismətimi qoruyaram mən...

sözlərilə Xosrovun məhəbbətini daha da alovlandırır.

Xosrovla Şirin arasındakı uzun deyişmələr böyük ehtiraslar mübarizəsinə çevrilir. Nizami, Şirinin saflığını və qürurunu tərənnüm etməklə kifayətlənməyərək, sonralar "İskəndərnamə"də özünə xas olan nəhəng bir qüdrətlə göstərdiyi Nüşabə surətində olduğu kimi, Şirini də mənəvi cəhətdən kişilərdən qətiyyən geri qalmayan, bəzən onlardan yüksəkdə duran bir insan kimi əks edir. Şirin böyük fikirlər yürütməyi bacaran, həssas və hazırcavab bir qadın kimi canlanır. O, yalnız məhəbbətdən deyil, hakimiyyət məsələlərindən də Xosrova dərs deməyi bacarır:

Yenə dəm vurursan şahlığından sən,
Zalimlik yolundan əl çəkməmisən!

deyir. Şirinin bunu deməyə haqqı vardır. Çünki o özü padşahlın edərkən məhz doğru yolla xalqı idarə etməyi bacarır:

"Padşahlıq Şirinə çatdıqdan sonra onun dövlətinin işığı yerdən göyə qədər hər yeri bürüdü. Onun ədalətli olması rəiyyəti sevindirdi. Şirin bütün zindandakı dustaqları azad etdi. Bütün məzlumları zülmdən qurtardı. Dünyada zülm əsasında qurulmuş qayda-qanunları aradan qaldırdı. Şəhər darvazalarında camaatdan alınan torpaqbasdı vergisini qadağan etdi. Əkinçiləri tövcidən azad etdi. Şəhərləri, kəndləri abadlaşdırdı".

Lakin Xosrov belə deyildir. Şirin onu hakimiyyət başında da yarımçıq adam olduğunu görüb, hiss edir və bunu açıq surətdə Xosrova deməyi özünə borc bilir. O, sevdiyi adamı da özü kimi adil, xalqı sevən və bacarıqlı bir hökmdar görmək istəyir. Şirin Xosrovun səhvlərini

ona başa salır, mütərəddid, əyyaş və pozğun Xosrov, nəhayət Şirinin təsirilə yenidən tərbiyə olunub dövlət işlərində bir sıra gözəl tədbirlər görməyə başlayır.

Burada Nizami poeziyası daha əlçatmaz bir yüksəkliyə qalxır və oxucuya elə gəlir ki, indiyə qədər onun insan haqqındakı təsəvvürü çox səthi və dayazmış, insanın təfəkkür istedadı haqqındakı anlayışı da çox məhdudmuş...

Beləliklə, Nizaminin dastanı zahiri cəhətdən maraqlı bir sərgüzəştin təsvirindən ibarət olaraq qalmır, uzun əsrlər boyu bəşəriyyətə öz fikirlərini və duyğularını tərbiyələndirməkdə kömək edən qüvvətli, poetik bir silaha çevrilir. Nizami sübut edir ki, böyük məhəbbət, heç bir vaxt şəxsi səadət çərçivəsində qalmır, xalq və ölkə məhəbbətinə çevrilir. Şirin, məhz belə bir məhəbbətin timsalıdır.

Lakin bu məhəbbət, eyni zamanda faciəlidir. "Xosrov və Şirin" dastanında yalnız Xosrov deyil, Şirin də məhv olur, özü də necə məhv olur! O, Şiruyənin qətlə yetirdiyi "Xosrovun döşünü açdı. Ciyərinin arasını öpdü və sonra öz sinəsinə də haman yerdən bir yara vurdu. Xosrovun bədənindəki yaranın yerini nəzərdə tutub xəncəri öz bədəninin haman yerinə sancdı. İsti qan ilə yatağı doldu. Şahın bədənindəki yaranı təzələdi. Sonra şahı qucağına alıb dodağını dodağına və sinəsini sinəsinə qoydu, uca səslə qışqırdı. Camaat onun səsinə gəlincə artıq can-cana, bədən-bədənə qovuşmuşdu. Bədən ayrılıqdan və can zülmdən qurtarmışdı".

Belə ölümdə də bir əzəmət vardır. Dahi rus tənqidçisi Belinski Romeo və Cülyettanın məhəbbətindən bəhs edərkən haqlı olaraq yazır ki:

"Şairanə, ehtiraslı məhəbbət – bizim həyatımızın və gəncliyimizin çiçəyidir; bu məhəbbət az-az adamlarda olur və özü də həyatlarında yalnız bir dəfə olur. Doğrudur, bəziləri sonra da bir neçə dəfə sevirlər, lakin bu cür yox, çünki alman şairinin dediyi kimi, həyatın mayı yalnız bir dəfə çiçək açır. Şekspir, tragediyasının sonunda nahaq yerə Romeo və Yuliyanı ölməyə məcbur etmir: bunun nəticəsində onlar oxucuların xatirində məhəbbət qəhrəmanları kimi qalırlar; məhəbbət apafeozu olaraq qalırlar; əgər Şekspir onları diri saxlasaydı, onlar xoşbəxt ər-arvad olar, bir yerdə oturub əsnəyər və bəzən dalaşardılar, bunda isə heç bir şeriyyət yoxdur".

Belinskinin bu fikri Nizaminin də məhəbbət dastanlarına asanlıqla tətbiq oluna bilər. Lakin Nizami əsərlərində istər Şirinin, istərsə də Məcnunun faciəli ölümü, yalnız əsərlərin bədii gözəlliyini hifz etmək üçün verilməmişdir. Nizami, bu dastanları ilə göstərmək istəmişdir ki,

haqsızlıq və zülm əsasları üzərində qurulmuş bir cəmiyyət, böyük məhəbbəti yaşatmağa qadir deyildir. Çünki bu cəmiyyətdə insanlar "qəm alıb, canı satırlar". Onlar hər addımda yalnız maddi sıxıntıya deyil. mənəvi əsarətə də məhkumdurlar.

Nizaminin qəhrəmanları ərəb və fars adlarını daşısalar da, ruh etibarilə Azərbaycan mühitinin adamlarıdır. Qeys də, Leyli də, Şirin də, Fərhad da intibah dövrünün başlandığı bir zamanda meydana çıxa bilərdilər. Buna görə də biz deyirik ki. onlar məhv olsalar da, böyük məhəbbətin qəhrəmanları kimi, gələcək nəsillərin oyanışına və intibahına az kömək etməmişlər və Nizaminin dövründəki qabaqcıl əhval-ruhiyyəni ifadə etməklə. Gəncliyin həyatında daima müsbət bir rol oynamışlar, onlarda mərdlik, sədaqət və qəhrəmanlıq duyğularının qüvvətlənməsinə səbəb olmuşlar. Onlar həqiqi gəncliyin yüksək timsalı kimi hər zaman oxucuların qəlbində yaşayacaqlar.

## V

Nizami məhəbbət problemini "Leyli və Məcnun" əsərində daha yüksək və romantik bir səviyyəyə qaldırır. Bu dastanın yürütdüyü əsas ideyalardan biri azad sevgi ideyasıdır.

Məlum olduğu üzrə islam dini hər məsələdə olduğu kimi qadın məsələsində də köləlik prinsiplərini irəli sürdü. Nizami bəşəriyyəti despotizm zəncirlərilə bağlayan bu dinin amansızlığını görməyə bilməzdi. Böyük azadlıq xəyallarilə yaşayan bir sənətkar, islam dininin gətirdiyi rəzalətləri hamıdan çox hiss etməli, ona özünün açıq münasibətini bildirməli idi, Nizami, öz humanistik fəlsəfəsinin tələbi üzrə, yalnız insanın xoşbəxtliyinə səbəb olan, onun azadlığını təmin edən bir dinə tərəfdar ola bilərdi. Onun əsərlərindən aldığımız ümumi təəssürat belədir ki, hər yerdə ideal kimi yüksəltdiyi qəhrəmanlar çox hallarda islam dininin tələblərinə müğayir hərəkət edir.

Məcnun da belədir. O, despotik – feodal mühitin islam dininə əsaslanan adətlərini pozur və bir nəfərin qəbilə başçısına dediyi sözlərdən aydın olur ki, Məcnun:

Yaxşı şeir deyir, şeri gözəldir.
Dəqiqə başına qəzəl düzəldir.
Bizi də, səni də rüsvay edirlər.
Onun qəzəlləri oxunan yerdə
Yırtılıb açılır yüzlərcə pərdə.

O, atası tərəfindən Kəbəyə aparıldığı zamanda da bu cür hərəkət edir. Məlum olduğu üzrə Məcnunun atası oğlunu Kəbəyə aparırkən, onun Allaha yalvarmasını, qəmdən, qüssədən xilas olmaq üçün Allaha dua etməsini tapşırır. Məcnun isə atasından "eşq" sözünü eşidər-eşitməz, yalnız öz könlünün səsini dinləyir, yalnız öz qəlbinin hökmünə əməl edir:

İlan tək qıvrılıb sıçradı yerdən,
Kəbə halqasına əl atdı birdən.
Halqanı tutaraq dedi: ey Allah!
Mən də bir qapının halqasıyam, ah...
Eşqin halqasında inildəyir can,
Bir gün də düşməsin o qulağımdan!
Mənə deyirlər ki: "gəl eşqi burax".
Bud ost məsləhəti deyildir ancaq.
Eşq ilə yaşayır aləmdə səsim,
Eşqsiz aləmdə batar nəfəsim.
Eşq ilə yoğrulmuş mənim xəmirəm,
Eşqdən başqa heç şey istəmirəm.
Eşqsiz bir ürək heçliyə varsın,
Onu qəm selləri yuyub aparsın.

"Leyli və Məcnun" yazılışından təxminən dörd yüz il sonra ölməz Şekspirin "Romeo və Cülyetta"sı yaranacaq və burada böyük məhəbbətin mücəssəməsi olan Romeo öz sevgilisinin "sən buraya nə üçün və necə gəldin?" sualına eşqin qüvvətini göstərən bu sözlərlə cavab verəcəkdir: "Məhəbbətim məni öz qanadları üzərində gətirdi". Dünya ədəbiyyatının bu əbədi motivi, Nizamidə özünün dərin fəlsəfi ifadəsini tapmışdır. Hər cür ənənə və adət çərçivələrini dağıdan böyük insan sevgisini, Məcnunun həyatına hərəkət verən yeganə bir qüvvə kimi göstərən Nizami, istəsə də, istəməsə də, xalqa maddi və mənəvi əsarət gətirən islam dininə qarşı çıxır. Romeo iki nəsli bir-birindən ayıran qalın və hündür divarı eşqinin qanadları üzərində adlayırsa, Məcnun özünün ahı ilə torpağı, daşı dindirir, sinədən dediyi sözlərlə daş ürəkləri belə sızladır. O, Leylinin üstündə baş verən qəbilə vuruşmalarından belə ənənələri ayaqlayır, yenə böyük məhəbbətinin gücüylə iki düşmən ordunun arasında "barışıq deyə dua edir".

Bir nəfər soruşdu: niyə ey cavan,
Çarx kimi döyüşdən kənara qaçırsan?
Biz sənin uğrunda can qoyuruq, bil,
Düşmənlə dostluğun heç insaf deyil!

Doğrudan da Məcnun, onun uğrunda vuruşub qan tökən cəngavərlərə kömək etmək əvəzinə, nə üçün onlara mane olur və Nizami burada nə demək istəyir?

Məhəbbət – Nizaminin fikrincə – insanlar arasındakı ədavətin yox olmasına kömək edən təmiz və saf bir hissdir. Daha doğrusu, bu ədavət böyük məhəbbətin önündə silahını yerə qoymalıdır! Məcnun qüdrətli şair və mütəfəkkir olmaqla bərabər, böyük də humanistdir. O, qan tökməyi rəva görməyir, qəbilələr arasındakı bu qanlı vuruşmaların mənasızlığını gözəlcə dərk edir. Bunu Məcnuna dərk etdirən yenə qeyri-adi, yeni çirkin məişət bataqlığından qoparılıb romantikləşdirilmiş yüksək məhəbbətdir. Məcnun da o biri adamlar kimi sadəcə evlənmək istəsəydi, qəzəl yazıb öz ülvi məhəbbətini tərənnüm etməsəydi və beləliklə Leyligilin qəbiləsini "rüsvay" etməsəydi, o, bu faciəli sərgüzəştə düçar olmazdı. Böyük şəxsiyyət, tragik insan, yalnız müəyyən bir ictimai sistemlə, illər və əsrlər boyu möhkəmlənmiş yaramaz adət və ənənələrlə barışmayan və bu dərin konfliktdə qəhrəmanlıqla məhv olan insandır. Məcnunu əhatə edən mühit, onu "dəli" adlandırır. Lakin o, dəlidirmi? Əlbəttə yox! Məcnun, mühitindəki adamların hamısından dərin düşünən, hamısından saf bir məhəbbətlə sevə bilən "ağlından başına bəla gələn" bir insandır.

Məcnun, hamıdan əvvəl Nizaminin dühasilə yaradılmış yüksək məhəbbət simvoludur. Müasir ədəbi dilə çevirsək belə, onun qəbilələr arasındakı sülhpərvərliyi pasifizm adlana bilməz. Çünki o:

Düşməni qanına qərq etmək olar

deyir.

Məcnun son dərəcə mürəkkəb, ümumiləşmiş fəlsəfi surətdir. O, sevgidə zorakiliyin düşmənidir. Leylinin özünə bəslədiyi məhəbbətdən ilham aldığı üçün o:

Sülhə çağırdın müharibələri,
O utanmasaydı qalxıb durardı,
Bulut tək özünə qılınc vurardı.
El qınamasaydı bu dəmdə onu
Qırıb qurtarardı öz qoşununu.

Budur, Məcnunun "dəliliyi" də bundan ibarətdir. O, azadəlik sevən və bəzən bu xüsusda ifrata varan bir insandır. O hətta ceyranları və maralları tora salmış ovçuları taqsırlandırıb zalim adlandıran bir insandır.

Qoy bu tora düşmüş zavallı əsir,
Bari bir-iki gün şad yaşasın bir!
Gəl onu sən salma tor havasına,
Getsin öz tayilə öz yuvasına.
Onu sevgilisi tapmasa əgər.
Bu gecə arxanca nə sözlər deyər?
Deyər: "Səni məndən alan ovçular,
Ayrılıq dərdinə olsunlar düçar".

Məcnunun sərgüzəşti nə qədər zəngindirsə, onun şahidi olduğu bütün hadisələrdə biz eyni böyük qəlbin çırpıntılarını eşidirik, eyni könül iniltilərinə qulaq asırıq. Hər yerdə, hər zaman o eyni Məcnundur. Hətta maralın gözünü sevgilisinin gözünə bənzədən, əsən küləklərdən də Leylinin qoxusunu duymaq istəyən, maralın əsirliyində də Leylinin əsarətini görən Məcnundur. Bu, böyük sevginin Nizami dühasılə ən son mərhələyə qaldırılmış bir ifadəsidir. Bundan sonra sevgini bir az da yuxarı mərhələyə qaldırmaq istəyən yazıçı əlbəttə müvəffəq ola bilməyəcəkdir. Məcnun, zamanın əsarətilə barışmayan, onun rəzalətlərinə köks gərən, özünün məhəbbət idealı uğrunda hər növ əziyyətə qatlaşan və həmişə üzünü gələcəyə tutmuş bir insandır. O, öz məğlubiyyətilə də zəmanəsinə qalib gələn, zəmanəsinin adət və ənənələrini pozan bir insandır. Onun sevgisi hər şeydən əvvəl yüksək bir idealdır. Məcnun, əsir kimi dörd divar arasında iztirab çəkən Leylinin azad olunması üçün mütəmadiyən çırpınan bir ürəyin sahibidir – özünə qəm zənciri vurmuş, ciyərini ələmlər yeyən Məcnun, dahi Nizaminin bütün dünya ədəbiyyatına verdiyi ölməz hədiyyələrdən biridir. Sonra yaranan Məcnun surətləri ya həqiqi cəngavər kimi və yaxud keçmiş üçün bu günlə vuruşan, canlı varlığı

duymaq istedadından məhrum olan, idealları qeyri-müəyyən donkixotlar kimi meydana çıxacaqdır. Nə olur-olsun onun azad məhəbbət idealı heç bir zaman ölməyəcəkdir. Bu ideal, bir çox böyük əsərlərin əsasını təşkil edəcəkdir. Gələcəkdə meydana çıxan məcnunlar:

İlahi, ömrümdən kəs indən belə,
Leylinin ömrünə cala əlinlə!

deyəcəkdir. Bu eşq, böyük Füzulinin də qəlbini çırpındıracaq və ona:

Yarəb, bəlayi-eşqilə qıl aşina məni!
Bir dəm bəlayi-eşqidən etmə cida məni!
Ay eylə inayətini əhli-dərdidən,
Yəni ki, çox bəlalərə qıl mübtəla məni!

dedirdəcəkdir və azad məhəbbət haqqındakı bu gözəl mahnılar dillərdən-dillərə keçərək xalqın gözəl xəyallarına qanad verəcəkdir.

Buradan çıxan nəticə: Nizaminin azad məhəbbət haqqındakı fikirləri böyük ədəbiyyatın ən mühüm motivlərindən biri olaraq bizim əsrimizə qədər yaşamış və bundan sonra, əsl azadlıq əldə edilmiş bir ölkədə daha da qüvvətlə səslənəcəkdir.

Lakin, sovet dövründə, azad məhəbbət ideallarından ilham alan şair, dövrümüzün qəhrəmanlarını ictimai ziddiyyətlər içərisində məhv olan faciəvi şəxsiyyətlər kimi tərənnüm etməyə ehtiyac duymayacaqdır. Çünki, böyük şəxsiyyətlərlə cəmiyyət arasındakı o qorxunc ziddiyyətləri sovet quruluşu çoxdan məhv etmişdir.

## VI

Nizami, böyük romantik dastanlarında məhəbbətin mənasını və mənbəyini göstərməklə kifayətlənməyərək, bu məhəbbəti odlu bir ehtiramla təbliğ etmişdir. Nizami bu sevginin ən ölməz müğənnisi olmuşdur. O, hər yerdə, hər zaman eşq aramış və bu eşqin barəsində yüzlərlə hikmətli söz yaratmışdır. Nizami poemalarını cəsarətlə "məhəbbət ensiklopediyası" adlandırmaq mümkündür. O, "Xosrov və Şirin"də demədiklərini "Leyli və Məcnun"da demiş və bu dastanlarda sevgi mövzunun çərçivəsini genişləndirərək, böyük ictimai ideallar səviyyəsinə yüksəlmişdir. Bunu sübut etmək üçün "Xosrov və Şirin"dəki "Eşq barəsində bir neçə söz" fəslini təkrar və diqqətlə oxumaq kifayət edər:

Eşqdən başqa söz könlümə yaddır.
Ömrümün quşuna o bir qanaddır.
Mehrabı eşqdir uca göylərin,
Eşqsiz ey dünya, nədir dəyərin!
Eşqin qulu ol ki, doğru yol budur,
Ariflər yanında, bil, eşq uludur.
Saf dünya eşqdir, qalan fırıldaq,
Eşqdən başqa şey bütün oyuncaq.
Eşqsiz olsaydı xilqətin canı,
Dirilik sarmazdı bütün cahanı.
Eşqsiz bir adam bir neydir qırıq,
Yüz canı olsa da, ölüdür artıq.

Nizami heç bir zaman bu böyük məhəbbəti xalq, vətən məhəbbətindən ayrı təsəvvür etməmişdir. Onu yaşadan, onun bütün yaradıcılığına təkan verən də məhz insanla həqiqi səadət arzulamaq meyli olmuşdur.

Yaransaydı, göylər eşqdən azad,
Düşün, olardımı yer üzü abad?

Buna görə də hamıdan çox Nizami, özü haqqında mübaliğəsiz bu sözləri deməyə haqlıdır:

Eşq ilə düzəltdim mən bu dastanı,
Doldurdum səsilə eşqin, dünyanı!

* * *

Zəmanəsinin bütün acılıqlarını dadmış, ədalətsizliklərini görmüş və hakimlərin rəzalətlərinə şahid olmuş Nizami, "İskəndərnamə"nin sonunda dünyanın vəfasızlığından şikayət edir və Allaha üz tutaraq belə deyir:

Xudaya, sən özün bu saf göhəri,
Hünər bağçasında etmiş səməri, –
Dünyada bikəsdir, – qoru hər zaman,
Gecəli-gündüzlü dərddən, bəladan...

Biz, xəyalən Nizamiyə müraciətlə deyə bilərik ki:

– Yox, böyük şair, sənin yaratdığın saf göhər artıq bikəs deyildir.

*1947*

# KİTABDAKILAR

## PYESLƏR



## ƏDƏBİ-TƏNQİDİ MƏQALƏLƏR

